**Redaktor:** Qurban Cəbrayıl

**Şahin Fazil. İran səfərnamələri**
***(Təkmilləşdirilmiş yeni nəşri*** **), Bakı 2012**

Tarix elmləri doktoru, professor, Azərbaycan Yazıçılar Birliyinin üzvü, "Məcməüş-şüəra" ədəbi məclisinin sədri Şahin Fazil öz şairanə müşahidə qabiliyyətini dəfələrlə sınaqdan çıxararaq, bu vaxtadək səfərə yollandığı onlarla ölkə haqqında səfərnamələr yazmış, müxtəlif poetik janr və vəznlərdə qələmə aldığı yüzlərlə səfər şeirlərinin müəllifi kimi tanınmışdır. 2003-cü ildə çapdan çıxan "İran səfərnamələri" kitabından sonra (cəmi 9 səfərnamə) daha 12 dəfə İranda olmuş, orada keçirilən müxtəlif elmi və poetik məclislərdə alim və şair kimi iştirak etmiş, səfərnamələrin sayını daha da artırmışdır.

İranı dəfələrlə şairanə və elmi seyr obyektinə çevirən Şahin Fazil çoxları kimi adi bir seyrçi olmamış, bu qədim dövlətçilik və mədəniyyət diyarının tarixini dərindən öyrənmiş, nəticədə böyük həcmli yeni bir səfərnamə kitabının müəllifi olmuşdur.

**Kitab Azərbaycan Respublikasındakı İran İslam Cümhuriyyəti Səfirliyinin Mədəniyyət Mərkəzi tərəfindən çapa layiq görülmüşdür.**

F ..................qrifli nəşr

*İbrahim Nuri -*
*İran İslam Respublikasının*
*Azərbaycandakı səfirliyinin*
*Mədəniyyət Mərkəzinin sədri*



# Şahin Fazil və İran səfərnamələri

Səfərə çox adam çıxır. Səfərə çıxmayan adam səfərnamə yazmaz. Amma, bəllidir ki, səfərə yollanan adamların hamısı səfərnamə yazmır. Səfərnamə yazmaq üçün, əlbəttə, diqqətli müşahidəçi olmaq qabiliyyəti zəruridir. Elə müşahidəçilərin birini mən tanıyıram. O, Şahin Fazildir.

Şərqşünasdır. Fars dili mütəxəssisidir. Alimdir. Müəllimdir. Professordur. Yazıçıdır. Şairdir. «Məcməüş-şüəra» məclisinin sədridir. Azərbaycan Yazarlar Birliyinin üzvüdür. 20-dən çox kitab, 300-dək elmi məqalə, 3 Divan müəllifidir. İranşünasdır.

Şahin Fazilin ilk səfərnamə kitabı «İran səfərnamələri» adı ilə 2003 - cü ildə çap olundu. Orada 9 səfərnamə vardı. Şahin o vaxtadək 9 dəfə İranda olmuşdu. Hazırda isə onun İrana etdiyi səfərlərin sayı 21 olmuşdur. Deməli, 9 səfərnamədən başqa 12 səfərnamə də yazıldı. Biz belə məsləhət gördük ki, onun bütün (hələlik bütün!) İran səfərnamələrini bir kitabda toplayıb oxuculara təqdim edək.

Budur, Şahin Fazil tərəfindən təkmilləşdirilən ikinci «İran səfərnamələri» kitabının əlyazması qarşımdadır. Varaqlayıram. Maraqla varaqlayıram. Onuncu səfərnamə: «Şahin, yenə İranə yetişdim, gözüm aydın». On birinci səfərnamə: «Bu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?». On ikinci səfərnamə: «Şahinə qismət olubdur yenə İran səfəri». Və sair və ilaxir. Diqqət yetirdinizmi? Hər səfərin öz adı var... Bu kitbdakı sonuncu (hələlik sonuncu) səfərnamə isə Şahinin bir il bundan əvvəl İrana etdiyi səfərin səfərnaməsidir: «Şahin yenə İran ilə sevda həvəsində». Bəli Şahinin İrana xüsusi məhəbbəti var. O, hər zaman İran ilə sevda etmək istəyir. Axı İranşünasdır. Axı bir şair kimi İran poeziyasının vurğunudur. Axı bir tarixçi kimi İran tarixinin bilicisidir. Axı bir səyyah kimi İran məmləkətinin məftunudur.

İyirmi bir İran səfərnaməsi. Və iyirmi bir İran səfərinin yüzədək şe'ri. Şahin həm əruz, həm heca, həm də sərbəst vəznli şe'rlərində İrana öz münasibətini bildirir. Həm nəsr, həm də nəzm dili ilə bildirilən münasibət.

Onuncu səfərnamənin ikinci şe'ri. Mürəbbe'dir. İkinci şe'rin birinci bəndində Şahin Fazil özü-özünə müraciətlə belə deyir:

*«Ey torpağa acgöz kimi bağlı qoca Şahin,*
*Torpağım seyr etməyə gəldim bu diyarın.*
*Yer Kürrəsi torpaq ilə dolmuşsa da, lakin*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*Dünyadakı çox viranı, abadı da gördüm,*
*Babildəki sahmanı da, bərbadı da gördüm,*
*İstanbulu da, Bəlxi də, Bağdadı da gördüm,*
*Torpağını seyr etməyə gəldim bu diyarın...*

*Göz var ki, doyub sevdiyi cananı seyrdən,*
*Göz var ki, bezib hurini, qılmanı seyrdən,*
*Şahin gözü doymur niyə İranı seyrdən?*
*Torpağını seyr etməyə gəldim bu diyarın»*

Yaxud, onuncu səfərnamənin üçüncü şe'ri. Qəzəldir:

*«Verdim canı, canana yetişdim, gözüm aydın,*

*Canana yetib, cana yetişdim, gözüm aydın...*

*İmkan ələ düşmürdü alam busə üzündən,*
*Görcək onu imkanə yetişdim, gözüm aydın.*

*Zənn eyləməsinlər ki, sənəm tə ’rifidir bu,*
*Şahin, yenə İranə yetişdim, gözüm aydın».*

Şahinin hər səfərnaməsi oxunaqlıdır. Gözlərini varaqlardan ayıra bilmirsən. Oxunaqlı kitabdır. Axı hər səfərnaməni onun şe 'rləri daha da oxunaqlı edir. Və oxucu oxuyur:

*«Çoxdu seyri bu diyarın*
*Nağıllar aləmi kimi.*
*Canda mehri bu diyarın,*
*Gəlmişəm həmdəmi kimi.*

*Çox olmuşam Tehranında,*
*Təbriz kimi məkanında...*
*Fikrim tarix ümmanında*
*Üzmədədir gəmi kimi».*

(«On birinci səfərnamə»dən)

Yaxud:

*«Qoca dərviş, yenə İranə səfər var», - dedilər,*
*«Ləngimə, get, hələ qəlbində təpər var», - dedilər.*

*«Sən ki, şahinliyi tərk eyləmisən, indi isə*
*Tutisən, tutiyə Təbrizdə şəkər var», - dedilər.*

(«On altıncı səfərnamə»dən)

Y axud:

*«Sözdə surət, həm də mə’na axtaran bir şairəm,*
*Surətə xor baxmıram, misra, səlam olsun sənə.*

*Gəlmə, ey rö'ya bugün, qoy ki, şəhidlərdən yazım,*
*Gözlərimdən çıx, çəkil, rö'ya, salam olsun sənə».*

(«İyirminci səfərnamə»dən)

Yaxud, sonuncu səfəmamə:

*Bitməkdə ömür günləri, bitmir zaman amma,*
*Yaş yetmişə yetmişsə də, qıvraqdı can amma.*

*Dağ timsalı qəddim dik olubdur mənim, indi*
*Dağ üstünü almaqda sərasər duman amma.*

*Faidə-ziyan məsələsində belə gördüm:*
*Faidəmiz olmuşsa da, çoxdur ziyan amma.*

*Həzz ilə fəğan fərqi müəyyən ola bilsə,*
*Üstün gələcəkdir neçə həzzə fəğan amma.*

*... Yazmaqda səfərnamə qələm hər səfərimdə,*
*Çox yazmalıyam mən hələ, çoxdur güman amma.*

*Şahin yenə İrandə ilhamə gəlibdir,*
*İranə gedən çoxsa da, azdır yazan amma.*

(«İyirmi birinci səfərnamə»dən)

Şahin Fazilin nəsr dili barədə isə bir neçə cümlə verməyim kifayətdir:

«19 oktyabr, 2009. Səhər saat 11 radələri. Biz artıq Mədəniyyət Mərkəzindəyik. Mən, Məmməd və Nəsib. Mərkəzin sədri cənab İbrahim Nuri və əməkdaşı cənab Əlirza Behbudi «Mersedes» markalı maşınla bizi yola saldılar. Biləsuvar səmtinə yollandıq... Salyan arxada qaldı. Qarşıda isə Biləsuvardı. Təbrizə getdiyimizi bilən sürücü dərhal adının Təbriz olduğunu dedi. Məşədi Təbriz. Məşədi İbad yaşında zarafatcıl bir adamdı. Yaman söhbətcildir...

Biləsuvara yetişdik. Yadıma yazıçı və şair Əlibala Hacızadə düşdü. Axı

Biləsuvardan idi Əlibala - bizim mərhum dostumuz. Həyat yoldaşı özündən əvvəl dünyasını dəyişdi. Qırxı təzəcə çıxmışdı.

Əlibala ilə Əfqanıstanda mütərcim vəzifəsində işləmişdik. Aramızda dostluq münasibəti yaranmışdı. Müxtəlif münasibətlərlə bir-birimizə o qədər şe'r yazmışdıq ki. Əlibalanın mənə yazdığı şeblərin birində belə sözlər var:

*...«Бaşımm üstündə Allah var» deyib,*
*«Düşmənə düşmənəm, yara yar» deyib...*

*«Sərvətim, xəzinəm düz ilqar» deyib*
*İlahi bir nura bələndi Şahin.*

*Onun kimi həmdəm ara, həyan gəz,*
*Məhəbbəti yerə, göyə edər bəs.*

*Şahin yaxşı deyib: «Sevənlər ölməz»,*
*Məgər bu eşq ilə öləndi Şahin?*

Çox təəssüf ki, sevənlərdən biri öldü. Əlibala dünyasını dəyişdi. Elə yaşamaq istəyirdi ki.

Mən Astara gömrük məntəqəsindən İrana çox gedib-gəlmişəm. Adətən orada İrana gedən və İrandan gələn adam çox olur, sərhədi keçmək «əməliyyatı» çox vaxt aparır. Bu dəfə isə biz Biləsuvardan keçəcəyik. Biləsuvardan Biləsuvara. Astara kimi iki hissəyə ayrılmış Biləsuvara (Yaxşı mövzudur, bu barədə şe'r yazmaq olar).

Sərhəddəyik. Bizim gedəcəyimiz Azərbaycan «Şərqi Azərbaycan» adlanırsa da, İrandır. İranda hələ Qərbi Azərbaycan (paytaxtı Urmiya) da vardır.

Sərhədi keçdik. «Pejo» markalı maşının sürücüsü bizi gözləyir...

Yol. Biləsuvar-Ərdəbil yolu. Keçib getdiyim kənd, qışlaq, şəhristan (kiçik şəhər) və başqa yaşayış yerlərinin adlarını dəftərimə qeyd edirəm. Həmişəki kimi qələmim əlimdə, dəftərim dizimin üstündədir. Yaşayış məskənlərinin adları mənim üçün toponimik baxımdan maraqlıdır: Zərgər, Qara qoçlar, Göytəpə, Gönpapaq, Fuladlı, Odlu, Muradlı, Xoruzlu, Bəybağlı,

Narqışlağı, Əkbər Davud, Əjdərli, Sarı Nəsir, Nəcəfqulukəndi, Şəkərab, Keçəllər, Arançı Germi, Şəhrəke- vəliəsr, Onbirbəyli, Dizac, Onqut, Ağdaş, Əliməhəmmədli, Hacı Əhmədkəndi, Nəsrullakəndi, Budaqlı, Qalabərzənd, Əmirkəndi, Alışansuyu, Seyidlər, Keçibulağı, Rəzi. Meşkin şəhəri sağ tərəfdə qaldı. Nağılçılar demiş, sağ getdik, sol getdik, gəlib Ərdəbilə çatdıq».

(«On doqquzuncu səfərnamə»dən)

Bəli, Şahin Fazilin bütün İran səfərnamələri belə çoxsahəli, çox- şaxəli və oxunaqlıdır. Oxu, oxucu. Oxuyub mənim haqlı olduğumu görəcəksən.



*Qurban Cəbrayıl -*
*şair, «Nəbz» qəzetinin baş redaktoru*
*AMEA Nizami adına Ədəbiyyat*
*institutunun dissertantı*

# Səfərlər və səfərnamələr Şahini

*Mən yolçuyam, mən yoldayam.*
*Od nə çəkdi?*
*Küldən soruş.*
*Hansı şeirim, hansı sözüm*
*Yaşayacaq məndən sonra?*
*Mən bilmirəm, eldən soruş!*
*Rəsul Rza*

Çoxdan tanıyıram Şahin Fazili. Lap çoxdan. Tələbəlik vaxtımdan da əvvəl. Qəzet və jurnallarda dərc olunan yazılarının altında ad və təxəllüsünü tez-tez görərdim. Əfqanıstan şair və nasirlərini Bakıda, Azərbaycan ədiblərini isə Kabulda tanıtdırırdı. İki ölkə arasına mənəvi körpü idi Şahin Fazil.

Əfqanıstanda nə az, nə çox, 13 il işləyib qayıtdı Bakıya. Amma, tər-

cüməçilik fəaliyyətini dayandırmadı, müxtəlif vəzn və janrlarda çoxsaylı şe’rlər müəllifi oldu, yaradıcılıq dairəsi daha da genişləndi, səfərləri daha da artdı, İrana, Türkiyəyə, İraqa, hətta Yaponiyaya müxtəlif görüşlərə yollandı, səfərnamələr yazdı.

Onun xaricdə ən çox işlədiyi ölkə Əfqanıstan, ən çox səfərə çıxdığı diyar isə İrandır. Şair-səyyah yazır:

*«Getmirəm Kabula, БадДаДэ haçandır, amma*
*Məni dəvət eləyir Ankara həm, Tehran həm.*

*Əfqanıstan ilə İranə könül bağlamışam,*
*Əfqanıstan da əzizdir bu kəsə, İran həm».*

Şahin Fazilin İrana hər səfəri (həmçinin başqa ölkələrə) «Səfərna- mə» ilə bitir. Qələmindən çıxan bəzi səfərnamələrin («İran səfərna- mələri»nin) sərlövhələrinə göz yetirirəm:

*«Dəyməsin xətrinə Allahı gərək İranın»;*
*«Qoca Şahin, nə çəkir hey qoca İranə səni?»;*
*«Şahin, yenə İranə yetişdim, gözüm aydın»;*
*«Şahinə qismət olubdur yenə İran səfəri»;*
*«Şahinin gözləri Təbrizdə qalıbdır, gözəlim»;*
*«Urmiyə torpağına heyran olubdur Şahin»;*
*«On beşinci səfərim başladı İranə mənim»;*
*«Qoca dərviş, yenə İranə səfər var dedilər»;*
*«Vaxtın ətəyindən tutub İranə tələsdim»;*
*«Gördüm nə qədər təntənə Təbriz şəhərində»;*
*«Şahin istər hər zaman etsin səni yad, Ərdəbil»...*

Şahin müəllim istər Əfqanıstanda, istər İranda, istər dünyanın o başındakı Yaponiyada olsun, fərqi yoxdur, darıxır. Darıxır doğma diyarı Azərbaycan üçün, Bakı, Quba, Göyçay üçün, əzizləri, dost-yoldaşları üçün. Odlar Yurdu olan ölkəsinin aşiq Məcnunudur Şahin, səyyah Məcnunudur Şahin, şair Məcnunudur Şahin:

*«Ey canım Azəribaycan eli, Odlar Yurdum,*
*Seyr edim hər yerini gündə bir az, vacibdir...*

*Gündə yüz dəfə bu Şahin əyilər qarşında,*
*Neyləsin, çünki müsəlmanə namaz vacibdir».*

Vətənində olduğu kimi xaricdə də vaxtını boş-boşuna keçirmir, özünün təbirincə desək, «vaxt qatili olmur», hər gün yazır, şe'rimizin müx - təlif növlərində qələm işlədir. Məsələn, onun bir varsağısını misal gətirim:

*«Savalandır,*
*Zirvəsi övc alandır,*
*İlhamım, yetiş dada,*
*Şahini havalandır».*

İranda Savalan dağından, El gölündən, Sefidrud çayından, Təbriz, Məşhəd, Qum şəhərlərindən yazmaqla bərabər tez-tez yaralı Qarabağını da xatırlayır, yadların xəyanət və rəzaləti nəticəsində işğal olunan doğma torpaqlarının həsrətindən yazır, yazır:

*«Dilbər Qarabağ dərdi mənim qəddimi əydi,*
*Çəkmiş vətənim gör nə cəfa yad əlindən».*

Şahin Fazil qiymətli sözün qədrini, dəyərli şe'rin dəyərini bilən şairdir. Bu sadə insan şe'rdə qəlizlikdən (daha doğrusu, qəliz dildən) uzaqdır və müasir dövrdə oxucular tərəfindən çətin anlaşılan, yaxud heç anlaşılmayan kəlmə və ibarə işlətməyin tam əleyhinədir:

*Məndən də bu dünyadə zəngin bir adam varmı?*
*Qiymətli dürüm yoxdur, qimətli kəlamım var.*

*Sə'yimlə, iradəmlə minlərlə şe'r yazdım,*
*Vallah, elə şahəm ki, minlərlə qulamım var.*
*Şe'rimdə mənim görməz bir kimsə qəliz kəlmə,*

*Seyr et nə səliqəm var, bir gör nə nizamım var.*

*Şe'r əhli gərək olsun həm milli, həmi xəlqi,*
*Düzgünlüyünə fikrin, söz yox ki, inamım var.*

Şahin Fazil keçən əsrin 64-cü ilində Azərbaycan Dövlət Universiteti Şərqşünaslıq fakültəsinin «Fars dili» şöbəsini fərqlənmə diplomu ilə bitirib və o vaxtdan bu günədək fars dilinin gözəllik cazibəsində qalmaqdadır, heç o cazibədən çıxmaq istəmir də. Onun «Beşinci səfərnamə»sində bu cümlələri oxuyuruq: «1995-ci il dekabr ayının ortalarında Tehrandan mənim adıma bir də’vətnamə gəldi. Də’vətnamədə bildirilirdi ki, 1996-cı il yanvarın əvvəllərində (İran təqvimi ilə 1374-cü ilin dey ayının 13-dən 15-dək) Tehranda «Fars dili ustadlarının Birinci Beynəlxalq Konfransı» keçiriləcəkdir və mənim iştirakım arzu olunur. Təbii ki, çox sevindim. Axı İrana etdiyim hər bir səfər (istər ziyarətlər, istərsə də elmi konfrans və simpoziumlar məqsədi ilə) bir iranşünas kimi məni sevindirməyə bilməz».

Şahin Fazil həmin konfransa getdi, bir həftə müxtəlif rəsmi iclas, mədəni tədbir və gəzintilərdə oldu və birinci misrası «Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl» ilə başlayan möhtəşəm bir qəzəl yazdı:

*Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,*
*Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl.*

*Nə qədər şairi vardır, əcəba, İranın,*
*Neçə arif yetirib hər ili, yarəb, nə gözəl.*

*Qərq olubdur gülə hər guşəsi, güldən başqa,*
*Bu qədim ölkədə var dil gülü, yarəb, nə gözəl.*

*Adi bir sözdəki məzmun məni ovsunlatmış,*
*Sanki axmaqdadı mə’na seli, yarəb, nə gözəl*
.
*Bu rəvan dildə Nizami yaradıb, Sə ’di yazıb,*
*Yetirib Ənvərini, Bideli, yarəb, nə gözəl.*

*Bu dilin şöləsi çox qəlbi işıqlatdı, bu dil,*
*Nura qərq eylədi çox mənzili, yarəb, nə gözəl.*

*Hafizin şe'rini Şahin dedi, bülbül susdu,*
*Fars dili məst elədi bülbülü, yarəb, nə gözəl.*

Bu günün şe'ri bu günün poetik şe'r dilində də yazılmalıdır! Budur Şahin Fazilin şairanə qayə və məqsədi. Klassik şairlərimizə dərin ehtiram bəsləyən bu şair bəzi qəzəlxanlarımız tərəfindən gen-bol işlədilən əcnəbi kəlmə və ifadələrin əleyhinə çıxır və yarım əsrdən çoxdur ki, mühafizəkar qəzəlxanlarla vuruşur. Mili dövlətimizin rəmzlərindən biri olan dilimizin saflığı uğrunda mübarizə onun qanındadır. Şe'rdə dil təmizliyinin zərurəti haqqında dönə-dönə fikirlər söyləyən Şahin belə yazır:

*«Kuh» gəl söyləmə, «dağ» düzgün olar,*
*«Ləb» demə bir də, «dodaq» düzgün olar.*

*Sağsa şair ölümündən sonra,*
*«Zində» gəl söyləmə, «sağ» düzgün olar.*

*Bilməyir türk, a canım, «guş» nədir,*
*Qulaq as, türkcə «qulaq» düzgün olar.*

*Əl-ayaq eyləmə yad sözlər üçün*
*«Dəst» - «əl», «pa»sa - «ayaq» düzgün olar.*

*Dilbərin zülfü daraqlanmalısa,*
*«Şanə» işlətmə, «daraq» düzgün olar.*

*Yad kəlam öldürəcək doğma sözü,*
*Xəlqi sözlə yaşamaq düzgün olar!*

İrana səfərlərim zamanı üç dəfə Kərbəlayi Şahinlə yol yoldaşı olmuşam. Çox məhsuldar adamdır. Qələmi əlindən düşmür. Onun səfərnamələrindən: «2006-cı il. Fələstinlə bağlı Beynəlxalq Tehran Konfransı. «Azadi» adlanan otel. Yüksək mədəni səviyyəli qarşılanma. Hacı Hacıağa ilə Tahir Kərimliyə 1411-ci, Hacı Qurbanla mənə isə 1413- cü otaqlar ayrılmışdı. 14-cü mərtəbənin

13-cü otağı. Nəhs adlanan bu rəqəm mənə düşür. Səfərimiz yaxşı keçəcək, inşallah!».

Yaxud, «Saat 15.00. Ayətullah Təsxiri ilə görüş. Məqami-müəzzəmi-rəhbər Ayətullah Seyid Əli Xameneyinin beynəlxalq əlaqələr üzrə müavini Ayətullah Təsxirinin yaşı məncə səksən olar. Olduqca mədəni və savadlı şəxsdir. Ərəb dilini gözəl bilir. Şairdir. O, sabah İranın ali dini rəhbəri cənab Xameneyi ilə bizim görüşümüz olacağını bildirərək bir qədər söhbətdən sonra getdi. Mənim «Fələstinnamə» silsiləsindən olan 4 şe'rimin və Hacı Qurban Cəbrayılın bir neçə şe'rinin surətlərini çıxarmaqdan ötrü varaqlarımızı surətçıxarma otağına apardılar. Dayanıb şe'rlərimizi aparan şəxsin qayıtmasını gözləyirik. Bu vaxt Hacı Qurban portağal şirəsi dolu qrafin gətirən bir nəfəri bizə göstərib dedi:

- Budur şe'rlərimizin şirəsini gətirirlər.

Yarı zarafatla cavab verdim:

- Yox, bizim şe'rlərimizin şirəsi sarı rəngdə ola bilməz, qıpqırmızı olmalıdır. Çünki onlar Fələstinə həsr olunduğundan özlərində qan rəngini əks etdirməlidir.

Gülüşdük».

Başqa səfərimizdən: İmam Rzaya (s) həsr olunmuş növbəti konfrans. 21 -24 noyabr, 2006-cı il. «Səfərə tək çıxmayacaqdım. «Nəbz» qəzetinin baş redaktoru şair Qurban Cəbrayıl da mənimlə birgə gedəcəkdi. Bu Hacı yaxşı həmsəfərdir. Mən onunla əvvəllər də İranda olmuş, müxtəlif İran şəhərlərinə səfərlər etmişəm. Sabah yenə birgəyik. Yolumuz işıqlı, səfərimiz uğurlu olar inşallah.

Gecə sabahdan başlayacaq yeni İran səfərimin - on altıncı səfərnamənin birinci şe'ri yazıldı:

*«Qoca dərviş, yenə İranə səfər var,* - *dedilər,*
*Ləngimə, get, hələ qəlbində təpər var,* - *dedilər.*
*On beşinci səfərim gendə qalıb çoxdandır,*
*Bixəbərsən, gedişin haqda xəbər var,* - *dedilər.*

*Oxuyarsan orada şe'rini şövq ilə yenə,*
*Dikilən yollarına doğma nəzər var,* - *dedilər.*

*Gedəcəkdir Hacı Qurban da səninlə oraya,*
*Bilməyirsənmi o şairdə nələr var, - dedilər...»*

Hal-hazırda 2011-ci ilin əvvələridir. Günlər şütüyür, aylar ötür, illər bitir. Ağsaqqal dostum, demək olar ki, hər il İrana gedir. Heç olmasa ildə bir dəfə.

*«Hələ çox gəzməliyəm, görməliyəm İranı,*
*Mənə bildir görünübdür bu ilin imkanı»* -
deyir Şahin Fazil.

Görüm ki, sənin canın sağ, imkanın geniş, səfərlərin çox, ilhamın yüyrək olsun. Yeni səfərnamələrini gözləyirik...



# BİRİNCİ SƏFƏRNAMƏ

## *«DƏYMƏSİN XƏTRİNƏ ALLAHI GƏRƏK İRANIN...»*

Mən ixtisasca şərqşünasam. 1964-cü ildə Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin fars dili şöbəsini fərqlənmə diplomu ilə bitirmişəm. 1963-1988-ci illər arasında müəyyən fasilələrlə 13 il Əfqanıstanın müxtəlif idarə və orqanlarında mütərcim vəzifəsində işləmişəm və bütün həyatım boyu İrana, onun xalqına, ədəbiyyatına yaxından bələd olan iranşünas olmuşam. Elə uzun illər çörəyini yediyim, suyunu içdiyim Əfqanıstan ölkəsi də İrana ən yaxın olan məkanlardan biridir. Deməli, mən uzun müddət cismən Əfqanıstanda yaşamağıma baxmayaraq, özümü ruhən İranda hiss etmiş, bu iki diyarı doğma Vətənim qədər sevmişəm.

1992-ci ilədək İranda olmamışdımsa da, həmişə onunla maraqlanmış, fars dilinin şirinlik və gözəlliyinin məftunu olmuş, Şərqin ən qədim ölkələrindən biri sayılan və Rüdəki, Firdovsi, Sədi, Hafiz, Mirzadə Eşqi, Pərvin Etisami, İrəc Mirzə, Şəhriyar kimi söz ustadlarının məskəni olan bir diyarı görməyi bərk arzulamışdım. Nəhayət, arzuma və 1992-ci il dekabr ayının 1-dən 8-nə qədər İranda olmaq səadətinə yetişdim. Bu səfərimin baş tutması üçün, əlbəttə, Məhəmmədhüseyn Şəhriyara minnətdaram.

Biz İranda dördüncü dəfə qeyd olunan «Beynəlxalq Şəhriyar Konfransı»nın iştirakçıları idik və hər birimizi bu ölkəyə ustad Şəhriyarın ecazkar poeziyasının işığı, Şəhriyar cazibəsi, Şəhriyar nisgili çəkib gətirmişdi.

Nümayəndə heyətimizin tərkibinə akademiklər Eldar Salayev, Ziya Bünyadov, yazıçı Anar, şairlər Sabir Rüstəmxanlı, Qabil, Qasım Qasımzadə, Fikrət Qoca, Fikrət Sadıq, Nazim Rizvan, Sərvinaz Həsənli, alimlər Bəkir Nəbiyev, Yaşar Qarayev, Rüstəm Əliyev, Ruqiyyə

Qənbərqızı, İmamverdi Həmidov, Şirindil Alıcanov, Kamil Allahyarov, rəssam Fəxrəddin Əli və başqaları daxil idilər.

İndi mən İrana etdiyim hələlik birinci olan səfərimi bir qədər təfərrüatla əks etdirməyə çalışacağam. Bu səfərnaməni İranın müxtəlif yerlərində olduğum zaman yaddaş kitabçama etdiyim müxtəlif qeydlərim, çap etdirdiyim «Gedirəm Təbrizə mən...» və «Görmüşdü gözüm Kabulu, Tehranı da gördüm.» adlanan iki məqaləm əsasında yazmışam.

*1 dekabr 1992-ci il, Bakı-Tehran*

Bu gün İranda Şəhriyar konfransı («Kongereye-Şəhriyar») öz işinə başlayır. Bu gün mən dilini öyrəndiyim, özünü isə görmədiyim bir ölkəyə ilk dəfə qədəm basmalıyam. Elə bu məqsədlə də Binə təyyarə meydanına getdim. Məni uzaqdan görən Əlican Əliyev («Gənclik» nəşriyyatının direktoru) dərhal məni pərt etdi: «Təyyarə gecikir. Neynək?! Biz belə gecikmələrə adət etmişik. Dözüb gözlərik.».

Dözüb gözlədik. Nə az, nə azacıq. Düz 3 saat 20 dəqiqə (nəticədə Tehran konfransı bizsiz açıldı). Təyyarəyə minib havaya qalxdıq. Tehran-Bakı hava yolunda 1 saat 5 dəqiqəlik məsafə var (700 km).

Təyyarə Tehrana yaxınlaşır. Yerdə milyonlarla elektrik ulduzları yanır, sanki göyü də işıqlandırırdı.

Bizi «Mehrabad» təyyarə meydanında olduqca səmimi qarşıladılar. Və dərhal yadıma Kabul düşdü. Mehriban Kabul. Qonaqpərvər Kabul. Sovetlərdən mehribansızlıq və biganəlik görüb tikə-tikə olan Kabul.

Dərhal hərəyə bir stəkan çay verdikdən və pasport qeydiyyatından sonra bizi beynəlxalq otel sayılan «Lalə» mehmanxanasına gətirdilər.

Foyedə oturub ordan-burdan söhbət edirdik. Yazıçı Anar hansı münasibətləsə belə bir hadisəni nəql etdi: Günlərin bir günü düşmənlər hansı bir şəhərisə ələ keçirdilər. Məğlubiyyətə düçar olan sərkərdə ağlayırdı. Arvadı ona deyir: «Şəhəri kişi kimi müdafiə edə bilməmisən,
indi isə arvad kimi ağlayırsan».

Dərhal yadıma Şuşa, Laçın, Xocalı düşdü. Elə biz də o müqəddəs

şəhərlərimizi kişi kimi müdafiə edə bilməyib, arvad kimi ağlamaqdayıq...

Lift məni 11-ci mərtəbəyə qaldırır. 1120-ci otaq mənimdir (Ərəbşünas alim İmamverdi Həmidov da mənimlə birgədir)... Bir qədər dincəldikdən sonra şam yeməyinə də'vət olunuruq. Restoran 13-cü mərtəbədədir. 13-cü mərtəbə əvəzinə liftdəki lövhəcikdə «R» hərfi yazılıb (yəqin ki «Restoran»). Yadıma yenə Kabul düşdü. Oradakı mehmanxanalarda 13 nömrəli otaq olmur. Eləcə 10, 11, 12-dən sonra 14-cü nömrə başlayır (Əfqanlar da «13» rəqəmini nəhs sayırlar).

Yeməklər olduqca ləzzətli, bol və çoxçeşidlidir: meygu (krevetka), qarç (göbələk) supu, salat, 3 növ kabab, 2 növ plov, çay, qəhvə, dondurma.

Şam yeməyimiz 2 saat çəkdi. Mizlərin üstünü çilçıraqlardan başqa şərq üslubunda şamlar da işıqlandırırdı. Şair Qabil birdən-birə dedi:

- Pah atonnan, şamlar bayaqdan yanır, amma ərimir ki, ərimir.

Şair müşahidəsi. şam keyfiyyəti.

Fikrət Sadıq zarafatla dilləndi: - Bizim şamlar sanki altdan yanır və buna görə də dərhal əriyir.

Və mən İrana qibtə etdim (yox, qibtə yox, paxıllıq!). Xörək və şam keyfiyyəti. Doğrudur, bizdə xörəklərin dadına-tamına söz ola bilməz. Amma, şam.

Otağıma qayıtdım. Bütün gecəni nə Tehran yatdı, nə mən.

Səhərədək qulağımızdan maşın səsi, şəhərdən uğultu kəsilmədi. Nə Tehran yatdı, nə mən. İlhamım da oyandı. Tehran da yatmadı, mən də, ilhamım da.

Bir qəzəl yazdım:

*Şəm'in odu nisgilə yetmir neçin?*
*Qəlbə ümid bir gilə yetmir neçin?..*

*'k'k'k*

*2 dekabr, Tehran*

Bu gün sübh yeməyindən sonra dərhal maşınlara oturub vəzifəcə İranın ən böyük rəhbəri *(«məqame-müəzzəme-rəhbər»)* olan ağaye- Xameneyinin qəbuluna yollandıq. İqamətgaha çatdıqda iki dəfə əsaslı yoxlamadan, yəni üst-başımız yoxlanıldıqdan sonra, ayaqqabılarımızı çıxarıb görüş otağına daxil

olduq. Yerdə bardaş qurub yarım saata qədər gözlədik. Ön divarda mərhum ayətullah Xomeyninin foto-şəkli, onunla üzbəüz isə rəngli boya ilə işlənmiş iri portreti vardır. Divarlardan müxtəlif şe'r parçaları və dini ifadələr əks olunan lövhələr asılmışdır. Operatorlar iki tərəfdən bizi çəkirlər (televiziya işçiləri). Salona göz gəzdirirəm: farsça «Allah kəlamı hər şeydən üstündür» yazılan lövhə sənətkarlıqla işlənmişdir.

Nəhayət, ayətullah içəri girir. Əynində qara əba, başında ağ əmmamə, gözlərində eynək var. Hamımız yerdə əyləşməyə öyrəşmədiyimizdən çətinliklə ayağa dururuq, sonra da elə həmin çətinliklə əyləşirik.

İranın Mədəniyyət və İslam irşadı naziri ağaye-Laricani sözə başlayır və Azərbaycandan gələn nümayəndə heyətini qəbul etdiyi üçün ayətullaha təşəkkür edir. O qeyd edir ki, «Şəhriyar konfransı»nda 400 - dən çox məqalə və şe'r oxunacaqdır. Konfransın bütün materialları isə üç kitabda nəşr ediləcəkdir.

Laricaniyə şərq adət və ənənəsincə təşəkkür edən «məqame- müəzzəme-rəhbər» ayətullah Xameneyi Şəhriyarın divanını varaqlaya-varaqlaya sözə başlayır. O, bizə səmimiyyətlə bildirir ki, biz İrana öz vətənimizə və evimizə təşrif gətirmişik. Sonra o, ustad Şəhriyarın şairliyi barədə müfəssəl danışır, onun şe'rlərinin «böyük duyğu və məhəbbətlə yazıldığını» qeyd edir. O, Şəhriyarın bir qəzəlindən bir neçə beyt misal gətirir ki, bir misrası dərhal beynimə həkk olunur:

*«Aşiq nəmişəvi ke, bebini çe mikeşəm».*

Tərcüməsi:

*«Olmayırsan aşiq ki, anlayasan dərdimi».*

Yeri gəlmişkən bir haşiyə çıxım. «Heydər babaya salam» poemasını yüksək qiymətləndirən bu yüksək dövlət xadimi çıxışının bir yerində dedi ki, Şəhriyarın əsərlərinin böyük əksəriyyəti fars dilində yazılmışdırsa da, «Heydər babaya salam» təkcə Azərbaycan ədəbiyyatının deyil, dəfələrlə qeyd edildiyi kimi, dünya ədəbiyyatının şah əsərlərindəndir. Ustad Şəhriyar ömrünün son illərində azərbaycanca şe'rlər yazmağa başlamış, fars dili ilə yanaşı Azərbaycan dilinin bənzərsiz gözəlliyini bir daha sübuta yetirmişdir.

Mən ağaye-Xameneyini dinlədikcə düşünür və təəssüflə öz-özümə

deyirdim: Kaş ki, Nizami, Xaqani, Məhsəti kimi şairlərimizin də heç olmasa bircə beyt azərbaycanca şe'ri bizə çatmış olaydı...

Ağaye-Laricani və Sabir Rüstəmxanlı bir neçə kəlmə cavab nitqi etdilər. Beləliklə böyük nüfuza malik «əzəmətli rəhbər məqamı»nı daşıyan ayətullah Xameneyi ilə görüşümüz bitdi və biz ayaqqabılarımızı geyinib, iqamətgahı tərk etdik.

Günorta yeməyini «Lalə» hotelində yedik. Bizə onlarca müxtəlif yeməklərdən əlavə kabab da təklif etdilər: parça kabab, toyuq kababı, balıq kababı və bəxtiyari kababı. Ustad Zəkəriyyə Tərzəmi bəxtiyari kababını məsləhət gördü. Səbəbini də zarafatla belə açıqladı ki, bəxtiyari sözündə həm «bəxt» var, həm də «yar».

Saat 16.00-da İran Mədəniyyət Nazirliyinin «Vəhdət» salonunda («Talare-vəhdət») konfrans başladı. 13 çıxış oldu. Şair Müşfiq Kaşani, Qabil, Mahmud Pədide, Dəstpiş Valeh, Cəfəri Urmiyəvi və Saed Baqeri öz şe'rlərini oxudular. Cəfərinin bir beyti belə başlayır:

*«Ey vətəndaşlar, bu gün İrana xoş gəlmişsiniz...*
*Şəhriyar yurdu Azərbaycana xoş gəlmişsiniz».*

Əli Əsgər Şe'rdust, Rüstəm Əliyev, Cəlil Təclil, Fərhad Fəxrəddini məqalə oxudular. Bakının Pirşağı qəsəbəsində doğulan və 1938-ci ildən İranda yaşayan ustad Səlimi («Aman ayrılıq» və «Salam gətirmişəm» mahnılarını bəstələyən Əli Səlimi) və kamançaçı Rastbod tar və kamança çaldılar, xanəndələr müxtəlif mahnılar oxudular.

Şam yeməyi Tehran universitetində verildi. Məclisdə Ali Təhsil naziri Mustafa Moin və universitetin rektoru ağaye Rəhimiyan da iştirak edirdilər. Orada hamımıza «Nəhcül-bəlağə» kitabını hədiyyə etdilər.

Otelə qayıtdıq. Bu gecə yenə, təbii ki, Tehran yatmadı. Mən yatdım və gecə yarısı oyandım. Çünki yuxuda ayətullah Xomeyni (Allah rəhmət eləsin!) mənə bir şe'r yazdırmış, həmin şe'rin kağıza köçürülməsini əmr etmişdi. Tez-tələsik ayılıb, əlimi dəftər-qələmə atdım. Aşağıdakı qəzəlin köçürəni mən, müəllifi isə ayətullah Xomeynidir, zənnindəyəm:

*Dəyməsin xətrinə Allahı gərək İranın,*
*Var isə xar ola bədxahı gərək İranın.*

***

*3 dekabr, Tehran*

Sübh tezdən bizi bəzi sovqat və hədiyyələr almaqdan ötrü Tehran mağazasına apardılar. Əvvəlcə, «Füruşgahi-Qüds» adlanan dövlət univermağına getdik. Hər şey boldur, amma cibimizə görə bahadır! Başqa mağazaları da gəzdik...

Saat 16.00-da yenə «Talare-Vəhdət»də konfrans öz işinə davam etdi. Konfransqabağı Tehran universiteti Dil və ədəbiyyat fakültəsinin ustadı ağaye-Çavuşiyə Bakıda bizim görkəmli etnoqraf-alimimiz Məşədixanım Nemətin İran alimi ağaye-Bəxşayeşiyə çatdırmaq üçün mənə verdiyi iki kitabını təqdim etdim. Dedi ki, hökmən sabah yox, birigün (sabah cümədir, idarələr işləmir) kitabları ünvanına çatdıracaqdır!

Konfransda Qabil, Fikrət Qoca, Solmaz xanım (Təbrizin cavan və gözəl şairəsi), Savalan Məcidzadə öz şe’rlərini oxudular.

Gənc və gözəl şairə Solmaz xitabət kürsüsünə qalxdı. O, heç bir yaddaş kağızına əl atmadan özü kimi gözəl şe’r dedi. Böyük vətənpərvərlik və şəhriyarpərvərliklə dolu olan gözəl bir şe’r. Mən Solmazı Bakıda da (televiziya ekranında) görmüş, təsirli misralarını dinləmişdim. Amma onun bu dəfəki şe’ri mənə xüsusi təsir etdi, qəlbimi riqqətə gətirdi. Nə gizlədim, doluxsundum və bu cavan şairə ilə fəxr etdim. Solmazın təsirli şe’riyyəti və böyük şairlik duyumu var. Kaş onun
şair xəyalı nəhayətsiz şe’r asimanında uçsun, hey uçsun...

Onu da qeyd edim ki, bizimlə gedən şairlərimizin əksəriyyəti İran şairləri müqabilində konfransın məzmununa uyğun olmayan şe’rlərini oxuyurlar, çünki, onlar özlərini zəhmətə salıb konfransın məzmununu nəzərə almamış, İran və Şəhriyar barədə yazmamış, Şərqin bu böyük və gözəl diyarına, demək olar ki, əliboş gəlmişlər.

Rüstəm Əliyev, Y aşar Qarayev və Bəkir Nəbiyev - hər üçü olduqca səlis,

rəvan nitq ilə güclü çıxış etdilər və xeyli alqışlandır. Belə alimlərə eşq olsun! Bir neçə Şərq və Qərb dilində sərbəst danışan prof. Rüstəm Əliyev, təbiidir ki, ölməz Şəhriyarla bağlı xatirələrini fars dilində söylədi və «Şairlər Şəhriyarı»nın bir neçə il əvvəl ona ithaf və öz əli ilə yazıb təqdim etdiyi məşhur şe'rinin bəzi beytlərini nəzərə çatdırdı.

İranlı ustadlardan Miskənrad, Əsgər Fərdi öz məqalələrini oxudular. Türkiyədən gələn Səlahəddin də məqalə ilə çıxış etdi.

İclasın yarısında İranın Xarici İşlər naziri ağaye-Əli Əkbər Vilayəti gəldi. Yerlərimiz təsadüfən yanaşı idi. O, «Şəhriyarın İran və İslam barədə görüşləri» adlı məqaləsi ətrafında danışdı və onun tudəçilərə və mərhum Seyid Cəfər Pişəvəriyə münasibəti məlum oldu. Ağaye-Vilayəti nəql etdi ki, bir gün Pişəvəri ustad Şəhriyarın yaxın dostlarından biri olan İqbal Azəri (məşhur musiqiçi və şair) yanına çağırıb, ondan Azərbaycan dilində bir şe'r oxumasını xahiş edir. İqbalsa, bu xahişə əsla əhəmiyyət vermədən Arif Qəznəvinin farsca bir qəzəlini oxuyur. (Yəni İranda hamı fars dilini sevir və üstün tutur).

Ağaye-Vilayəti vaxtilə Rusiya və İran arasında bağlanan «Gülüstan» və «Türkmançay» müqavilələrini olduqca pislədi və həmin müqavilələrin hər şeydən çox Azərbaycan və azərbaycanlılara zərbə vurduğunu xüsusilə qeyd etdi. O, qəribədir ki, «Qoy Arazın o tərəfi də, bu tərəfi də təzədən möhkəm birləşsin» dedi.

Ağaye-Əli Əkbər Vilayətini dinlədikcə yadıma Abbasqulu ağa Bakıxanov düşdü. Məlumdur ki, «Türkmançay» müqaviləsinin imzalanmasında onun da iştirakı olmuşdur. Lakin, o, sonralar bu günahını yumaq üçün Məkkəyə getmiş, orada tövbə etmiş, özünə ölüm arzulamış, səsi Tanrı tərəfindən eşidilmiş, geri qayıdarkən elə yoldaca vəfat etmişdi. İran Xarici İşlər Nazirinin sözünün qüvvəti, həmin müqavilənin Azərbaycan və azərbaycanlılara vurduğu zərbə xüsusilə ağır olmuşdu...

Çıxışlararası yenə də müğənnilər öz istedadlarını nümayiş etdirir, natiqlər şe'r oxuyurdular.

Axşamüstü otelin foyesində yığışmışdıq, bir-birimizlə söhbətləşirdik. Akademik Ziya Bünyadovla otelin bir işçisi arasında belə bir sual- cavab oldu. Orta yaşlı həmin kişi akademikimizə yaxınlaşıb onun döşündəki Sovet İttifaqı Qəhrəmanı nişanına əl çəkərək soruşdu:

- Bu nədir?

- Qəhrəmanlıq nişanıdır.
- Sən kimsən?
- Qəhrəmanam.
- Bunu nəyə görə veriblər?

Ziya Bünyadovun cavabı konkret oldu:

- Müharibədə almanları öldürdüyümə görə.
- Axı niyə onları öldürürdünüz? Onlar ki, sizi rus əsarətindən xilas etməyə gəlmişdilər.

Ziya müəllim əlini yelləyib ondan uzaqlaşdı.

Axşam «Rəvan» adlı restorana getdik və bir daha İran mətbəxinin dadlı, ləzzətli xörəklərini daddıq.

Gecəyarısı yenə də sərasimə durub təzə bir qəzəl yazdım. Görünür ki, İran barədə hələ çox şe’r yazacağam. İrana məftun olmuşam.

*Görmüşdü gözüm Kabulu, Tehranı da gördüm,*
*Gördüm vüsalı çox, hələ hicranı da gördüm.*

Mən bu günün gündəliyini bitirmək istəyirdim ki, yadıma iclas zamanı bir jurnalistdən aldığım məktub düşdü. Jurnalist yazırdı:

«Ustad Şahin Fazil!

Salam ilə.

Sizə zəhmət verməklə istərdik ki, ölkənin radiosunun incəsənət proqramlarının birində sizin vaxtınızı bir neçə ləhzəliyə əlinizdən alaq. Sizinlə bir neçə dəqiqəlik müsahibə aparmaq istərdik».

İclas zalından çıxdım, səsimi və bir qəzəlimi radioda yarım saat verməkdən ötrü lentə yazdılar.

Beləliklə, İran radiosunun «Həft iqlim» proqramı ilə 5 dekabrda saat 15-dən 15.30-a qədər çıxışım olacaq. Həmin çıxışa Təbrizdə qulaq asaram, inşallah!

*4 dekabr, Tehran-Behişti-Zəhra-*

*Qum yolu-Xomeyninin məqbərəsi-Tehran*

Bu gün səhər saat 9.00-da Qum şəhərinə tərəf yollandıq. İkitərəfli geniş yoldur. İmam Xomeyninin məqbərəsinə gəldik. Əzəmətli bir mavzoleydir. Dörd qüllənin ikisi bitib, ikisi isə tikilib qurtarmaqdadır və dördüncüsünün əsas özülü qoyulmuşdur. Ayaqqabılarımızı soyunub imamın qəbri olan olduqca geniş dua zalına girdik. Zala birdəfəlik namaz üçün 30000 adam toplanır. Ön tərəfdə üstünə yaşıl örtük salınmış məzarda imam Xomeyni uyumaqdadır. Məzar naxışlı dəmir şəbəkələrlə örtülmüşdür.

Ziyarətdən sonra meyvə yemək üçün başqa bir otağa də’vət olunduq və yarım saatdan sonra Tehran yoluna çıxdıq.

Bizi Tehranın Əlbürz dağının Şəmiran hissəsinə (Şəmiran - «soyuq yer», Tehran isə «isti yer» deməkdir) gətirdilər. Dağ qar içində ağarırdı. Yarım saata qədər məsafə qət edib kanat yolu ilə hərəkət edən «telekabinlərə» minərək havadan Tehranı seyrə başladıq. Dağın ən yüksək zirvəsində inşa olunan restoranda yeməyə də’vət olunduq...

Şəmirandan geri qayıdıb «Parke-Sai»yə gəldik. Geniş və yaraşıqlı olan bu parkda heyvanxana var. Qu, şahin, bayquş, dovşan və meymunlara bir qədər tamaşa etdik və konfrans zalına yollandıq.

21 şair və məruzəçi çıxış etdi. Fikrət Sadıq Şəhriyarın «Azərbaycan» şe’rinin tərcüməsini, mənsə İranı salamladıqdan sonra Tehranda yazdığım 5 qəzəlin üçünü oxudum. Alqışlandıq. Görünür bəyənmişdilər.

Doktor İsmayıl Hakemi, Rəhim Çavuş Əkbəri, Əli Rəfineye - Cirdehi, Tofiq Hacıyev, bizim İmamverdi məqalələr, Qasım Qasımzadə,
Səba Firuzkuhi və başqaları öz şe’rləri ilə çıxış etdilər.

Sabah Təbrizə getməliyik. Gecə yeni bir qəzəl yazdım:

*Gedirəm Təbrizə mən bir məzar şövqüylə,*
*Bir məzar içrə yatan Şəhriyar şövqüylə...*

***

*5 dekabr, Tehran-Təbriz*

Bu gün sübh yeməyindən sonra otağıma qayıdanda cavan və gözəl bir Təbrizli qadın otaqda yır-yığış edir, hamamı yuyurdu (*Ümumiyyətlə, «Lalə» oteləində mədəni xidmət yüksək səviyyədədir. Dəsmal və mələfələr, hətta sabunlar da hər gün dəyişdirilir).*

Dünən Bakıdakı həmkarım Abdulla Fazilinin qardaşı Sabir Fazili yanıma gəlib, bir qutu tort gətirmişdi. Bizi burada elə bol çeşidli xörək və şirniyyatla təmin edirlər ki, tort heç yada düşmür. Təbrizə gedib- qayıdacağımız müddətdə tortun xarab ola bilmə ehtimalını nəzərə alıb, mən onu həmin qadına təklif etdim. O dedi ki, bir parça kağıza yazıb bu tortun mənə bağışlandığını qeyd etməsən, aşağıdakı işçilər onun aparılmasına icazə verməzlər. Tez bir kağıza tortun həmin qadına bağışlandığını yazaraq imzaladım.

Saat 10-da İranın beynəlxalq hava meydanı olan Mehrabada gəldik. 11.30-da Təbrizə uçmalıyıq. Uçduq. Təbriz... Günəşli Təbriz... Dumanlı Təbriz. Nə qədər arzulu, gümanlı Təbriz.

Təyyarədən enən kimi bizi Təbrizin yüksək məqamlı sahibləri - baş ruhani ağaye-Mələkuti və başqa idarələrin işçiləri qarşıladılar. Maşınlara minib yola düşdük.

Önümüzə yol kənarında, görünür ki, bizim şərəfimizə kiril (şeytan) əlifbası ilə yazılmış (Allah Şəhriyara rəhmət eləsin: «Ayırıb şeytan əlifbası sizi Allahdan») bir plakat çıxdı: «İgidlər diyarı Təbriz şəhərinə xoş gəlmisiz!».

Acıçay üzərindən keçib, sağa buruldıq. Öndə al-əlvan bayraqlarla örtülmüş (daha doğrusu, bayraqlar asılmışdı) bir qəbristanlıq göründü. Bizi «Vadiye-rəhmət» məzarıstanına gətirdilər. Burada İraq-İran müharibəsində şəhid olmuş 2500-dən çox şəhid dəfn olunmuşdur. Allah şəhidlərə rəhmət eləsin!

Şəhərə yola düşdük. Eynal-Zeynal dağında qar görünürdü. Səhənd solda qalmışdı...

«Gostəreş» («İnkişaf», «Tərəqqi») mehmanxanasında yerləşdik. Dərhal restoran və bol yeməklər.

Axşam saat 18-də Təbriz imamcüməsi olan ağaye-Mələkutinin hüzuruna yollandıq. Onunla görüşümüz 2 saat çəkdi. Qayıdıb mehmanxanaya gəldik. Şam yeməyindən sonra isə «Şəhriyar» məqbərəsinə yollandıq. Saat 21.00-da «Müşairə» («Şairlər deyişməsi») keçiriləcək.

Böyük və əzəmətli məqbərədir. Önündə Şəhriyarın böyük büstü,

Nizaminin kiçik heykəli var. Pillələrlə aşağı, yerin altına düşdük. Budur, şairlər şairi dahi Şəhriyarın qəbri.

Çoxlu şair və elm-ədəb əhli əyləşib bizi gözləyirdi. Xeyli şe’r oxundu. Mən özümüm «Minacat»ımı oxudum. İstedadlı rəssamımız Fəxrəddin Əli ustad Şəhriyarın böyük portretini hədiyyə etdi. 22 çıxışın 7-si bizim idi. Qabil, Fikrətlər (Qoca və Sadıq), Qasım Qasımzadə, Sərvinaz Həsənli, Nazim Rizvan, Sabir Rüstəmxanlı və mən şe’rlə, Anar isə məruzə ilə çıxış etdi. Görüş gecə 12.45-də bitdi.

Səhərə yaxın bir qəzəl də peyda oldu:

*Ya İlahi, qov acı illəri yaddan çıxsın,*
*Daima şənliyi İranıma göndər gəlsin.*

***

*6 dekabr, Təbriz-Tehran*

Səhər saat 9.00-da «Şəhrdariye-Təbriz»də şəhərin yüksək məqamlı başçıları ilə rəsmi görüşümüz oldu. Görüşdə ağaye-Mələkuti və Təbriz şəhrdarı mühəndis Musəvi çıxış edib «xoş gəldin» dedilər. Sonra maşınlara minib, Şəhriyarın yenicə açılmış ev-muzeyinə getdik. Çoxlu adam vardı. Oğlu Hadi ilə görüşüb şəkil çəkdirdik.

Saat 12-də «Muzeyi-Azərbaycanda» («Azərbaycan muzeyi»), 13-də isə «Fərhəngsəraye-Təbriz»də («Təbriz Mədəniyyət Sarayı») olduq. Hər iki görüş bizə böyük zövq verdi. Rəsam və heykəltəraş Əhəd Hüseyninin tuncdan tökdüyü əzəmətli insan mücəssimələri (qədim zamanlardan tutmuş öz günümüzə qədər), insanın təkamülünü əks etdirən əsərləri çox təsirli idi.

Mənə təsir edən hallardan biri də rəsmi görüşlər zamanı xorla edilən dualar və qarğışlardır:

*Dua - Ällahu-əkbər, Ällahu-əkbər, Ällahu-əkbər!*
*Xomeyni rəhbər!*
*Qarğış - Mərg bər Ämrika!*
*Mərg bər İngilis!*

*Mərg bər İsrail!*

Saat 14-də «Elgölü» adlanan səfalı bir parka tərəf yollandıq (Bir neçə il əvvəl «Şahgölü» adlanırdı). İstirahət və ziyafətdən sonra «Şeyx Səfi bazarı»na getdik. Pulsuz-parasız nə bazar? Oradakı bolluğa mat- məəttəl qaldıq.

Saat 18.30-da təyyarə meydanına gəldik. Tehrana uçan təyyarəyə mindik...

İndi yenə də «Lalə» mehmanxanasındayıq.

Biz bu gün səhər Təbrizdə olduğumuz vaxt şair Mahmud Pədidə gəlib mənə həsr etdiyi bir qəzəlini oxudu. Qəzəl səmimanə deyilmiş misralarla zəngindir və məni bərk mütəəssir etdi:

*«Salmışdı şure-şe’rin yeksər cahanə Şahin,*
*Sən tək doğa çətindir mame-zəmanə, Şahin.*

*Hərçənd əyləşibdir başında bərfe-piri,*
*Müşkül vəli otursun tə’be-cəvanə, Şahin.*
*Əzbəs salıb şərarə hicran odu bu qəlbə,*
*Neytək rəvadı gəlsəm hər dəm fəğanə, Şahin.*
*Səndən məni ayırsın hicran məhal işdir,*
*Çün mehrin əyləşibdir bu cismi canə, Şahin.*

*Bir min deyil ki, hüsnün ta mən yazam mədihə,*
*Saydan keçibdi, gəlməz bu yerdə sanə, Şahin.*

*Gündüz səninlə getdi, qaldı gecə mənimlə,*
*Bu ev mənə olubdu bir həbsxanə, Şahin.*

*Qoy sözlərin Pədidə bu növ ilə yetirsin,*
*Qalsın bu şer məndən səndə nişanə, Şahin».*

*14.09.1371, Təbriz, Pədidə*

Gecə uzun müddət yata bilmədim. Təbriz şəhərinin gözəlliyi və bizə göstərilən ehtiram qəlbimi riqqətə gətirmiş, ilhamımı qanadlandırmışdı. Belə bir qəzəl yazdım:

*Başladı öylə ki, Tehranə yolum Məni məst*
*eylədi məstanə yolum...*

•kkk

*7 Dekabr,*
*Tehran*

Bu gün istirahət günümüzdür. Hərə bir cür istirahətlə məşğuldur. Mənimsə istirahətim şe'r yazmaq, qəzəl qoşmaqdar.

Amma bu gün bir qit'ə yazdım:

*Yenə tale məni göndərdi murad bağçasına,*
*Baxıram vəcdə gəlib mən yenə bağbanə sarı...*

Vaxtı boş keçirmək fikrim yoxdur. Sabah İranı tərk etməliyik. Nə qədər ki, İrandayıq, nə qədər ki, vaxtımız var, nə qədər ki, ilham coşub- daşır, yazmaq, yazmaq lazımdır!

*Nə gözəl yerdi bu İran, gedirəm,*
*Eləyib qəlbimi viran, gedirəm.*

'k'k'k

*8 Dekabr, Tehran-Bakı*

Bu gün İranla xudafizləşmək günümüzdür. Bu günün nisgili həmişəlik məni ağrıdacaqdır. Əlvida, gözəl İran, gözəl Tehran, gözəl Təbriz! Əlvida Şəhriyar yurdu! Sağlıq olsun, yenə görüşərik, inşaallah!

*Tutsaydı əlim bir də o cananın əlindən,*
*Biryolluq üzərdim əli hicranın əlindən...*

Budur, yenə Tehranın «Mehrabad» təyyarə meydanındayıq. Bizi Tehrana gətirən təyyarə bizi yenə gözəl Bakıya qaytaracaq.

Məni İrana Şəhriyar işığı çəkib gətirmişdi. Mən həmin işığın bir zərrəsini özümlə götürüb, qəlbimdə Azərbaycana aparıram. İran, xudahafiz!

'k'k'k

1-8 Dekabr, Tehran-Bakı, 1992

## Birinci Səfərnamə Şe’rləri

*I*
*QƏZƏL*

*Şəm’in odu nisgilə yetmir neçin?*
*Qəlbə ümid bir gilə yetmir neçin?*

*Tehrana yetdim necə şad-şadiman,*
*Бurdan əlim Kabila yetmir neçin?*

*Yelkəni qərq olmada peymanımın,*
*Əhd qayığım sahilə yetmir neçin?*

*Ruzini, əlbəttə ki, Allah verir,*
*Ruzi payım zənbilə yetmir neçin?*

*Söyləyirəm bülbülə «sev bir gülü»,*
*Бəs bu öyüd bülbülə yetmir neçin?*

*Təbrizi görmək diləyir gözlərim,*
*Göz diləyim hasilə yetmir neçin?*

*Sevgili yarım, yenə hicran var,*
*Hicrə bugün fasilə yetmir neçin?*

*İndi gözün Şahini görmür niyə?*
*İndi əlin Fazilə yetmir neçin?*

*1 ДекаЬг, 1992*

*II*
*QƏZƏL*

*Dəyməsin xətrinə Allahı gərək İranın,*
*Var isə xar ola bədxahı gərək İranın.*

*İranın şənliyi vardırsa əgər ahı da var,*
*Ola yox birkərəlik ahı gərək İranın.*

*İnkişaf ümmanı bağrında üzən bir gəmidir,*
*Pisliyindən qaça timsahı gərək İranın.*

*Erməsin dərdə giriftar onu düşmən bir də,*
*Kəsə hər dərdini cərrahı gərək İranın.*

*İranı vəsf eləyib Sə'di, Nizami, Hafiz...*
*Yarada şe'rini hər dahi gərək İranın.*

*Şəhriyar öldüsə də, şe'r və şe'riyyətdə*
*Şəhriyar təntənəli şahı gərək İranın.*

*Bu gözəllikləri mədh etməyə qadirmi bəyəm?*
*Neçə Şahin kimi məddahı gərək İranın.*

*2 dekabr, 1992*

*III*
*QƏZƏL*

*Görmüşdü gözüm Kabulu, Tehranı da gördüm,*
*Gördüm vüsalı çox, hələ hicranı da gördüm.*

*Hərdən dolaşıb bir-birinə dəydi ayağım,*
*Məcnun gəzişən bərrü biyabanı da gördüm.*

*Qərq olmadı cismim gəmi tək dalğalar içrə,*
*Dəryadəki tufanı da, tüğyanı da gördüm.*

*İmkan arayıb dərdimə imkansız olunca*
*«İmkansıza imkan» dedim, imkanı da gördüm.*

*Hərdənbir olub qərq xəyalatə sərasər,*
*Şah İsmayılı, Babəki, Sən'anı da gördüm.*

*Təşviq olundumsa da, ruhdan da salındım,*
*Təqdir olundumsa da, böhtanı da gördüm.*

*«Şura» deyilən səltənətin məhvi göründü,*
Qur' *anə əlim yetdi və Qur'anı da gördüm.*

*Rüstəm diyarın görməyi əhd eyləmiş idim,*

*Çox şükr ki, Şahin, gəlib İranı da gördüm.*

*3 dekabr, 1992*

*IV*
*QİTƏ*

*Hər məqsədimə tam yetə bilməksə muradım,*
*Yarəb, mənə bəxş eyləmə imkanı yarımçıq.*

*Hicran, əminəm ki, təzədən qaldıracaq baş,*
*Heyfa, əzə bildim yenə hicranı yarımçıq.*

*Mənsur kimi mən də «təsəvvüf» deyə coşdum,*
*Dərk eyləyə bilməm axı irfanı yarımçıq.*

*Səyyahlərin fikri bütövsə diləməz ki,*
*Bir yanı mükəmməl görə, bir yanı yarımçıq.*

*Meydandə Rüstəmləri, Söhrabları görsəm*
*Tərk eyləmərəm mən elə meydanı yarımçıq.*

*Şahin quşusan, uç, buraya bir də gələrsən,*
*Görmək diləmirsən axı İranı yarımçıq.*

*4 dekabr, 1992*

*V*
*QƏZƏL*

*Aşiqəm, bir pəri var aşiqə yar - İrandır,*
*Məni meysiz də edən indi xumar - İrandır.*

*Yandırıbdır məni eşq atəşinə şəm' kimi,*
*Eləyən cismi alovlarə düçar - İrandır.*

*Şəhriyar ismini car etdi bütün dünyayə,*
*Бu səbəbdən elə dillərdə şüar - İrandır.*

*Onu görmək diləyənlər oxusun Şəhriyarı,*
*Elə başdan-ayağə Şəhriyar - İrandır.*

*Dönərəm yurduma, əlbət, neçə gündən*
*sonra, Mənə bundan belə bir intizar -*
*İrandır.*

*Ey nigarım, bilirəm qısqanacaqsan bir də,*
*Qız deyildir, daha qısqanma, nigar - İrandır.*

*Şahina, inciməsin Azəribaycan məndən,*
*Ona bənzər, ona tay bir diyar - İrandır.*

*5 ДекаЬг, 1992*

*VI*
*QƏZƏL*

*Başladı öylə ki, Tehranə yolum,*
*Məni məst eylədi məstanə yolum.*

*Elə qərq eylədilər gül-çiçəyə,*
*Sanıram düşdü gülüstanə yolum.*

*Hey dolandım başına Şimranın,*
*Dolanır gör neçə pərvanə yolum.*

*Dərvişəm, gəzmədəyəm, bilməyirəm*
*Düşəcək hansı biyabanə yolum.*

*Tutmuşam mən yenə Məcnun yolunu,*
*Məni üzməkdə bu divanə yolum.*

*Yetərək Təbrizə oldum xoşhal,*
*Yetiribdir məni Loğmanə yolum.*

*Çox abad yol gəlirəm çoxdandır,*
*Olacaq bəlkə də viranə yolum.*

*Yetəcəkdirmi o cananə əlim,*
*Çatacaqdırmı o cananə yolum?*

*Gedirəm, Şahina, Allah qoysa*
*Düşəcəkdir yenə İranə yolum.*

*6 dekabr, 1992*

*VII*
*QİTƏ*

*Yenə tale məni göndərdi murad bağçasına,*
*Baxıram vəcdə gəlib mən yenə bağbanə sarı.*

*Astara torpağına Astaradan gəldim mən,*
*Tutmuşam üz təzədən Qəzvinə, Tehranə sarı.*

*Ulu Tanrı, qoca Məşhəddə gözüm qalmışdır,*
*Baxıram şövq ilə Urmiyyəyə, Zəncanə sarı.*

*«Nə səbəb var ki, Xorasanə məni qoymurlar?»* -
*Dedi Xaqani tutub üz neçə xaqanə sarı.*

*Eləmişdi Xorasan elləri cəlb şairimi,*
*Mümkün olsa gedərəm mən də Xorasanə sarı.*

*Yerləri, göyləri ey xəlq eləyən Allahım,*
*Məni, rica edirəm, qov neçə imkanə sarı.*

*Mənlə İran arasında yaranıbdır ülfət,*
*Ülfətin səmtini sövq eyləmə hicranə sarı.*

*İstəsə kimsə ayırsın bizi, İran boyda Bir* yumaq
*ip götürüb sən məni İranə sarı.*

*7 dekabr, 1992*

*VIII*
*QƏZƏL*

*Nə gözəl yerdi bu İran, gedirəm,*
*Eləyib qəlbimi viran gedirəm.*

*Бu nə möhnətdi gəlibdir böylə?*
*Бu nə halətdi pərişan, gedirəm.*

*Mümkün olsaydı qalardım xeyli,*
*Qalmayıb qalmağa imkan, gedirəm.*

*Əlvida, ey ulu Tehran şəhəri,*
*Gözləyir sevgili canan, gedirəm.*

*Məni heyran eləmək müşküldür,*
*Etmisən qəlbimi heyran, gedirəm.*

*Бит - cənnət bucağından guşə,*
*Görübən huri və qılman gedirəm.*

*«Dirilikdir, - dedi, - birlik» atalar,*
*БМк olsun, a müsəlman, gedirəm.*

*Təbrizim, eşqü vüsaldır yalnız,*
*Sənə məlhəm, mənə dərman, gedirəm.*

*Zəncanım, sən mənə «can» söyləmisən,*
*Deyibən mən sənə «can, can» gedirəm.*

*Şahina, incimәsin qoy İran,*
*Çağırır Azəribaycan, gedirəm.*

*7 dekabr, 1992*

*IX*
*QƏZƏL*

*Tutsaydı əlim bir də o cananın əlindən,*
*Biryolluq üzərdim əli hicranın əlindən.*

*Əfsus, bəşər sirrini loğman bilə bilmir,*
*Əfsus, əlac olmadı loğmanın əlindən.*

*Dünya yaranışdan bəri üsyanə giriftar,*
*Qurtulmadı aləm niyə üsyanın əlindən?*

*Şeytan əməlindən nə təhər yan ola billik?*
*Yan oldu mələklər necə şeytanın əlindən?*

*Dünya üyüdür bizləri, acdır bu dəyirman,*
*Qaçmaq diləram mən bu dəyirmanın əlindən.*

*Qayğıyla yanaşdım qocaman bağbana, bir gün*
*Gül çıxdı, çiçək çıtladı bağbanın əlindən.*

*İran xudahafiz əlini verdi, a Şahin,*
*İndi tuturam Azəribaycanın əlindən.*

*8 dekabr, 1992*

*Bu gün İran səfirliyində oldum və «Xalq qəzeti»ndə (19 dekabr 1992) dərc edilən «Gedirəm Təbrizə mən...» adlı İran xatirələrimi səfirliyin məsul işçisi Yusif Kordiyə təqdim etdim. O, mənə İranda İslam inqilabının 14-cü ildönümü münasibətilə İrana yeni səfər edəcəyim barədə xəbər verdi. «Bu haqda Elmlər Akademiyasının Xarici Əlaqələr Şöbəsinin müdiri Etibar Xəlilova bir söz demək lazımdırmı?» sualıma Yusif Kordi «Şahin Fazilin etibarı bütün Etibarların etibarından daha etibarlıdır» deyərək mənə belə bir*

*məlumat verdi: «1-8 dekabrda İranda olan Azərbaycan nümayəndə heyətinin üzvləri barədə İrandan səfirliyə verilən xəbərdə sizin barənizdə olduqca yüksək rəy söylənilmiş, Tehran və Təbrizdə oxuduğunuz qəzəllərin dəfələrlə alqışlarla qarşılandığı bildirilmişdir».*

*Yusif Kordinin bu sözləri məni bərk riqqətə gətirdi...*

*22.12.92*



# İKİNCİ SƏFƏRNAMƏ

## *«ƏS-SƏLAM-ƏLEYK, YA RUHULLAH!»*

İmam Xomeyninin vəfatının dördüncü ildönümü münasibətilə keçiriləcək mərasimlərdə iştirak etməyim üçün İran səfirliyinin təklifi ürəyimdən oldu. Həm də ürəyimcə olan başqa bir məsələ imam Xomey- nidən çox-çox əvvəl yaşamış başqa bir imamın - imam Rzanın Məşhəddəki məzarını ziyarət etmək təklifi idi. Sevindim və məmnuniyyətlə razılıq verdim.

Ziyarətinizə gəlirik, imamlar. Qoy hər ikinizin müqəddəs ruhu şad olsun!

(«İkinci səfərnamə»nin qısaldılmış variantı «Şəhriyar» qəzetində (1 iyul - 8 iyul sayları, 1993-cü il) dərc edilmişdir).

*30 may 1993-cü il.* 8 avtobusa əyləşib Bakı-Astara yolu ilə İran sərhədinə tərəf yola düşdük. Salyan, Cəlilabad, Masallı, Lənkəran şəhərlərini keçib, Azərbaycan Astarasına gəldik. Akademik Cəmil Quliyev deyəsən təyyarədən sərfnəzər edib, avtobusla gəldiyi üçün peşman olmuşdu. Gömrükxana qarşısında böyük nizam-intizamsızlıq var idi. 2-3 yüz adam növbədə dayanmışdı. Bizim «zirək» adamlarımızdan birisi dərhal hərədən 5 min manat rüşvət toplamağa başladı. Guya gömrükxana işçilərinə böyük məbləğdə pul verilməsə, gecəni Azərbaycan Astarasında qalasıyıq. 10-15 adam dərhal pul verdi. Akademik Cəmil Quliyev və şair Famil Mehdi bərk əsəbiləşdilər. Zorbəla ilə içəri keçdilər. Mən vəziyyətin dözülməz və iyrənc olduğunu görüb, dostum Həsən Əliyevin oğlu Sunayı çağırtdırdım (Bakıya iş dalınca gedən gömrükxana rəisi Ağanəcəfin müavini). Dünən gecə Həsən ona zəng edib, məni qarşılamasını tapşırmışdı. Sunay gəlib çox böyük hörmətlə məni və Arif Ramazanovu gömrükxanadan «keçirdi». Nəhayət, hamı bir yerə toplaşdı. Cəmil Quliyevin ciddi tələbi ilə hamı gömrükxanadan keçə bildi. Pul verənlərin pulları isə özlərinə qaytarıldı. Yola düşdük. Axşam saat 18 idi. İran Astarası... Bizim Astaramızdan gözəl və təmiz şəhər... Orada nəzərimi

dərhal bir şüar cəlb etdi: «Əs-səlam əleyk, ya Ruhullah!» («Salam əley- küm, ey Ruhulla!»).

Tehrana yollandıq. «Dorahiye kəmərbəndi». Qarşımıza iki yol çıxdı. Sağ yol Ərdəbil-Meşkinşəhr, sol yol isə Rəşt-Tehran yolu idi. İkinci yolla hərəkət etdik.

Maşınımızda 30-32 nəfər vardı. Elmlər Akademiyasının müxbir üzvləri professor Ağasəlim Ələsgərov (iqtisadçı, Elmlər Akademiyası İqtisad İnstitutunun direktoru), Teymur Bünyadov (tarixçi, tarix elmləri doktoru, professor), Şahpələng Quliyev (etnoqraf, tarix elmləri namizədi), Ədalət Zeynalov (Bakıdakı İran səfirliyinin baş mütərcimi), Mehdi Kazımov (BDU-nun professoru) və arvadı Lalə xanım, Arif Ramazanov (şərqşünas), televiziya işçiləri (Ramiz Məşədihəsənli, Arif Bahaduroğlu), Şahnaz Ağamir və çoxsaylı jurnalist qrupu («Azərbaycan», «Azərbaycan qadını», «7 gün», «Həyat» və başqa qəzetlərdən) və s.

Yolda bir neçə gözəl məscid və imamzada binaları gördük. Sağda, solda ucsuz-bucaqsız düyü plantasiyaları. Evlərin üstündən qara bayraqlar asılmışdı (İmam Xomeyninin vəfatının 4-cü ildönümü münasibətilə).

Talış adlı şəhər. Gilan ostanı.

«Salone-qəzaxoriye Azərbaycan» yeməkxanası.

Yol uzanır, sərnişinlər isə uzanmadan yatırdılar (axı *uzanmaq mümkün də deyildi).*

*Hamı yatdı...*
*Bütün gecə*
*mən yatmadım,*
*yol yatmadı,*
*sürücü də.*
*Hamı durdu...*
*mən*
*durmadım, yol*
*durmadı,*
*sürücü də.*
*Çünki,*
*biz*
*yatmamışdıq...*

Yol boyu həmişəki adətim üzrə fikrim misrada, əlim qələmdə idi. Yenə qəzəl yarandı:

*Biz Xomeyni söyləyib, iranı yad etdik yenə,*
*İranı yad eyləyib, ovqatı şad etdik yenə...*

Yol uzanır, sürücü Davud yolun kələyini kəsirdi...

Səhər bizə məlum oldu ki, iki avtobusumuz qəzaya uğrayıb. Bir neçə nəfər (o cümlədən Əsmətxanım Məmmədova - filologiya elmləri namizədi, BDU müəllimi) yüngül yaralanıblar. Allah axırını xeyir eləsin!..

Yol uzanır, yolun kələyini kəsən Davud isə maşınını sürür, Tehrana gedən məsafəni qısaldırdı.

31 may. Bütün gecəni yol getdik. Birdən-birə sürücümüz Davud maşını bir kənara verib, dedi ki, əgər bir-iki saat yatmasa maşını heç cür idarə edə bilməyəcəkdir. Qəzvin şəhərinə çatmağımıza 110-120 km qalırdı. Davud avtobusun arxasında sürücülər üçün xüsusi düzəldilmiş yatağına girdi. Doğrudan da, o, bir qədər sonra durub sükan arxasına əyləşdi. Yolumuz davam edirdi.

Qəzvin şəhəri. I Şah Təhmasib Səfəvinin 1555-ci ildə Səfəvilər dövlətinə paytaxt etdiyi qədim bir şəhər. Doğrusu bu şəhər mənim təsəvvürümdə həmişə geniş bir yaşayış məskəni, gözəl və uca minarələr şəhəri kimi canlanırdı. Lakin Astara-Tehran magistral yolunun üstündə bir hissəsinin mövcud olduğu Qəzvində mən elə bir gözəçarpan gözəllik görə bilmədim. Yadıma hansı bir xanəndəmizinsə oxuduğu bir mahnının bir misrası düşdü:

*«Sən bu gözəlliyi duya bilməzsən...»*

Nə deyim? Bəlkə də elədir, amma mən təbiətin məftunu, gözəllik vurğunu olduğum üçün gözəlliyi duymaya bilmərəm.

Nə isə, yolumuz davam edir, sərnişinlər mürgüləyir, sürücü sürür, mən ətrafı seyr edirdim.

Qəzvin-Tehran «otoban yolu»na (ikitərəfli hərəkəti olan böyük və rahat asfalt yol) çıxdıq. Tehrana saat yarımlıq yol qalırdı.

Gözəl yoldur «otoban yolu». Mən həmin yolun bənzərini keçən ilin

dekabrında İrana olan səfərimdə Tehran ilə Qum arasında görmüşdüm. Ə'la yoldur «otoban yolu». Hər müəyyən məsafədən bir sürücülərdən «yol rüsumu» (yol vergisi) alınırdı. Təki bizim yollarımızda da rüsum alınaydı, amma yollarımız yol olaydı...

Qəzvin-Tehran yolundan sağa buruldu. Kərəc şəhəri. Əhalisi təxminən 2 milyon nəfərdir.

İran Kənd Təsərrüfatı nazirliyinin «Amuzeşe-keşavərzi» adlanan Kənd Təsərrüfatı İnstitutunun sahəsinə gəldik. Hal-hazırda ora ordugahdır (istirahət parkı). Hər tərəf gül-çiçək içindədir. Amma, açığını deyim ki, oradakı bizə verilən otaqların şəraiti xoşumuza gəlmədi. 7 avtobusun sərnişinlərinə orada yer verildi. Bizi isə, bir şeyxin başçılığı ilə Tehrana gətirdilər (az sonra hamı gözəl Tehrana gətirildi).

Tehran. «İstiqlal» oteli. Müasir üslubla işlənmiş beşulduz iki nəhəng bina.

Doğrusu, həmin gün başımıza gələn macəra da elə həmin «İstiqlal» otelindən başlandı. Bizə yer vermədilər. Demə, Bakıdakı İran səfirliyinin bizdən ötrü yolladığı teleqram hələ gəlib Tehrana yetişməyibmiş. Bizi böyük çək-çevirdən sonra elə öz avtobusumuza mindirib, Tehranın Şəmiran istiqamətində yerləşən «Qəsre-səadətabad» adlı bir qəsrin yaxınlığındakı pansionata yolladılar. İçəri girən kimi üç-dörd yüz türkmənin böyük bir açıq salonda əyləşdiyini, yatdığını, bəzi türkmənlərin isə əsəbi şəkildə var-gəl etdiklərini gördük. Buradakı şərait doğrudan da yaxşı deyildi. Doğrudur, bina olduqca gözəldir (Sahibi Xürrəm adlı bir varlı olubdur. O, İran İslam inqilabından sonra Amerikaya getmiş, onun geniş villası isə dövlət tərəfindən zəbt edilmişdir), lakin bu qədər adamın yaşaması üçün əlverişsizdir.

Bərk yağış yağırdı. Allah, görəsən bu gün Tehrana qayıda biləcəyikmi? Bu günün qəziyyəsi bu gün bilinəcək. Avtobusda yazdığım bir qəzəl yadıma düşdü:

*Neyləməli, başlanıb hicr anı əvvəlkitək,*
*Həcv edirəm mən yenə hicranı əvvəlkitək.*

1 iyun. (Qurban bayramı günü, yəni «eydi-əhsa»).

Sübh saat 6-da durdum. Pansionatın cənnət bucağını andıran bağı ilə tanış oldum. Hər tərəf gül, hər yan təmizlik.

Bütün günü qəfəsə düşən quşlar kimi heç yana çıxa bilmədik. Üstümüzdə güclü nəzarət vardı. Nahar yeməyindən sonra hərəmizə 1 kitab (İmam Xomeyninin son vəsiyyətnaməsini) bağışladılar. Təəssüf ki, kitab urdu dilində Pakistan üçün hazırlandığından mən ondan heç nə başa düşə bilmədim.

Ramiz Məşədihəsənli öz operatoru ilə birlikdə çox böyük çətinliklə bizi qoruyanlardan izn ala bilib, Azərbaycan səfirliyinə «şığıdı». 2-3 saat sonra qayıdan Ramiz, bizə xoş müjdə gətirdi: Bizim hamımıza «İstiqlal» otelində yer verilmişdir. Nəhayət, şam yeməyimizi yeyib, pansionatı tərk edərək, «İstiqlal»a (keçmiş adı «Hilton») gəldik. Ədalət və mən 516 -cı otaqdayıq.

Nəhayət ki, üç günün əziyyəti bitdi, dincələ bildik.

Saat 12-dən sonra yatdıq. Gecə durub bir qəzəl yazdım:

*Məni hicran eləyibdir elə bədhal əbəs,*
*Qəlbə düşmüş təzədən qapqara bir xal əbəs...*

Müqəddəs Məşhəddən qayıdana qədər saqqalımı qırxdırmayacağam.

2 iyun. Səhər saat 7-də bizi «məqame-müəzzəme-rəhbər» ağaye-ayətullah Xameneyi ilə görüşə apardılar. Nəbi Xəzri, Cabir Novruz (onlar İrana təyyarə ilə gəlmişdilər) və mən hamı kimi yerdə güc-bəla ilə əyləşmişdik. Mərasim iki saatdan çox çəkdi. Məclisi açan ağaye-Ənsari (Ayətullah Xameneyinin köməkçisi) xarici və daxili donaqlara xarici və daxili işlər barədə məlumat verdi.

Ayətullah Xameneyi daxil oldu. Zal gurladı. Müxtəlif şüarlar deyil - məyə başladı:

*«Səlli əla Məhəmməd -*
*Ruhe-Xomeyni aməd»*
*(Tərcüməsi: «Məhəmmədin salamı, Xomeyni ruhu gəldi»)*
*«Xameneyi rəhbər əst,*
*Varese-peyğəmbər əst»*
*(Tərcüməsi: «Peyğəmbərin varisi Xameneyi rəhbərdir»).*

*«Hüseyn! Hüseyn! - şüare-mast*
*Şəhadət eftexare-mast»*

*(Tərcüməsi: «Hüseyn! Hüseyn! - şüarımız, Şəhidlik iftixarımız»).*

*«Dəste-xoda bər sərе-mast*
*Xameneyi rəhbəre-mast»*
*(Tərcüməsi: «Hifz edir Allah bizi, Rəhbərdir Xameneyi»).*

Ayətullah nitqə başladı. Keçən il gördüyüm kimi yenə başında qara çalma, gözlərində qara haşiyəli eynək, əynində qara əba var. Kresloda oturub 30 dəqiqə məruzə etdi. O, İrandakı islam hərəkatının XX əsrin ən mühüm hadisəsi olduğunu bildirdi. «İslam Allahın sözüdü», «Müsəlmanlar heç bir yerə hücum etməsinlər, amma öz haqqlarını da müdafiə etsinlər» və s.

Yer kürəsinin qaynar nöqtələrindən Fələstinin, Bosniya-Hersoqovinanın və Əfqanıstanın adını çəkdi, onlardan bir xeyli danışdı...

Məclis bitdi. Yenidən şüarlar. Geri qayıtdaq. Yolda bələdçimiz də bir şüar dedi (ağaye-Musəviye-Xəlxali): «Səlman Rüşdinin başı ilə bədəni arasında qoy on kilometr məsafə olsun!».

Axşam saat 4-də «Dəryaye-nur» («Nur dəryası») sarayında xarici nümayəndəliklər, jurnalistlər və qonaqların toplandığı «dəyirmi miz»də imam Xomeyninin oğlu Əhməd Xomeyni ilə görüş keçirildi. Xitabət kürsüsünün arxasından 3 kişi portreti salona boylanırdı. İmam Xomeyni, ayətullah Xameneyi və cənab Rəfsəncaninin portretləri. Onların altında fars, ərəb və ingilis dillərində «Həzrət imam Xomeyninin dünyadan köçməsinin 4-cü ildönümü» sözləri yazılmışdı və belə bir şüar da dərhal nəzəri cəlb edirdi: «Əs-səlam əleyk, ya Ruhullah!».

Əhməd Xomeyni və onu müşayiət edənlər salona daxil oldular. Onun nitqindən əvvəl imamın ömrünün son günlərini əks etdirən «Ləbbeyk» («Gəlmişəm, ey Allah, sənin xidmətindəyəm») filmi göstərildi. Quran tilavəti oxunduqca biz də tez-tez «Allahuməsəlli əla Məhəmməd və ali-Məhəmməd» deyirdik.

Əhməd Xomenni «Xibregan»nı - ölkənin baş dini rəhbərini təyin edən şuranın üzvüdür. Əlliyə yaxın yaşı var, yaxşı natiqdir. Şuranın sədri isə ayətullah Meşkinidir.

İranda hal-hazırda dinin aşağıdakı elmi dərəcələri vardır: Siqqətül- islam, höccətül-islam, höccətül-islam vəl moslemin, ayətullah, ayətullahe- üzma və

imam.

Əhməd Xomeyni öz əhatəli məruzəsini bitirib salonu tərk etdi. «Dəyirmi miz» ətrafında çıxışlar başladı. İranlı höccətül-islam Seyid Məhəmməd Haşimi, Tacikistanın mətbuat naziri Babaxan Məhəmmə- dov, Ərəbistandan (Suriya) gəlmiş doktor Seyid Məhəmməd Şəhabi («Əl-aləm» jurnalının baş redaktoru), afrikalı Əhməd Kazım çıxışlar etdilər və «dəyirmi miz»in çıxışları yuvarlaqlandı.

3 iyun. Bu gün səhər saat 9-da İranın prezidenti olan Hüccətül-islam vəl müslemin Haşimi Rəfsəncaninin qəbulunda olduq. O, daim gülümsəyə-gülümsəyə 20-25 dəqiqəlik məruzə etdi. Ağıllı adamdır. Yaxın günlərdə İranda yeni prezident seçkiləri keçiriləcəkdir. Namizədlər hələlik üç nəfərdir (ağaye-Rəfsəncani, doktor Casbi və doktor Təvəkkoli).

Biz bir qədər əvvəl prezident iqamətgahına daxil olarkən məlum bir şüar görmüşdük. Həmin şüar oradan çıxarkən də diqqətimi cəlb etdi: «Əs-səlam əleyk, ya Ruhullah!».

Axşamüstü mətbuat konfransından, axşam isə Qur’anın tilavətindən ləzzət aldıq. Yəzd şəhərindən gələn qarilər (Qur’an qiraət edənlər) Quranın sözləri ilə təsnif oxuyurdular.

Gecə bu qəzəli yazdım:

*Nə Loğman arizu etdim, nə çox əfğanə gəldim mən,*
*Haçan canam yad etdim, həmin dəm canə gəldim mən.*

Sabah səhər tezdən imam Xomeyni dəfn olunan «Behişte-Zəhra»ya gedəcəyik.

Saat 10-da «Behişte-Zəhra»ya yollandıq. Yüz kilometrlik yolun hər iki tərəfi zəvvarlarla doludur. Maşınla getmək imkanı olmayanlar piyada addımlayırlar. Bizim bütün avtobuslarımızı 10-15 mersedes markalı maşınlar və motosikletlər eskordu müşayiət edir. Gəlib çatdıq. Hər yan qara içindədir. Hər yanda bu gün İranda dəbdə olan şüar : «Əs-səlam əleyk, ya Ruhullah».

İmam Xomeyninin dəfn olunduğu məqbərənin önündəki sahəyə minlərlə xalı döşənmiş, ziyarətə gələnlər əyləşərək, diktafon ilə verilən dini ifadə və cümlələrə hay verir, xorla qışqırırdılar. Məsələn, «Mərg bər Amrika» və s. Növbəti «xor»un bir məqamında mən fürsəti qənimət bilib, «Mərg bər

Amrika» əvəzinə «Mərg bər erməni» («Ermənİyə ölüm») deyə qışqırdım. Bu sözü eşidən bizim bütün nümayəndə heyətimiz (20-25 adam) «Mərg bər erməni» deyib təkrar etməyə başladı. Mənimlə vaxtilə Əfqanıstanda işləmiş tacik yazıçısı Şadi Hənif yaxına gəlib məni qucaqladı və o da təkrar etdi: «Mərg bər erməni!».

Mən son illərdə Ermənistan-Azərbaycan münaqişəsində bizi o qədər də fəal müdafiə etməyən keçmiş Sovet müsəlman respublikalarının laqeyd münasibətindən mütəəssir olaraq bir qəzəl yazmışdım. Qəzəlin bir neçə beyti belə idi:

*Ay kişilər, mən də acıqlanmışam,*
*Bişkekə, Daşkəndə acıqlanmışam.*

*Eyləməyirlər niyə yardım bizə?*
*Mən bu təhər fəndə acıqlanmışam.*

*Zəbt edərək torpağımı, başlayıb*
*Erməni rişxəndə, acıqlanmışam.*

*Çox kəsi bənddən eləmişdim xilas,*
*İndi düşüb bəndə, acıqlanmışam.*

Orta Asiya respublikaları nümayəndəsinin bizim nifrin şüarımızı təkrarladığını görübü, yanıldığımı duydum. Amma görünür ki, siyasət açıq müdaxilə və tərəfdarlıq tələb etmir. Bizim haqq səsimizə səs verin, ey özbəklər, qazaxlar, türkmənlər, taciklər, qırğızlar! Kim bilir, bəlkə haçansa bizim də səsimiz sizlərə lazım ola bilər. Pərişanam, bu gün şe’r yazmadım.

Ayətullah Xameneyinin bir saatdan bir qədər az çəkən çıxışı başladı. Ziyarətçilər namaza başlayan kimi, biz tribunanı tərk etdik. Geri qayıdırıq. Qum-tehran otobanı yenə də izdihamlıdır. Yenə də tanış şüar: «Əs-səlam əleyk, ya Ruhullah!».

4 iyun. Bu gün saat 4-ə qədər bir tənəzzöhdə olduq. İranlılar bizi pay-piyada «Parke-Dərbənd» deyilən şəhərin bir hissəsindən düz Şəmiran dağının təpəsinə qaldırdılar. Bir qədər yorulduq, amma baxmağa dəyər.

Axşamüstü İrandakı Azərbaycan səfirliyinin əməkdaşları ilə mətbuat

konfransına də’vət edildik. Görüşdə bizim tərəfimizdən Ağasəlim Ələsgərov, Teymur Bünyadov, Şahpələng Quliyev, Vəkil Hacıyev, Calal Allahverdiyev, bu sətirlərin müəllifi, Ədalət Zeynalov və bir qrup jurnalist, səfirlik tərəfindən Nəsib Nəsibzadə, Həsən Əlibəyli, Səməd Bayramzadə, Allahverdi, Suliddin Qasımov iştirak edirdi. Maraqlı keçdi. Y orğun olduğum və ilham pərisi yanıma gəlmədiyi üçün bu gün şe’r yazmadım...

5 iyun. Bu gün səhər saat 7-də Tehran-Məşhəd reysli təyyarəyə minib Məşhədə uçduq. Məşhəd böyük şəhərdir. Uca binaları azdır. Elə buna görə də şəhər eninə və uzununa çox böyümüşdür.

Məşhədin harasında olursan-ol «Hərəme-mütəhhər» («Pak məscid») görünür. Olduqca uca, geniş və gözəl tikilidir. Məscidin qübbəsi, deyilənə görə, qızıl təbəqəsi ilə örtülmüşdür. Mən Məşhədi seyr edərkən diqqətimi yenə də həmin yazı cəlb etdi: «Əs-səlam əleyk, ya Ruhullah!».

«Hərəme-mütəhhər»də İmam Rzanın qəbrini ziyarət etdik. Məscidin binası olduqca əzəmətlidir. Mənimi qələmim həmin məscidin gözəlliyini təsvir etməkdən acizdir.

Dəstəmaz aldım, qəbri dörd tərəfdən araya alan dəmir şəbəkəyə əlimi sürtdüm.

Mən bu gün məşədi oldum. Rəsmi sənəd verdilər. Axşam yenə bir qəzəl yazdım:

*Qismətim dərdü bəla olsa da hərgah*
*mənim, Diləyim hasilə yetməkdədi gah-gah*
*mənim.*

Saat 11-də bizə telefonla zəng edən iranlılar gecə 1-də, 2-də Azərbaycana doğru geri yollanacağımızı bildirdilər. Bu xəbər bizim üçün gözlənilməz olsa da, deməк olar ki, hamımızın ürəyindən oldu. Çünki səfirliyimizdən və İran televiziyasından aldığımız xəbərlərə görə Azərbaycan od içindəydi. Gəncədə vəziyyət gərgindi...

6-7 iyun. Astaraya doğru yönəldik. Gecə saat 3-ün yarısıydı. Canımızda yar və diyar həsrəti vardı. Bütün gecəni yol getdik. Gündüz saat 3-də Astara sərhədini keçdik. Öndə baxımsızlıq üzündən boz rəngə düşən, zövqsüz tikilən aşxanalar, xaşxanalar, İranın səliqəli-sahmanlı tarlaları ilə müqayisəyə gəlməyən əkin-biçin sahələri gözə dəyirdi.

Doğrudur, gözəl naxışlarla bəzənmiş xüsusi evlərə və dövlət tikililərinə də təsadüf olunur, lakin bunlar hələ azdır, çox azdır. Müstəqilliyimiz bəlkə də imkan verəcəkdir ki, məişət və iqtisadiyyatımız normal hala düşsün, kəndlərimiz, qəsəbələrimiz, şəhərlərimiz və yollarımız abad olsun, xalq yaxşı dolansın. İnşallah, vətənimizdə bolluq ayaq tutub yeriyər, mənhus müharibə bitər, müstəqillik meyvəsinin dadını duyarıq.

Əs-səlam əleyk, ya Vətən!!!

Bakı-Tehran-Bakı, 30 may-7 iyun

## İkinci Səfərnamə Şe'rləri

*I*
*QƏZƏL*

*Biz «Xomeyni» söyləyib İranı yad etdik yenə,*
*İranı yad eyləyib ovqatı şad etdik yenə.*

*Dəstə-dəstə yollanıb Rüstəm diyarın görməyə,*
*Möhtərəm qardaşlar ilə ittihad etdik yenə.*

*Bizdə mehri İranın onsuz da çoxdan var idi,*
*Qəlbimizdə İranın mehrin ziyad etdik yenə.*

*Qoy səlamət eyləsin Allah islam əhlini,*
*Məsləki, əzmi, təvanı biz polad etdik yenə.*

*Ey Xomeyni, ey imamı cümlə islam əhlinin,*
*Biz səni pərvazımız üçün qanad etdik yenə.*

*Artırır irfani şe'rin zövqünü ariflərin,*
*Bisəvadı hikmətinlə basəvad etdik yenə.*

*Qəlbimizdə qeyrətinlə yandı ümmid məşəli,*
*Himmətinlə küfrə qarşı biz cəhad etdik yenə.*

*Şahina, hey «ayətullah, ayətullah» söylərik,*
*Ey Xomeyni, biz səni İranda yad etdik yenə.*

*30 may 1993*

Iran səfərnamələri

## III
## QƏZƏL

*Neyləməli, başlanıb hicr anı əvvəlki tək,*
*Həcv edirəm mən yenə hicranı əvvəlki tək.*

*Yox xətəri ayrılıq cümsa da meydanıma,*
*Mən yenə tərk etmirəm meydanı əvvəlki tək.*

*Dəfinə biganənin bir neçə* imkan olub,
*Axtarıram mən təzə imkanı əvvəlki tək.*

*Mən elə üsyançıyam, üstümə lap div gələ*
*Qaldıraram üstünə üsyanı əvvəlki tək.*

*Yerdə səməndər quşu varsa mənəm şübhəsiz,*
*Atəşə yaxmaqdayam hey canı əvvəlki tək.*

*Dağda görünmür daha, qartalımız qeyb olub,*
*Görməyirik düzdə biz ceyranı əvvəlki tək.*

He-*ey, nə bülbül, nə gül, he*-*ey, nə sünbül*-*fi*lan,
*Bilmədəyəm baş bağa bağbanı əvvəlki tək.*

*Əldə şərab kuzəsi tutmağı tərk etmişəm,*
*Saqiya, mən tutmuram fincanı əvvəlki tək.*

*Əlli olub yaş, nə qəm? Çox ağarıb baş, nə qəm?*
*Şahina, sevməkdəyəm İranı əvvəlki tək.*

*31 may 1993*

***II***
***QƏZƏL***
Şahin Fazil

*Məni hicran eləyibdir elə bədhal əbəs,*
*Təzədən qəlbə düşübdür qara bir xal əbəs.*

*Mən də laləm, hələ ilham da olub lal bu gün,*
*Lalı dindirməyə cəhd eyləməsin lal əbəs.*

*Daha təskinliyi olmaz bu dilin, dildarım,*
*Deməərəm könlümü əvvəlki təkin al əbəs.*

*Daha şadlanmayacaqdır bu ürək onsuz da,*
*Ürəyi söyləmərəm mən sənə ki, çal əbəs.*

*O gözəl saldı məni bir dəli sevdayə nahaq,*
*O gözəl etdi könül mülkünü işğal əbəs.*

*Gözümün yaşı axır sel sayağı, axsın qoy,*
*Verməyin göz yaşımı silməyə dəsmal əbəs.*

*Yenə dərviş oluban gəzməliyəm İranı,*
*Kimsə qoy eyləməsin bir daha cəncal əbəs.*

*Yar uzatmış özünün cövrünü, mən saqqalımı,*
*Şahina, öylə uzun cövr və saqqal əbəs!*

*1 iyun 1993*

Iran səfərnamələri

***III***

## QƏZƏL

*Nə loğman arizu etdim, nə əfğanə gəldim mən,*
*Haçan canam yad etdim həmin dəm canə gəldim mən.*

*Sənə həmd olsun, ey Tanrım, məhəbbət meydanı əsla*
*Deyil divanədən xali, budur, meydanə gəldim mən.*

*Sizə rəhmətlər olsun qoy, ey aşiqlər, mənəm varis,*
*Xoşam tazə bir aşiq tək bu gün dövranə gəldim mən.*

*Məni divanə etmişsən? Yanından, ey mənim Leylim,*
*Dünən divanə getdim mən, bu gün divanə gəldim*
*mən.*

*Vəsl xülyası olmazsa qanım məstanə qaynarmı?*
*Əgər divanə gəlsəm də, müdam məstanə gəldim mən.*

*Yıxılmaqdan uzaq oldum, dəmadəm haqqa söykəndim,*
*Görüb haqdan dönən insanları tüğyanə gəldim mən.*

*Mənim könlümdə, ey Şahin, bu gün yoxdur dilək başqa,*
*Dilək hasil olub, çünki yenə İranə gəldim mən.*

*2 iyun, 1993*

***II***
***QƏZƏL***
Şahin Fazil

*Qismətim dərdü bəla olsa da hərgah mənim,*
*Diləyim hasilə yetməkdədi gah-gah mənim.*

*Hər sevincim sənin olsun, sənin olsun həzzim,*
*İztirab qoy mənim olsun, mələyim, ah mənim.*

*Dərdimin çarəsi səndəndi fəqət, tədbir et,*
*Çarəmi istəmirəm mən qıla cərrah mənim.*

*Görsə idim mən əgər səhvimi, səhv etməzdim,*
*Səhvimi etmədi bir kimsənə islah mənim.*

*Qəzəlin şəhriyarı olduğumu bilsəydi,*
*Qulluq eylərdi qapımda nə qədər şah mənim*

*Büsbütün arxayınam mən, əgər ölsəm də, nə qəm,*
*Eşqimi hifz edəcəkdir o Xeyirxah mənim.*

*Məşədi olmağı bərk arzulamışdım, Şahin, Arzumu*
*eylədi gerçək ulu Allah mənim.*

*Məşhəd, 5 iyun 1993*



# ÜÇÜNCÜ SƏFƏRNAMƏ

## *«MƏŞƏDİ ŞAHİNİ, ƏLBƏT, YENƏ İRAN ÇƏKDİ...»*

İranda bir neçə dəfə olmuşam. Bu qədim ölkə, bu bənzərsiz diyar, bu ariflər və şairlər yurdu məni həmişə heyran etmişdir. Maraqlı tarixi, zəngin ədəbiyyatı, özünəxas mədəniyyəti və zərif incəsənəti olan bu məmləkət hələ gənclis illərimdən - universitetin şərqşünaslıq fakültəsində oxuduğum vaxtlardan məni maqnit kimi özünə çəkmişdir. Respublikamızdakı İran İslam cümhuriyyəti səfirliyinin məsul işçisi ağayi-Nəzafətin yeni səfər təklifi, əlbəttə, mənim böyük sevincimə səbəb oldu. Eşidəndə ki, prof. Şahin Səfərov, yazıçı Əlibala Hacızadə, jurnalist Sirus Təbrizli, tərcüməçi Ədalət Zeynalov, nasir Vaqif Musa, şair Kamil Sərbəndi, şərqşünas Maqsud Hacıyev, bir çox dini mahnılar müəllifi Yaşar Cahid, alim dostlarım Şahpələng Quliyev, Elxan Əzizov, Tofiq Cahangirov, Şirindil Alışanov, şair-jurnalist Şahnaz Ağamir, Gəncə müəllimi V aleh İbrahimov (V aleh Layiq Gəncəli) də bu səfərdə bizimlə birgə olacaqlar, sevincim qat-aqt artdı. Ziyalısı olmayan yerin ziyası olmaz!

Mənim əvvəlki İran səfərlərim barədə oxucuların müəyyən məlumatı var. 1993-cü ildəki səfər təəssüratım «Şəhriyar» qəzetinin bir neçə sayında «Əs-səlam əleyk, ya Ruhullah!» adı altında çap olunmuşdur. İndi də mən bu yazımda İranın bir neçə dəfə gördüyüm kənd, şəhər, muzey, ziyarətgah və xiyabanlarından aldığım təəssüratı ümumiləşdirərək oxuculara təqdim edəcək, diqqəti bəzi tarixi məlumatlara də cəlb edəcəyəm.

Hər şeydən əvvəl qeyd edim ki, bu səfərdən məqsəd İran islam inqilabının rəhbəri mərhum ayətullah Xomeyninin vəfatının 6-cı ildönümü ilə əlaqədar keçiriləcək tədbirlərdə iştirak etmək, həmçinin məşhur dini mərkəzlər olan Qumu və Məşhədi ziyarət etmək idi.

Mayın 29-da səhər saat 9 radələrində Astara istiqamətinə yola düşdük. Biz zəvvarların ardınca öz məsul işçiləri ilə birlikdə İran İslam

Cümhuriyyətinin səfiri ağaye-Tahiri də Astaraya gəldi. Bunun özü böyük qayğının nəticəsi kimi bizim diqqətimizi özünə cəlb etdi.

İki Astara gözlərimin qarşısında idi. Bizim Astarada təbii gözəllik və qeyri-təbii səliqə-sahmansızlıq gözə dəyirdi. Gömrükxana qabağında sıralanmış yüzlərlə minik və yük maşınının sürücüləri özlərinin İrana keçid günlərini (!) böyük səbrlə gözləyirdilər. Bir neçə saatdan sonra nəhayət gəlib İran Astarasına yetişdik. Bizi dərhal «Mehmansaraye- Astara»ya («Astara mehmanxanası»na) gətirdilər və mehmannəvazlıqla şam yeməyinə də’vət etdilər.

Şamdan sonra yola düşdük. Gilan. Qədim məmləkətin qədim bir vilayəti. İki yüz ildən artıq bir müddətdə (XV-XVI əsrlərdə) müstəqil dövlət olmuş dağlar və meşələr diyarı. Gilan vaxtilə iki hissədən ibarət idi: Biyəpəs və Biyəpiş. Birində ishaqilər (yaxud ishaqvəndlər), digərində isə kiyalar sülaləsi hakimiyyətdə olmuşlar. Yadıma Biyəpiş Gilanının məşhur hökmdarı Xan Əhməd xan Gilani düşdü. O, Biyəpişi uzun müddət idarə etmiş, nəhayət, I Şah Təhmasib tərəfindən həbs olunub, əvvəlcə Qəhqəhə, sonra isə Estəxr qalasına salınmış, 1578-ci ildə II Şah İsmayıl tərəfindən yenidən Gilan hakimiyyətinə qaytarılmış, ömrünün son illərində isə I Şah Abbasın təqibindən qaçıb Türkiyədə vəfat etmişdir.

Xan Əhməd xanın Qəhqəhədə olarkən Şah Təhmasiblə şe’rləşməsi də yadıma düşdü. Qəhqəhə qalasında ağlar vəziyyətdə olan bu Gilan hakimi Səfəvi hökmdarına yazır:

*«Dövranın əlindən bu gün ağlar mənəm,*
*Tale mənə zülm eylədi, naçar mənəm.*
*Бuг kuzə təki əyildi qəddim qəmdən,*
*Бədbəxtliyə bax, Qəhqəhədə zar mənəm».*

Xan Əhməd xandan bu rübaini alan Şah Təhmasib də onun cavabını rübai ilə verir:

*«Olmuşmu görən heç belə ağlar səni?*
*Бədbəxtliyə bilmişəm səbəbkar səni.*
*Sən dərdə düşüb indi fəğan eylərsən,*

*Qəh-qəhdir edən Qəhqəhədə zar səni».*

*(Rübailərin tərcüməsi bu sətirlərin müəllifinindir).*

Talışı, Fuməni, Rəşti, Rudbarı keçdik. Sefidrud (keçmiş Qızılüzən) çayını seyr etdim. Ola bilsin, haçansa qızılgüllər üzən buç ayda indi bol balıq üzür. Balıq da qızıldır, ələlxüsus indiki zəmanədə...

Bütün gecəni yol getdik. Səhərə yaxın Qəzvinə yetişdik. 1555-ci ildən 1590-cı elədək Səfəvilər dövlətinin paytaxtı olan minarəli-günbəzli, restoranlı-karvansaralı, bağlı-bağatlı Qəzvin şəhəri. Şah Təhmasibin çox sevdiyi, tarixçi Qazi Əhməd Qəffarinin doğulub ərsəyə gəldiyi tarixi bir şəhər. Əski və müasir memarlıq abidələri ilə nəzəri özünə cəlb edən təzadlı bir şəhər.

Qəzvindən çıxıb Kərəcə, oradan da Tehrana gəldik. «İnqilab» hotelində yerləşdik. Bir qədər dincəldikdən sonra bizi İmam Xomeyninin «Hərəme-motəhhərinə» (məqbərəsinə) apardılar. Böyük ziyarətgahdır. 6 il müddətində bom-boş yerdə inşa edilən bu nəhəng abidəyə baxdaqca təəccüblənməyə bilmirsən. Belə az bir vaxt ərzində 4 nəhəng qüllə - minarəsi olan bu əzəmətli mavzoleyin tikilməsi heyrətə səbəb olur. Burada eyni vaxtda otuz min adam namaz qıla bilir.

İmam Ruhulla Xomeyni və oğlu Hüccətül-islam Əhməd Xomeyninin uyuduqları məzarın ətrafında dövrə vurduq. Yaşar Cahid özünün imama həsr etdiyi mərsiyəsini oxudu. Mən isə ilham pərimin təşviqi ilə bir kənara çəkilib imamın şəninə belə bir qəzəl yazdım:

*«İrfam edib məsləkinə yar Xomeyni,*
*İrf aləminə oldu vəfadar Xomeyni».*

*İmamın «Hərəme-motəhhir»ini ziyarətdən sonra Rey şəhərinə gəldik. Şah Əbdüləzim ziyarətgahı. Səttar xanın sinə daşı. Seyid Əbülhəsən Kaşaninin qəbirüstü lövhəsi.*

*Kimdir Şah Əbdüləzim?*

*İmam Həsən Müştəbanın nəvəsi olan bu şəxs Bəni-Üməyyidin təqibindən qurtulub, onuncu imamın (Hadinin) məsləhəti ilə İraqdan Reyə gəlmiş, bir müddət burada yaşamışdır. Məzarı nəhəng bir məscidin içərisindədir.*

*Seyid Əbülhəsən Kaşani isə ayətullah idi. O, bir müddət İranda şah əleyhinə gedən mili-azadlıq hərəkatına (1945-1963-cü illərdə) rəhbərlik*

*etmişdir. Bir neçə dəfə həbs olunmuş (1956, 1959), 1963-cü ildə şahın «ağ inqilabından» sonra vəfat etmişdir.*

*Biz Reydə imam Rzanın qardaşı imamzadə Həmzənin məzarlarını ziyarət edib «Şah Əbdüləzim muzeyi»nə girdik. O qədər də böyük olmayan bir otaq. Şüşə örtüklər altında saxlanan cild-cild nəfis Quranlar. Birinin xəttatı Məhəmməd Rza ibn-Məhəmməd Tağı Təbrizidir. Nəstəliq xətti ilə yazılan bu Quranın qızıl suyu ilə işlənmiş hər səhifəsi təbrizli xəttatımızın ecazını göz önündə canlandırır.*

*Tehranda olduğumuz ikinci gün Qəzali şəhərindəki kino studiyasına getdik. Olduqca böyük ərazidə yerləşən bu studiya göz işlədikcə qədim Tehranı əks etdirən küçələr, evlər, hotellər, restoranlar və film çəkmək üçün zəruri olan başqa tikililərlə doludur. İran kinosunun onlarca filmi məhz bu studiyada çəkilmişdir.*

*Axşam saat 17-də məşhur «istiqlal» hotelinin «Dəryaye-nur» («Nur dəryası») salonunda imam Xomeyninin vəfatının ildönümünə həsr edilən təntənəli iclas keçirildi. Ön divarda mərhum Ruhulla Xomeyni, Seyid Əli Xameneyi və Əhməd Xomeyninin rəngli boya ilə çəkilmiş şəkilləri bizə baxırdı. Şəkillərin altında İranın hər yerində geniş yayılmış məlum şüarı oxudum: «Əs-səlam əleyk, ya Ruhullah!».*

*Dövlət himni çalındı. İclasda höcəttül-islam vəl-müslimin Seyid Məhəmməd Əbtəyi, höcəttül-islam Həsən Xomeyni (imamın nəvəsi), höcəttül-islam vəl-müslimin doktor Həsən (mili məclis sədrinin birinci müavini) Ruhani və Livan yazıçısı Süleyman Kətani çıxış edərək, imamın həyat və mübarizə yolundan danışdılar.*

*İclasda çıxış edən bəzi məruzəçilərin dediklərindən bir neçə məqamı misal gətirmək maraqlı olardı:*

*Həsən Xomeyni: İmam necə imam oldu? Allahpərəst olduğuna görə! Quranın göstərişlərinə dəqiq əməl və riayət etdiyinə görə! Atası vəfat edəndə o, hələ doğulmamışdı. Həddi-büluğa çatmamış anası da rəhmətə getdi. Ərak və Qumda dini təhsil aldı. İslam fiqhi və təşəyyö, (şiəlik) fiqhini dərindən mənimsədi. 63 yaşında ikən pəhləvilərə qarşı siyasi mübarizəyə başladı... və qələbə çaldı.*

*D-r Həsən Ruhani: İmamın beynəlxalq münasibətlərdə böyük rolu olmuşdur. İran-İraq müharibəsində biz iki böyük dövlətin o zamankı SSRİ və*

*ABŞ-ın köməyindən istifadə edib asanlıqla qələbə əldə edə bilərdik. Bun etmədik, çünki belə olan halda biz gərək Əfqanıstanı və Fələstini müdafiə etməyəydik. Müharibə başlanarkən Amerikadan hətta bir təyyarə dolusu diplomat Tehrana gəldi, lakin onlar İran dövlət başçıları tərəfindən qəbul olunmadıqları üçün geri qayıtdılar.*

*İclas qurtardıqdan sonra «İstiqlal»dan «İnqilab»a qayıtdıq. Şam yeməyindən sonra bir neçə pakistanlı jurnalist və din xadimi ilə tanış oldum, şəkil çəkdirdik. Elə bu əsnada mikrofonla elan olundu: II mərtəbədə Azərbaycan zəvvarlarının iştirakı ilə hüzn məclisi keçirilir. Yuxarı qalxdıq. Yaşar Cahid sinə vurur və mərsiyə oxuyurdu. Kamil Sərbəndi ağıya keçmişdi.*

*İyun ayının 1-də səhər saat 10-da «Fərhəngsəraye-Xavəran» adlı mədəniyyət sarayında olduq. Çox böyük bir saraydır. Plana görə 8 il müddətinə inşa olunmalı idi, lakin cəmi 19 aya tikilib qurtarmışdır. Verilən məlumatlardan aydın oldu ki, bu saray kompleksi 48 milyard tümən xərclə başa gəlmişdir. Sarayın əsas binası bir neçə mərtəbədən ibarətdir. Buna mərtəbədə əsasən dini məzmunlu rəsmlər diqqəti cəlb edir: Əbülfəzl Abbas... Qolları vurulmuş Əbülfəzl Abbas... Lakin, o dişləri ilə tutduğu qabda öz fədai yoldaşlarına su daşıyır... Neyləsin, hər iki qolundan məhrum olan bu fədakar insan döyüşü kənardan seyr edə bilmir və qolsuz qəhrəman dişlərinin köməyindən istifadə edir... Yadıma, Azərbaycanın faciəli günlərində, 1993-cü ildə, müharibə zamanı yazdığım «Nəşəqçi» şe'rim düşdü. Həmin şe'ri yazmağa məni XVIII əsrin xristian misyoneri Yan Tadeuş Kruşinskinin bir məlumatı vadar etmişdi. Mən təzəlikcə Y.T.Kruşinskinin «Xristian səyyahın tarixi» adlı kitabına fars dilindən azərbaycancaya tərcümə edib «Azərnəşr» nəşriyyatında çap etdirmişdim. Polyak misyoneri öz kitabında İsfahanın əfqanlar tərəfindən tutulması barədə yazırdı: «Əfqanlar... cəng zamanı nizamla səf bağlayırlar. Öz dillərində «nəşəqçi» və «pəhləvan» adlandırdıqları döyüşçüləri də vardır... Döyüşçülərdən bir nəfər belə geri qaça bilməz, çünki nəşəqçiyə hökm olunmuşdur ki, döyüşdən qaçan hər kəsi amansızcasına qətlə yetirsin...*
*İsfahanın müharibəsində (1722-ci il) əfqanların əcəmlərlə döyüşü zamanı mən... döyüşü izləyirdim: Sağ əli üzülmüş və səfin arxasına qayıtmış bir əfqan gördüm. Səfi mühafizə edənlər və nəşəqçi onun döyüşdən qaçdığını zənn edib, öldürmək istədilər. O, öz kəsik qolunu göstərdi. Yenə də onun geri qaçmağı ilə razılaşmadılar. Dedilər: «Ey avara, əgər döyüş zamanı sənin sağ əlin də*

*kəsilibsə, gərək sol əlinlə cəng edəsən, yox, əgər sol əlin də kəslibsə, gərək ağzınla döyüşəsən və düşmənin üzünə tüpürəsən ki, Allah - Təaladan böyük mərhəmət görəsən». Бelə deyib onu təzədən döyüş meydanına tərəf qovdular» (Бax: Yan Tadeuş Kruşinski. Xristian səyyahın tarixi, Бakı, 1993).*

«Fərhəngsəraye-Xavəran» mədəniyyət sarayının sərgi salonunda şəkildə gördüyüm Əbülfəzi Abbas da, qolları üzülmüş Əbülfəzi Abbas da düşmənlərlə döyüşürdü, lakin qolları ilə yox, ağzı ilə, dişləri ilə _____ Mən həmin şe'rimdə yazmışdım:

*.Düzlərim, dağlarım azalmaqdadır,*
*Çöllərim, bağlarım azalmaqdadır,*
*Vətən, torpaqlarım azalmaqdadır,*
*Nəşəqçi gərəkdir bizə, nəşəqçi!*

*Yağını salmamış dara, qaçırlar,*
*Бədəni almamış yara, qaçırlar,*
*Hara götürülür, hara qaçırlar?*
*Nəşəqçi gərəkdir bizə, nəşəqçi!*

*...Geriyə bircə də addım atılmaz,*
*Zəfər şəkərinə zəhər qatılmaz,*
*Nəşəqçi olarsa, fərari olmaz,*
*Nəşəqçi gərəkdir bizə, nəşəqçi!*

*...Heyf, aramızda nifaq tapılır,*
*Rəzil peyda olur, alçaq tapılır,*
*Nə qədər ki, hələ qorxaq tapılır,*
*Nəşəqçi gərəkdir bizə, nəşəqçi!*
*Bu qoca canımda qövr edir yaram,*
*Düşməni salmağa bəndə hazıram.*
*Nəşəqçi olmağa mən də hazıram,*
*Nəşəqçi gərəkdir bizə, nəşəqçi!*

Nə isə!.. «Fərhəngsəraye-Xavəran» sarayındakı rəngli boyalarla işlənmiş

şəkillərin seyrini davam etdirirəm: Məhəmməd peyğəmbər. Fatimeyi-Zəhra... İmam Hüseyn övladının qətli...

Sarayın əsas binasından çıxıb bu nəhəng parkın başqa yerlərini gəzməyə başlayırıq. Teatr studiyası, kino zalı, klassik və müasir musiqi səslənən otaqlar, uşaq və yeniyetmələr evi, tədris sinifləri və s.

Axşam saat 16-da «Qəhvəxaneyi-sonnətiye-azəri» («Azəri mili qəhvəxanası») adlanan bir qəhvəxanaya aparıldıq. Köhnə üslubda tikilmiş və əsasən «Şahnamə» motifləri əsasında işlənmiş rəsmlər. Dərvişlər, xanəndələr, daha doğrusu «şahnaməxanalar». Amma Şire-Xoda adlı bir xanəndə imam Xomeyninin irfani bir qəzəlini də oxudu.

Sonra «Parke-sai»yə gəldik. Gözəl yerdir! Rəy kitabına mənim azərbaycanca yazdığım rəyi fars dilinin gözəl bilicisi olan alim dostum Tofiq Cahangirov tərcümə edib müdiriyyətə təqdim etdi.

İyunun 2-də axşam 17-də imam Xomeyninin Cəmarandakı mənzil və məscidinin ziyarətinə getdik. Budur, imamın birotaqlı evi. İran islam inqilabından sonra imam bu evdə yaşayırdı. Necə deyərlər, İran adlı böyük bir məmləkətin ən böyük rəhbəri və kiçik bir otaq. Budur insanın böyüklüyü! Budur fanidünya var-dövlətindən imtina! Budur imam Xomeyni gözütoxluğu!..

Məscidə girdik. Yazıçı dostum Əlibala Hacızadə İran və imam barədə odlu-alovlu çıxış etdi, Kamil Sərbəndi mərsiyə, mən isə qəzəl oxudum.

Ziyarətdən sonra Cəmşidiyyə parkında olduq. İyunun 3-ü cümə günüdür. Bizə istirahət verildi.

İyunun 4-də böyük hüzn günü oldu. «Behişti-Zəhra»ya gedib imam Xomeyni təziyə mərasimində iştirak etdik. Olduqca təntənəli toplantı idi.

Ertəsi gün avtobuslarla Qum şəhərinə gəldik. «Hərəme-Həzrəte-Məsuməni» və «Hərəme-Cəmaran»ı ziyarət etdik. Məsumə (imam Rzanın bacısı) məscidinin yaxınlığında kiçik bir qəbiristanlıq da var. Məşhur ayətullah Şeyx Mahmud Şəirətmadari orada uyuyur. Seyid Hüseyn Təbatəbai Bürucerdi, Əllamə Təbatəbai, ayətullah Məhəmməd Rza Gül- payegani, Məhəmməd Əli Əraki və Məhəmməd Təqi Xonsari də burada uyumaqdadırlar.

Qum dünyanın ən böyük dini elm mərkəzidir. Məşhur «Xülasətüt-təvarix» əsərinin müəllifi Qazi Əhməd Qumini xatırladım. Orta əsrlər Azərbaycanı haqqında, xüsusilə XVI əsrdə Azərbaycanda baş vermiş tarixi hadisələr barədə olduqca dəyərli məlumat verən bu tarixçi qumda doğlumuş,

Təbrizdə yaşamış, Səfəvi sarayına yaxın şəxslərdən olmuşdur. Bəli, tarixçi Qazi Əhmədi xatırladım və yadıma dərhal tarixçi Şükufə Sorxədizadə-Məmmədova düşdü. O, gözəl şərqşünas alimdir və Akademiyada mənimlə bir şöbədə işləyir.

Qumda olduğumuz gün ərzində bir neçə şe'r yazdım. Bu Qit'ə də Qumda qələmə alındı:

*Qələmim, zənn elə, xortum boyda,*
*Varağım sanki olub Qum boyda...*

Bəli, İranın qədim tarixi mədəniyyət mərkəzlərinin müşahidəsi mənim ilhamımı olduqca gücləndirirdi, orada olduğumuz 10 gün ərzində 21 şe'r yazdım.

Qarşıda Məşhəd səfəri dururdu. Hələ sərhədi keçərkən yazdığım bir qəzəlin məqtə (son beyt) hissəsi belə idi:

*Bir kərə məşhədi olmaqla kifayətlənmir,*
*Məşhədi Şahini, əlbəttə, yenə İran çəkdi.*

İyunun 6-da imam Xomeyni günlərində iştirak etmək üçün İrana gedənlərin demək olar ki, hamısını təyyarələrlə Məşhədə gətirdilər. Məlum olduğu kimi bu şəhər İranın ən müqəddəs yerlərindəndir. Səfəvi şahları I İsmayıl, I Təhmasib və I Abbas dəfələrlə bu şəhərin yaraşığı olan «Hərəme-imam Rza»nı ziyarət etmişlər. Şah Abbas hətta İmam
Rza yolunda xeyli əziyyətə qatlaşaraq bir dəfə İsfahandan Məşhədə piyada yol getmişdir.

Mən Məşhəddə ikinci dəfə məşədi oldum. Ziyarət mərasimini başa yetirdikdən sonra məscidin bir kənarında oturub belə bir Qit'ə yazdım:

*Ya ilahi, nə qədər insanə*
*Sənə mə'lumdupənah eyləməyim...*

Təəccüblü bir hadisə baş verdi: Göründüyü kimi, bu Qit'ə mənim etdiyim günahların əfvi xüsusunda sidq ürəkdən yazıldığından və mənim iltimasım Allah tərəfindən eşidildiyindən, lakin bəyənilmədiyindən, həmin gün və ertəsi

gün iki labüd ölümdən qurtuldum. Belə ki, Məşhəddən havaya qalxan təyyarəmiz 17 dəqiqədən sonra mühərriki yandığı üçün geri qayıdıb, yenidən Məşhəd hava limanında yerə endirildi və biz mehmanxanada gecələməli olduq. Ertəsi gün sübh tezdən mindiyimiz yenə təyyarənin mühərriki də Tehrana çataçatda sıradan çıxdı və təyyarə zor-bəla ilə yerə endi. Görünür ki, Allah hələ mənim ölümümü təxirə salır. Təyyarədə məndən başqa 300-dək zəvvar vardı. Bəlkə də onların xatirinə mənim bu Qit'ədəki iltimasım Allah tərəfindən eşidilmədi.

Məşhəd ziyarətinin ertəsi gün axşamüstü xüsusi avtobuslarla Bakı istiqamətinə yola düşdük.

Səfər haqqında ümumi təəssüratım: Qonaqpərvər İran bu dəfə də bizi olduqca səmimanə qarşıladı, böyük mehmannəvazlıqla yola saldı. Gecə-gündüz azərbaycanlı zəvvarların qulluğunda duran ağaye-Vəliullah Zərgəriyə, ağaye Pərviz Qasimiyə tehranda olduğumuz günlərdə tez-tez bizi yoluxan Əliəkbər Hüseynxaniyə və şair dostumuz Həsən Savalana minnətdarlıqla təşəkkür edirik. Respublikamızın İrandakı səfiri Əlyar Səfərli və səfirliyin əməkdaşı Cavanşir Vəkilov vaxtaşırı mehmanxanaya gəlir, bizdən hal-əhval tuturdular. İran Cümhuriyyətinin Azərbaycandakı səfiri ağaye-Tahiri cənabları da səfərimizin uğurlu keçməsindən ötrü bir sıra zəruri tədbirlər görmüşdü ki, ona minnətdarıq.

29 may-7 iyun, 1995

**Üçüncü Səfərnamə Şe'rləri**

*I*

*QİT'Ə*

*Vətənin qədri bilinməkdədi, həsrət çəkirəm,*
*Bəli, qürbətdə qalan şəxs müdam həsrətli.*

*Şad ola bilməyirəm, həsrəti vardır könlün,*
*Nə təhər söyləyə billəm ki, şadam həsrətli?*

*Doğma ünsiyyəti görsəm də açılmır könlüm,*

*Mən güman eyləyirəm burda yadam həsrətli.*

*Məni bezdirdi bu hicran, görüş şövqüylə*
*Uçuram vəslə tərəf, qol-qanadam həsrətli.*

*Dil badam idi, dodaq püstə, özüm tutti, a yar,*
*Nə qədər qalmalıyam püstə-badam həsrətli?*

*Fumən-Rəşt-Rudbar yolu*
*29.05.95*

## *II*
## *SÜRUD*

*Hicri inkar elə, inkarını görmək diləræm, Vəslə*
*iqrar elə, iqrarını görmək dilərəm, Könlümün*
*sən təki memarını görmək dilərəm, Gözəlim,*
*mən yenə rüxsarını görmək dilərəm.*
*Vəslə əvvəlki o xudmani bucaq olmasa da,*
*Qollarım qollarına indi calaq olmasa da,*
*Heç nəyi görməyə qəlb içrə maraq olmasa da,*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Təkcə cismani gözəllikmi o rüxsardə var?*
*Ya ki, irfani gözəllikmi o rüxsardə var?*
*Yoxsa ruhani gözəllikmi o rüxsardə var?*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Nə dözüm, qüvvə qalıbdır, nə qalıb hay canda,*
*İndi ah ilə həmahəng olub vay canda...*
*Mən İran məmləkətində, sən Azərbaycanda,*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Məni gündən-günə hicran ələmi üzsə əgər,*
*Fikrimin bülbülü yüz bağça-bağı gəzsə əgər,*
*Gözlərim seyr eləməkdən fələyi bezsə əgər,*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Aşiqin altı sözü dildə şüar eyləsə də,*
*Altı sözdən dilimin üstü qübar eyləsə də,*
*Deyirəm, böylə, bu istək məni zar eyləsə də,*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Görmürəm mən neçə gündür ki gözəl yarı yenə,*
*Gözümün yaşları düşmüş üzə mirvari yenə,*
*Gündə Şahin görə yüz dəfə o rüxsarı, yenə*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Qəzvin, 29.05.95*

*III*
*QƏZƏL*

*Əllərimdən el əki, zülfünü canan çəkdi,*
*Sanki qarmağə dönüb zülfü yenə can çəkdi.*

*Gecə əyyamı nə cövr oldu mənə, üstümdən Elə*
*bil ruzigarın əlləri yorğan çəkdi.*

*Sanki tale məni hicran ilə evləndirmiş,*
*Bu zəif cüssəli aşiq neçə hicran çəkdi.*

*Aşiqəm mən, bütün aşiqlərin öz şakəri var,*
*Məni, əlbəttə, şəhər, Qeysi biyaban çəkdi.*

*Niyə qurbanə baxa bilməyirəm qurbanda?*
*Kəsməyə boynunu qəssab yenə qurban çəkdi.*

Bu *fələk köhnə dəyirmandı, çəkir illərlə,*
*Vahidi, Vurğunu, Cabbarı dəyirman çəkdi.*

*Çox dedim «dilbəri ağuşunə çək», rədd etdi,*
*Öyrəşibdir deyə zərgər yenə mərcan çəkdi.*

*Sevgi meydanı, şərafətli şe'r meydanı,*
*Elm meydanı... Məni gör neçə meydan çəkdi.*

*Bir kərə məşhədi olmaqla kifayətlənmir,*
*Məşədi Şahini, əlbət, yenə İran çəkdi.*

*Tehran yolu, 30.05.95*

*IV*
*QƏZƏL*

*Təmtərağım nə gözəldir ki, bu dünya yaradıb,*
*Təzə Qeysəm, mənə dünya təzə Leyla yaradıb.*

*Yusifəm, hansı gözəldir ki, cırıb köynəyimi?*
*Bəllidir ki, belə qovğanı Züleyxa yaradıb.*

*Qəribəm, yanmadayam Şahsənəmin eşqiylə,*
*Vamiqəm, Vamiqinə təntənə Əzra yaradıb.*

*Elə zənn eyləyirəm mən yeni Şah İsmayılam,*
Bu - *Ərəbzəngi xanımdırmı ki, qovğa yaradıb?*

*İranın vəsfinə minlərlə şe'r lazımdır,*
*İranın vəsfi alınmaz iki misra yaradıb.*

*İstərəm olmağı mən ümdə qəzəlxan, amma Nə*
*təmənnadı bu ki, böylə müəmma yaradıb?*

*Nə yaman öymədəsən böylə, ey aşiq, özünü?*
*Nə igidlik eləyibsən neçə mə'na yaradıb?*

*Qürrələnmə iki-üç qətrə töküb göz yaşını,*
*Məcnunun gözlərinin yaşları dərya yaradıb.*

- *Belə şəkkər qəzəl olmaz, belə şirin xurma,*
*Şahinim, - söylədi yarım, - yenə xurma yaradıb.*

*Tehran, 30.05.95*

*V*
*QƏZƏL*

*Şirvandə idim necə İranə tamarzı,*
*İrandəyəm indisə Şirvanə tamarzı.*

*Bayquş kimi neynir yaşamaq çox, canı çıxsın*
*Bülbül qalacaqdırsa gülüstanə tamarzı.*

*Bir canlı gülüm var ki, gəzir güllər içində,*
*Həsrət bu gülün ətrinə gül, nanə - tamarzı.*

*Meylim bilinir yarıma, imkan isə mübhəm,*
*Yarəb, eləmə meylimi imkanə tamarzı.*

*Mərcan yaradıbsan mənə yarın dodağında,*
*Gəl qoyma məni bir daha mərcanə tamarzı.*

*Saqi mənə mey verməsə yalvarmaram əsla,*
*Mən saqiyə, əlbəttə ki, mərdanə tamarzı.*

*Gözlər dikilib yollara Məcnun isə gəlmir,*
*Zəncir səsinə gör neçə divanə tamarzı.*

*Dərman - vüsaldır mənə, mən - xəstəsi vəslin,*
*Hər xəstə ola kaş elə dərmanə tamarzı.*

*Odlar diyarı şəm isə, pərvanədi Şahin,*
*Şəm atəşinə gör neçə pərvanə tamarzı.*

*Tehran, 30.05.95*

*VI*
*QİTƏ*

*Ürəyimdən qoparıb eşqini sən alsan da,*
*Təsiri getməyəcək bil ki, beyindən eşqin.*

*Düşmüşəm mən nə gözəl bir kələyə eşqinlə,*
*Açmayıb baş hələ şeytan kələyindən eşqin.*

*Məni bihudə sınaqlarla, gülüm, bezdirmə,*
*Keçmişəm bir neçə yol mən ələyindən eşqin.*

*Sənə divanə deyim, ya deməyim, ey rahib,*
*Çəkinirsən billə bilməm ki, nəyindən eşqin?*

*Nə gözəl yerdi bu Reyşəhr ki, oldum heyran,*
*Reyə çox nəğmə axıbdır tütəyindən eşqin.*

*Reyi əşya kimi satmaq diləyiblər, olmaz,*
*«Ay alan, Rey satıram.»[1], varmı Reyindən eşqin?*

*Meyi tənqid edib ifratə varanlar çoxdur,*
*Məst olan mən kimi vardırmı meyindən eşqin?*

Tehran, *Reyşəhr, 30.05.95*

[1] M.Ə.Sabirin şe'rindən

*VII*
*QƏZƏL*

*Kamalın var isə, dövlət nə şeydir?*
*Vüsalın var isə, söhbət nə şeydir?*

*O xalı görmüşəm, halım xoş olmuş,*
*O hüsnü görmüşəm, həsrət nə şeydir?*

*Xəzinəmdə məhəbbət tək varım var, Mən*
*artıq bilmişəm sərvət nə şeydir.*

*Sən oldun, bir mən oldum, bir də fürsət,*
*O gündən bilmişəm fürsət nə şeydir.*

*Sınaq eylə, sınağından sınım lap,*
*Zəhər göndər mənə, şərbət nə şeydir?*

*Dəmadəm görmüşəm Tehranda hörmət,*
*Mən indi bilmişəm hörmət nə şeydir.*

*Mənim ardımca ey laf eyləyən kəs,*
*Həqiqətdən danış, qiybət nə şeydir?*

*Vətən qəlbindəsə hərgah mən tək,*
*Nə şeydir ayrılıq, qürbət nə şeydir?*

*Dilində cahilin daim cəhalət,*
*Əlində alimin hikmət nə şeydir?*

*Mənəm mə’na gəzən şe’r içrə, Şahin,*
*Məni mə’na çəkir, surət nə şeydir?*

*Tehran, 1.06.95*

*VIII*
*QƏZƏL*

*Qismət olubdur bu ziyarət bizə,*
*Gör neçə üz verdi səadət bizə.*

*Hər Xomeyn[1] əhli Xomeyni deyil,*
*Oldu Xomeyni həmin həzrət bizə.*

*Tazə həyat eylədi bəxş dinə ki,*
*Verməsin üz bir də ətalət bizə.*

*Tapdı şərəf gör necə imanımız,*
*Tazə imam oldu şərafət bizə.*

*Arif edib çox kəsi irfan ilə*
*Çoxlu kitab etdi əmanət bizə.*

*Şe'r ilə mat eylədi şairləri,*
*«Badeye-eşq»[2] oldu qiraət bizə.*

*Şeytan olan Rüşdini[3] lənətlədi,*
*Qətiliyi verdi cəsarət bizə.*

*Biz yenə üz sürtəcəyik qəbrinə,*
*Olsa əgər bir daha fürsət bizə.*

*Şahina, bir gör necə qismətdi ki,*
*Qismət olubdur bu ziyarət bizə.*

*1.06.95*

---

[1] İmam Xomeyninin doğulduğu yer
[2] İmam Xomeyninin lirik-irfani şe'rlər kitabının adı
[3] «Şeytan ayələri» adlı bədnam kitabın müəllifi Salman Rüşdi

*IX*
*QƏZƏL*

*İrfam edib məsləkinə yar Xomeyni,*
*İrf aləminə oldu vəfadar Xomeyni.*

*Surət çəmənindən neçə məʾna gülü dərdi*
*Bağbanı edib qəmlərə qəmxar Xomeyni.*

*«İslamədi ümmid» deyib fani cahanda*
*Fikrində müdam eylədi israr Xomeyni.*

*Fiqh elminin əsrarını təmkin ilə açdı,*
*Cəhl aləmini eylədi inkar Xomeyni.*

*Nəzmində də, nəsrində də, elmində də hikmət,*
*Fövt eyləmədi bir annı hüşyar Xomeyni.*

*Təlqin edərək adəmə ruhani gözəllik,*
*Abad elədi İranı memar Xomeyni.*

*Dünyasını dünyadə dəyişdirsə də, lakin Şahin,*
*nə qədər var bəşər var Xomeyni.*

*Tehran, 1.06.95*

*QƏZƏL-TƏZMİN*

*«Xacu ki, çəkir bir bu qədər qəm, şad olursan,*
*Amma ola bilmir o sənin şad əlindən»*[1].

Xacu Kirmani
(XV əsr İran şairi)

*Yet dadıma ki, eyləməyim dad əlindən,*
*Qov hicri, görüm mən yenə imdad əlindən.*

*Bərbad fələkdən çox ömür badə gedibdir,*
*Bir gün gedər ömrüm bada bərbad əlindən.*

*Şirinə fəda eylədi şirin canı, eyvah,*
*Dağ lərzəyə düşmür daha Fərhad əlindən.*

*Məcnun eləyən nalə yadımdan çıxacaqdı,*
*Batmaqda qulağım təzə fəryad əlindən.*

*Dilbər Qarabağ dərdi mənim qəddimi əydi,*
*Çəkmiş vətənim gör nə cəfa yad əlindən.*

*Cəld eyləməsəm bir neçə torpağımı azad,*
*Qoy yarə alım bir neçə cəllad əlindən.*

*Namərdin əlindən şəkər almaz qoca Şahin,*
*Nuş eyləyər amma zəhər ustad əlindən.*

*Tehran, 2.06.95*

[1] «Z-in san ke, beqəm xordəne-Xacu şodeyi şad,
Şəkk nist ke, hərgez nəşəvəd şad ze dəstət».

*XI*
*QİT’Ə*

*Xali deyildir cahan, yaxşı adamlar nə çox...*
*Yaxşı ki həmdərdinin dərdini həmdərd alıb.*

*Duydu məni, yaxşı ki, bir neçə mərdanə kəs,*
*İndi mənim fikrimi bir neçə namərd alıb.*

*Həm satıcı olmuşam, həm alıcı indi mən,*
*Həm satanam həm alan, həzz satıram dərd alıb.*

*Əldə məhəbbət zəri, səndəsə eşq nərdi var,*
*İrana üz tutmuşam qoltuğuma nərd alıb.*

*Tehran, 2.06.95*

*XII*
*QİT’Ə*

*Bəsdir məni bülbül səsi ilhamə gətirmiş,*
*Tovhid[1] ilə təkbir[2] səsi gözlər məni indi.*

*Çox çeşmə gözündən əyilib dadlı su içdim,*
*Ruhani fikir çeşməsi gözlər məni indi.*

*«Yaz, yaz» dedi ilham pərisi, şövq ilə yazdım,*
*Zənn eyləyirəm «bəs, bəs»i gözlər məni indi.*

*Keyfiyyəti artırmalıyam sadə qəzəldə,*
*Mə’na dağının zirvəsi gözlər məni indi.*

*Əfqanlərin töhfəsi eşq oldu bu şəxsə,*
*İranlıların töhfəsi gözlər məni indi.*

*Tehran, Şahəbdüləzim məscidi, 3.06.95*

[1] Tovhid - vəhdət, birlik
[2] Təkbir - «Allahu əkbər» çağırışı

*XIII*
*QİT'Ə*

*Mənə bəxş etmə bütöv xoşbəxtlik,*
*Aşiqə bəsdir onun parəsi də.*

*Elə zənn eyləyirəm eşq axıdır*
*Gözümün arxı da, fəvvarəsi də.*

*Ürəyim qövr eləyir hicrindən,*
*Hələ çox sızlayacaq yarəsi də.*

*Qəmimin baisi sənsən, yarım,*
*Sən özünsən bu qəmin çarəsi də.*

*Gözümün qarəsinə meyl etsən*
*Sənin olsun gözümün qarəsi də.*

*Tehran, 3.06.95*

*XIV*
*QİT'Ə*

*Eşqdən çox aşiqin fəryadı can göynətsə də,*
*Etməyibdir sən kimi, ya Qeys, heç bir kəs səda.*

*Бəs daha, bəsdir daha candan qopan fəryadlər,*
*Бəs ürək göynərtisi, bəsdir sızıltı, bəs səda.*

*Əqlinin artıqlığındanmı olur insan dəli?*
*Zəncirin cingiltisi qəmdənmi eylər səs-səda?*

*Tehran-Бehişte-Zəhra,*
*4.06.95*

## *XV*
## *QİT'Ə*

*Bir daha bu aşiqin sevgisi ifrat olub,*
*Bildi mənim meylimi söylədi canan «bəs».*

*Getmə daha heç yana, qürbətə meyl eyləmə,*
*Bir neçə yol görmüsən hüsnünü, İran bəs.*

*Baş əyirəm gərçi mən hökmünə dildarımın,*
*Söylədim: - Ey nazənin, aşiqə fərman bəs.*

*Oldu vüsalın sonu - əvvəli hicranımın,*
*Zülm eləsin aşiqə göz görə hicran bəs?*

*Baxdı mənə naz ilə, güldü qızılgül kimi,*
*Söylədi: - Gəl söyləmə sən mənə dastan, bəs!*

*Sən ki deyirdin vüsal - rəmzi olub sevginin!*
*Vəslə yetibdir məgər Qeys ilə Sənan bəs?*

*Öylə sevənlər çətin bir də gələ aləmə,*
*Bəlkə deyib aləmə hökm ilə dövran «bəs»?*

*Sən ki Azərbaycanın adi qəzəlxanısan,*
*Eşq oduna yox, qəzəl atəşinə yan, bəs!*

*Söylədim: - Aydındı ki, çoxdu qəzəllər yazan,*
*Qit'ə yazan mən kim varmı qəzəlxan bəs?..*

*Tehran, 04.06.95*

*XVI*
*QƏZƏL*

*Hələ şirin edəcək sözləri şəkkər qəzəlim,*
*Hələ çox güldürəcək düzləri Tərtər qəzəlim.*

*Qəzəlimdən neçə gövhərşünasın yox xəbəri,*
*Hələ gizlində qalan gövhərə bənzər qəzəlim.*

*Yazıram inci kimi saf qəzəllər, amma Äfərinlər*
*yerinə görmədə xəncər qəzəlim.*

*Korlamaz ətrini misramın izafət qoxusu,*
*Tazə nərgiz sayağı rayihəli, tər qəzəlim.*

*Tərtəmiz şe'rimi yazdıqca coşur ilhamım,*
*Neçə Zəmzəm qəzəlim var, neçə Kövsər qəzəlim.*

*Nə zülüm çəkmədəyəm saf yazıb Ällah bilir,*
*Çox qəlizdillini təmir eləmir gər qəzəlim.*

*Bilməyir qədrimi «Məcməş-şüəra» həm hələlik,*
*Eybi yox, zərgəri heyran edəcək zər qəzəlim.*

*Äğqoyunlu Həsənin dövrü əgər olsaydı,*
*Neçə «əhsən» qazanar idi mənim hər qəzəlim.*

*Cövhəri burda qoyub, orda gəzənlər vardır,*
*Hər cəvahirgəzənə yetməli cövhər qəzəlim.*

*Çap edən olsa əgər bir neçə «Divan» eləyər,*
*Gözləyir nəşrini, Şahin, neçə dəftər qəzəlim.*

*Tehran, 5.06.95*

*XVII*
*QİT'Ə*

*Qələmim, zənn elə xortum boyda,*
*Varağım sanki olub Qum boyda.*

*Bir böyük çömçə ikən hicranım,*
*Azalıbdır, olub ovcum boyda.*

*Sanıram Təbrizi həm görsəm mən*
*Gileyim qalmayacaq qum boyda.*

*Nisgilim xeyli azalmış Qumda,*
*Bir çinar idi, olub tum boyda.*

*Qum şəhəri, 5.06.95*

*XVIII*
*QİT'Ə*

*Ya İlahi, nə qədər insanə Sənə*
*məlumdu pənah eyləməyim.*

*Mənə Məşhəd yenə olmuş qismət,*
*Daha lütf eylə ki ah eyləməyim.*

*Olacaqdırsa sabahımda qara*
*Gecəmi bir də sabah eyləməyim.*

*Düşməyim küfrə yaxın, insanəm,*
*Nəhs işə bir də tamah eyləməyim.*

*Özümü nəfsimə qul eyləyərək*
*Nəfsimi qəlbimə şah eyləməyim.*
*Günəhim indicə əfv olmuşsa,*
*Məni öldür ki, günah eyləməyim.*

*Məşhəd, imam Rza (ə) məscidi,*
*6.06.95*

*XIX*
*QİTƏ*

*Ey bu şe'r sahibi, Məşhədi gördün yenə,*
*Sən gətirib hər zaman şe'rə yaşat Məşhədi.*

*Köhnə şəhər, köhnə dəb, köhnə müqəddəs məzar...*
*Tazə edib gör neçə tazə həyat Məşhədi.*

*Təsbehinin yox sayı, möhrəsi ulduz qədər,*
*Musiqiyə qərq edir hər salavat Məşhədi.*

*Burda olanlar müdam Allahı yad eyləyir,*
*Allahı yad eyləyib tapdı səbat məşhədi.*

*«Məşhədi» olmuş kəsin niyyəti saf olmalı,*
*Bəlkə qiyamətdə də buldu nicat məşhədi.*

*Sözlərimə, sevgilim, sən ikiqat as qulaq,*
*Çünki daha olmuşam mən ikiqat məşhədi.*

*Məşhəd-Şamaxı, 6-12 iyun 1995*



# DÖRDÜNCÜ SƏFƏRNAMƏ

## *«BÜLBÜL KİMİ ŞÄDƏM Kİ, GÜLÜSTÄNƏ YETİŞDİM.»*

İran İslam Respublikasında keçiriləcək «Füzuli-500» konfransında iştirak edəcəyimi bildikdə çox sevindim. Çünki mən qəzəlxanlığa başlayan vaxtdan bəri ustadım Füzuliyə çox borcluyam. Ona görə borcluyam ki, qəzəl yazmağın sirrini mənə o öyrədib. Bəli, Füzuli öyrədib mənə heçdən söz yaratmağı. Füzuli öyrədib mənə sözləri misraya, misraları beytə, beytləri şe'rə çevirməyin əsrarını. Özü də təmənnasız-filansız. Çox borcluyam ona. Tale mənə imkan yaratdı ki, ustada olan borcumun cüzi bir hissəsini qaytarmaq üçün Tehrana gedim, mümkün olsa, ona həsr etdiyim «Məhəmməd peyğəmbər və Məhəmməd Füzuli» adlı elmi məqaləmi[4] Füzulisevərlərin nəzərinə yetirim, ustadıma dərin ehtiram və məhəbbətimi bildirim.

1995-ci ilin dekabr ayının 6-da səhər tezdən İrandan bizi aparmaq üçün gələn qəşəng və səliqə-sahmanlı bir avtobusa minib, Astara istiqamətinə yola düşdük. Nümayəndə heyətinin tərkibində akademik Kamal Talıbzadə, Elmlər Akademiyası Ədəbiyyat İnstitutunun direktoru professor Yaşar Qarayev, Dilçilik İnstitutunun direktoru Ağamusa Axundov, BDU-nun professorları Təhminə Rüstəmova, Tofiq Hacıyev, Anya Rzayeva, EA-nın Ədəbiyyat İnstitutunda çalışan elmlər doktorları Nüşabə Araslı, Bəhlul Abdullayev, Füzulişünas alimlər İmamverdi Həmidov, Teymur Kərimli, Asif Rüstəmli, şair Ayaz Vəfalı, müğənni Lütfiyar İmanov, «Şərq-Qərb» mətbəəsinin direktoru Hacı Quliyev və başqaları vardı. Akademiklər Ziya Bünyadov, Bəkir Nəbiyev, həmçinin Nazirlər Soveti, Mədəniyyət nazirliyi və Mətbuat nazirliyinin məsul işçiləri təyyarə ilə Tehrana gələcəkdilər.

---

[4] Bu məqalə 5 il sonra Bağdadda çıxan «Yurd» qəzetində də ixtisarla çap olundu (Bax: «Yurd» qəzeti, 15.02.01).

Yol boyu, təbiidir ki, Füzulidən söhbət açaraq və onun ruhuna rəhmət diləyərək, gündüz sərhədi, axşam isə İran Astarasını arxada qoyub, məqsəd istiqamətində yollandıq.

Bütün gecə yol getdik və sübh açılmamışdan Tehrana yetişdik. Bizim üçün əvvəlcədən «Lalə» beynəlmiləl otelində yer hazırlanmışdı.

Qeyd etməliyəm ki, konfransda iştirak etmək üçün Azərbaycan nümayəndə heyətindən başqa Türkiyədən (Yazarlar Birliyinin sədri Mehmed Toğan, professorlar Mustafa İsən və Ehsan Sürəyya), Tacikistandan (şairlər Aşur Səfərov, Fərzanə Xocəndi, şərqşünas alimlər Curibek Nəzərov, Bürhan Rəhmanov), Türkmənistandan (Aşur Orazov), Özbəkistandan (Həmid Ziyayev) da nümayəndələr gəlmiş, özləri demişkən «ürəklərində bizim Füzulimizə sonsuz məhəbbət gətirmişdilər». İran Füzulişünaslarının sayı isə lap çox idi. Onların içərisində İranın Mədəniyyət və irşad naziri Mühəndis Mir Səlimin, höccətül- islam ağaye İjeyinin, d-r Cavad Heyətin, d-r Əli Əsgər Şe’rdustun, d-r Əsgər Fərdinin, d-r Cəlil Təclilin, d-r Xəlicinin, Təbrizdən gəlmiş alim və şair dostum Mahmud Pədidənin, Məşhəd alimləri Ənzabnejadin, Əlvi- nin, şair və tədqiqatçı Rəhim Çavuş Əkbərinin, Təbrizli şair Payegoza- rın, gənc tədqiqatçı xanım Sabitzadənin, höccətül-islamlar Bidarın, Rəşadın və başqalarının adlarını çəkmək olar.

Konfrans dünlərində iyirmidən çox elmi məruzə dinlənildi. Müxtəlif məruzəçilərin Füzuli haqqında dediklərindən:

Bəkir Nəbiyev: *«Məhəmməd Füzuli öz əsərləri vasitəsilə БадДаД, Təbriz və Бакɜ türkləri arasında uzun bir ədəbi körpü yaratdı».*

Cavad Heyət: *«Бюуӱк Füzuli məşhur İran şairləri Sədiyə, Hafizə və başqalarına dərin ehtiramla yanaşmış və onlardan böyük ilham almışdır».*

Hacı Seyid Cəvadi: *«Füzulinin şe’rləri Бosniyadan Kaşğara və Sind çayından Araza qədər bütün ərazidə yayılmışdır. Anna dilinin fars dili olmadığına baxmayaraq, onun bu dildə olduqca gözəl şe’rləri vardır».*

Əli Əsgər Şe’rdust: *«Füzulinin 500 illiyinədək onun farsca yazdığı şe’rləri İranda o qədər də çox yayılmamışdırsa da, bu əzəmətli şairin türk divanı bir əsrdən çoxdur ki, dillər əzbəridir».*

Ağamusa Axundov: *«Heç bir şəkk-şübhə yoxdur ki, Füzuli əsərlərinin dili müəllifin ərəb mühitində yaşamasına baxmayaraq məhz Azərbaycan ədəbi dilidir».*

Höccətül-islam Müizziddin: *«Çox təəssüf ki, üç dildə əsərlər yaradan Füzuli kimi nəhəng şairin əsərləri İranda lazımi qədər yayılmamışdır».*

Curibek Nəzərov: *«Füzuli bütün Mavərənnəhr, o cümlədən tacik xalqı üçün olduqca önəmli möhtərəmdir».*

Ayaz Vəfalı: *«Mən Füzuli poeziyasının müxtəlif xüsusiyyətləri barədə bir elmi kitab yazmışam. Elə nəhəng şair haqqında yazılan yüzlərlə əsər mövcuddur. Xoşbəxtəm ki, mən də Füzuli qələmindən çıxan misra və beytlərin tədqiqatçılarındanam».*

Həmid Ziyayev: *«Füzuli Özbəkistanda elə məşhurdur ki, əgər mən sizə «Özbəkistandan Füzuli salamını gətirmişəm» desəm bunu əsla mübaliğə sanmayın. Füzuli bütün islam dünyasının dürrüdür!».*

Əsgər Fərdi: *«Füzulinin yazmış olduğu «səbke-hindi və səbke- İsfahani» adlanan şe'r növlərini «səbke-Azərbaycani» adlandırmaq daha düzgün olardı».*

Kamal Talıbzadə: *«Бnu Füzulimizdən sonra ərəb, fars və türkdilli ədəbiyyat aləmində poetik incilər yaradan bir çox şairlər şe'rdə siqlət və məsuliyyət baxımından məhz ona bənzəməyə çalışmışlar».*

Mehmed Toğan: *«Füzuli qardaş xalqlar arasında bir körpü rolunu oynayır».*

İmamverdi Həmidov: *«Mən azərbaycanlı ustad şairin ərəb dilindəki şerlərini araşdırmışam. Füzulinin ərəbcə qəzəl və qəsidələrini oxuyan ərəblər onunla başqa ərəb şairləri arasında dilin püxtəliyi baxımından heç bir fərq görmürlər, Füzulini ərəb şairi kimi qəbul edirlər».*

Konfransın üçüncü günü çıxış edən Azərbaycan Respublikasının İrandakı səfiri prof. Əlyar Səfərli Füzulinin anasının guya kürd olduğu barədə fikir söyləyən kürd alimi Səlahəddin Eşin məlumatını təkzib edib, uzun əsrlər boyu İran və Azərbaycan arasında mövcud olan dostluqdan danışdı, Mahmud Kaşğarinin «Baş börksüz, fars türksüz olmaz» misalını xatırlatdı. Alimlərimiz Bəkir Nəbiyevin, Kamal Talıbzadənin, Yaşar Qarayevin, Tofiq Hacıyevin, Nüşabə Araslının, Bəhlul Abdullayevin, İmamverdi Həmidovun, Teymur Kərimlinin, Ayaz Vəfalının, Səfurə Quliyevanın çıxışları da hədsiz maraqla qarşılandı. Nümayəndə heyətimizin başçısı, Azərbaycan Nazirlər Soveti sədrinin müavini İsmayıl
Sadıqovun konfransdakı nitqi və onun dövlətimiz adından İrana hədiyyə kimi

gətirdiyi üzərində Füzulinin şəkli əks olan xalça da böyük təəssürat yaratdı.

İranın Xarici işlər naziri ağaye-Vilayətinin Füzuli barədə çıxışı mənə onun üç il öncə Tehranda Şəhriyara həsr edilən konfransda etdiyi çıxışı xatırlatdı və bu dövlət xadiminin, həkimin, ədəbiyyatçı və tarixçi alimin məşğuliyyət sahəsinin genişliyini bir daha büruzə verdi.

Mən konfransın üçüncü günü axşamüstü Füzuli ildönümünün keçirildiyi «Talare-vəhdət» sarayında elə Tehranda yazdığım iki qəzəlimi möhtərəm tamaşaçılara təqdim etdim. Qəzəllər şe’rsevərlər tərəfindən hərarətlə qarşılandı. Xüsusilə ikinci qəzəlimin:

*Tez-tez düşür İranə yolum, söylədilər ki,*
*Şahindi bu, hər ölkəyə İranı dəyişməz.*

Son beyti bir neçə dəqiqə davam edən alqışlara səbəb oldu.

Konfransın iclasları hər gün saat 17-dək davam edirdi. Axşam namazından sonra bədii hissə başlanır, İranın «Azərbaycan» və «Saqi» ansamblları, həmçinin əsrarəngiz səsə malik olan Lütfiyar İmanov hər dəfə tamaşaçılar tərəfindən hərarətlə qarşılanırdı.

Deməliyəm ki, İran İslam Respublikası Füzuli konfransına olduqca yaxşı hazırlaşmış, böyük şairin xatirəsinə 5 nəfis kitab nəşr etmişdir. Onlar Füzulinin fars və türk divanlarından, o cümlədən Əli Əsgər Sədiqinin «Fələklər yandı ahimdən» və Cəlil Təclilin «Leyli və Məcnune- Füzuli» və «Nizami» kitablarından ibarətdir.

Tehranda olduğumuz 7 gün ərzində bizə olduqca böyük ehtiram göstərildi, müxtəlif mədəniyyət ocaqlarında və rəsmi də’vət və ziyafətlərdə olduq. Qarşıda Füzulinin şərəfinə Bakıda keçiriləcək zirvə konfransı. İndi biz Tehran konfransından aldığımız nəhayətsiz təəssüratla qarşıdakı Bakı konfransını gözləyirik. Ruhun şad olsun, ulu şair!

Azərbaycan- İran, 6-14 dekabr, 1995

**Dördüncü Səfərnamə Şe’rləri.**

## *I*
## *QƏZƏL*

*Bülbül kimi şadəm ki, gülüstana yetişdim,*
*Can intizar idi, elə bil canə yetişdim.*

*Meylim düşübən ardına imkanı qovurdu,*
*Meylim elə gücləndi ki, imkanə yetişdim.*

*Yetmək diləyib Azəribaycanə İranda,*
*İranə yetib, Azəribaycanə yetişdim.*

*Canan, ürəyim getsə də, loğmanı çağırma,*
*Bir xəstəliyim qalmadı, lomanə yetişdim.*

*Qurbanın olum, gəl mənə mey təklifi etmə,*
*Saqi, yeni meyxanəyə məstanə yetişdim.*

*Mazəndəranın şəkkəri çox şəkkərə üstün,*
*Tutti quşu oldum şəkəristanə yetişdim.*

*Dost ölkəyə, qardaş, elə dördüncü səfərdir,*
*Şahin, gözüm aydın, yenə İranə yetişdim.*

*İran Astarası, 6.12.95*

*II*
*QƏZƏL*

*Yoxdur işim şivən ilə, zar ilə,*
*Dil dilə gəlmiş yenə dildar ilə.*

*Qəlb evimiz olmayacaqdır xarab,*
*Eyləmişəm əhd bu memar ilə.*

*Tar ki, var, söyləmişəm tarçıya,*
*Gəl dağıdaq dərdimizi tar ilə.*

*Eşq çıxar heç yadımızdan məgər*
*Беynə yeritsək onu mismar ilə?*

*Gör neçə qürbət meyi nuş etmişik,*
*Ömrü puç etdim bu zəhrmar ilə.*

*Saç elə sürətlə ağarmaqda ki,*
*Бəhsə giribdir elə bil qari lə.*

*Eşqə ki «yoxdur» dedilər, «var» deyib*
*Бəhsə girişdim elə inkar ilə.*

*Can ola qoy eşqə fəda, Şahina,*
*БЮУЬ qərar eyləmişəm yar ilə.*

*Tehran, 7.12.95*

*III*
*QƏZƏL*

*«İnsan olam heç vədə dövranı dəyişməz,*
*Hər şey dəyişik olsa da, insanı dəyişməz»*[1].

*Cananı yolunda gözünü yumsa da hətta Aşiq*
*dəyişər aləmi, cananı dəyişməz.*

*Rahətsiz edən kimsəni rahətliyə ziddəm,*
*Könlüm elə rahətliyə tüğyanı dəyişməz.*

*Hicranı da sevmiş bu qəzəl sahibi hərdən,*
*Etməzsə vüsal arizu, hicranı dəyişməz.*

*Alim qələmə, dəftərə zər sərf elədikcə,*
*Zərgər qələmə, dəftərə mərcanı ləyişməz.*

*Min bir mərəzə düşsə də Məcnun kimi aşiq,*
*Loğmanı əgər Leylisə, loğmanı dəyişməz.*

*Tez-tez düşür İranə yolum, söylədilər ki,*
*- Şahindi bu, hər ölkəyə İranı dəyişməz.*

*Tehran, 8.12.95*

[1] Бey1; Həsən Məcidzadə Savalanmdır.

## *IV*
## *ƏZİZİM, BİZ YENƏ GÖRÜŞƏCƏYİK*

*Əzizim, çatırmı sənə bus əda?*
*Bilirəm, biz yenə görüşəcəyik.*
*Günəşlə ay kimi ayrıyıqsa da,*
*Bilirəm, biz yenə görüşəcəyik.*

*Qaralayıb hicrin qara baxtını,*
*Qəlbimdə qurmuşam eşqin taxtını,*
*Dəqiq bilməsəm də görüş vaxtını*
*Bilirəm, biz yenə görüşəcəyik.*

*Əhdimiz sırğadır qulağımızda,*
*Vüsal gizlənibdir fərağımızda,*
*Çin səddi də dursa qabağımızda,*
*Bilirəm, biz yenə görüşəcəyik.*

*Dilək tükənməzdir arzumuz kimi,*
*İstək tükənməzdir arzumuz kimi,*
*Ürəyim sərindir, inan, buz kimi,*
*Bilirəm, biz yenə görüşəcəyik.*

*Bir gün qoymasa da fələk sağ bizi,*
*Yandırıb yaxsa da od-ocaq bizi,*
*Mümkün olmayacaq ayırmaq bizi,*
*Bilirəm, biz yenə görüşəcəyik.*

*Yaramız dərindir, aramız sərin,*
*Aramız sərindir, yaramız dərin...*
*Gülüm, acığına nakəs kəslərin БИ^эт,*
*biz yenə görüşəcəyik.*

*Məni düşünsənə, məni duysana,*
*Ayrılıq mərəzi yoluxub cana,*
*Acıq vermək üçün acı hicrana,*
*Бilirəm, biz yenə görüşəcəyik.*

*Kim görüş diləsə, onun zövqü var,*
*Zövqün şövqü vardır, şövqün fövqü var,*
*Əzizim, canımda görüşdə şövqü var,*
*Бilirəm, biz yenə görüşəcəyik.*

*Tehran, 10.12.95*

*V*
*QƏZƏL*

*Yarəb, elə sürətlə dolur canə məhəbbət,*
*Dönmək diləyir qəlbdə ümmanə məhəbbət.*

*Məşəl kimi sönmüşdü, günəş timsalı yandı,*
*БШаЩ, güman etməz idim yanə məhəbbət.*

*Göz gördü, könül sevdi, ürək coşdu fərəhdən,*
*Баşlandı o cananəyə cananə məhəbbət.*

*Divanə məni yar eləyibdirsə, qəbuldur,*
*Etsin məni gündən-günə divanə məhəbbət.*

*Canlanmaqdadır məndə müdam aləmə sevgi,*
*Cananəyə eşq, Azəribaycanə məhəbbət.*

*Gerçək sevənə tay deyil əfsanəvi aşiq,*
*Gerçəkliyə üstün deyil əfsanə məhəbbət.*

*Türküstana şəmi, odu əfqanə çatıbdır,*
*Yandırmada Şam mülkünü pərvanə məhəbbət.*

*Gah öpmədə, gah oxşamada, qucmada Şahin,*
*Cananı kimi etmədə İranə məhəbbət.*

*Tehran, 11.12.95*

*VI*
*QƏZƏL*

*Nə gərək fikrimi gülzarü gülüstan apam?*
*Qoy mənim diqqətimi təkcə o canan apara.*

*Olmasın imkanı qurbanlığa bayram gəlcək,*
*Gözəlim qoç yerinə qoy məni qurban apara.*

*Hökm elə, yerdə də cənnət yarana, ey Rəbbim,*
*Qılmanı huri çəkə, hurini qılman apara.*

*«Бu qaranlıq gecələrdə qapımız pis döyülür,*
*Nə bilim, bəlkə əcəldir dayanıb can apara?»*[1].

*Məni hərgah o mələk çəkməsə öz ağuşinə,*
*Qorxu var cismimi heçsizliyə şeytan apara.*

*Ya da, şirin canıma qəsd edərəm Fərhad tək,*
*Qoymasınlar yeni bir aşiqi də qan apara.*

*Şahinin «Divan»ı, Rəbbim, kömək ol, nəşr olsun,*
*İstəmir qəbr evinə sinədə «Divan» apara.*

*TeЬгan, 12.12.95*

[1] Бey1; Məhəmmədhüseyn Şəhriyarındır.

*VII*
*QƏZƏL*

*Kim ki istər mə nonu bənzətməyim biganəyə,*
*Yanmağı heç vədə irad etməsin pərvanəyə.*

*«Qeyri kəslər zər gətirmiş səpmək üçün başına,*
*Canımı verrəm mən isə həzrəti-cananəyə»*[5]*.*

*Gözlərin dürdanə gəzməz, çünki etməz etina,*
*Ey pəri, dürdanələr dürdanəsi dürdanəyə.*

*Sən ki, varsan, gül kiy ox gülxanədə səndən gözəl,*
*İstərəm olmaq gözətçi, ey gülüm, gülxanəyə.*

*Bişüur eylər məni əqlim bu yerdən çəksəm əl Mən*
*şüur ilən dəyişsəm abadı viranəyə.*

*Baş ayıq, yaddaş oyaq, aşiq sayıq olsun gərək,*
*Çayçı qoy çay dəmləsin, mən getmirəm meyxanəyə.*

*Eşqi təqdim eyləmək namərdə məqbul iş deyil,*
*Yadigar olsun bus öz mərdanədən mərdanəyə.*

*Gerçək aşiqlər gəzək, əfsanələrdən əl çəkək,*
*Gerçəyəm, ömrüm boyu bağlanmadım əfsanəyə.*

*Ərkin öpdüm ərk edib hər daşından, Şahina,*
*Kaşan icrə heyran oldum bir neçə kaşanəyə.*

*Tehran, 13.12.95*

---

[5] Beyt Mənsur Həllacındır. Farscası:
«Digəran gər sim - o zər arənd əz bəhre-nesar,
Mən nesare-həzrəte-canane sazəm cane-xiş».

*VIII*
*QƏZƏL*

*Бгг yanda durub ki, səsi hər yanə yetişdi,*
*Aləm yaranandan sözü hər canə yetişdi.*

*Rəbbimdi həmin zat, məni sevdiyi üçün*
*Şahin yenə şahin kimi İranə yetişdi.*

*Heyran eləyibdir məni surətdəki mə'na,*
*Can verdisə də, şəminə pərvanə yetişdi.*

*Şirin cana öz istəyi tuş etdi külüngü,*
*Öz meyli ilə zəncirə divanə yetişdi.*

*İranə yetişcək Бakıda gəzdi sözüm ki:*
*- Hicranı sevəndir buk i, hicranə yetişdi.*

*Hər hansı həyatın sonu, əlbəttə, ölümdür,*
*Ey Tanrı, ölüm varmı ki, dərmanə yetişdi?*

*Zənnimcə mənim, bəxtəvər adəmdi o kəs ki,*
*İmkanı əlindən verib imkanə yetişdi.*

*Бй gün deyəcəklər mən öləndən sora: Şahin*
*Tərk eyləyərək aləmi cananə yetişdi.*

*Текгаn, 14.12.95*



# BEŞİNCİ SƏFƏRNAMƏ

## *«NƏ GÖZƏL DİLDİ BU FARSIN DİLİ, YARƏB, NƏ GÖZƏL...»*

Mən bir qayda olaraq, bütün ölkələrə səfərlərim zamanı yol qeydlərimi dəftərlərə yazır, vətənə döndükdən sonra müvafiq səfərnamələr hazırlayaraq çap etdirirəm. İrana etdiyim beşinci səfərimi də həmin səfər qeydləri üçün özümlə götürdüyüm xüsusi dəftərə yazmışdım, amma həmin dəftəri çox axtardımsa da, öz arxiv kağızlarımın arasında tapa bilmədim. Yaxşı yadımdadır, mən İrana beşinci səfərimin «Səfərna- mə»sini məqalə şəklində hazırlayıb qəzetlərin birində dərc olunmaq üçün redaksiyaya təqdim etmişdim, lakin, təəssüf ki, o məqalə çap olunmamış qaldı və beşinci səfərnamə möhtərəm oxucuların nəzərinə yetə bilmədi. Buna baxmayaraq, həmin səfər günlərində ilham pərimin səxavətli köməyi ilə qələmimdən varaqlara düşən şe’rlərim mühafizə olunmaqdadır ki, mən həmin şe’rlərin köməyi və səfərin sonuncu günü Tehranda bizə təqdim olan «Vijenamənin» («Xüsusi çap olunan şəkilli qəzet, yaxud jurnal») məlumatı ilə «Beşinci səfərnamə» təəssüratlarımı bərpa etməyə çalışacağam.

1995-ci ilin dekabr ayının ortalarında Tehrandan mənim adıma bir də’vətnamə gəldi. Də’vətnamədə bildirilirdi ki, 1996-cı ilin yanvar ayının əvvəllərində (İran təqvimi ilə 1374-cü ilin dey ayının 13-dən 15-dək) Tehranda «Fars dili ustadlarının Birinci Beynəlxalq Konfransı» keçirilə - cəkdir və mənim iştirakım arzu olunur. Təbii ki, çox sevindim. Axı İrana etdiyim hər bir səfər (istər ziyarətlər, istərsə də elmi konfrans və simpoziumlar məqsədi ilə) bir iranşünas kimi məni sevindirməyə bilməz.

Yaxşı xatırlayıram, Tehrana getməzdən bir gün əvvəl Bakı-Tehran reysi ilə uçmaq üçün bilet verildi və mən və səfər yoldaşlarım 1996-cı ilin yanvar ayının 1 -də Bakı təyyarə meydanından havaya qalxdıq.

Nümayəndə heyətimizin tərkibində respublikamızda və ondan uzaqlarda tanınan nüfuzlu mütəxəssislər vardı: Təhminə Rüstəmova,

Anya Ələkbərova, Mirzə Rəhimov, Əlibala Hacızadə, Əsmətxanım Məmmədova, Tofiq Cahangirov, Hacı Mail, Möhsün Nağıyev, Nizami Məhrəm (Məhərrəmov), İmamverdi Həmidov və bu sətirlərin müəllifi Şahin Fazil.

Təyyarə havaya qalxar-qalxmaz yeni qəzəlimin ilk beytlərini dəftərimə yazdım:

*Səsləmədə bir neçə canan məni,*
*Qum məni, Zəncan məni, Tehran məni...*

Tehranda, həmişə olduğu kimi, böyük hörmətlə qarşılandıq. Bizi pişvaz edənlər içərisində bir neçə nazirliyin məsul işçiləri, o cümlədən Mədəniyyət və İslam irşadı naziri Mühəndis Seyid Mustafa Mirsəlimin müşaviri alim dostumuz Əli Əsgər Şe'rdust da vardı.

Mən bu cavan və istedadlı alimlə (o hal-hazırda İranda millət vəkilidir) Bakıda və Tehranda əvvəllər də görüşmüşdüm və ona xüsusi rəğbətim var.

Yanvarın 2-də bizi İslam inqilabının əzəmətli rəhbəri ayətullah Xomeneyinin iqamətgahına - «məqame-müəzzəme-rəhbər»in görüşünə apardılar. Bir neçə həftə əvvəl Füzulinin şərəfinə təşkil olunmuş konfransa gəldiyimiz zaman olduğumuz geniş qəbul otağı. Qara çalmalı, qara əbalı, ağ köynəkli, ağ saqqalı rəhbər. Nüfuzedici nəzərlərini diqqətlə hər birimizin üzündə gəzdirən ayətullah dünyanın 40 ölkəsindən bu konfransa təşrif gətirən yüzdən çox alim və söz ustadlarını salamladı, əvvəlcə fars dilinin gözəlliyindən, Firdovsi, Nizami, Xəyyam, Sədi, Hafiz və başqa klassik sənətkarların bu dildə cahanşümul əsərlər yaratdığından, sonra isə bir sıra beynəlxalq məsələlərdən və dünya siyasət və ədəbiyyatında İranın tutduğu mövqedən danışdı.

Yanvarın 3-də isə prezident ağaye-Rəfsancaninin qəbulunda olduq və onun yarım saatdan bir qədər artıq çəkən çıxışını dinlədik.

Bu nüfuzlu konfransda təmsil olunan ölkələr və onların nümayəndələri və hörmətli oxucuları tanış etmək maraqlı olardı zənnin- dəyəm. Bunun üçün yuxarıda xatırlatdığım «Vijenamə»yə baxıram. Səliqə-sahmanla çap olunan jurnal. 1 -ci səhifədə, üz qabığının arxasında «Fars dili ustadlarının Birinci konfransı»nın hazırlanması və keçirilməsində böyük rolu olan ağaye-Şe'rdustun məqaləsi dərc olunmuş, sonrakı səhifələrdə ağaye-Xameneyi və

ağaye-Rəfsəncani ilə görüşümüzdən çəkilən şəkillər, toplantı iştirakçılarının aparıldıqları sərgiləri və iclas zallarını əks etdirən şəkillər verilmişdir. Budur, bütün ustadların ayrı- ayrı çəkilmiş şəkilləri: cəmi 144 rəngli əks. Əkslərin hər biri nömrələnmişdir. Mənim şəklimin nömrəsi 110-dur. Jurnalın şəkilləri əks etdirən 5- ci və 6-cı səhifələrində İranın bu konfransda iştirak edən və yüksək vəzifə sahibi olan dövlət xadimləri və məşhur alimlərinin surətləri nəzərə çarpır: Mədəniyyət və İslam irşadı naziri Mühəndis Seyid Mustafa Mirsəlim, Təhsil və tərbiyə naziri d-r Məhəmmədəli Nəcəfi, Mədəniyyət və ali təhsil naziri d-r Seyid Məhəmmədrza Haşemi Golpayegani, Fars dili və Ədəbiyyatı Akademiyasının rəisi d-r Qulaməli Həddad Adil, Mədəniyyət və İslam əlaqələri təşkilatının rəisi ayətullah Məhəmmədəli Təsxiri, Xarici işlər nazirliyi Təhsil və tədqiqatlar şöbəsinin rəis müavini Mühəndis Abbas Mələki, Mədəniyyət və Ali təhsil nazirinin müavini d-r Əli Əkbər Salehi, «Dehxuda lüğətnaməsi» müəssisəsinin rəisi d-r Seyid Cəfər Şəhidi, Tehran Universitetinin ustadı d-r Əbdülhüseyn Zərrinkub, həmin universitetin rektoru Məhəmməd Rza Arif və s...

Sonrakı şəkillərə göz gəzdirirəm. Onların arasında Türkiyədə, Rusiyada, Əfqanıstanda, Tacikistanda, Özbəkistanda və Türkmənistanda tanış olduğum adamların əksləri də vardır, Məsələn, Qulam Sərvər Hümayun və Qəyyum Qəvim (Əfqanıstan. Qəyyum Qəvim həm də şairdir və yeni şe’r səpki - «ağ şe’r» adlanan şe’rlər müəllifidir ki, onun bəzi şe’rləri mənim tərcüməmlə Bakıda «Zəfər təranələri» adlı kitabda çap olunmuşdur), Sədəddin Qocatürk və Faruq Ali (Türkiyə), Boris ostrovski, Vladimir İvanov (Rusiya), Alimcan Xocamuradov, Məhəmməd Asimi (Tacikistan), Dilaram Yusifova (Özbəkistan - «Vijenamə»də onun ölkəsinin səhvən Qırğızıstan olduğu göstərilib), Gümüş Amangəldiyeva (Türkmənistan).

«Fars dili mütəxəssislərinin Birinci Beynəlxalq Konfransı»nı təmsil edən xarici ölkələr bunlardır: İngiltərə, Fransa, Amerika, Banqladeş, Bolqarıstan, Azərbaycan, İordaniya, Hindistan, Pakistan, Əfqanıstan, Ukrayna, Rusiya, Yaponiya, Qırğızıstan, Tacikistan, Özbəkistan, Türkmənistan, Hollandiya, Livan, Cənubi Afrika Respublikası, Türkiyə, Çin, Qazaxıstan, Çexiya, Polşa, Mərakeş, İtaliya, Malayziya, Suriya, Misir, Ermənistan...

Bu konfransın keçirildiyi günlərdə ev sahibləri bizi müxtəlif universitet, kitabxana və sərgi salonlarına aparır, vaxtımızın səmərəli keçməsindən ötrü

canfəşanlıq edirdilər. Fars dili və ədəbiyyatı Akademiyasında olarkən oranın rəisi (prezidenti) d-r Adil Həddad bizimlə bir elmi-bədii görüş təşkil etdi və mən fars dilinin gözəlliyi barədə elə həmin gün yazdığım bir qəzəlimi oxudum:

*Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,*
*Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl...*

Mən şe'rimi oxuyub qurtaran kimi fars dilini bilən, lakin Azərbaycan dilini bilməyən xarici ölkə alimləri şe'rin tərcüməsini xahiş etdilər. Prof. Təhminə xanım Rüstəmova «şe'ri elə müəllifin özü fars dilinə tərcümə etsin» dedi və mən yenidən onu beyt-beyt oxuyub tərcümə etdim. Bu zaman Hindistandan gələn alim Əbdülvüdud Əzhər söz alıb şe'ri təriflədi və dedi ki, şe'rdə «hind səpki» ilə şe'rlər yazmış görkəmli klassik şair Bidelin də adı çəkilmişdir ki, azərbaycanlı şairin dilindən onun adının çəkilməsi məni çox sevindirdi.

Biz tehran universitetində olarkən oradakı görüş günorta namazı vaxtı bir saatlığa təxirə salındı və mən əl-üz yuyulan otağa girdikdə orada konfrans iştirakçısı olan amerikalı Karl Ernst adlı bir alimin dəstəmaz aldığını gördüm. Mənə dedilər ki, o, islam dinini qəbul eləyib və şəriət qayda-qanununa ciddi əməl edir.

İrana etdiyim beşinci səfərim zamanı bir çox maraqlı görüşlər və gəzintilərdən aldığım təəssürat mənim yaddaşıma ömürlük həkk oldu. Onlardan biri mənim alim dostum Tofiq Cahangirovla bağlıdır. Biz Tehranda Vəliəsr Xiyabanından (sabiq Əmiriyyə) keçərkən Tofiq yolun sağ tərəfindəki bir evi göstərib dedi:

- Bu 3 mərtəbəli bina 40 il bundan əvvəl bizim evimiz olub.

Əvvəlcə binaya, sonra Tofiqə baxdım. Gözləri yaşarmışdı.

Onunla 1961-ci ildə Şərqşünaslıq fakültəsində tanış olmuşdum.
Yenicə İrandan qayıtmışdılar. Vətəndən gedənlər Vətənə dönmüşdülər. Atası İmran Mozəyyənpur Gəncədə doğulmuş, Bakıda Tibb institutunu bitirmiş, 1937-ci ildə keçmiş iranlı kimi İrana sürgün olunmuş, bir il sonra xanımı naib əvə qızı Şəhla da onun yanına Tehrana getmişdilər. Tofiq isə 1939-cu ildə Tehranda dünyaya gəlmişdir...

Tofiqin sonrakı həyatı, 22 il İranda yaşayıb Azərbaycana qayıtmalarına

baxmayaraq, yenə də İranla bağlı olmuş, Universitetin Şərqşünaslıq fakültəsinin fars dili (məhz fars dili!) şöbəsində oxumuş, dissertasiya müdafiə etmişdir. Sonralar fakültədə «Fars dili kafed- rası»nın müdiri olan Tofiq dəfələrlə doğma İrana səfər etmişdir.

Bəli, Tofiq gözləri yaşarmışdı. Onun üçün İran da vətəndir, Azərbaycan da! Birində doğulub, digərində yaşayır.

Əvvəlki səfərlərdə olduğu kimi mənim İrana bu dəfəki gedişim də uğurlu keçdi. Çoxlu görüşlər, söhbətlər, ziyafətlər şe'rləşmələr və s... Yanvarın 9-da artıq Bakıda idim. Lakin hələlik fikrim, düşüncəm, yaddaşım yenə də İranda qalmışdı.

1-8 yanvar 1996, Tehran

## Beşinci Səfərnamə Şe’rləri

*I*

*QƏZƏL*

*Səsləmədə bir neçə canan məni,*
*Qum məni, Zəncan məni, Tehran məni.*

*Bülbülü oldumsa da çox gülşənin,*
*Cəlb eləyir tazə gülüstan məni.*

*Xatirə düşcək yenə qan qaynadı,*
*Çəkmədə Qəzvin məni, Kaşan məni.*

*Qurban olum Azəribaycanə mən,*
*Şad edəcək Azəribaycan məni.*

*Varmı məgər qəlb kədərlənməsin?*
*Görməyəcək kimsə pərişan məni.*

*Dilbərimin vəslinə yetməkdəyəm,*
*Zar edə bilməz acı hicran məni.*

*Bismillahir-rəhmanir-rəhim,*
*Şövq edəcək düz yola hər an məni.*

*Şahina, şadəm, necə şad olmayım?*
*Də'vət edibdir yenə İran məni.*

*1.01.96*
*Bakı-Tehran, təyyarə*

Iran səfərnamələri
***III***
***QƏZƏL***

*Ayrılıq gözələrə görsəndi kədər oəngində,*
*Nəzərə dəydi vüsal isə şəkər rəngində.*

*Necə rəngindi, ilahi, bu müğam gülşənimiz,*
*Var onun bir neçə mə'na gülü hər rəngində.*

*Var imiş, sevgili yarım, gülüşün həm rəngi,*
*Qəhqəhən gəldi mənə çatdı qəhər rəngində.*

*Saçların - rənginə bənzər gecənin, hüsnünsə*
*Dəymədə gözlərimə nurlu səhər rəngində.*

*Həmişə mən kimi rahətliyə möhtac olacaq*
*Kim ki rahətliyi görmüşsə xətər rəngində.*

*Bu qəzəl sahibi Şahin elə şad olmuş ki,*
*İranı görmədə şəfqətli səfər rəngində.*

*Xoş xəbər yetsə vətən barədə halım xoş olar,*
*O xəbər görsənə, eykaş, zəfər rəngində.*

*O həqiqət nə gərəkdir mənə ki, ömr uzunu*
*Üstümə axmada böhtan ilə şər rəngində.*

*Şahina, bilməyirəm eşqdə xeyrim nə olub,*
*O xeyirdirmi məgər gəldi zərər rəngində?*

*2.01.96*
*Tehran*

*3.01.96*
*Tehran*

***II***

***QƏZƏL***

Şahin Fazil

*Aşiqə, ey pəri, qürbət kimi məhbəs yoxdur,*
*Səslərəm hey səni, səndənsə mənə səs yoxdur,*

*Gecə-gündüz bir olaq vəslə yetişdikdə yenə,*
*Daha «bəs» söyləmə, «bəsdir» demə ki, bəs yoxdur.*

*Gözəlim, qurban olum Allaha, peyğəmbərə mən,*
*Amma, sən tək mənə aləmdə müqəddəs yoxdur.*

*Ney qəzəl yazmada «Məcməş-şüəra» üzvləri,*
*Niyə şe'r içrə bu gün qit'ə, müsəddəs yoxdur?*

*Nə üçün tərci yazılmır, niyə qeyb oldu sürud?*
*Bəs müləmme niyə yoxdur, nə müxəmməs yoxdur.*

*Necə şadəm ki, gəlib sülh İran torpağına,*
*Sülhə qarşı orada indi sıxan səs yoxdur.*

*Gəlməyir baş başa İran ilə Türkiyyə daha,*
*Yox qızılbaş papağı başda, bu gün fəs yoxdur.*

*Daha Sultan Səlimin yox tamahı İranda,*
*Çaldıranda necə xoşdur ki kəsakəs yoxdur.*

*«Ey Füzuli, bu cahan mülkünə çox bağlanma,*
*Buraya çoxdu gələn, amma qalan kəs yoxdur»*[1].

Ləğvi m ü m k ü n m ü görən birkərəlik hicranın?
Şahina, varmı güman, ümmidini kəs, yoxdur!

[1] «Be molke-dəhr, Fozuli, məbənd del k-inca
Bəsist amədе, əmma kəsi ke, manəd, nist».

***IV***
***QƏZƏL-TƏZMİN***
Şahin Fazil

*«Mehri könlümdə nihan olduğun ol mah bilir,*
*Kimsə bilməz füqəra sirrini, ol şah bilir».*
Məhəmməd Füzuli

*Oldumu şah ki, aləmdə nədir ah bilir?*
*Bunu biz bilməyirik, bilsə də Allah bilir.*

*Gəlməyir başqa vilayətdə qərarı bu kəsin,*
*Ayağın altını, ey şux, qərargah bilir.*

*Aşiqin üzgün olur səndən uzaqlarda müdam,*
*Özünü amma kənarındasa gümrah bilir.*

*Oxudan bülbülü gəh vəsl, gəhi hicr olmuş,*
*Gah bilmir bu gözəl sirri o gül, gah bilir.*

*Bəndəyəm mən, mənə şah isə o dilbərdir, onun*
*Necə şah olduğunu bəndə bilir, şah bilir.*

*Ürəyindən keçəni bildirirəm öylə dəqiq,*
*Özünə aşiqi cananəsi cərrah bilir.*

*Yurda dön, hər səfərin zilləti var, ey Şahin,*
*Səfərin zillətini sən kimi səyyah bilir.*

*4.01.96*
*Tehran*

*V*
*QİT'Ə*

*Nə siyafurdu bu hicran, qovuram ar olmur,*
*Üzə bax ondakı, yarəb, təzədən rəngə gəlib.*

*Neçə müddətdi həvəs yoxdu, şe'r gəlmirdi,*
*Yenə hicran ilə şerim deyəsən cəngə gəlib.*

*Hər gecə ağlayıram dilbərimin hicrində,*
*Qonşular ahüzarımdan yorulub təngə gəlib.*

*5.01.96 - Tehran*

*VI*
*QƏZƏL*

*Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,*
*Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl.*

*Nə qədər şairi vardır, əcəba, İranın,*
*Neçə arif yetirib hər ili, yarəb, nə gözəl.*

*Qərq olubdur gülə hər guşəsi, güldən başqa*
*Bu qədim ölkədə var dil gülü, yarəb, nə gözəl.*

*Adi bir sözdəki məzmun məni ovsunlatmış,*
*Sanki axmaqdadı mə'na seli, yarəb, nə gözəl.*

*Bu rəvan dildə Nizami yaradıb, Sədi yazıb,*
*Yetirib Ənvərini, Bideli, yarəb, nə gözəl.*

*Bu dilin şöləsi çox qəlbi işıqlatdı, bu dil Nurə*
*qərq eylədi çox mənzili, yarəb, nə gözəl.*

*Hafizin şe'rini Şahin dedi, bülbül susdu,*
*Fars dili məst elədi bülbülü, yarəb, nə gözəl.*

*6.01.96 - Tehran*

*Hərdən gülürəm mən məni hicran*
*çağıranda, Hərdən oluram zarü pərişan,*
*çağıranda.*

*Hicranə düşərkən bilinir qiyməti vəslin,*
*Dönnəm geri, əlbəttə, a canan, çağıranda.*

*Gəlmək yanına sanma çətindir mənə, əmr et,*
*Getməzmi məgər bəndəni sultan çağıranda?*

*Olmazsa qəfəs sakini, güldən aralanmaz,*
*Bülbül məgər uçmazmı gülüstan çağıranda?*

*Çox vaxtımı yar ilə keçirdimsə də, hərdən*
*Əzm eyləmişəm meydana meydan çağıranda.*

*Üsyan odu bir vaxt yanar idi canımda,*
*Asi oluram indisə üsyan çağıranda.*

*İndi məni söz meydanı çəkməkdə, gedibdir*
*Fərhadı qaya, Qeysi biyaban çağıranda.*

*Döndərmərəm əsla üzümü yaxşı adamdan,*
*Hər an olaram munisi hər an çağıranda.*

*Şahin, nə qədər də'vətə göz yummadayam mən,*
*Amma gedirəm şövq ilə İran çağıranda.*

*7.01.96*
*Tehran*

Iran səfərnamələri

***VIII***

***QƏZƏL***

*Həm vəslə yetən, həm də ki, hicranə mənəm, mən,*
*Həm aqil olan, həm də ki, divanə mənəm, mən.*

*Hərdən yanıram, yandırıram həm də ki hərdən,*
*Həm şəmə dönən, həm də ki, pərvanə mənəm, mən.*

*Mey məst eləyir canımı, məstanə edir yar,*
*Həm məst görünən, həm də ki, məstanə mənəm, mən.*

*Kin bəsləməyin ziddinə olsam da həyatda,*
*Həm doğma olan, həm də ki, biganə mənəm, mən.*

*İllərlə mənə əhd ilə peyman idi məqsəd,*
*Həm əhdə yetən, həm də ki, peymanə mənəm, mən.*

*Dərdim də olubdur, mənə dərman da tapılmış,*
*Həm dərdə yetən, həm də ki, dərmanə mənəm, mən.*

*Eşqim elə pak oldu ki, əfsanə döndü,*
*Həm gerçək olan, həm də ki, əfsanə mənəm, mən.*

*Hərdənbir ötüb sərhədi şahinlik edən kəs Həm İrana,*
*həm Azəribaycanə mənəm, mən.*

*8.01.96*
*Текгаn*



# ALTINCI SƏFƏRNAMƏ

## *«ARZU ELƏYƏN ÇOXSA DA İRANƏ YETİŞMƏZ»*

Sərhədi keçən kimi saatımın əqrəblərini ölkələrimiz arasında vaxt fərqinə görə yarım saat geriyə çəkdim. Bu o demək idi ki, mənim üçün gün yarım saat uzanacaq, gecə yarım saat gec gələcək. Yarım saat az vaxt deyil. Yarım saatda çox gözəllik seyrinə dalmaq olar. İlham pərisi köməyə çatsa yarım saatda gündüz işığında ən azı bir şe'r yazmaq olar:

*Hərdən həzzə dalıb, hərdən nisgilə,*
*Kaş bilim qədrini hər anın belə.*

Bəli, mən yenə İrandayam. Əsrimizin beşinci onilliyinin son ilindən, yəni tələbəliyimdən başlayaraq bu ana qədər tarixini, ədəbiyyatını, incəsənətini, bir sözlə bütün çoxşaxəli mədəniyyətini və vüsalını həsrətlə izlədiyim ecazkar İran yenə mənə qucağını açmışdır. Mən yenə, hər dəfə olduğu kimi, bu dəfə də, say etibarilə altıncı dəfə bu torpaqların əsrarəngiz gözəlliklərini maraq və diqqətlə seyr edirəm. Budur, Astara, Talış geridə qaldı. Fumən, Rudbar, Qəzvin arxamızca «yvxşı yol» dedi, Tehran bizi səhərin əlvan şəfəqləri ilə qarşıladı. «Qorxulu Tehran» əsərindən tanıdığım qorxusuz Tehran, mehriban Tehran...

Şair-qəzəlxan həkim Qəni, jurnalist Hacı Rafiq, tarixçi Anar Muradov, naşi rvə şair İsgəndər Etibar, iman sahibi və təqvalı insan olan Məhəmməd Hüseynli, mən Şahin Fazil və daha 200 mömin qardaş və bacılarımız yetişdik Tehrana. Qarşıda ayətullah İmam Xomeyni həzrətlərinin 8-ci il dönümü münasibətilə keçiriləcək mərasimdə iştirak etmək, Məşhəddə İmam Rzanın, Qumda Məsumə xanımın məzarlarının ziyarətlərinə getmək kimi müqəddəs tədbirlər dururdu.

Bir qədər istirahət etdik, sonra bizim üçün müəyyənləşdirilmiş tədbirlərdən biri başlandı. Azərbaycandan gələn nümayəndə heyətini

«Fərhəngsəraye-Bəhmən» adlanan Mədəniyyət və İstirahət Parkına gətirdilər və biz həqiqətən də mədəni istirahət etdik: gözəlliyə baxdıq, parkdakı adamlarla söhbət etdik, dondurma yedik və s. Keçmişdə qəssabxana olan bir yerdə nə böyüklükdə park salınmışdır, İlahi. Üzgüçülük hovuzu, müxtəlif kitab, xəttatlıq və rəsm sərgiləri, kompüter otaqları, zəngin kitabxana, qiraətxana, kino zalı və s.

Ertəsi gün Tehran universitetinə gəldik. Bu məşhur tədris ocağında mən bir neçə dəfə olmuşam. Dünən televiziyanın son xəbərlər verilişinə baxarkən Tehranda beynəlxalq bir konfransın keçirildiyindən xəbərdar olmuşdum. Həmin elmi tədbirin üçüncü günündə iştirak etmək bizə də nəsib oldu. Konfrans zalına girən kimi nəzərimi ön divardan bizə baxan imam Xomeyninin, oğlu Əhməd Xomeyninin, imamdan sonra «məqame-müəzzəme-rəhbər» («əzəmətli rəhbər məqamı») vəzifəsində olan ayətullah Xameneyinin və prezident Haşimi-Rəfsəncaninin yağlı boya ilə çəkilmiş portretləri və iri hərflərlə yazılmış buy azı cəlb etdi: «Beynəlxalq İmam Xomeyni və Aşura mədəniyyəti konqresi». O gün biz olduqca maraqlı məruzələr dinlədik. Ondan çox ölkədən gələn onlarla elm adamı (İrandan d-r Şəfəqi, xanım Feyz, d-r Nasir Hadiyan, höccətül-islam Hacı Seyid Əhməd, d-r Nəcəfqulu Həbibi, xanım Əzəm Taleqani, Hollandiyada yaşayan livanlı alim Qazi Əhməd Lobnani, Türkiyədən, Tacikistandan, Məğribdən və daha bir neçə Afrika respublikalarından gələn din xadimləri) çıxış edərək imam Xomeyninin rəhbərliyi ilə İranda qələbə çalan islam inqilabı və Aşura mədəniyyəti barədə məzmunlu fikirlər söylədilər, bu inqilabın 1400 il bundan əvvəl imam Hüseynin şəhid olduğu Aşura inqilabının davamı olduğunu vurğuladılar, onu «ikinci Kərbəla inqilabı» adlandırdılar. O gün axşam saat 21-dən gecə 1-ə qədər yaşadığımız «İnqilab» hotelinin namazxa- nasında İran və Azərbaycan şairləri arasında «müşairə» keçirildi. İran şairlərindən dostumuz Həsən Məcidzadə Savalan, Arif Rəfi, Nəsiri, bizdən isə Həkim Qəni, İsgəndər Etibar, Vaqif Məmmədov və İsa Həbibbəyli, habelə mən özüm çıxış etdik. Aparıcı bu sahədə xüsusi istedadı olan Hacı Rafiq idi («Say» qəzetinin baş redaktoru).

İyunun 3-də sübh yeməyindən sonra avtobuslarla Qum şəhəri istiqamətində - «Behişte-Zəhra»ya tərəf yollandıq. Bu gün xordad ayının 15-i, imam Xomeyninin vəfatının 8-ci ildönümü günüdür. Tehrandan başlamış imamın dəfn olunduğu əzəmətli mavzoley kompleksinə qədərki bütün yerlər

əsasən qara geyimli adamlarla doludur. Həmçinin mərasimdə iştirak etmək üçün 26 ölkədən 6 mindən çox adam də'vət olunmuşdur ki, onların əyləşdikləri avtobus karvanı bir neçə kilometr məsafə uzunluğunda irəliləməkdədir. Hamı ziyarətgaha axışır.

Mən İmamın «irtihalı» (vəfatı) münasibətilə əvvəlki illərdə yazdığım xatirələrimdə bu mənəvi tədbirin əzəmətindən xüsusi bəhs etmişəm. Odur ki, daha təfərrüata varmıram, bircə onu demək istəyirəm ki, yenə də əvvəllərdə olduğu kimi, yolları, düzləri, bağ-bağatları tutmayan milyonlarla adam, minlərlə xarici nümayəndə nəzəri cəlb etməkdədir. Məqame-müəzzəme-rəhbər ayətullah Seyid Əli Xameneyi yenə izdiham önündə çıxış etdi, bu müqəddəs tədbirin hər il qeyd olunacağını bir daha bildirdi.

O gün orada məndən İran televiziyası üçün müsahibə aldılar. İran və İmam barədə fikirlərimi bildirdim.

Əvvəlki şe'r və məqalələrimdə yazdığım kimi Məşhəd ziyarəti mənə iki dəfə qismət olmuşdur. Yenə Məşhədə gedəcəyimizi eşidəndə olduqca sevindik. Bu gün axşam saat 21-də İmam Rzanın şəhid olduğu məkana yollanacayıq. Özü də qatarla.

Əvvəlki səfərlərdə bizi Məşhəd ziyarətinə təyyarə ilə aparmışdılar. Demək, bu dəfə İranın bir neçə şəhərini, qatar pəncərələri arxasından olsa da, seyr eləmək imkanım vardır. Gözlərim bu füsunkar təbiəti seyr etdikcə neçə-neçə şəhəri - Nişapuru, Semnanı, Şahrudu, Vəramini, Səbzvarı, Damğanı və başqa böyük-kiçik şəhərləri ötüb keçdik. Nəhayət, Məşhədə gəlib çatdıq:

*Ey saqi, gözüm, sanma ki, meyxanədə qaldı,*
*Fikrim, nəzərim sən kimi cananədə qaldı...*

*.. .Məşhəddəyəm, hicran yenidən qismətim olmuş,*
*Fikrim yenə Ülviyyə və Şahanədə qaldı...*

Bəli, Məşhəddə birdən-birə qızlarım yadıma düşdü. Kaş onlar da bu müqəddəs şəhərə gələydilər, ziyarətgahı ziyarət edəydilər və Məşədi Ülviyyə, Məşədi Şahanə olaydılar...

Məşhəddə bizi xüsusi qonaqpərvərlik və mehribanlıqla qarşıladılar. Xorasan ostandarının müavini bizim şərəfimizə böyük bir ziyafət verdi. Məşhəd könlümüzü açdı. Amma, əlbəttə, bizim üçün ən böyük şərəf İmam

Rzanın «hərəme-mütəhhərini» - pak məzarını ziyarət etmək oldu. Nəticədə mən üçüncü dəfə məşədi oldum. Orada elə o anlarda yazdığım yeni qəzəlim doğuldu:

*Şahin, yenə bəxtim gətirib, Məşhədə gəldim,*
*Arzu eləyən çoxsa da, İranə yetişməz...*

Məşhur iki şəxsiyyətin - Firdovsinin və Nadir şahın heykəllərini bir daha seyr etdim, hər ikisinə rəhmət oxudum. Ertəsi gün saat 11-də Tehrana qayıtdıq.

İyunun 5-də gündüz bizim hörmətli dostumuz, İran Cümhuriyyəti Mədəniyyət və İrşad nazirliyinin müşaviri olan d-r Əli Əsgər Şe’rdust ilə görüşdük. Axşam isə o, bizim şərəfimizə böyük bir şe’r məclisi təşkil etdi. Mən «Divan»ımın ilk şe’ri olan «Minacat» adlı Allah-təalaya müraciətlə yazdığım böyük həcmli qəsidəmi oxudum. Həmin «Minacat»ın bir neçə beytində dövrümüzün ən faciəli hadisələrindən biri - Qarabağ faciəsi bir daha xatırlandı:

*... Sən Allahsan, kərimsən,*
*Allah, bağışla məni. «Ər-*
*rəhmanu rəhimsən La*
*ilahə illəllah»,*
*Allah, bağışla məni.*

*Vəhmin qılınctək kəsir,*
*Əlim-ayağım əsir,*
*Qüsurum az olsa da,*
*Dilim-dodağım əsir,*
*Allah, bağışla məni.*
*Ötməyib ömrüm hədər,*
*Savabım ulduz qədər.*
*Günahlarım da olub,*
*Üzr günahdan betər,*
*Allah, bağışla məni.*

*Özümü öymüşəm də,*
*Özümü döymüşəm də,*
*Bəzən söyüşçülərtək*

*Kimisə söymüşəm də,*
*Allah, bağışla məni.*

*Bəzən əfvə başladım,*
*Hicranı bağışladım,*
*Çox cahili, alçağı,*
*Nadanı bağışladım,*
*Allah, bağışla məni.*

*Ən pis günü də gördüm,*
*Kipriklə od götürdüm,*
*Ağ bəxtim qara oldu,*
*Qarabağı itirdim,*
*Allah, bağışla məni.*

*Yaşım son həddə çatır,*
*Ömür o səddə çatır...*
*Ata minə bilmirəm,*
*Düşmənlər at oynadır,*
*Allah, bağışla məni.*

*Gəldi kədər, cumdu qəm,*
*Gözlərimi tutdu nəm,*
*Özüm öz günahımı*
*Bağışlaya bilmirəm,*
*Allah, bağışla məni,*
*Allah, bağışla məni!!!*

İyunun 6-da sübh yeməyindən sonra Qum şəhərinə yollanıb «Həræme-Məsumə»ni ziyarət etdik. Elə həmin gün də Tehrana qayıdaraq, bir qədər dincəldikdən sonra Tehran-Bakı istiqaməti ilə hərəkət etdik. Ertəsi gün artıq Bakıda idik.

Mən bu səfər təəssüratımın sonunda bizim bu ziyarətimizi olduqca yüksək səviyyədə təşkil edən İran İslam Cümhuriyyətinin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri ağaye-Bigdeliyə, səfirliyin məsul işçisi ağaye-Hafiziyə, irfani söhbətlərinə heyran olduğum ağaye-Ocaqnejada, bizi böyük qayğıkeşliklə müşayiət edən ağaye-Səduqiyə, İranda xidmətimizdə duran

ağaye-Pürmərcana, ağaye-Qasimiyə, dostumuz ağaye- Şe'rdusta dərin təşəkkür və minnətdarlığımı bildirməklə sözümü bitirirəm.

2 iyun-7 iyun, Azərbaycan-İran, 1996

## Altıncı Səfərnamə Şe’rləri

*I*
*QƏZƏL-TƏZMİN*

*Dərdim o qədər çoxdu ki, dərmanə yetişməz,*
*Dərman o qədər azdı ki, hər canə yetişməz.*

*Meydanə girənlər yenə bihudə verir can,*
*«Бəsdir» sözü, yarəb, niyə meydanə yetişməz?*

*Бayram yetişib, qoç yenə qurbanlığa hazır,*
*Бax rəhmimə, xəncər yenə qurbanə yetişməz.*

*Tapmaq dilədim azca da nöqsanını yarın,*
*Nöqsanı fəqət bunda ki, nöqsanə yetişməz.*

*«Gər yandıra öz varını pərvanə rəvadır,*
*Kimdir ki, qaranlıq gecə cananə yetişməz?»*[1]

*Tənə oxu atmaqda səriştən hələ yoxdur,*
*Canan, oxunun bir dənəsi canə yetişməz.*

*Şahin, yenə bəxtim gətirib, Məşhədə gəldim,*

*Tehran,*
*02.06.96*

[1] Бey1; Əlican Qövsi Təbrizinindir.

*II*
*QƏZƏL-TƏZMİN*

*Öylə şad etmiş məni yarım, pərişan eyləməz,*
*Qəlbimi hüsnündən özgə heç nə heyran eyləməz.*

*Zərrəbinlə bircə-bircə gəzmişəm nöqsanını,*
*Kim desə nöqsanı gər yoxdursa, nöqsan eyləməz.*

*«Ah, bir naşı təbibin olmuşam bimarı kim,*
*Hər nə istər eylər, amma dərdə dərman eyləməz»[1].*

*Dərdimin yetmir dəvası, küsmüşəm loğmandən,*
*Çarəmin mümkünlüyü yoxdurmu dərman eyləməz?*

*Vacib olsa eylərəm üsyanımı dünyayə mən,*
*Asi könlüm bir daha cananə üsyan eyləməz.*

*Görkəmimdən qorxaraq bir ləhzə aram olmadı,*
*Vəslimi, bildim ki, yarım bir də hicran eyləməz.*

*БеШш1е-*
*ЗеЬга,*
*03.06.96*

*Öylə məftunəm bu yurda, gözlərəm də'vət yenə,*
*Бivəfahq Şahinə, əlbəttə, İran eyləməz.*

*III*
*MÜRƏBBE*

*Aşiq, gözəlim, işvəni görməkdə açıqca,*
*Hər nazını, hər qəmzəni görməkdə açıqca,*
*Gizlənmə, gözüm çöhrəni görməkdə açıqca,*

[1] Бey1; Əlican Qövsi Təbrizinindir.

*Hərdənbin əgər qürbətə etsəm də səfər mən,*
*Səndən tuturam, ey pəri, hər ləhzə xəbər mən,*
*Küsmə o gözəl surətə baxmazsam əgər mən,*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*Hicranın açıq gəldi, vüsalın niyə gizlin?*
*Bildir mənə, gizlətmə, məlalın niyə gizlin?*
*Gizlincə xəyal etmə, xəyalın niyə gizlin?*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*İqrarını pünhan eləyə bilməyəcəksən,*
*İlqarını pünhan eləyə bilməyəcəksən,*
*Əsrarını pünhan eləyə bilməyəcəksən,*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*Mənsiz, bilirəm, qoymada ahin bu dəqiqə,*
*Səndən uzaq olmuş bu pənahin bu dəqiqə,*
*Yox fərqi ki, Məşhəddədi Şahin bu dəqiqə,*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*Yarım, fəraq olduqda da görmək səni mümkün,*
*Gözdən uzaq olduqda da görmək səni mümkün,*
*Səndən iraq olduqda da görmək səni mümkün,*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*Mənsiz nə seyr sən, nə çəmən bilməyəcəksən,*
*Mənsiz nə qızılgül, nə süsən bilməyəcəksən,*
*Məndən özünü gizlədə bilməyəcəksən,*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*Hərçənd işi aşiq olanın ahü fəğandır,*
*Nikbinliyim amma mənim hər fərdə əyandır,*
*Gəl Şahinə gül hüsnünü gizlətmə, amandır,*
*Onsuz da xəyalım səni görməkdə açıqca.*

*Məşhəd*
*04.06.96*

*IV*
*QƏZƏL*

*Ey saqi, gözüm, sanma ki, meyxanədə qaldı,*
*Fikrim, nəzərim sən kimi cananədə qaldı.*

*Ay öylə işıqlatdı yeri şəmə yox hacət,*
*Şadəm, gecə şam yanmadı, pərvanə də qaldı.*

*Cəlb etmədə hər dəm məni mərdanə adamlar,*
*Mərdin nəzəri, bəlli ki, mərdanədə qaldı.*

*Dərdim gülü, qeyb eylədi öz ətrini, amma*
*Yarəb, nə sehrdir ki, ətir nanədə qaldı?*

*Məşhəddəyəm, hicran yenidən qismətim olmuş,*
*Fikrim yenə Ülviyyə və Şahanədə qaldı.*

*Yox məndə qızıl, var qəzəl, əlbəttə, bu xoşdur,*
*Minlərlə qızıl var ki, viranədə qaldı.*

*Şahin, bu şərəfdir mənə ki, gerçəyəm indi,*
*Bir gün görərlər adım əfsanədə qaldı.*

*Məşhəd*
*04.06.96*

*V*
*QƏZƏL*

*Tarçı, muğamat çal, mizrabım tarə çək,*
*Çal ki, camım yammada, oldu ciyər parə, çək.*

*Ey bu qəzəl sahibi, qoy qələmi bir yama,*
*Mehrimi göstər yara, şilləmi əğyarə çək.*

*Çarəmi, tədbirimi gözləyirəm, ey pəri,*
*Simidə tədbir gətir, məcməyidə çarə çək.*

*Yamdı üzüm şəm tək, rəd delə pərvaməmi,*
*Cəzb elə ulduzları, şəmimə səyyarə çək.*

*Gül mə gərəkdir məmə, kəlməlrim gül kimi,*
*Söyləmirəm məm səmə «gəl məmi gülzarə*
*çək».*

*Vəsmə çəkibsəm, qaşım qarələmib gör mecə,*
*Gözlərimə qurbamam, gözlərimə qarə çək.*

*Şahimə bax, Məmsurum*[1] *şe'rimə məftum olub,*
*«Ya sözümə as qulaq, ya özümü darə çək».*

*Tehram,*
*05.06.96*

[1] Həllac Mənsur

# YEDDİNCİ SƏFƏRNAMƏ



## *«ŞAHİN UÇMUŞ YENƏ ŞAHİN KİMİ İRAN TƏRƏFƏ»*

Ustad Şəhriyarın Tehran və Təbriz şəhərlərində keçiriləcək 90 illik yubiley konfransının birinci iclası, mən deyərdim ki, elə Bakıda, Elmlər Akademiyasında başlandı. İclas salonuna yüzədək adam toplanmışdı. Onlardan 40 nəfəri İrana gedəcəkdi. Yolasalma mərasimində iştirak edən akademik Fərəməz Maqsudov, İİR-in səfiri Əlirza Bigdeli və İran Mədəniyyət Mərkəzi sədrinin müavini ağaye Korəvi çıxış edərək bizə uğurlu yol və səmərəli görüşlər arzuladılar.

Hər şeydən əvvəl qeyd etməliyəm ki, nümayəndə heyətinin tərkibi respublikamızın nüfuzlu alim, müəllim, şair və tədqiqatçılarından ibarət idi. Azərbaycanın Mədəniyyət naziri Polad Bülbüloğlunun rəhbərliyi ilə qonşu və dost diyara yollanan heyətin tərkibində akademiklər Fərəməz Maqsudov, Bəkir Nəbiyev, elmlər doktorları Yaşar Qarayev, Təhminə Rüstəmova, Nizami Cəfərov, Gövhər Baxşəliyeva, Tahir Məhərrəmov, Şövkət Tağıyeva, Müseyib Məmmədov, Kamil Allahyarov, elmlər namizədləri Tofiq Cahangirov, Sabir Əmirov, Mənzərə Məmmədova, Mehri Məmmədova, Rasim Nəbioğlu, Ruqiyyə Qəmbərqızı, Nüşabə Əlizadə, Lalə Əlizadə, Sənan İbrahimov, Elman Quliyev, şairlər Şahmar Əkbərzadə, Nazim Rizvan, müəllimlər Əbdül Qənbəroğlu, Mahmud Fətiyev, Tamrida Fərzəliyeva, «Say» qəzetinin redaktoru Hacı Rafiq, jurnalistlər Telli Pənahqızı, Afaq Əbdülqızı və başqaları vardı.

Axşam saat 19-da Tehranın beynəlxalq hava limanında bizi qarşılayanlar arasında «Şəhriyar Beynəlxalq Yubiley Konfransı»nın katibi, d-r Əli Əsgər Şe'rdust, prof. Möhsün Xəlici, d-r Zəkəriyyə Tərzəmi, Azərbaycan Respublikasının İİR-dəki müvəqqəti işlər vəkili Eynulla Mədətli də vardı.

Gözəl «Lalə» hotelində şam yeməyi zamanı çıxış edən d-r Ə.Şe'r- dust Azərbaycan, Türkiyə və Türkmənistandan gələn şəhriyarsevərləri bir daha salamladı və sabah başlanacaq konfransın işinə uğurlar dilədi.

Bizdən bir gün əvvəl Azərbaycandan gələnlərin içərisində Naxçıvan Muxtar Respublikasındakı ziyalı dostlarımız, prof, İsa Həbibbəylini, Naxçıvan Mədəniyyət naziri Nizami Həmzəyevi və həkim-şair Nadir Əlincəni gördükdə çox sevindim. Az sonra bizimlə görüşə gələn şair Savalan v əd-r Fərzanə sevincimi daha da artırdı.

Ertəsi gün saat 10-da İİR-in Prezidenti Seyid Məhəmməd xatəmi cənabları bizi qəbul etdi. Görüşdə çıxış edən Polad Bülbüloğlu ustad Şəhriyarın İranın və Azərbaycanın müştərək şairi olduğunu, yəni iki zəngin dildə - fars və Azərbaycan dillərində şe’rlər yazdığını və bu dillərin poetik Şəhriyar zirvəsinin yaraşığı olduğunu xüsusi vurğuladı, Şəhriyar yubileyinin payızda Bakıda da geniş şəkildə qeyd ediləcəyini bildirdi. İİR-in Prezidentinə Azərbaycan Respublikası Prezidenti Heydər Əliyev cənablarının salamını çatdıran nazir onun prezidentimiz tərəfindən Azərbaycana də’vət olunduğunu da söylədi. Görüşdə çıxış edən Seyid Məhəmməd Xatəmi bizi səmimiyyətlə salamladıqdan sonra dedi: «Şəhriyar tarixi şairdir. Ana dilinin Azərbaycan dili olmasına baxmayaraq, o, müasir fars şe’rinin öncül, bəlkə də ən birinci yerdə duran şairlərindəndir. Şəhriyar şe’rlərinin əsas məzmunu insanlara dərin məhəbbəti əks etdirir. Bu böyük şairin şöhrəti çoxdandır ki, İran sərhədlərini aşmış, məhz buna görə də siz buraya təşrif gətirmişsiniz». Görüşün sonunda Polad Bülbüloğlunun İİR-in Prezidentinə təqdim etdiyi Bakının mənzərə-portreti minnətdarlıqla qəbul edildi.

Aprelin 14-də Yubiley Konfransı özünün birinci iclasına başladı. İclas əzəmətli «Talare-vəhdət»də («Vəhdət klubu») keçirilirdi. Geniş və yaraşıqlı foyedə Şəhriyara həsr olunmuş zəngin eksponatlı sərgi təşkil edilmişdi. Foyedə ustad Şəhriyarın boyu bərabərliyində hazırlanmış abidə o qədər canlı idi ki, sanki şair indi də şe’r oxuyacaqdı. O, fikrə dalmışdı, ilham aləmində idi...

İclas zalına də’vət olunduq. Quran tilavətindən sonra çıxışlar başlandı. Azərbaycan, Türkmənistan, Tacikistan və Türkiyə nümayəndə heyətləri sədrlərinin təbriklərini dinlədik. Sonra Şəhriyarın həyatının müxtəlif dövlərini əhatə edən film göstərildi və ustad böyük qürur hissi ilə «Azərbaycanın hünərli övladı» («Fərzənde-hönərmənde-Azərbaycan») kimi təqdim edildi. Filmdə həm azərbaycanca, həm də farsca şe’rlər
oxuyan Şəhriyar sanki tamaşaçı ilə danışırdı.

Çıxış edən d-r Ə.Şe’rdust şairi «fars şe’rinin Şəhriyarı» («Şəhriyare-

şe’re-farsi») adlandıraraq onun həmçinin «İranın mili şairi» («Şaere- melliye-İran») olduğun xüsusi vurğuladı. Ondan sonra İranın mədəniyyət və islam irşadı naziri d-r Mohacerani çıxış etdi. Prezident Heydər Əliyev cənablarının təbrik məktubu Polad Bülbüloğlu tərəfindən oxundu və prezidentimizin aşağıdakı gözləri alqışlarla qarşılandı: «Qardaş Azərbaycan və İran xalqları arasında hərtərəfli münasibətlərin, o cümlədən elmi-mədəni əlaqələrin inkişaf etməsində Şəhriyar simasının rolu və xidməti misilsizdir».

Sonra Tacikistan mədəniyyət nazirinin məktubu dinlənildi. Türkmənistan nümayəndəsi öz ölkəsinin təbrikini çatdırdı, Türkiyə Yazarlar Birliyinin sədri Məhəmməd Toğan konfrans iştirakçılarını və salona toplaşanları təbrik etdi. İclasda çıxış edən Mehdi Rövşənzəmir (İran), Bəkir Nəbiyev (Azərbaycan), Cəlil Təclil (İran), Əsgər Fərdi (İran) Şəhriyar yaradıcılığının müxtəlif xüsusiyyətlərindən bəhs etdilər, ustadı böyük məhəbbətlə qiymətləndirdilər.

Fasilə zamanı hələ dörd il bundan əvvəl öz gözəl şe’rləri ilə məni Tehranda məftun etmiş gənc şairə Solmazla görüşdüm, ustad Şəhriyarın bacısı 79 yaşlı Səriyyə xanımla söhbət etdim.

Ertəsi gün keçirilən ikinci iclasa Azərbaycan mətbuat və informasiya nazirinin müavini Rəfael Məmmədov sədrlik edirdi. İzzətulla Rəzzaqi «Şəhriyar və Hafiz», Afaq Əbdülqızı «Şəhriyar şe’rində xəl- qilik», Kərim Məşrutəçi (şair Sönməz) «Heydərbabaya salam»ın tərcümələri haqqında, Ruqiyyə Qənbərqızı «Şəhriyar və Rüstəm Əliyevin görüşləri», d-r Əli Əkbər Vilayəti (sabiq xarici işlər naziri) «Şəhriyar şe’rində iranlılıq məsələsi», d-r Məhəmməd Bağır Sədrniya «Şəhriyar yaradıcılığında ənənəçilik ilə novatorluğun mübarizəsi», d-r Əbülfəzl Əfşar «Şəhriyar - həkim-şair, şair-həkim», Şahmar Əkbərzadə «Şəhriyar şe’rinin ifadə tərzi» mövzularında məqalələrlə çıxış etdilər.

Fasilə zamanı Təbriz radiosu «Azərbaycan cümhuriyyəti» redaksiyasının ədəbi verilişlər şöbəsinin müdiri Əbülfəz Əlayi mənimlə bir saata qədər davam edən müsahibə apardı və bir neçə şe’rimi maqnitofon lentinə yazdı.

Aprelin 16-da Təbrizə uçduq. Yadıma Məmməd Səid Ordubadinin «Dumanlı Təbriz» romanı düşdü. Təbriz dumansız idi.

Təyyarədən yenə enən kimi tədqiqatçı və yazıçı Sabir Əmirov meydanın beton döşənəcəyindən sürətlə keçib, yüyürə-yüyürə özünü çəmənliyə çatdırdı, dərhal yerə döşəndi, «şükür-şükür» deyə-deyə Təbriz torpağını öpməyə

başladı. O, 18 yaşında ikən doğma şəhəri olan Təbrizi tərk etmiş, Bakıya gəlmiş, 52 il Azərbaycanda yaşamış, bu qədər uzun ayrılıqdan sonra yenidən doğulub boya-başa çatdığı məkanı görmək səadətinə yetmişdi.

Bir qədər sonra kənarda Əbdül Qənbəroğlu da torpaq öpürdü. Torpaq qədri bilənlərə eşq olsun! Hamımız riqqətə gəlmişdik. Sabir aya - ğa qalxdı. Tosqun adam olmasına baxmayaraq, bir də yerə çökdü, torpağı yenidən öpdü. O, gözləri yaşarmış halda yenə də «şükür, şükür» deyirdi.

İki min ildən çox yaşı olan qədim Təbrizin doqquz qapısı vardır: Sürxab, Şütürban, İstanbul, Vicuyə, Gəcil, Məhadmihən, Novbər, Xiya - ban, Bağmişə. Bu giriş qapılarının bəzilərinin tağları hələ də qalmaqdadır. Acıçay və Meydan çayları şəhərin içindən keçir. Bu çayların hər ikisinin suyu azdır.

«Təbriz» mehmanxanasında bir qədər dincəldikdən sonra məşhur «Məqbərətüş-şüəraya» (yaxud «Həzrətüş-şüəra») gəldik. Adı ərəbcə olan bbu ifadənin tərcüməsi «Şairlər məqbərəsi» deməkdir. Özü də neçə şairin məqbərəsi: Əsədi Tusi, Qətran Təbrizi, Mücirəddin Beyləqani, Zəhi- rəddin Faryabi, Əfzələddin Xaqani, Şahpur Nişaburi, Şəmsəddin Səccasi, Zülfüqar Şirvani, Hümam Təbrizi və b. Hümamın vəfatınadək bu qəbiristan «Sürxab», ondan sonra isə «Məqbərətüş-şüəra» adlanmağa başlayıb. Orada 407 ədib və şair, 70 nəfər isə arif şəxsiyyət dəfn olunmuşdur. Qəbristanın ön tərəfində nəhəng bir məqbərə ucaldılmışdır. Nəhəng Şəhriyar bu nəhəng məqbərənin içərisində uyuyur.

Saat 16-da «Petroşimi» («Neft-kimya») institutunun konfrans salonuna gəldik. Bugünkü Təbriz konfransı məşhur «Qədire-Xom» bayramı gününə təsadüf edir. Bu, Məhəmməd (s) peyğəmbərin öz yerinə Həzrət Əlinin xilafətə vəliəhd olduğunu bəyan edən müqəddəs gündür.

Quran tilavətindən sonra şərqi Azərbaycan ostanının valisi Yəhya Məhəmmədzadə böyük nitq etdi. O, çıxışında Təbrizin ustad Xaqanini Tehrandan, Mücirəddini Beyləqandan, Zülfüqarı Şirvandan, Zəhirəddini Faryabdan öz ağuşuna çağırıb bağrına basdığı bir şəhər olduğunu iftixarla qeyd etdi. Sonra Təbriz imamacüməsi, ayətullah Şəbüstəri çıxış edərək, dünyada səkkiz milyondan çox adamın Şəhriyar poeziyası ilə tanışlığından danışdı, böyük şairin əsərlərinin Litva, Pakistan, Hindistan, Yuqoslaviya və başqa ölkələrdə tərcümə olunduğunu bildirdi. Ayətullah Şəhriyarın həyatından bu lövhəni xatırlatdı:

«Bir gün Şəhriyara deyirlər ki, «Heydərbabaya salam»ın fars dilinə bir neçə tərcüməsi var ki, onların heç biri oxucunu qane etmir. Əsəri sən özün fars dilinə çevirsən daha yaxşı olmazmı? O cavab verir: «Doğ- rudur», «Heydərbabaya salam» fars dilinə tərcümə olunub. Elə mən özüm də onu farscaya çevirə bilərəm. Amma onun fars dilinə tərcüməsi türk dilinin lətafətini verə bilməz».

Söz d-r Ə.Şe'rdusta verildi. O öz çıxışında İranda artıq «Şəhriyar ədəbi mükafatı»nın təsis edildiyini və bu mükafatın hər il təqdim olunacağını bildirdi.

Fasilədə Təbriz, Marağa və Urmiyə şairləri ilə tanış olduq. Təbriz söz ustadlarından Yəhya Şeyda, Məhəmməd Abid, Dövlətabadi, Həmid Şəhanəgi, Behruz İmani, Marağa poeziya sənətçilərindən Kərimi Marağayi (biz onu bu yaxınlarda Bakıda qəbul etmişdik), Vədud İlqar, Firuz Cavadi, Rəsul Qurbani Müqəddəməsr, Eyyub Şərifi, Asi Marağalı, Urmiyədən gələn Beytulla Cəfəri ilə xeyli söhbətləşdik. Axşam «Məqbərətüş-şüəra»da müşairə (şe'rləşmə) keçirilməli idi. «Petroşimi» salonunda iclasımız uzun çəkdi. Biz oradan çıxında artıq saat 23 -cü keçmişdi. Düşünürdük ki, müşairə daha baş tutmaz. Amma şe'rsevər təbrizlilər bizə müşairəyə getməyi təklif etdikdə heç də təəccüblənmədik. Elə dörd il öncə gecəyarısı başlayan Azərbaycan və İran şairlərinin müşairəsi demək olar ki, səhərə kimi davam etmiş, şairlərimiz Qabil, Fikrət Sadıq, Fikrət Qoca, Nazim Rizvan və bu sətirlərin müəllifi öz şe'rləri ilə çıxış etmişdilər.

Biz «Məqbərətüş-şüəra»ya yaxınlaşanda orada böyük izdiham gördük. Yolumuzu gözləyirdilər. Şahmar Əkbərzadə və mən bir neçə şe'r oxuduq. Şe'rlərə dəfələrlə edilən alqışlar onların müəyyən marağa səbəb olduğuna dəlalət edirdi. Mənim orada oxuduğum şe'rlər arasında aşağıdakı Qit'ə vardı. Mən onu elə həmin gün, ustad Şəhriyarın məzarını ziyarət etdikdən sonra yazmışdım:

*Bəllidir ki, nə qədər mədəni şaxlar dağlar,*
*Nə qədər gizli xəzinə dağın altında yatır.*
*Elə kəs var, kəfənsiz uyuyur torpaqda,*
*Elə adəm dəxi var bayrağın altında yatır.*
*Uyuyur torpağın altında böyük bir şair,*

*Torpaq üstündə gəzən torpağın altında yatır.*

«Məqbərətüş-şüəra»dan mehmanxanaya gecə saat 3-də qayıtdıq. Marağalı şairlər müşairəni orada da davam etdirməyi qərara aldılar. Hacı Rafiq, Tofiq Cahangirov, Nazim Rizvan, Nadir Əlincə, Rasim Nəbioğlu və mən səhərə qədər şe'r dedik, bir-birimizi dinlədik.

Ertəsi gün aprelin 17-də Şəhriyarın ev muzeyində olduq. Bir neçə darısqal otaqda saxlanılan əşyaların sayca çoxluğu dərhal nəzərimizi cəlb etdi. Güman edirik ki, vaxt ötəcək, ustadın həyat və fəaliyyətinə dair eksponatlar daha da artacaq, bəlkə də bu darısqal həyətə sığmayacaq.

Bir muzeydən çıxıb başqa muzeyə gəldik. İmam Xomeyni xiyabanında yerləşən «Azərbaycan» muzeyinə. Muzey 40 il bundan əvvəl yaranmağa başlamışdır. Üç böyük nümayiş salonu vardır ki, onlarda qədim və orta əsrlərə aid 2300 ədəd nəfis və qiymətli əşya saxlanmaqdadır. Orada habelə 100-dən artıq əlyazma və 2500-dən çox çap kitabı mövcuddur. Xaricdən və daxildən hər il yüz minədək adam bu muzeylə tanış olmaq üçün Təbrizə gəlir. Muzeyin direktoru Məsud Ələmpur Rəcəb orada çox sada müxtəlif dövrlərə aid sikkələrin saxlandığını (hətta 7000 il bundan əvvəl zərb edilən sikkələr) bildirdi. XIX əsrdə xorasanlı Mirzə Sənglaxın Məhəmməd (s) peyğəmbərin qəbri üçün hazırladığı zərif naxışlı sinə daşı da muzeyin birinci mərtəbəsində ön divara nəsb edilmişdir. Həm mahir nəqqaş, həm də şair olan Mirzə Sənglax həmin sinə daşını sifariş edən osmanlı sultanı ilə aralarında yaranan inciklik səbəbindən bu daşı 4000 km. yol qət edərək Təbrizə gətirmişdir.

Muzeydən çıxıb kluba gəldik - «Şəhid Mədəni» klubuna. Orada istedadlı rejissor Hüseyn Baqqal Lalənin tamaşaya hazırladığı «Heydər- babaya salam» musiqili pyesə baxdıq. Olduqca təsirli idi. Dəfələrlə səslənən tamaşaçı alqışları, bəzən də riqqətə gələnlərin axıtdıqları göz yaşları (Mehri Məmmədova hətta için-için ağlayırdı) bu tamaşa barədə başqa söz yazmağı lüzumsuz edir.

Tamaşadan sonra mən ustad Şəhriyarın qızı Şəhrzad, gəlini Sima Rəcəbzadə və nəvəsi Nəkisa ilə tanış oldum. Sima Rəcəbzadə elə mənimlə və Hacı Rafiqlə yanaşı əyləşmişdi. Olduqca savadlı və mədəni qadındır.

Axşam saat 16-da konfransın yekun yığıncağı öz işinə başladı. Şair Musəvi Gərmrudinin şe'rindən sonra söz prof. Yaşar Qarayevə verildi. Onun

aşağıdakı cümləsindən sonra salonda alqışlar qopdu: «İranda türk, Azərbaycanda fars dilini bilməyənlər ola bilər, amma Şəhriyar dilini bilməyən adam ola bilməz».

Ustad Nəzminin türk və fars dillərində oxuduğu iki qəzəldən sonra çıxış edən millət vəkilimiz Fəttah Heydərov özünün Təbrizə əvvəlki səfərləri ilə bağlı xatirələrini danışdı. Nüşabə Əlizadə, şairlər Yəhya şeyda, Beytulla Cəfəri, Şəkib, Kərimi-Marağayi və bu sətirlərin müəllifi öz şe'rlərini yığıncaq iştirakçılarına təqdim etdilər. Şəhriyarın türk dili xüsusundakı bir qəzəlinə yazdığım «Təxmis»in aşağıdakı bəndi oxunduqda zaldakı təəssüratı təsəvvür etmək heç də çətin deyildir:

*Bilələr gər bu dilin qədrini dünya dilidir,*
*Həmi surətdə gözəldir, həmi mə'na dilidir,*
*Həmi ülfət, həmi iffət, həmi sevda dilidir,*
*«Türki, vallah, analar oxşarı layla dilidir,*
*Dərdimi mən bu dəva ilə müdava elədim».*

Ertəsi gün Təbriz görüşlərimizi bitirib yenidən Tehrana uçduq. İki gündən sonra isə artıq Bakıdaydıq. Özüm Bakıya gəlmişdimsə də, xəyalım Tehranda, Təbrizdə, ustad Şəhriyarın gəzib-dolaşdığı yerlərdə uçmaqda idi.

*13-20.04.1998, Äzərbaycan-Iran-Azərbaycan*

## Yeddinci Səfərnamə Şe’rləri

*I*
*QƏZƏL*

*Sənsizəm, mən necə möhnət çəkirəm mən bilirəm,*
*Ayrılıqdan nə əziyyət çəkirəm mən bilirəm.*

*Neçə surət meyi süzmüş mənə mə’na qədəhi,*
*Bu fəraq içrə nə firqət çəkirəm mən bilirəm.*

*Öndə dağ, əldə külüngüm... Qələmimdir bu külüng,*
*Şirinim, mən niyə surət çəkirəm mən bilirəi.*

*Seçmirəm köhnə lüğətlərdən ərəb-fars sözünü,*
*Saf yazıb mən necə zillət çəkirəm mən bilirəm.*

*Bir gülü, qafil olub tapdamışam bağında,*
*Bağibanım, nə xəcalət çəkirəm mən bilirəm.*

*Gözləyirsən məni, saqi, sənə minnətdarəm,*
*Nə səbəbdən sənə minnət çəkirəm mən bilirəm.*

*Deməyin Şahinə qürbətdə fərəhdən bir də, Gecə-*
*gündüz necə xiffət çəkirəm mən bilirəm.*

*Tehran*
*13.04.98*

*II*
*MÜRƏBBE*

*Dərdimə canam loğman eləmişdim təzəcə,*
*Yenidən canımı hicran alovu yandırdı.*
*Eşqimə aləmi heyran eləmişdim təzəcə,*
*Yenidən canımı hicran alovu yandırdı.*

*Başlamışdı təzəcə əhd ilə peyman şövqü,*
*Düşünürdüm ki, yaranmaz daha hicran şövqü,*
*Çulğadı qəlbimi birdən-birə İran şövqü,*
*Yenidən canımı hicran alovu yandırdı.*

*Məşələ döndü alov, mən isə pərvanə kimi...*
*Məqsədi xatirə salmaqmı məgər həsrətimi?*
*Niyyəti yoxlamaq olmuşmu mənim taqətimi?*
*Yenidən canımı hicran alovu yandırdı.*

*Düşünürdüm mətinəm, sındıra bilmişdi məni,*
Sirr deyil, *bir neçə yol yandıra bilmişdi məni,*
*Şəhriyar eşqi ilə atəşə verdim bədəni,*
*Yenidən canımı hicran alovu yandırdı.*

*Mən ki ram eyləməyə naləmi söz vermişdim,*
*Yaxına qoymayacaqdım qəmi, söz vermişdim,*
*Mən ki tərk etməməyə ölkəmi söz vermişdim,*
*Yenidən canımı hicran alovu yandırdı.*

*Bülbüləm mən, məni gözlər süsənim, yasəmənim,*
*Dönərəm tez geriyə, arxayın olsun vətənim,*
*Şəhriyar ilə görüş naminə şadəm ki, mənim*
*Yenidən canımı hicran alovu yandırdı.*

*«Dözməsəm hicr oduna, - söylər idim, - ər deyiləm»,*
*Dözmürəm, dərk edirəm ki, daha sərvər deyiləm,*
*Çünki, mən şahinəm eşq içrə, səməndər deyiləm,*
*Yenidən canımı hicran alovu yandırdı.*

*Tehran*
*14.04.98*

*III*
*QİT'Ə*

*Tanış oldum gülərüz, baməzə bir baqqalla,*
*İçirəm Qumda yanıb qum kimi baqqal çayını.*

*Oturub üz-üzə vaxt vardı eyş eylərdim,*
*Nuş edərdim o şirin dilbərimin bal çayını.*

*Təşnəyəm öylə ki, indi Qubada olsaydım,*
*Qurudardım içərək bəlkə də Qudyal çayını.*

*Qum şəhəri*
*15.04.98*

*IV*
*QƏZƏL*

*Bağiban, baxmayıram sünbülü reyhan tərəfə,*
*Baxıram çünki yenə sevgili canan tərəfə.*

*Sevgilim, vəslə sanırdım daha yoxdur imkan,*
*Yenə cəlb eyləmisən fikrimi imkan tərəfə.*

*Yox idi can nəzərimdə, mənə vermişsən ruh,*
*Təzədən ruhə gəlib meyl edirəm can tərəfə.*

*Sən şəkərsənmi, deyilsən, şəkəristansan sən,*
*Şəkərim, gəlmədəyəm mən şəkəristan tərəfə.*

*Göz mürəkkəb tərəfə baxdı qəzəl yazmaqçın,*
*Qanə düşsün can atan varsa əgər qan tərəfə.*

*İstərəm mən təzədən vəsf eləyim İranı,*
*Qətrə təbim yenə yön tutmada ümman tərəfə.*

*Bakıda görmədilər Şahini, canan dedi ki,*
*Şahin uçmuş yenə şahin kimi İran tərəfə.*

*Tehran*
*16.04.98*

## *V*
## *QİT'Ə*

*Təbriz, ustad Şəhriyarın məzarı*
*önündə düşüncələr*

*Bəllidir ki, nə qədər mədəni saxlar dağlar,*
*Nə qədər gizli xəzinə dağın altında yatır.*

*Elə kəs var ki, kəfənsiz uyuyur torpaqda,*
*Elə adam dəxi var bayrağın altında yatır.*

*Uyuyur torpağın altında böyük bir şair,*
*Torpaq üstündə gəzən torpağın altında yatır.*

*«Məqbərətüş-şüəra» qəbiristanlığı*
*17.04.98*

*VI*
*QƏZƏL*

*İstəmişdi neçə yol sevgili canan - ləli,*
*İstədim töhfə edim bir neçə əlvan ləli.*

*Deyib «Allahə təvəkkül» səfərə əzm elədim,*
*Düşdüm hicranə, fəqət vermədi hicran - ləli.*

*Əfqanıstandakı ləlin əvəzi mümkünmü?*
*Tapmadım mən yaraşan yarıma İran ləli.*

*Neçə ləl almağa var idi əlimdə imkan,*
*Бəxş edə bilmədi amma mənə imkan - ləli.*

*Бizə can ləli ürəkdir, çıxarıb köksümdən*
*Hazıram təklif edim cananıma can ləli.*

*Gəlib ilhamə yara ləl kimi söz yazdım,*
*Şairin ləli yanında nədi sultan ləli?*

*Qiyməti «Divan»ımın ləli-Бədəxşandan çox,*
*Şahina, az tapılan daşdı Бədəxşan ləli!*

*Təbriz*
*17.04.98*

*VII*
*QƏZƏL*

*Söz demişik, sözdə qələt var imiş,*
*БИтэтщк, bizdə qələt var imiş.*

*Mən səni, ey gül, gülə bənzətmərəm,*
*Lalədə, nərgizdə qələt var imiş.*

*Qeys ilə Fərhadə əlac olmadı,*
*Dağda qələt, düzdə qələt var imiş.*

*Təbrizi bizdən ayırıbmış duman,*
*Söyləmə Təbrizdə qələt var imiş.*

*Çox üzə malik bu siyasətçilər,*
*Б1Г üzə bax, üzdə qələt var imiş.*

*Ərdəbil üçün darıxıbdır Бakı,*
*Бizdə xəta, sizdə qələt var imiş.*

*Zənn eləyirdim ki, bükülməz dizim,*
*Ağlayıram, dizdə qələt var imiş.*

*Şahına, vacibdi bəsirət gözü,*

*Üzdə olan gözdə qələt var imiş.*

*Təbriz*
*18.04.98*

*VIII*
*QƏZƏL*

*Sən mehrini göstər, yenə sevda eləyim zənn,*
*Bük zəhrini göndər mənə, həlva eləyim*
*zənn.*

*Bildir mənə şirinliyini, öylə danış ki,*
*Hər bir sözünü şəkkərü xurma eləyim zənn.*

*Surətdəki mə’nanı görən yoxdu mənimtək,*
*Sən surəti göstər mənə mə’na eləyim zənn.*

*Var öylə adam dilbəri ağlar gecə-gündüz,*
*Tök bircə gilə göz yaşı dərya eləyim zənn.*

*Yağmur kimi səp sən mənə xoşbəxtliyi öylə,*
*Aləmdəki bədbəxtliyi röya eləyim zənn.*

*Səhrayə yolum düşməsə də, istəyirəm ki,*
*Yarım, məni Məcnun, səni Leyla eləyim zənn.*

Canan dedi: - *Şahin, daha sən qürbətə getmə,*
*Yol vermə daha şahini durna eləyim zənn.*

*Təbriz*
*18.04.98*

*IX*
*QƏZƏL*

*Əlvida, ey həmsəfərlər, mən səfərdən bezmişəm,*
*Hər səfərdə min kədər vardır, kədərdən bezmişəm.*

*Xoş xəbərlər göndərən yox, bəd xəbərlər tez gəlir,*
*Bixəbərlər bilməyirlər bəd xəbərdən bezmişəm.*

*İstərəm sərhədsiz olsun bağlar xülya təki,*
*Bağiban istər çəpər, mən hər çəpərdən bezmişəm.*

*Bir yarım var, bezmirəm, amma demiş Xosrov mənə:*
*«Şirini istər könül, billəh Şəkərdən bezmişəm».*

*Söyləyirlər eşqdən əl çək, zərərdir, çəksəm əl Faidəm*
*vardırmı, ey Rəbbim, zərərdən bezmişəm.*

*Gör nə müddətdir mənim gülmür gözüm gülzardə,*
*Saqidən bezməkdəyəm, meydən də hərdən bezmişəm.*

*Neyləyim, qaçqınlarım, köçkünlərim zillət çəkir,*
*Bəd nəzərlər dəydi yurda, bəd nəzərdən bezmişəm.*

*Doğru sözdür, dustlər, ortaq malın var əngəli,*
*Müştəri beşdir, Xəzər bir*[1]*, dərdisərdən bezmişəm.*

*İsti qum, əngin səma, səhradə Leyla-yanğısı,*
*İstərəm Məcnun olum, Şahin, şəhərdən bezmişəm.*

*Tehran*
*19.04.98*

[1] Azərbaycan, İran, Rusiya, Qazaxıstan, Türkmənistan.

*QİTƏ*

*Varağım şe᾽rlə doldu, bu gecəm uğurlu oldu,*
*Yenə sübh açıldı, saqi, gətir axşamın meyindən.*

*Necə də səliqəsizdir gecə yazdığım sətirlər,*
*Qələmim də məst olubdur yenə ilhamın meyindən.*

*Yenə uçmada xəyalım, sonu varmı arizunun?*
*Nə ola içəydim indi Cəm içən camın meyindən.*

*Mənə surə mey olubdur, şərabım olubdur ayə,*
*Hanı islamın şərabı, hanı islamın meyindən?*

*Niyə sərxoş olmuram mən, mənə sən su vermisənmi?*
*Mənə, saqi, öylə mey ver ola Xəyyamın meyindən.*

*20.04.98*

*XI*
*QİTƏ*

*Eşq əzəl qismət olub Adəm ilə Həvvayə,*
*Xoş gəlib onlara, sonra yayılıb dünyayə.*

*Elə eşq gəzirəm mən bizə olsun örnək,*
*Sevəni şövq eləsin surətə yox, mə'nayə.*

*Fəqət eşqində şirinlik gəzən aşiq hanı ki,*
*Dikməyə gözlərini tutti kimi xurmayə.*

*Meyi zəqqum billə, zənn eyləyə həlvanı acı,*
*Nə sala badəyə meylin, nə baxa həlvayə.*

*Hanı aşiq gözü ki, əzmi görünsün gözdə,*
*Neçə daş-qaşə görə başlamasın qovğayə.*

*Gözü olmuş bulaq aşiq görürəm mən, sanki*
*Axıdıb göz yaşı verməkdə açıq dəryayə.*

*Nə dəli söyləyəcəklər, nə şəhərdən qaçacaq*
*Kim ki, Şahin təhəri düşsə əgər sevdayə.*

*Tehran*
*20.04.98*



# SƏKKİZİNCİ SƏFƏRNAMƏ

## *«MƏŞHƏDİN HƏR DAŞI MƏRCÄNƏ BƏRABƏRMİŞ Kİ!..»*

Mənim İran ölkəsinə budəfəki səfərim gözlənilməz oldu. Əməkdaşı olduğum Elmlər Akademiyası Tarix İnstitutunun direktoru İqrar Əliyev belə təklif etdi:

- İran səfirliyindən İrana getmək üçün bir alim xahiş ediblər. Bilirəm, orada çox olmusan, amma bu səfər maraqlı olmalıdır. Oraya nüfuzlu bir heyət yollanır və proqramma Məşhəd ziyarəti də salınmışdır. Getməzsən ki?

Axşam İqrar müəllimə zəng edib razı olduğumu bildirdim. Səfəri təşkil edən İran İslam Cümhuriyyətinin «İmdad» Komitəsinin Azərbaycan Respublikasındakı səlahiyyətli nümayəndəsi möhtərəm Hacı Bəhram Kazımzadənin rəhbərliyi ilə iyun ayının 15-də rahat bir avtobusa əyləşib Bakı-Astara istiqamətində yola düşdük. Gecə yarıdan keçmişdi. Hava xoş idi. Avtobusda 25 nəfər azərbaycanlı alim və şair, həmçinin «İmdad»ın işçilərindən şair təbiətli füzulişünas Tahi rvə operator Əlihü- seyn də vardı. Lənkəranda oranın Dövlət Universitetinin 3 alimi də bizə qoşulmalı idi. Elə də oldu. 31 nəfərdən ibarət nüfuzlu heyət Azərbaycan Astarasından İran Astarasına qədəm basdı və qonşularımızın bir dəstə məsul işçisi tərəfindən böyük ehtiram və qonaqpərvərliklə qarşılandı. Hey’ətimizin tərkibində EA Milli Münasibətlər İnstitutunun direktoru, prof. Vaqif Arzumanlı, Bakı Dövlət Universitetinin professorları Abuzər Xələfov, Əyyub Əzizov, tarix elmləri doktoru Həsən Əlibəyli, iqtisad elmləri doktoru, prof. Əhməd Sadıqov, EA Aşqarlar kimyası institutunun direktoru, prof. Vaqif Fərzəliyev, Lənkəran Dövlət Universitetinin prorektoru, prof. Tanrıverdi Əzizov, şairlər Balasadıq və Ənvər Əhməd, fəlsəfə elmləri doktoru, prof. Yusif Rüstəmov, incəsənət elmləri doktoru, prof. Hüseynağa Hüseynov, memarlar - elmlər namizədi Nəriman Əliyev, Kazım Ağabəyov, Vidadi Muradov və başqaları da vardı.

İran ərazisi ilə irəliləyirik. Budur, Vizinə kəndi. Astara ərazisi bu kənd ilə bitir və Talış başlayır. Talış şəhərində «Azərbaycan» restoranı. Lisar kəndi. Covkəndən kəndi. Mən birdən-birə elə bu yerlərdə yaşayan 85 yaşlı şair Haruni Şəliqi Ənbəranı xatırladım. Bir neçə ay bundan qabaq «Divan»ı əlimə düşmüşdü. Nəsr əsərləri də var.

Avtobus tər-təmiz və səliqə-sahmanlı asfalt yolla irəliləyir. Səfəvilə- rin məşhur qohumlarından olan Şeyx Zahid Gilaninin qohumları bu yerlərdə yaşamışlar. Onun Seyid Niki, Seyid Əhməd və başqa qohumlarının köhnə məzarları. Tanrıverdi müəllim dedi ki, Şeyx Zahidin qəbri bizim kənddədir - Lənkəranın Şıxəkəran kəndində. O, mənə «Şeyx Zahid türbəsi» adlı bir məqalə verdi. Müəllifi Ş.Nəzərli olan bu yazıda şeyx haqqında maraqlı məlumat vardır. Orada göstərilir ki, bu məşhur şeyxin əsl adı Tacəddin İbrahimdir. O, ilk təhsilini Lənkəranın Butəsər kəndində təbrizli Seyid Cəmaləddindən almışdır, ona elə «Zahid» ləqəbini də o seyid vermişdir. Cəmaləddin Astarada yaşadığı illərdə bir çox dini ayin təbliğ etmiş və oğlu Seyid Sədullanın köməyi ilə rəhbəri olduğu təriqəti Abşe’ron ərazisində yaymışdır. Sonralar Bakıda Seyid Sədullanın «Xey- riyyə» cəmiyyəti yaradılmış və o, Azərbaycanda sufiliyi yaymağa cəhd etmişdir. Görünür, buə məl baş tutmamış və Sədulla məxsusi ekstaz vəziyyətdə Allaha yaxınlaşma tələb edən sufizmdən birdəfəlik əl çəkib ənənəvi İslam yoluna qayıtmışdır.

Şeyx Zahid Gilani Lənkəranda evlənmiş, bir neçə il sonra onunla Şeyx Səfiəddin Ərdəbili (Şah İsmayılın ulu babası - Ş.F.) arasında yaxın qohumluq münasibəti yaradılmış və Şeyx Seyidin qızı Bibi Fatiməni almışdı (Bir neçə gündən sonra mən Ərdəbildə onların məzarlarını ziyarət etdim). Deməli, Şah İsmayıl Xətainin dördüncü babası Şeyx Sədrəddin Musa (Şeyx Səfiəddinin oğlu - Ş.F.) anna tərəfdən Lənkəranlı, ata tərəfdən Ərdəbillidir.

Şeyx Zahid Azərbaycan, türk, fars və kürd dillərini gözəl bilmişdir. Xalq arasında böyük hörməti olan bu kəramətli şeyx dövrünün hökmdarları (məsələn, Qazan xan) ilə görüşmüş, onlara müəyyən məsləhətlər vermişdir. Şeyxin dəfn olunduğu yer barədə ziddiyyətli mülahizələr vardır. XVII əsr alman səyyahı Adam Oleari onun Astaranın Şindan qalasında, İran alimi Səid Nəfisi Lahicanın Şıxənbar kəndində, digər İran tədqiqatçısı Seyid Əbdürrəhim Xəlxali isə Gilanın Sesər adlı kəndində dəfn olunduğunu göstərmişlər. Başqa İran alimi Fəxrəddin Musəvi şeyxin məzarının keçmiş Çiləkəran, indiki

Şıxəkəran kəndində olduğunu qeyd etmişdir. Şah İsmayılın atası Şeyx Heydər 1488-ci ildə Lənkərana gəlib orada Şeyx Zahidin məqbərəsini təmir etdirmişdir.

Mən o böyük şeyx haqqında fikirlərə qərq olmuşdum, avtobusumuz artıq Xəlifabadı, Rizvanşəhri və kəpurçalı arxada qoymuşdu. Qarşıya çıxan çayların üstündən yan-yana iki körpü salınmışdır: biri maşınların hərəkəti, o biri isə piyadaların gediş-gəlişindən ötrü. Y ol boyu çoxlu dini şüarlar gözə dəyir: «Bər Məhəmməd və ale-Məhəmməd salavat» («Məhəmmədə və Məhəmməd xanədanına salavat»), «Allah-əkbər», «Əs-sə- lam əleyk, ya Ruhullah!», «Ya Şahibəz-zaman» və s. Yollarda polis nəfərləri və yol müfəttişləri yoxdur, sağ və sol boyunca uzanan geniş çəltik sahələri göz oxşayır.

Budur, Ənzəli şəhəri. Evlərin əksəriyyəti bir və iki mərtəbəlidir. Solda Xəzər göyərir...

Gözəl Lahican şəhərinə çatırıq. Yuxarıda Zaqros dağları, aşağıda Xəzər dənizi. Lahican təbiətinin gözəlliyi qəlbimi riqqətə gətirir, mənə ilham gəlir:

*Aşağıda dəniz, yuxarıda dağ,*
*Aşağı Xəzərdir, yuxarı Zaqros.*

*İlin hər fəslində göydür bu torpaq,*
*Özündə saxlayıb baharı Zaqros.*

Lahicanın əsrarəngiz gözəlliyi artıq arxada qalmışdı. Çaboksər (Gəcsər) şəhərinə gəlib «Ordugahe-şəhid Mütəhhəri» («Şəhid Mütəhhəri istirahət parkı») adlı, gül-çiçəkli bir yerin qonaq evində gecələdik. Ertəsi gün Ramser şəhərinə çatdıq, azacıq dincəlib Tünəkabona, oradan çıxıb Calusa yetişdik. Əliabad, Novşəhr, ruyan, Mahmudabad, Amil, Xəzərşəhr, Babilsər, Sari, Behşəhr, Gürgan şəhərlərindən keçdik. Gürganda «Vis və Ramin» epik dastanının müəllifi Fəxrəddin Gürganini xatırladım. Fəxrəddini Gürgan boya-başa yetirdi, Gürganı Fəxrəddin məşhur etdi. Belə şərəf hər şairə qismət olmur. Hər şirazlı şair Sədi, hər
gəncəli mütəfəkkir Nizami olmur.

Minudəşt şəhristanının (şəhərciyinin) «İstiqlal» otelində gecələdik. Otelin giriş qapısında böyük, ağ parça üzərinə yaşıl rənglə fars dilində yazılmış bir neçə sətir söz diqqəti cəlb etdi: «Azərbaycan Respublikası ali

məktəblərindən şəhidpərvər Minudəşt şəhərinə təşrif gətirən möhtərəm ustadları salamlayırıq». Bizi orada salamlayanlar arasında İran Milli Məclisinin deputatı ağayi-Abbasəli də vardı.

Ertəsi gün Bocnurd şəhərini arxada qoyub «Baba Əman» parkı adlanan böyük bir istirahətgahda bir qədər dincəldik. Şərəfimizə ziyafət verildi.

Rzaabad şəhərini keçdikdən sonra yol kənarında lövhələrdən birindəki yazı diqqətimi cəlb etdi. Öndə, 18 kilometr məsafədən sonra Şirvan adlı bir şəhər olacaq. Düşünürəm: Görəsən bizim Şirvan torpağımızla İran Şirvanı arasında nəsə bir yaxınlıq, doğmalıq ola bilərmi?

Şəhərə daxil oluruq. Böyük və yaraşıqlı məscidi var. Küçə və evlər başqa İran şəhərlərindəki küçə və evlər tərzində salınmış, inşa olunmuşdur. Buranın əhalisinin kimliyi ilə maraqlandım. Əksəriyyəti kürdlərdir, amma Şirvandan bir qədər aralı Faruc adlı şəhərdə isə əsasən azərbaycanlılar yaşayırlar.

Qucan şəhəri. Sonra isə tarixi Çinaran. Burada çinar çox az gözə dəyir. Yəqin ki, orta əsrlərdə bu yerin çinarı bol olubmuş, indi isə bağ- bağatı, meyvə ağacları boldur.

Çinaran-Məşhəd yolu ilə irəliləyirik. Məşhədə bir saatlıq məsafə var. Şe’r dəftərim dizimin üstündə, qələmim əlimdədir. Nədənsə, birdən- birə Seyid Əzim Şirvani ilə Hümam Təbrizi yadıma düşdü. Elə onsuz da Seyid Əzimi həmişə anıram, çünki onun qəzəllərinin vurğunuyam. Bəs Hümam niyə yadıma düşdü? Bilmirəm. Bəlkə, tarixi bir mənbədə Hümamın Məşhəd ziyarəti barədə oxuduğum məlumat yadıma düşdü. Seyid Əzim Şirvani və Hümam Təbrizi. İki gözəl qəzəl ustadı. Yazdığım yeni qəzəlin bir beytində Şirvan və Təbrizlə yanaşı Seyid Əzim və Hümam da xatırlandı:

*БıГ ölkəni, min əfsus bir çay iki pay etdi,*
*Şirvanda Seyid varsa, Təbrizdə Hümamım var.*

Axşam saat 7 radələrində Məşhədə çatdıq. «Milad» adlı zayersa- rayda (zəvvar evində) bizi gözləyirdilər. «İmdad» komitəsinin inşası yenicə bitmiş mehmanxanasıdır. Oranın ilk mehmanları biz olduq. Xorasan ostanının məsul işçiləri ilə görüş. Sabah isə səkkizinci imam olan Rza Əleyhüssalamın «Hərəme-mütəhhərini» (pak məscidini) ziyarət etməliyik. Bu, mənim son bir neçə ildə məscidi 4-cü ziyarətim olacaq.

İmam Rza kim olub? Ərəb dünyasının və təəssübkeş islam ölkələrinin

fəxr etdikləri bu imam niyə cilayi-vətən olaraq İrana gəlmiş və orada şəhid olmuşdur? Bu haqda oxuculara müxtəsər məlumat vermək yerinə düşərdi:

İmam Rza hicrətin 148-ci ilində ziqədə ayının 11-də Mədinə şəhərində doğulmuş və 55 il ömür sürmüşdür. Adı Əli, ləqəbi Rzadır. Onun imamətlik dövrü üç Abbasi xəlifəsinin (Harun, Əmin, Məmun) hakimiyyəti illərinə təsadüf edir. İmam Rza imamətin 17 ilini Mədinədə, 3 ilini isə İranda (Xorasanda) keçirmişdir.

Qeyd olunmalıdır ki, Abbasilərin xilafəti dövründə Ələvilər (Əli tərəfdarları) və iranlılar bu hakimiyyətə qarşı mübarizə aparırdılar. Elə buna görə də xəlifə Məmun imam Rzanı Mədinədən uzaqlaşdırdı, bir növ sürgün etdi. İranın Nişabur şəhərinə gələn imamın getdikcə artmaqda olan nüfuzundan yaxşı xəbərdar olan Məmun onun həyatına sui-qəsd təşkil etdi və imam şəhid oldu. İmamın xilafətin təzyiqi ilə Mədinədən uzaqlaşdırılan ailə üzvlərindən Həzrət Məsumə Qum şəhərində, digər iki bacısı isə Azərbaycanda dəfn olunmuşlar. Sübh saat 7-də şəriət qayda-qanunu ilə çimdim, qüsl etdim: çiməndən sonra bir teşt suyu başıma, ikincisini sağ çiynimə tökə-tökə təkrar etdim: «Ya İlahi, sənin izninlə Həzrət İmam Rzanın ziyarətinə gəlmişəm. Ya İmam Rza, ziyarətimi qəbul elə».

Budur, artıq hərəme-mütəhhərdəyik. Dua oxuduq, ziyarət namazı qıldıq, ürəyimizdəki niyyətləri dilimizə gətirdik. Hərəmdə həmişə olduğu kimi çoxlu zəvvar vardı. Özümü məzarın şəbəkəsinə çatdırdım, şəbəkəyə əl vurdum, üz sürtdüm və 4-cü dəfə məşədi oldum.

Ziyarətdən sonra məscidin kitabxanasına («Astane-qüdse-Rezəvi») getdik.

Xarici əlaqələr şöbəsinin müdiri ağaye-Mərcayi ilə tanışlıq. Azərbaycanlıdır, Hindistanda ali təhsil alıb, şairdir, ingilis dilində bir şe’r kitabı var. Söhbətimiz baş tutdu. Ona bir neçə beyt şe’r dedim. Deyəsən, xoşuna gəldi. Məndən «Divan»ımı istədi. Ona lap elə bu günlərdə ikinci dəfə çap olunan «Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə» adlı kitabımın bir nüsxəsini təqdim etdim. Kitab latın əlifbası ilə yazıldığı üçün ağaye-Mərcayi dərhal onun «Giriş» hissəsini oxudu və bu kitabın İran tarixi üçün əhəmiyyətli olduğunu söylədi.

«Astane-qüdse-Rezəvi» kitabxanasının 1200 yaşı var. Həzrət Əlinin, imam Həsən və Hüseynin, Zeynalabdinin (4-cü imam Səccad) və şərqin böyük

mütəfəkkiri Şeyx Bəhainin öz əli ilə yazılan əlyazma nüsxələri. İran İslam İnqilabına qədər bu kitabxanada 70 min kitab vardı, hazırda isə 56 dildə 500 mindən çoxdur (İranın 23 digər şəhərindəki İmam Rza məscidinin kitabxanasının filiallarında isə 600 min cild kitab vardır). Bu kitabxanaa hər gün 7-8 min oxucu gəlir. Bütün işlər kompüterlə idarə olunur. 8 oxu zalı vardır: 4-ü qadınlar, 4-ü kişilər üçün.

Ağaye-Mərcayi dedi ki, keçən il Mirzə Fətəli Axundov adına Azərbaycan Dövlət Kitabxanasının direktoru Leyla xanım burada olub və kitabxanalararası mədəni əlaqələr barədə bizimlə danışıq aparıblar, lakin çox təəssüf ki, bu sahədə fəaliyyətsizliyimizə görə danışıqlarımız hələlik nəticəsiz qalmışdır.

«Astane-qüdse-Rezəvi» kitabxanası 8 guşəli (8-ci imam Rzanın şərəfinə) böyük bir binadır. Guşələrin birində Mədinə şəhərindəki «Quba məscidi» kitabxanası kimi (fərşdən tavanadək nəhəng xurma ağacının budaqları uzanmış, salona dekorativ gözəllik bəxş etmişdir) məscid kitabxanası tikilmiş, divarların birinə İmam Zeynalabdinin xətti ilə ahu dərisi üzərində yazdığı Quran kitabından 4-cü ayə həkk edilmişdir.

O günün axşamı biz Məşhəddən 20 dəqiqəlik maşın yolu məsafəsində yerləşən Tuş şəhərinə yollandıq. Fars şe’rinin öncül nəhəngi olan Əbülqasim Firdovsinin əbədi uyuduğu tarixi Tus. Böyük şairin məzarını ziyarət etdik. Mən iki il bundan əvvəl də bu məzar önündə baş əymişdim. Musiqisi Tofiq Bakıxanov tərəfindən bəstələnmiş ««Şahnamə»si ürəkdədir adlı şe’rimi xatırladım:

*Firdovsini yad elədik,*
*«Şahnamə»si ürəkdədir.*
*Dönə-dönə rəhmət dedik,*
*«Şahnamə»si ürəkdədir.*

*Bağban varsa çiçək də var,*
*Cahan varsa dilək də var,*
*İnsan varsa ürək də var,*
*«Şahnamə»si ürəkdədir.*

*Yaşamayıb ömrü hədər,*
*Şöhrəti var dünya qədər,*

*Şahlar gələr, şahlar gedər,*
*«Şahnamə»si ürəkdədir.*

*Əsrlərdə qalan kəsin,*
*Min yaşına dolan kəsin,*
*Şe'rin şahı olan kəsin «Şahnamə»si*
*ürəkdədir.*

*Yer vardır hər könüldə,*
*Ötsə neçə ay da, il də,*
*Firdovsinin adı dildə,*
*«Şahnamə»si ürəkdədir.*

Məzarı ziyarətdən sonra «Gəncineyi-Tus» muzeyinə daxil olduq. Bu muzeydə hər şey Firdovsini xatırladır. «Şahnamə»də təsvir olunan müxtəlif hadisə və qəhrəmanların həyatına həsr edilmiş rəngarəng şəkillər, hərb alətləri, etnoqrafik əşyalar, böyük tablolar... Bir daha böyük şairin məzarı önünə gəldim və dilimdən bu misralar axdı:

*Nakam idi ürəyim, kamə çatıbdır burda,*
*Qoparıb nisgili bir yolluq atıbdır burda.*
*Mən ziyarət elədim Tusə gəlib bu zatı,*
*Ulu Firdovsi min ildir ki, yatıbdır burda.*

Axşam «Milad»a qayıtdıq. Bir qədər dincəlib, yenə imamın «Hərəme-Mütəhhərinə» getdim, o böyük məscid kompleksini bir daha heyranlıqla gəzib-dolandım. Artıq 5 gün idi ki, Bakıdan çıxmışdım. Bu vaxt ərzində müxtəlif vəznlərdə 7 şe'r yazmışdım. İranın füsunkar təbiəti, ələlxüsus mənə olduqca mehribanlıqla yanaşan insanları ilham vermişdi. Təbimin köhləni dördnala çapmaqda idi və dərhal bir qəzəl yarandı:

*Məşhədin hər daşı mərcanə bərabərmiş ki!*
*Qəlbimin sevgisi ümmanə bərabərmiş ki!..*

Ertəsi gün iyunun 20-si idi. Səfərimizdən 6 gün keçirdi. Saat 10-da Məşhəddəki Firdovsi adına Universitetin Ədəbiyyat və ictimai elmlər

fakultəsinin rektoru bizi qəbul etdi. Bu institut səviyyəli böyük fakültəsnin 50 yaşı və 8 şöəbsi var: Fars dili və ədəbiyyatı, ingilis dili və ədəbiyyatı, fransız dili və ədəbiyyatı, ərəb dili və ədəbiyyatı, tarix, coğrafiya, ictimai elmlər, dilçilik. Gələn il fakültədə rus dili və ədəbiyyatı şöbəsi də açılacaq (Kaş Azərbaycan dili və ədəbiyyatı şöbəsi də açılaydı).

Görüşdə bir neçə professorumuz - V.Arzumanlı, H.Əlibəyli, Ə.Əzizov, Y.Rüstəmov çıxış etdi, Ənvər Əhməd, Balasadıq və mən şe'r dedik. Görüş bitdikdən sonra rektorla vidalaşdıq və avtobusla Ömər Xəyyamın yaşadığı və yazıb-yaratdığı Nişabur şəhərinə yollandıq.

Məşhəd-Nişabur yolu təbiəti etibarilə nəzəri bir qədər az özünə çəkir. Yolun hər iki tərəfindən boz çöllər, çılpaq dağlar...

Amma Nişabura yaxınlaşdıqca yaşıllıq artmaqdadır. Budur, qoca Nişabur. Böyük şəhərdir. Geniş küçələr, tipik evlər, mağazalar və . Mehriban insanlar. «Cahangərdi» mehmanxanası. Şəhərin fərmandarı, Nişabur universitetinin rektoru, alimlər, müəllimlər, din xadimləri bizi qarşıladılar. Nahar yeməyindən sonra məşhur «Məhəmməd Məhruq» məscid kompleksini ziyarətə getdik. Özü ələvi olan və xəlifə tərəfindən diri-diri yandırılan («məhruq»- atəşə verilən, yandırılan deməkdir) Məhəmməd Məhruqun məzarı önündə dayanıb onu andıq. Bu aramgahın sol yanındakı mavzoleydə isə İmam Musanın nəvələrindən İmamzadə İbrahimin məzarı var. Gül-çiçəkli həyətdən keçib 5 guşəli bir abidəyə yaxınlaşırıq. Budur, zəmanəsinin məşhur filosofu, riyaziyyatçısı, astronomu və şairi olan Ömər Xəyyamın məzarı. Həndəsi fiqurlu, üstü yazılı və naxışlı bir qəbir daşı. Bu abidə məni xəyallandırdı və xəyalımın şahini min il geriyə uçdu, nəzərimdə Xəyyam canlandı. Canlandı və yenə yox oldu. Yerin üstündə 5 guşəli həndəsi fiqurlu, üstü yazılı və naxışlı bir qəbir daşı, qəbir daşının altındasa ulu Xəyyamın on əsr bundan qabaq bu məzarda dəfn olunmuş nəşi, şe'r, elm və irfanla dolu başı. Mən elə oradaca yazdığım bir Qit'əni Xəyyamın məzarı önündə təzimlə dayananlara oxudum:

*Meyi meyxanədə tökdüm yerə şərbət gəldi,*
*Məni şad eylədi saqi dolu bir cam ilə.*

*Təbimin şahini tab aldı həmən şərbətdən,*
*Başladım yazmağa misraları ilham ilə.*

*Şükür olsun sənə ey Tanrı, min ildən sonra*
*Mən Nişaburda görüşdüm ulu Xəyyam ilə.*

İran xalqı şe’rpərvərdir, şe’rsevərdir. Qit’ənin qiraəti qurtaran kimi iki yerli alim mənə yanaşıb həmin şe’ri onların xatirə kitabçasına köçürməyimi xahiş etdi.

Şair Xəyyamın mavzoleyini tərk edib nəqqaş Kəmalülmülkün (XX əsrin məşhur fars rəssamı) mavzoleyinə yollandıq. Sonra isə başqa bir klassik şairin məzarını ziyarət etdik. Fəridəddin Əttar. Hicrətin 618-ci ilində monqollar tərəfindən öldürülən Şeyx Əttar. Fars ədəbiyyatı tarixində ilk irfan və təsəvvüf şairi. «Əsrarnamə», «Məntiqüt-teyr», «Təzkirətül-övliya» kimi məşhur əsərlərin müəllifi, 114 il yaşayan, 114 əsər yazan (Quranda da 114 surə var) ustad bir şair.

Nişapurla Məşhəd arasında «Qədəmgah» adlanan tarixi bir məkan var. Deyilənə görə, imam Rza buradan keçərkən qədəmini yerə bərk vurub və orada bir bulaq çıxıb. Biz hal-hazırda yerdən iki metr aşağıda olan həmin bulaqdan su içdik, imamın hər iki ayağının izi nəqş edilən divarın önündə sükut içərisində dayandıq. Yanımızdakı zəvvarlar həmin ayaq nəqşini öpüb imama dua edirdilər.

Məşhədə qayıtdıq. Axşam «İmdad» Komitəsinin beynəlxalq işlər üzrə müavini ağaye-Ənvari ilə görüş. O, elə bu gün Tehrandan uçmuş və bizimlə tanış olmaq üçün Məşhədə təşrif gətirmişdir. Yenə çıxışlar, şe’rlər...

Ertəsi gün bir neçə saat Məşhəddəki mədəniyyət və istirahət parkında (Ordugah) dincəldik, iranlı dostlarla söhbətləşdik, musiqiyə qulaq asdıq. Yadıma Əfqanıstan düşdü. «Əfqan» dostum prof. Həsən Əlibəyli diqqətimi həzin-həzin səslənməkdə olan bir əfqan musiqisinə cəlb etdi. Sonra şair Ənvər Əhməd öz Qarabağ ləhcəsi ilə Azərbaycan muğam və təsniflərini ifa etdi. Sonra isə «Baharıstan» restoranı.

İyunun 22-də axşam saat 15-45-də təyyarə Tehran səmtinə yön aldı. Budur, dəfələrlə olduğum «Mehrabad» təyyarə meydanı. Biz yenə «İmdad» Komitəsinin məsul işçiləri tərəfindən ehtiramla qarşılandıq.

«Mərmər» oteli. Şam yeməyi. İstirahət.

Ertəsi gün. Özəl İslam Universitetinə gəldik («Daneşgahe-islamiye-azad»). Bu böyük təhsil ocağının İranın müxətlif şəhərlərində 120 filialı vardır

və onlarda 700 min tələbə təhsil alır. Təhsil haqqı kimi hər tələbə ildə 120 dollar pul ödəyir. Əlverişlidir, deyilmi?

Universitetin laboratoriyalar kompleksi. Kimyəvi və fiziki təcrübələr aparılan laboratoriyalar. Elektron maşınlar, kompüterlər. Günorta «İmdad»ın rəisi ağaye-Nəyyari ilə rəsmi görüş.

Axşamüstü İran Xarici İşlər Nazirliyinin Siyasi və Beynəlxalq Araşdırmalar Mərkəzinin binasında olduq. Orada artıq ikinci gündür ki, Xəzər problemlərinə həsr olunmuş 7-ci beynəlxalq konfrans keçirilir. Bizi binanın qarşısında İİR-in Bakıdakı fövqəladə və səlahiyyətli səfiri ağaye-Əlirza Bigdeli və Tehrandakı Azərbaycan səfirliyinin məsul işçisi Eynulla Mədətli qarşıladılar. İran səfirliyinin sabiq işçisi ağaye-Hafizi ilə görüşdüm. O, məni sevindirib dedi ki, mənim vaxtilə Əfqanıstanda əldə etdiyim, osmanlıcadan azərbaycancaya çevirdiyim və 1992-ci ildə Bakıda çap etdirdiyim Jozef Tiflisinin «Vaqeate-Mir Veys və Şah Hüseyn» adlı kitabım yaxın vaxtlarda Tehranda fars dilində (mənim tərcüməmlə) çap olunacaqdır.

Konfransın axşam iclasında Azərbaycan Xarici İşlər Nazirinin müavini Xələf Xələfovun çıxışı oldu və maraqla qarşılandı.

Sonra İran Xarici İşlər nazirinin müavini Sadiq Xərrazinin bizimlə görüşü keçirildi və hamımız qəbul otağında dəyirmi miz ətrafında əyləşdik.

Sadiq Xərrazinin dediklərindən: İran Cümhuriyyəti və Azərbaycan Respublikası bir-birilərindən ayrı yaşaya bilməzlər. Azərbaycan İranın xarici siyasətində hər gün diqqət mərkəzində olan mühüm bir ölkədir. Azərbaycanın abadlığı İranın abadlığıdır. Biz Azərbaycanı, onun ərazi bütövlüyünü və müstəqilliyini müdafiə edirik. Biz Azərbaycanın müstəqil dövlət kimi qalmasından ötrü, hətta öz qanımızı belə əsirgəmirik. Əcdadlarımız bəşəriyyətin inkişafında həmişə əlbir hərəkət etmişlər. Biz sizin hər bir uğurunuza sevinirik. Siz gərək yalnız İran-Azərbaycan hüdudunda deyil, bütün islam ölkələri hüdudunda fəal olasınız...

Sadiq Xərrazi ilə görüşdən sonra yenidən konfrans zalına qayıtdıq və o, son söz deyərək bağlı elan etdi.

İyunun 24-də sübh tezdən Quma yollandıq. Mən bu İran şəhərində (əhalisinin sayı bir milyondan çoxdur) dəfələrlə olmuşamsa da, yenə də oraya sonsuz həvəslə gedirəm. Tarixi yerdir və yüzlərlə şair, alim, tarixçi və ruhani mütəxəssis yetişdirməsi ilə fərqlənir. Görkəmli tarixçilər Həsən bəy Rumlu və

Qazi Əhməd Qumi bu şəhərdə doğulmuşlar.

Qumda müxtəlif institutlar fəaliyyət göstərir. Orada qadın həkimlər hazırlayan Tibb Universiteti açılmışdır. Dini təhsil almaqdan ötrü dünyanın 84 ölkəsini təmsil edən minlərlə tələbə məhz bu şəhərdə yaşayır və oxuyur ki, onların arasında 200-dək azərbaycanlı da vardır. Şəhərdə 38 kitabxananın olması elmə marağın və dövlət qayğısının təzahürü deyilmi?

Qum şəhəri imam Rzanın bacısı Həzrəte-Məsumənin möhtəşəm məscidi ilə dünyada məşhurdur. Bu məscidi hər il 10 milyon zəvvar ziyarət edir.

Mən bu dinpərvər şəhərdə bir saat bundan əvvəl yazdığım bir Qit'əni möhtərəm oxuculara təqdim edirəm:

*Gəlmişəm səcdənə, ey Məsumə,*
*Qəlbimə daimi nisgil Sənsən.*
*Nurisən gözlərinin dindarın,*
*Dinsizin gözlərinə mil Sənsən.*

*Qum sanı var idi dərdim Qumda,*
*Eləyən dərdimi yüngül Sənsən.*

*«Sevginin sahili olmaz» dedilər,*
*Бəлкə də sevgimə sahil Sənsən.*

*Nur edən məscidi qəndilmi məgər?*
*Бu şərif məscidə qəndil Sənsən.*

*Torpaq üstündə bitən gül çoxdur,*
*Torpaq altında bitən gül Sənsən.*

Mən bu Qit'əni İmam Xomeyninin Qumdakı evində bizim şərəfimizə keçirilən görüş zamanı qiraət etdim. Evin bir hissəsi artıq bir neçə ildir ki, muzeyə çevrilmişdir. Başqa hissəsi isə imamın vəfatından sonra «məqamı-müəzzəme-rəhbər» («əzəmətli rəhbər məqamı») vəzifəsini daşıyan ayətullah Xameneyi cənablarının dəftərxanası kimi fəaliyyət göstərir (bu evi ona imamın oğlu mərhum Əhməd Xomeyni bağışlamışdır). Orada bizi son dərəcə ehtiramla qəbul edən məsul bir ruhani şəxs (adını unutmuşam) dedi:

- Qum şəhəri qiyam şəhəri, eşq və məhəbbət şəhəridir. Həzrət Məsumənin məzarını ziyarət edən adam behiştə düşər, çünki o adamın Allahın yanında ehtiramı olar. Qumda, ümumiyyətlə, 400-dək imamzadə dəfn olunubdur. İmam Xomeyni isə məhz indi bizim olduğumuz bu evin həyətə açılan bu qapısından (əli ilə göstərir) İranda islam inqilabının başlanmasını elan ediö. Onu bu evdə tutub Ankaraya, sonra isə Bursaya göndəriblər. İmam Türkiyədəki 11 aylıq sürgündən sonra əvvəlcə Nəcəfə (İraqdadır) və nəhayət, Parisə getmişdir. Şah onu Türkiyəyə göndərdi, bütün türk dünyası onu tanıdı, imam Nəcəfə getdi, ərəblər arasında məşhur oldu. Fransaya üz tutdu, Qərb aləmində tanındı...

Qumla xudahafizləşib İmam Xomeyninin Qumla Tehran arasında yerləşən məşhur aramgahına gəldik. Yolda ikən avtobusda bu qəzəlimi yazdım:

*Alaraq şövq ilə islamdən ilhamı imam*
*Təzədən şövqə gətirdi ulu islamı imam.*

Bu mənim «Badeye-eşq» və «Divane-İmam» adlı irfani şe’r kitablarının müəllifi olan İmam Xomeyniyə həsr etdiyim (son üç ildə) üçüncü şe’rim idi.

Axşam «Mərmər» otelində rəsmi şam yeməyi. Səfirlər Abbasəli Həsənov və Əlirza Bigdeli, «İmdad» komitəsinin prezidenti ağaye-Nəy- yiri və başqa məsul şəxslər iştirak edirlər.

Əlirza Bigdelinin dediklərindən:

- Dünən bizim xarici işlər nazirimiz «Siz alimlər islam dünyasının sərvətisiniz» dedi. Mən bu sözlərdə mübaliğə görmürəm. İran Azərbaycan üçün, Azərbaycan isə İran üçün doğma vətəndir, sizin sərvətiniz bizim sərvətimizdir və ya əksinə. Zəncan zəlzələsi zamanı İrana öz yardım əlini uzadan ilk ölkə məhz Azərbaycan oldu...

Abbasəli Həsənovun dediklərindən:

- Son aylarda Azərbaycandan İran Cümhuriyyətinə bir neçə nümayəndə heyəti gəlmişdir, lakin siz ziyalıların səfəri həmin səfərlərdən çox fərqlənir, çünki İranı məhz ziyalı adamlar həqiqət gözü ilə görməyi bacarırlar. İran islam aləminin müxtəlif sahələrində böyük uğurlar qazanan ulu bir ölkədir. Bu ölkəyə qarşı qərb ölkələri tərəfindən çoxlu qeyri-obyektiv fikirlər irəli sürülür. Yaxın gələcəkdə Azərbaycanda Ermənistan işğalına son qoyulacaqdır. Azərbaycana «İmdad»ın köməyi hələ işğaldan əvvəl başlayıb. Bu komitənin

Azərbaycanda fəaliyyəti humanist, savab bir fəaliyyətdir. Sizin İrana təşrif gətirməyiniz bizim İranla əlaqələrimizin inkişafına böyük təsir edəcək. Siz sabah Təbrizə, sonra Ərdəbilə gedəcəksiniz. Oralarda da İranın uğurlarını görəcəksiniz.

Ağaye-Nəyyirinin dediklərindən:

- Məhəmməd peyğəmbər demişdir ki, başqa müsəlmanlara kömək etməyən müsəlman deyil. İmam Xomeyni İran İslam İnqilabının qələbəsindən heç 20 gün keçməmişdi ki, bu komitəni yaratdı. O deyirdi ki, biz gərək İrandakı və bütün dünyadakı müsəlmanlara öz köməyimizi əsirgəməyək. «İmdad» imamın bu göstərişinə ciddi riayət edir...

İyun ayının 25-i. Tehranın zingənlər məhəlləsi olan böyük bir hissəsinə - Şəmirana gedirik. İmam Xomeyninin ev-muzeyində, evin önündəki «Hüseyniyyə»də (kiçik məscid) və «Nigarıstan» muzeyində olmalıyıq.

Budur Cəmiranda - İmam Xomeyninin iki göz otaqdan ibarət evindəyik. İmam Qumdan Tehrana gələndən sonra bir müddət Dərbənddə (Tehranın yüksək bir səmtində yerləşən sahədir) yaşamış, sonra Cə- mirandakı bu kiçik evi kirayəyə götürmüşdür. Dövlət İmamın vəfatından sonra bu evi sahibindən satın alaraq onu mərhum imamın adına qeydiyyata salmışdır. «Hüseyniyyə»də bizə imamın həyatının son günlərini əks etdirən film göstərdilər.

Muzeyə daxil oluruq. Müxtəlif tablolar, imama məxsus əşyalar, sənədlər, əlyazmalar. Bir də şüşə arxasında saxlanan eynək, çəlik, ətir şüşəsi, təsbeh və s. İmamın mütailəsi ilə məşğul olduğu bəzi kitablar da nəzəri cəlb edir. Bizə məlumat verib dedilər ki, hakimiyyətdə olduğu dövrdə imama ölkə daxilindən bir milyon, xaricdən isə 200 minədək məktub gəlmişdir ki, onlar xüsusi arxivdə qorunmaqdadır.

Mən «Hüseyniyyə»də «Divan»ımda İmam Xomeyniyə həsr etdiyim şe’rimi oxudum. «Nigarıstan»da isə muzeyin xüsusi kitabçasında nümayəndə heyətimiz adından bir neçə xoş söz yazıb imzaladım.

Axşam isə Təbrizə uçduq. Çoxdan yazıb çap etdirdiyim bir qəzəlin bir beyti yadıma düşdü:

*Gedirəm Təbrizə mən bir məzar şövqüylə,*
*Bir məzar içrə yatan Şəhriyar şövqüylə.*

Təbriz şəhəri bizi mehribanlıqla qarşıladı. Xəfif meh əsirdi. Hava isti idi. Mehmanxanada şam yeməyindən sonra konfrans zalında təbrizli ziyalılarla görüş oldu. Mən iki həftə bundan əvvəl Bakıda söhbətləşdiyim təbrizli şair Daşqını da orada gördüm. Balasadıq və mən görüşdə şe’r oxuduq.

Üç milyona yaxın əhalisi olan Təbrizin hazırda «El gölü» adlanan istirahət guşəsi. Gecə gəzintisi. Minlərlə təbrizli artıq gecə yarısı olmasına baxmayaraq çəmənliklərdə əyləşib istirahət edirdi. Cümə günü idi. Belə istirahət günləri bizim üçün də zərurətdir...

Ertəsi gün bizi Təbrizin «Məşrutiyyət muzeyi»nə apardılar. İki mərtəbəli böyük bir binadır. Səttar xan və Bağır xanın büstləri, İranda ilk «Darüş-şura» («Milli parlament») üzvləri olmuş Siqqətül-islamın, Ziyaül-mülkün, Sadiqül-mülkün, Vali Ziyaullanın, Piranın, Şeyx Səlimin divarlardan asılan müxtəlif şəkilləri, sənədləri, əşyaları və s. Habelə onlardan 8 nəfərinin dara çəkilib qəddarlıqla qətl etdirildiyini əks etdirən böyük foto-şəkil. Şeyx Məhəmməd Xiyabaninin və Mirzə İsmayıl Növbərinin xalçalarda toxunmuş portretləri. Müzəffərəddin şah Qacar tərəfindən imzalanmış «qanuni-məşrutiyyət» sənədinin çərçivəyə salınmış surəti.

Muzeydən çıxıb Təbrizin baş ruhani rəhbəri Ayətullah Şəbüstərinin qəbuluna getdik. İranda islam inqilabının qələbəsində onun da xidməti olmuşdur. Kazımzadə, Sadat və Hacı Rauf çıxış etdilər.

Ayətullah Şəbüstərinin dediklərindən:

- Sizin İrana, xüsusən Təbrizə gəlişinizə görə çox məmnunam. Eşitdim ki, Məşhəddə və Qumda olmusunuz. Allah ziyarətinizi qəbul eləsin. Siz İrana İmam Xomeyninin 100 illiyi münasibəti ilə təşrif gətirmisiniz. İmamın arzusu islam ölkələrində elm və texnikanı daha da inkişaf etdirmək idi. Sizlər alimlərsiniz və şübhəsiz imamın bu müsbət fikrinin tərəfdarlarısınız. İmam və elm - islamın iki qanadıdır. Müsəlmanlar yalnız bu iki qanadla səadət zirvəsinə yüksələ bilərlər. Cabir ibn-Həyyane-Kufi altıncı imam Cəfəri-Sadiqin şagirdi olub, elmə böyük qiymət verib. O, çox məşhur kimyaçı-alim idi. Ümumiyyətlə, bütün imamlar elmi yüksək qiymətləndiriblər, deyiblər ki, əgər elminiz inkişaf etsə sizin başqa dövlətlərinköməyinə ehtiyacınız olmaz. İmam Xomeyni də elm və tərəqqinin inkişafına tərəfdar idi. İranda şah zamanı tələbə az idi, indi 10 dəfədən çox artıb. Təbriz elm şəhəridir. Təbriz və Azərbaycan həm dini, həm də elmi cəhətcə İranın ən çox inkişaf etmiş məkanıdır. Təbriz şəhərində 8

universitet var, 55 min tələbə təhsil alır. Təbriz institutlar şəhəridir. İranda elektrik işığı olmayan bircə kənd də yoxdur.

Görüşə Binab şəhərinin imamcüməsi də gəldi. Bəhram Kazımzadə də Binabdandır. Söhbətlər xeyli davam etdi. Ayətullah Şəbüstəri ilə xudahafizləşərkən mən ona keçən ilki görüşümüzü xatırlatdım. Mən onun yadına ustad Şəhriyarın 90 illik yubileyindəki görüşümüzü, o isə mənim yadıma həmin rəsmi görüş zamanı yüksək tribunadan oxuduğum şe’rimi saldı.

Sonra Şərqi Azərbaycan ostandarı Məhəmmədzadənin idarəsinə getdik. O, dedi:

- Bu gün İranda «Vəhdət həftəsi»nin birinci günüdür. Siz öz gəlişinizlə bu günü daha da şərəfləndirmisiniz. Məşhəddə, Tehranda, Qumda olmuşsunuz, indi isə Təbrizdəsiniz. Qərbi Azərbaycan (paytaxtı Urmiyə - Ş.F.) və Şərqi Azərbaycan (paytaxtı Təbriz - Ş.F.) vilayətlərinin hər iki Azərbaycandır. Azərbaycan İran tarixində azadlıqsevərliyi ilə məşhurdur. Azərbaycanda bir çox inqilablar baş vermişdir. İranda ilk kitabxana və ilk çapxana Təbrizdə yaranıb. Zavod və fabriklərimizin sayı 3700-ə çatıb. İranın hər yerində azərbaycanlı vardır. Biz bu gün fəxr edirik ki, Azərbaycan respublikası müstəqillik əldə etmişdir. Müstəqilliyinizi qoruyun, torpaqlarınızı azad edin, öz gücünüzə güvənin. Azərbaycanın uğuru bizim uğurumuzdur...

Həsən Əlibəyli ilə Təbrizi gəzirik. O dedi ki, şahlıq üsul-idarəsi zamanı azərbaycanlılar İranda, hətta Təbrizdə öz dillərində pıçıltı ilə danışırdılar, indi isə gördüyümüz kimi, hər yerdə öz anna dilində danışır, azərbaycanca rəsmi çıxışlar edirlər. O, mənə maraqlı bir məlumat da verdi: Hal-hazırda İranda yaşayan ermənilər yağış yağan vaxtlarda qapılıb qalırlar öz evlərində. Onlar hətta vacib işləri olduqda belə yağışlı havada küçəyə çıxmırlar, guya ki, olduqca pakdırlar, məbada yerdər yağış suyu sıçrayar və onların paltarları müsəlmanların ayaqları altından sıçrayan suya bulaşar.

Ustad Şəhriyarın aramgahına gedib, məzarını ziyarət edirik. «Məqbərətüş-şüəra». 407 məşhur şairin dəfn olunduğu müqəddəs bir məkan. Əfzələddin Xaqani, Mücirəddin Beyləqani, Qətran Təbrizi, Hümam Təbrizi və b. burada uyuyurlar. Eləcə də Siqqətül-islam, Qayimməqam Fərahani, Xiyabani və Şəhriyar.

Axşamüstü Təbrizdən çıxıb Ərdəbilə yollandıq. Bostanabad-Sərab-Ərdəbil-Astara yolu. Səhənd dağı arxada qaldı. Ərdəbilə yaxınlaşırıq. Şahdağ

yadıma düşdü. Savalan kimi həmişə zirvəsi qarlı Şahdağ.

Ərdəbilə çatdıq. «Dərya» oteli. Bir qədər istirahət. Sonra isə gecə saat 12-dən 2-dək şe’r guşəsi.

27 iyun. İran səfərimizin sonuncu günü. Ərdəbildə Şeyx Səfiəddin xanəgahına (məqbərə kompleksinə) yollandıq. «Allah-Allah» gümbəzi. Bu gümbəz Şah İsmayıl Xətainin 4-cü sələfi Şeyx Səfiəddin Musa tərəfindən inşa edilmişdir.

Şeyx Heydərin ələmi. Şeyx Səfiəddinin qəbri. Onun dörd yanında bu nəslin 10 nümayəndəsi dəfn olunmuşdur. 5-ci və 8-ci qəbirlərdə yatanların adları naməlumdursa da (sinəüstü daşların üstü oxunmur) qalan 8 məzarda aşağıdakılar basdırılmışdır: Şeyx Səfiəddinin qızı (adı göstərilməyib), arvadı Bibi Fatimə (Şeyx Zahid Gilaninin qızı), Sa- lamulla ibn-Xəlilulla, Məhəmməd (hicri 753-cü ildə vəfat etmişdir), Seyid Musa ibn Seyid Heydər (hicri 792-ci ildə vəfat etmişdir), Mürşüdqulu, Şeyx İdris və Sultan Bayazid (hicri 908-ci ildə vəfat etmişdir).

Şeyx Səfiəddinin məzarından sonra Şah İsmayıl Xətainin qəbrini ziyarət etdik. Üstündə böyük bir sənduqə vardır. II Dünya müharibəsi zamanı ruslar Ərdəbildə olarkən sənduqəni məzarın üstündən qaldırıb aparmaq istəmişlərsə də, onu qapıdan çölə çıxara bilməmişlər. Divarları sökmək istəyən ruslara, xoşbəxtlikdən, bu qəbahətli işi etməyi qoymayıblar və sənduqə öz yerində qalmışdır. Əvəzində isə ruslar Şah İsmayıl mavzoleyinin yanındakı məşhur «Çinixana» sarayının nəfis naxışlı minlərlə çini qabını daşıyıb Ermitaj muzeyinə aparmışlar.

«Çinixana»da I Şah İsmayılın, I Şah Təhmasibin, II Şah İsmayılın, I Şah Abbasın, II Şah Abbasın və Şah Süleymanın qərb etdirdikləri pullar şüşə örtük altında saxlanılır.

Elə həmin gün Ərdəbildən çıxıb Astaraya yollandıq. Axşamüstü sərhədi keçdik. Sağ ol, ulu İran. Yeni görüşlərədək!

*15.06. - 26.06.1999*

## Səkkizinci Səfərnamə Şe'rləri

*I*
*QƏZƏL*

*Elə ki naz ilə ol sevgili canənə gəlir,*
*Nazı çəkmək həvəsim tazələnib canə gəlir.*

*Gülləri bağibanın gör nə yaman solmuşdur...*
*Tazə bir gülsə məhəbbətlə gülüstanə gəlir.*

*Necə istək, nə diləkdir, nə ürəkdir* onda,
*Sanki şəmin oduna yanmağa pərvanə gəlir.*

*Əhsən üstdən ona əhsən demişəm hər vədə,*
*Бütün əğyarlərə gör necə biganə gəlir.*

*Qədrini sevdiyinin bilməyən insanlar var,*
*Asi könlüm elə insanlara üsyanə gəlir.*

*Yaşımın çoxluğunun təbimə yoxdur zərəri,*
*Təbimin köhləni gündən-günə cövlanə gəlir.*

*Eşidib dostları Şahin Бakım tərk eləyib,*
*Dedilər: - Özgə yer yox, yenə İranə gəlir.*

*1ган Амагам,*
*15.06.1999*

## *II*
## *QƏZƏL*

*Çox uzandı bu səfər zənnimcə,*
*Məni üzməkdə kədər zənnimcə.*

*Yenə sərhəddə dirəklər gördüm,*
*Çürüyübdür bu çəpər zənnimcə.*

*Ənzəli, Rəşt, Lahican, Ruyan...*
*Durudur burda Xəzər zənnimcə.*

*Dözmüşəm mən neçə il çox hicrə,*
*Tərk edir cismi təpər zənnimcə.*

*Gecə rahətliyimiz var bizim,*
*Amma üstündü səhər zənnimcə.*

*Gözəlim, gündə üzərrik yandır,*
*Bizə dəyməkdə nəzər zənnimcə.*

*Gəl ki, səhrayə gedək, ey Leyli,*
*Boğanaqdır bu şəhər zənnimcə.*

*Olaram bəlkə də səhra şahı,*
*Görərəm orda səmər zənnimcə.*

*Şahina, xatirə düşməkdə Bakı,*
*Məni boğmaqda qəhər zənnimcə.*

*Ənzəli-Ruyan yolu*
*16.06.1999*

*III*
*QƏZƏL*

*Mey ver mənə, ey saqi, bir ülvi məramım var,*
*Cəm qoy məni bilsinlər, əldə neçə camım var.*

*Məndən də bu dünyadə zəngin bir adam varmı?*
*Qiymətli dürüm yoxdur, qimətli kəlamım var.*

*Səyimlə, iradəmlə minlərlə şe'r yazdım,*
*Vallah, elə şahəm ki, minlərlə qulamım var.*

*Şerimdə mənim görməz bir kimsə qəliz kəlmə,*
*Seyr et nə səliqəm var, bir gör nə nizamım var.*

*Şe'r əhli gərək olsun həm milli, həmi xəlqi,*
*Düzgünlüyünə fikrin, söz yox ki, inamım var.*

*Bir ölkəni, min əfsus, bir çay ikipay etdi,*
*Şirvanda Seyid varsa, Təbrizdə Hümamım var.*

*Mənsur çəkən həzzi Şahin çəkəcək bir gün,*
*Ey dar «əleyküm» de, ey dar «salam»ım var.*

*Çinaran-Məşhəd yolu,*
*17.06.1999*

*IV*
*QƏZƏL*

*Məşhədin hər daşı mərcanə bərabərmiş ki!*
*Qəlbimin sevgisi ümmanə bərabərmiş ki!*

*Xəstələndim, mənə bir xəstə gəlib verdi şəfa,*
*Bu yerin xəstəsi loğmanə bərabərmiş ki!*

*Mən imamı yenə sidq ilə ziyarət elədim,*
*Niyyətim, şükr ola, imkanə bərabərmiş ki!*

*Necə mömündü bu iman evinin bəndələri* -
*Mələyə, huriyə, qılmanə bərabərmiş ki!*

*Mənə zəng eylədi canan «Bakıya tezcə qayıt»,*
*Cananın xahişi fərmanə bərabərmiş ki!*

*Bir vüsal naminə mən neçə hicran gördüm,*
*Bir vüsal bir neçə hicranə bərabərmiş ki!*

*Nə qədər ölkəni gəzdimsə də, İran təkdir?*
*Demərəm heç yerə «İranə bərabərmiş ki!..»*

*Görübən qüvvəmi eşq içrə mənim söylədilər:*
- *Necə şahindi bu, aslanə bərabərmiş ki!*

*Məşhəd*
*18.06.1999*

*V*
*QƏZƏL*

*İçsəm meyi az, başimə meyxanə dolanmaz,*
*Saqisə edər naz, daha məstanə dolanmaz.*

*Pərvanələrin xətrinə yanmaq dilərəm mən,*
*Şam yanmasa, ətrafinə pərvanə dolanmaz.*

*Bədbinliyim artıb neçə vaxtdır, dedi yarım:*
- *Şahım niyə çoxdandı ki, şahanə dolanmaz?*

*Eşqim elə şöhrətli ki, əfsanə deyirlər,*
*Bilməm niyə dillərdə bu əfsanə dolanmaz?*

*Biganə adamlar ilə ülfətdə olan var,*
*Amma mən olan yerdəsə biganə dolanmaz.*

*Cahil - görübən məndəki fiazilliyi gəlməz,*
*Aqil - dolanar dövrəmə, divanə - dolanmaz.*

*Hər dəfiə gələndə məni Tehranə çəkirlər,*
*Şahin quşu çoxdandı ki, Zəncanə dolanmaz.*

*Təyyarə, Məşhəd-Tehran hava yolu*
*19.06.1999*

*VI*
*QİTƏ*

*Gəlmişəm tə 'zimə, ey Mə'sumə,*
*Qəlbimə daimi nisgil sənsən.*

*Nurisən gözlərinin dindarın,*
*Dinsizin gözlərinə mil sənsən.*

*Qum sanı var idi dərdim Qumda,*
*Eləyən dərdimi yüngül sənsən.*

*Rövzədə var neçə gül rayihəsi,*
*Nəstərən, lalə, qərənfil sənsən.*

*Möhtəşəmsən, ey imamın bacısı,*
*Həmi aqil, həmi kamil sənsən.*

*«Faziləm» söyləsə Şahin Fazil,*
*Qoy eşitsin bunu: Fazil sənsən.*

*Nur edən məscidi qəndilmi məgər?*
*Bu şərif məscidə qəndil sənsən.*

*«Sevginin sahili olmaz» dedilər,*
*Bəlkə də sevgimə sahil sənsən.*

*Torpaq üstündə bitən gül çoxdur,*
*Torpaq altında bitən gül sənsən!*

*Qum şəhəri, «Hərəme-mütəhhəre-həzrəte-Məsumə»*
*20.06.1999*

*VII*
*QİT'Ə*

*Salam olsun sənə, ey Qum şəhəri,*
*Salam olsun sənə, ey Mə'sumə.*

*Eləyiblər gülə qərq dörd yanım,*
*Gəlmişəm gülşənə, ey Mə'sumə,*

*Bu ziyarətdə şərafət vardır,*
*Bu şərəfdir mənə, ey Mə'sumə.*

*Çox ziyarət eləyərlər gözəli.*
*Gələrəm mən yenə, ey Mə'sumə.*

*Qum, ziyarətdən sonra*
*20.06.1999*

*VIII*
*QƏZƏL*

*Alaraq şövq ilə islamdən ilhamı İmam,*
*Təzədən canə gətirdi ulu islamı İmam.*

*Tazə əyyam zərurətdi qoca dünyadə,*
*Köhnə dünyayə gətirdi təzə əyyamı İmam.*

*Onu Məsumə edibdirmi qiyamə vadar?*
*«Eləyək Qum şəhərindən, - dedi - iqdamı» İmam.*
*Müslimin qədrini qədr əhlinə düstur elədi,*
*Kafərin ziddinə göndərdi sərəncamə İmam.*

*Şe'r əhli İmamın ənamım gözlərdi,*
*«Badeye-eşq»i ilə eylədi ənamı İmam.*

*Götürüb əllərinə eşqü məhəbbət camını*
*İçdi, son qətrəyəcən içdi həmən camı İmam.*

*Niyyəti vardı ziyarət eləyim bir də onu,*
*Şahinin xiffətinə eylədi əncamı İmam.*

*Behişti-Zəhra, İmam Xomeyninin məzarı önündə*
*21.06.1999*

*IX*
*TƏKBEYT*

*Bir quş kimi İranə uçub danə gəzmişəm,*
*Eşqü vəfavü mehrü şəfa... da nə gəzmişəm?*

*Tehran*
*22.06.1999*

*UÇA BİLMƏYİRƏM YANINA QUŞ TƏK*

*Hər adı Şahin kəs şahindir bəyəm?*
*Uça bilməyirəm yanına quş tək.*
*Qayıdıb adımı dəyişəcəyəm,*
*Uça bilməyirəm yanına quş tək.*

*Yerdən aralanıb göyə uçmuşam,*
*Tehrana uçmuşam, Reyə uçmuşam,*
*Səni tənha qoyub niyə uçmuşam?*
*Uça bilməyirəm yanına quş tək.*

*Sədd deyil yağış, qar, boran quşlara,*
*Göyün sinəsini yaran quşlara,*
*Paxıllığım tutur qaranquşlara,*
*Uça bilməyirəm yanına quş tək.*

*Göydən qoymayıblar bağdan uçmuşam,*
*Yoldan qoymayıblar dağdan uçmuşam,*
*Soldan qoymayıblar sağdan uçmuşam,*
*Uça bilməyirəm yanına quş tək.*

*Qərib-qərib uçur durnalar hələ,*
*Uçur şahin hələ, uçur sar hələ...*
*Axı qanadımda qüvvə var hələ,*
*Uça bilməyirəm yanına quş tək.*

*Niyyətim də açıq, yolum da açıq,*
*Sağım da açıqdır, solum da açıq.*
*Ayağım da açıq, qolum da açıq.*
*Uça bilməyirəm yanına quş tək.*
*Gərək bir də sənə fikrimi deyəm:*
*Hər adı Şahin kəs şahindir bəyəm?*

*Qayıdıb adımı dəyişəcəyəm,*
*Uça bilməyirəm yanına quş tək,*
*Uça bilməyirəm yanına quş tək.*

*Tehran*
*23.06.1999*

## *XI*
## *QƏZƏL*

*Çöhrəndə ziya görmədəyəm al ilə birgə,*
*Qurban o zənəxdanə olum xal ilə birgə.*

*Gəh cəlb eləyir diqqəti zülfün, gəhi şalın,*
*Zülfün məni heyran elədi şal ilə birgə.*

*Hafiz falını bil ki, pəsənd eyləyirəm mən,*
*Falçı, səni inkar edirəm fal ilə birgə.*

*Bir şəxsin əgər tük sanı çox olsa günahı,*
*Bir gün yanacaq bığları saqqal ilə birgə.*

*Çəksəydi əgər qəm hər adam qəm tükənərdi,*
*Tay-tay çəkirəm qəm yükü hambal ilə birgə.*

*Şadəm ki, diyarımda igidlər yenə vardır,*
*Xəlqim, neçə Rüstəm görürəm Zal ilə birgə.*

*Şahin, sənə şah söyləməyim mən nə deyim bəs?*
*Fəth eyləmisən Qübbəni Qudyal ilə birgə.*

*Təbriz*
*24.06.1999*

*XII*
*QƏZƏL*

*Kaşanəni həqq yıxdısa təmir ola bilməz,*
*Olmazsa kömək, şah cahangir ola bilməz.*

*Hər yanda hərarətlə məni qarşılayırlar,*
*İranlıya tən, bəlkə də, təndir ola bilməz.*

*Hər Seyyid olan kimsənə Seyyid Əzim olmaz,*
*Hər gülməli söz sahibi Sabir ola bilməz.*

*Söz meydanı söz yox ki, səvad əhli üçündür,*
*Adəmdə səvad olmasa şair ola bilməz.*

*Həmtay ola bilməz mənə ilhamı sönüklər,*
*Cəhd eyləsə də tülkü əgər şir ola bilməz.*

*Tərlanın önündə axı cüllüt quşu neylər?*
*İpdən, ikiqat olsa da, kəndir ola bilməz.*

*Zəncirlə gəlib zülf ilə, divanədi Şahin,*
*Zülfün kimi möhkəm mənə zəncir ola bilməz!*

*Təbriz*
*25.06.1999*

*XIII*
*QƏZƏL*

*Qəlizdil qəzəlxana!*

*«Kuh» gəl söyləmə, «dağ» düzgün olar, «Ləb»*
*demə bir də, «dodaq» düzgün olar.*

*Sağsa şair ölümündən sonra,*
*«Zində» gəl söyləmə, «sağ» düzgün olar.*

*Bilməyir türk, a canım, «guş» nədir,*
*Qulaq as, türkcə «qulaq» düzgün olar.*

*Əl-ayaq eyləmə yad sözlər üçün*
*«Dəst» - «əl», «pa»sa - «ayaq» düzgün olar.*

*Dilbərin zülfü daraqlanmalısa,*
*«Şanə» işlətmə, «daraq» düzgün olar.*

*Yad kəlam öldürəcək doğma sözü,*
*Xəlqi sözlə yaşamaq düzgün olar!*

*Çox uzaqdır mənə sən tək şair,*
*Demirəm «dur» - «uzaq» düzgün olar.*

*Olsa hər şairimiz, ey Şahin,*
*Yad deyimlərdən iraq, düzgün olar!*

*Ərdəbil*
*26.06.1999*



# DOQQUZUNCU SƏFƏRNAMƏ

## *«QOCA ŞAHİN, NƏ ÇƏKİR HEY QOCA İRANƏ SƏNİ?..»*

Adətim üzrə tez yatıram, axşam saat 23-dən sonra oyaq ola bilmirəm (amma mənə elə gəlir ki, yuxuda oyağam). Gündüzün yorğunluğu - bir neçə yerdə iş, ədəbi məclislərdə iştirak və hər gün şe'r yazmaq vərdişim axşam olan kimi məni yatağa çəkir. Mənim bu «cədvəlimi» bilənlər də insafən, zəng etmirlər. Amma aprelin 26-da telefon zənginin səsi göz qapaqlarımı qaldırdı, kiprik çəpərlərim söküldü. Dəstəyi götürdüm və danışanın səsini dərhal tanıdım. Axı həmin səslə bu yaxınlarda «Vahid poeziya evi»ndə mənim 60 illik yubiley gecəm keçirilərkən İran İslam Respublikasının möhtərəm səfiri cənab Əlirza Bigdelinin təbrik məktubunu oxunmuşdu. Bəli, mənə bu gecə yarısı zənc edən Əsgər Fa- resi idi - İranın Azərbaycandakı Mədəniyyət Mərkəzinin məsul işçisi:

- Ağaye-Şahin, Sizi bir qədər dincəlmək üçün İrana göndərmək istəyirik. Tehranda may ayının 3-dən 13-dək XIII Beynəlxalq «Tehran kitabı» sərgisi keçiriləcək. Siz də ki, kitabsevər bir adamsınız, məncə orada sizin iştirakınız münasib olar.

Razılığımı bildirib cənaba təşəkkürümü izhar etdim. Ertəsi gün Lənkərana getdim, universitetdə iki gün mühazirə oxudum, geri qayıdıb bir gecə Bakıda qaldım, mayın 1 -də isə sübh tezdən maşın artıq bizi Tehrana aparırdı.

Səkkiz nəfərdən ibarət Azərbaycan nümayəndə heyətini Əsgər Faresinin özü müşayiət edirdi. Heyətimizin tərkibi belə idi: Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutunun şöbə müdiri, filologiya elmləri doktoru Roza Eyvazova, Şərqşünaslıq İnstitutunun şöbə müdiri, filologiya elmləri namizədi Tərlan Quliyev, Əlyazmalar İnstitutunun baş elmi işçisi Arif Ramazanov, M.Ə.Rəsulzadə adına Bakı Dövlət Universitetinin müəllimləri Qumru Məmmədəliyeva və Bilqeyis Quliyeva, «Ədəbiyyat» qəzetinin əməkdaşı Simuzər Baxışlı, həkim Qəmər Hüseynova və mən.

Budur, Astara gömrük məntəqəsi. Yenə də köhnə tanışımız, türkşünas dostum Hüseyn Sadıqovun oğlu gömrük rəisi Çingiz Sadıqovla görüş. Yenə mehribanlıq, diqqət və qayğı...

Sərhədi keçirik. İranda hərbi və mülki işçilər də bizi son dərəcə ehtiramla qarşıladılar. Üç «Peykan» markalı İran maşınına əyləşib Tehrana doğru yola düşdük.

Bu rahat yol barədə, yolüstü şəhər, kənd, çay və körpülər haqqında mən əvvəlki məqalə-xatirələrimdə xeyli xoş söz demişəm. Təkrarçılığa yol vermək istəməsəm də, bir daha nəzərə çatdırmalıyam:

Mən öz yollarımızda da belə rahat gediş-gəliş arzulayır, haçansa bizim də belə geniş və yaraşıqlı, rəngarəng yol işarələri ilə göz oxşayan yollara malik olmağımızı diləyirəm.

Böyük şəhərlərin yolüstü restoranlarında «təam nuş edə-edə» və ətrafın təbii gözəlliyindən zövq ala-ala düz 21 saatdan sonra arxayınlıqla gəlib çatdıq qorxusuz Tehrana (yadıma nədənsə «Qorxulu Tehran» romanı düşdü). Y olda ikən qələmə aldığım bir qəzəlin son beyti belə idi:

*Ömrüm boyu, billah, mənə yad oldu soyuqluq,*
*İsti nəfəsim, Şahina, İranə yetişdi.*

Gecə saat 1 -də şəhərin Səadətabad adlı yüksək bir yerində yerləşən Dil və Ədəbiyyat Fərhəngestanının (institutunun, bu sözü «Akademiya» kimi də tərcümə etmək olar) mehmansərasına (qonaq evinə) yetişdik. Gec olsa da təəccübümüzə rəğmən, bizi gözləyirdilər. Dedilər ki, siz Beynəlxalq «Tehran kitabı» sərgisinə təşrif gətirən ilk nümayəndə heyətisiniz. Sevindik ki, birincilik bizə nəsib olmuşdur. Dərhal süfrə açıldı. Gecə yemək-içməyi. və rahat otaqlarda şirin yuxu, istirahət.

Sübh saat 8-də yeməyimizi yeyib, maşınlarımıza əyləşib yola düşdük. Müşayiətçilərimiz Punə Nedia (qadınlarımız üzrə) və Məhəmməd Rza Nəsiri (kişilər üzrə) idilər.

Budur, Tehranın şimal-qərbi ilə hərəkət edirik. Başı qar papaqlı Evindərəke dağları, Evindərəke məhəlləsi, Evin zindanı, Evin oteli. «Bağe-behişt»in yanından ötürük. «Daneşgahe-melli» («Milli institut») burada yerləşir və onun hazırkı adı «Daneşgahe-Şəhid Behişti» («Şəhid

Behişti İnstitutu») olmuşdur. İki otobanı (ortadan iki hissəyə ayrılan iki istiqamətli geniş yol) arxada qoyuruq: «Otobane-Şəhid Çəmranı» və «Otobane-Modərresi». «Azadi» («Azadlıq») oteli də artıq geridədir. Nəhayət, «Nümayeşgah» («Sərgi») ərazisinin şimal giriş qapısı. Qeyd etməliyik ki, bu nümayişgah 30 il bundan əvvəl salınıb. Ərazisi olduqca böyükdür, orada onlarla pavilyon binası, istirahət zonaları, qəlyanaltı yerləri, kitab-qəzet köşkləri və yaraşıqlı bir məscid var.

Nümayişgahın giriş darvazasının ağzında d-r Xəlicini gördüm. Olduqca savadlı, mədəni və sözün tam mə'nasında ziyalı şəxs olan ağaye- Xəlicini. Mən Tehran və Təbrizdə keçirilən bir neçə Beynəlxalq Elmi Konfransda onunla birgə olmuşam, bir-birimizdən hal-əhval tutmuşuq, söhbətləşmişik. Tanışlığımız illərində o «Əllamə Təbatəbai» İnstitutunun rektoru idi. Amma indi mənə bəlli oldu ki, ağaye-Xəlici İran Mədəniyyət və İslam İrşadı Nazirliyinin «Sazmane-Ertebate-İslam» («İslam əlaqələri təşkilatı») idarəsində rəis müavini vəzifəsində işləyir. Doktor Xəlicidən dostumuz Əli Əsgər Şe'rdustu soruşdum. Dedi ki, o, Təbrizdədir. Milli Məclis vəkilliyinə öz namizədliyini irəli sürmüşdür. Çox sevindim, çünki dostum Şe'rdust olduqca ləyaqətli bir simadır.

Nümayişgahdakı süni yaradılmış göl qırağında üstü açıq, geniş bir zalda əyləşib prezident höccətül-islam vəl müslimin Xatəminin gəlişini gözlədik. Birdən-birə ətrafda canlanma. Alqışlar. Onlarla avtomobil. Prezident Xatəmi. İran İslam Cümhuriyyətinin himni. Quran tilavəti. Aparıcının qısa çıxışı. Bir neçə beyt şe'r. İran Mədəniyyət və İslam İrşadı naziri d-r Mohaceraninin dediklərindən:

- «Tehran kitabı» sərgisi İran mədəniyyətinin çilçırağıdır. Keçən il (hicri 1378 - Ş.F.) İranda xeyli kitab çap olunmuşdur. Bu il isə «Elmin qapısı olan» Həzrət Əlinin yubiley ilidir və təbii ki, kitab çapı daha da artacaqdır (Nazirin çıxışı cəmi on dəqiqə oldu).

D-r Mohaceranidən sonra onun mədəniyyət işləri üzrə müavini və XIII Beynəlxalq «Tehran kitabı» sərgisinin rəisi ağaye-Əhməd Məscidcameinin çıxışı səsələndi. Onun dediklərindən:

- Məlum olduğu kimi kitab sərgisi hər il keçirilir. Xatırlanmalıdır ki, İranda hər il 50 milyondan çox kitab çap olunurdu, ötən il isə bu rəqəm 91 milyonu ötmüşdür... (Rəisin çıxışı 20 dəqiqəyədək çəkdi).

Sonra Ə.Məscidcamei müxtəlif mükafatlara layiq görülən bir neçə naşir və nəşriyyatın adını çəkdi. Onların arasında mənim Şe’rdust dostumun rəhbərlik etdiyi «Sürüş» nəşriyyatı da vardı.

Üçüncü çıxışçı İİR prezidenti ağaye-Xatəmi oldu. O, nümayişgaha gələnləri ehtiramla salamladıqdan sonra müasir dövrdə bir çox sahələrin, həmçinin kitab nəşrinin genişlənməsində internet və elektronikanın faydasından bəhs etdi. Nəşriyyat və naşirlərə yeni-yeni uğurlar dilədikdən sonra qeyd etdi ki, Avropa mədəniyyəti son illər amerikanlaşma- dadır. Bu isə çox böyük bir xətadır. Biz müsəlmanlan, xüsusən iranlılar mili müstəvidən çıxış edib, öz dini-mədəni səylərimizi artırmalıyıq (Prezident cəmi 8 dəqiqə danışdı).

Çıxışçıların işlətdikləri bir ifadə mənim diqqətimi cəlb etdi: «Çaleş» islahatı. Düşündüm ki, bus öz çox güman ki, «çalışmaq» məsdərindən düzəlmişdir. Ağaye-Xəliciyə müraciət etdim. Dedi ki, bu sözün farsca mə’nası «səy etmək» deməkdir, lakin ola bilər ki, türk ismi olan «Çalışmaq»dandır.

Gümanımın düz çıxmasına sevindim.

Nümayişgahın açılışının rəsmi hissəsi bitdi. Müxtəlif pavilyonlarda olduq. Gözlərimiz alacalanmışdı. İlahi, necə nəfis və yaraşıqlı kitablar! Cild-cild lüğətlər, dairətül-məariflər (ensiklopediya - Ş.F.), bütün elm sahələrini əhatə edən dərsliklər, xəritələr, illüstrasiyalar... Bu kitab xəzinəsini bir qədər seyr etdikdən sonra yoruldum və seyrimin davamını sabaha saxladım.

Tərlan və Ariflə nümayişgahın geniş bir xiyabanında gəzişərkən Eynulla Mədətlini gördüm. Onunla 1995-ci ildə Ankarada tanış olmuşdum. Vaxtilə Naxçıvan Dövlət Universitetinin müəllimi idi, sonradan diplomatik işə cəlb olundu. İndi isə 4 ildir ki, Tehranda Azərbaycan səfirinin müavinidir. Hal-əhvallaşdıq. Yanında İlham adlı bir həmyerlimiz də vardı.

Saat 17-də mehmansəradan «Daneşgahe-tərbiyəte-modərres» («Pedaqoji institut») adlanan elm və təhsil ocağına qədəm basdıq. İran Mədəniyyət və İslam İrşadı nazirinin fars dili və ədəbiyyatı şurasının katibi ağaye-Qulamhüseynzadə ilə görüşdük. Sonra iclas zalında əyləşib təziyə sənətinə həsr olunmuş bir sənədli kinofilmə baxdıq. Ssenari müəllifi d-r Mohtabad kadrlarda əks olunanları mikrofon vasitəsilə bizə izah edirdi.

Nəzərə çatdırılmalıdır ki, təziyə məzhəbi bir nümayişdir. Onun mərasimləri əsasən məhərrəm və səfər aylarında keçirilir. İlk təziyə məclisi

seyyidüş-şühəda (şəhidlər rəhbəri, seyidi) İmam Hüseyn və yoldaşlarının xəlifə Yezid tərəfindən qətli hadisəsinə həsr olunmuş və Bağdadda göstərilmişdir. D-r Mohtabadın fikrincə təziyədə üç ünsür mühümdür: dram, musiqi, şe'r. Təziyənin yaşı min ildən çoxdur. İranın məşhur musiqiçisi Əbülhəsən Səba demişkən «Təziyə İran musiqisinin beşiyidir».

Qeyd edim ki, d-r Mohtabad İranşünaslıq elmləri üzrə mütəxəssisdir. O, amerikada təhsil almış, təziyə mərasiminə dair dissertasiya yazmışdır. D-r Mohtabad Amerikada bir neçə dəfə təziyə məclisi də təşkil etmişdir. Onun sözlərinə görə, təziyə barədə İraq, Misir, Suriya, Livan və Sudanda da kitablar yazılmışdır.

4 may. Yenə nümayişgahı seyr. Sonra gəzinti. Əvvəllər də olduğum gözəl Parke-Sai (Sai parkı). Çay və dondurma.

Axşam mehmansərada köhnə gürcü dostum tarixçi Giya Beradze ilə təzə görüşüm oldu. Onunla birgə 12 gürcü alimi də gəlmişdi. Elmlər dotkorları Nana Gelaşvili, Nomedi Bartaya, elmlər namizədi Tengiz Geşalava ilə çox mehribanlıqla salamlaşdıq, qucaqlaşdıq. Marika Muse- liani, Xatuna Tudua, Maya Saxukiya və Tbilisi Universitetinin aspirantları olan iki Teya adlı qızla (Canaşiya və Meparişvili) tanış oldum.

Axşamdan bir qədər keçmiş dörd erməni də gəldi (üç qadın, bir kişi). Təbii ki, nə biz onlarla, nə də onlar bizimlə görüşə cəhd etmədi. Ermənilərin haqsız torpaq tamahkarlığı bizi düşmən edib bir-birimizə...

O gün mehmansaraya Rusiya (13 nəfər), Pakistan (20 nəfərdən çox), Tacikistan (2 nəfər), Suriya (11 nəfər), Türkmənistan (9 nəfər), Özbəkistan (6 nəfər) nümayəndələri də gəldilər. Onların bəziləri ilə Əfqanıstanda işlədiyim vaxtlarda, bir neçəsi ilə müxtəlif elmi ezamiyyətlərim zamanı tanış olmuşdum. Çox sevindim ki, Rusiya alimlərindən Vladimir İvanovu, Nina Mixaylovna Mamedovanı (elmlər doktorları), Klyaşto- rina Vera Borisovnanı, Kolesnikov Aliy İvanoviçi (elmlər namizədləri), həmçinin Pakistan alimi d-r Məhəmməd Bəşir Ənvəri (Bəhaəddin Zə- kəriyya Multani Universitetinin müəllimidir, Şeyx Mahmud Şəbüstərinin «Gülşəni-raz» («Sirr gülşəni») əsəri üzərində elmi-tədqiqat işi aparmış və dissertasiyasını Tehranda müdafiə etmişdir). Tehranda gördüm. M.B.Ənvər özü demişkən Bakıda iki-üç dəfə olmuşdur və bir çox Azərbaycan alimi ilə yaxından tanışdır. Fərəhləndim ki, Mədəniyyət Nazirliyinin baş mütəxəssisi Şəkər Bayramovanı, Əfqanıstan Elmlər

Akademiyasının sabiq əməkdaşı Şəfiqə Y arğın Dibacı (hazırda əri və üç uşağı ilə Daşkənddə yaşayır və işləyir), Daşkənd şərqşünaslıq institutu İran-Əfqan filologiyası kafedrasının müdiri, filologiya elmləri doktoru Əhmədcan Kuranbekovu (onunla uzun illər Əfqanıstanda birgə işləmişdik) və başqa tanışları bir daha gördüm. Tacikistandan gələn iki nümayəndəni isə tanımırdım. Sabirov Cahangir və Bədəlov Mirzəbədəl Tacikistan Mədəniyyət Nazirliyinin idarə müdirləridir. Eləcə də, əvvəllər tanımadığım və indiki tanışlığımızdan son dərəcə məmnun olduğum özbək alimləri Əvəzbek Vahidov, Şöhrət Məmmədov (o, Nizami Gəncəvi adına Daşkənd Dövlət Pedaqoji Universitetinin dosentidir), Həmrəgül Berdigülov, Əbülhafis Əhrarov məndə xoş təəssürat oyatdılar.

Axşam belə bir xəbər yayıldı ki, mayın 2-də Tehrandakı «Ararat» erməni klubu naməlum şəxslər tərəfindən partladılmışdır. Ermənilər İranda da dinc oturmur, özlərinə vaxtaşırı müxaliflər tapırlar.

Elə bir gün gələ bilər ki, onlar İran iddiasında da olsunlar.

Əfqanıstan və mehriban əfqan xalqı yadıma düşdü və Şəfiqə Yarğın Dibac ilə xeyli söhbət etdim. Onun söylədiyinə görə, mənim əfqan tanışlarımdan sabiq baş nazir Sultan Əli Keştmənd, maliyyə naziri Əbdülkərim Misaq, akademik Əhməd Cavid, məsul partiya işçisi Zahir Tənin - Londonda, şair və hüquqşünas Şəri Cövzəcani Daşkənddə, Əbdülqüdus Qurbəndi - Almaniyada, ticarət naziri Məhəmməd Cəlalər - Amerikada, şair və nazir Süleyman Layiq, həmçinin Dəstəgir Pənçşiri - Pakistanda mühacirət həyatı keçirməkdədirlər.

Bu gün Bakı Dövlət Universiteti Şərqşünaslıq fakültəsində fars dili müəllimi işləyən Qumru xanım (məşhur şərqşünas Vasim Məmmədəliyevin xanımı) mənə bir qəzet verdi. Qəzet «Həfteyi-ketab» («Kitab həftəsi») adlanırdı və XIII Beynəlxalq «Tehran kitabı» sərgisinin orqanı idi. Orada kitab nümayişgahının tarixçəsi barədə maraqlı məlumat vardı. Mənə məlum oldu ki, I Tehran Beynəlxalq kitab sərgisi hicri 1366 - cı ildə keçirilmiş və orada 215 daxili və 196 xarici naşir iştirak etmişdir. II sərgidən sonra hicri 1368-ci ildən etibarən İranda hər il keçirilən kitab nümyaişgahı kitabsevərlərin bayramına çevrilmişdir. Yuxarıda yazdığımız kimi, builki sərgi isə say etibarilə XIII nümayişgahdır.

Belə sərgilər xarici ölkələrdə də hər il təşkil olunur. Onların ən məşhuru

ilbəil təşkil edilən Beynəlxalq Frankfurt sərgisidir ki, birincisi 1949-cu ildə keçirilmişdir. 1964-cü ildən bəri İtaliyanın Bolonya şəhərində də Beynəlxalq Uşaq və Gənclər sərgisi fəaliyyətdədir.

Mayın 5-də sübh tezdən Qum şəhərindəki məşhur «Seyid Şəha- bəddin Hüseyni Mərəşi Nəcəfi» adına kitabxananın müdiri höccətülislam vəl müslimin Seyid Mahmud Mərəşi alim dostum Arif Ramazanovla məni Quma aparmaq üçün maşın yolladı və biz bir günlüyə Tehranı tərk etdik.

Yolda Arifdən öyrəndim ki, (o, Qum şəhərində il yarım yaşamış və həmin kitabxanada elmi-tədqiqat işi aparmışdır), ayətullahe-üzma Seyid Şəhabəddin Mərəşi (1897-1990) İraqın Nəcəf şəhərində doğulmuş və 93 yaşında ikən İranın Qum şəhərində vəfat etmişdir. 68 il Nəcəf və Qumda müəllimlik etmiş, 150 kitab yazmış, Qumda öz məşhur kitabxanasını təsis etmişdir. Hələ onun sağlığında kitabxanasında 30 min cildədək əlyazma, 3 min mikrofilm, 100 minlərlə çap kitabı vardı.

Bizi ayətullahe-üzma Seyid Şəhabəddinin oğlu, uca boylu, uzun saqqallı, ciddi görkəmli, gözəl simalı Seyid Mahmud Mərəşi qarşıladı. O, elə ilk görüşümüzdə mənə öz ünsiyyətini bildirib, atasının tərcümeyi-halı və elmi fəaliyyəti əks olunan 748 səhifədən ibarət «Şəhabe-şəriət» («Şəriət şöləsi») kitabını bağışladı. Onun sol, sağ arxa və ön tərəfindəki kitab rəflərində tez-tez istifadə etdiyi kitablar səliqə ilə düzülmüş, yazı masasının üzərində isə əlyazmalar səliqəsiz şəkildə üst-üstə qalaqlanmışdı. Seyid Mahmudun məlumatına görə bu kitabxanada 30-dan çox dildə çap və əlyazma əsərləri mövcuddur, minlərlə jurnal və qəzet topluları qorunub saxlanılır. O, söhbətini birdən-birə saxlayıb dedi: - Şenidən key bovəd manəndə-didən (Yəni eşitmək hara, görmək hara?). Gəlin gedək bizim köhnə və yeni binalarımızı sizə göstərim.

Kabinetdən çıxdıq. Seyid Mahmud düyməni basdı, lift bizi 3 mərtəbə aşağı apardı. Mən bu kitabxananı ürəyimdə «bunker kitabxana» adlandırdım. Allah eləməmiş, əgər günlərin bir günü Qum şəhərinə tonlarla bomba düşsə belə (necə ki, İraş-İran müharibəsi zamanı bir neçə bomba ilə şəhərin bəzi yerləri dağıdılmışdı) bu müasir üslubda tikilən və möhkəm mühalizəedici qurğularla təchiz olunan binanı yerindən tərpədə bilməz.

Kitabxananın yeraltı (3 mərtəbə), yerüstü (4 mərtəbə) otaqlarını bir- bir gəzdik. Burada nələr yoxdur, ilahi. Otuz mindən çox əlyazmanı, altı yüz

mindən artıq çap kitabını, yüz minlərlə nüsxə jurnal və qəzeti öz məxzənlərində toplayan kitabxananın müxtəlif xəzinələri, oxu zalları, ekspoziya salonu, iclas zalı, həkim otağı, qonaq evi, fotolaboratoriya, kimyəvi laboratoriya, bilgisayar mərkəzi, restavrasiya otağı, cildxanası, mikrofilmlər otağı, telefonxanası və muzeyi vardır. Binaya nəzarət üçün 70 durbin və 11 teleekran quraşdırılmışdır. Ən müasir avadanlıqla təchiz olunan binanın qapılarının hamısı seyf qapılardır. Təkcə giriş qapısının ağırlığı 3 tondur və təəccüblü olsa da, necə deyərlər, adamın çeçelə barmağı ilə də açılıb-örtülə bilir. Avadanlığı Yaponiya, Fransa, İsveçrə, Almaniya, İtaliya və başqa ölkələrdən gətirilən bu müasir bina 15 milyard tümənə başa gəlmişdir. Kitabxana müdirliyi irsi xarakterə malikdir və Seyid Mahmuddan sonra (Allah onun ömrünü uzun eləsin) onun övladlarından biri burada müdir olacaqdır. Kitabxananın girişində Seyid Şəhabəddin Mərəşi dəfn olunmuş və məzarının üstündə bir türbə inşa edilmişdir (bunu mən kitabxanadan çıxarkən gördüm).

Nahar süfrəsinin arxasında söhbət zamanı Seyid Mahmud mənim yaradıcılığım və əsərlərimlə maraqlandı. 1988-ci ildə Kabul şəhərindən gətirdiyim, Bakıda Azərbaycan dilində çap etdirdiyim (1992), indi isə iki ildən bəri Tehranda bir nəşriyyatda yatıb qalan «Vaqeate-Mir Veys və Şah Hüseyn» («Mir Veys və Şah Hüseynin əhvalatları») adlı tərcümənin (müəllifi Jozef Tiflisi olan həmin əlyazma osmanlı dilində qələmə alınmışdır) Qumda çapının mümkünlüyünü söylədi və əsərin fotokopi- yasını və fars dilinə tərcüməsinin bir surətini təcili ona göndərməyimi xahiş etdi.

Axşam Tehrana qayıtdıq. Günəş şüalarının qızdırdığı qum kimi isti Qumdan sonra Səadətabadın sərin havasını udmaq üçün gəzintiyə çıxdım. Yuxarıda barəsində danışdığım Pakistan alimi Məhəmməd Ənvər mənə yoldaş oldu. «Təzkirət-ül-Multan» adlı bir kitab yazan bu ustadın iki-üç dəfə Bakıda olmasına baxmayaraq «Atəşgah» adlı tarixi abidəmizdən xəbəri yoxdur. Bildiyimiz kimi, həmin atəşgahda XVIII əsrdə multanilər yaşamışlar və o tarixi abidə «Moltanı atəşgahı» adı ilə məşhurdur.

Mayın 6-sı və 7-sində də günün yarısını nümayişgahda keçirdik, axşamlar isə bizi müxtəlif ziyarətgahlara və istirahət yerlərinə aparırdılar. 8-də mən və Arif Ramazanov «Saraye-əhle-qələm»də («Qələm əhli sarayı») «Həfteyi-ketab» qəzeti üçün müsahibə verdik, ustad Məliküşşüəra Bahara həsr olunmuş xatirə günündə iştirak etdik. Şairlər məlikinin qızı Çehrzad Baharın atası

barədə xatirələri (M.Bahar vəfat edəndə onun 14 yaşı vardı, indi isə 63 yaşındadır) maraqla qarşılandı. Fasilədən sonra mən, Arif Ramazanov və Qumru xanım Məmmədəliyeva Tehran televiziyasının IV proqrammı «Afaq» üçün fars dilində müsahibə verdik.

Onu da qeyd edim ki, Mədəniyyət və İslam İrşadı Nazirliyi tərəfindən sərgidə rəsmən iştirak edən hər bir xarici ölkə nümayəndəsinə 20 min tümən məbləğində bon (pulu əvəz edən qiymətli kağız) ayrılmışdı. Mən həmin bona çoxdan arzuladığım 6 cildlik «Fərhənge-Moin» (Moin fərhəngi) lüğətini, habelə məşhur Azərbaycan alimi İqra Əliyevin son günlərdə İranda fars dilində çap olunan «Atropaten» kitabını aldım.

Tehran və Qumda olduğum zaman ondan çox şe'r yazmışdım. Mayın 9-da qələmə aldığım bir qəzəlimi möhtərəm oxuculara təqdim etmək, zənn edirəm ki, maraqsız olmaz. Çünki bu qəzəldə İranla ayrılıq ərəfəsində keçirdiyim bədii hisslər qələmə alınmışdır:

*Bağiban, getməliyəm, bağda bəhər qurtardı,*
*Söyləyin tutiyə «lal ol ki, şəkər qurtardı...»*

Mayın 10-da bizi ehtiramla yola saldılar. Dərsim olduğu üçün mən Lənkəranda səfər yoldaşlarımdan ayrıldım.

Mayın 13-də artıq Bakıdaydım. Gecə birdən-birə yenə telefonum səsləndi. Əsgər Faresi idi. Dedi ki, sabah saat on ikinin yarısında İran Mədəniyyət Mərkəzinin rəisi ağaye-Ocaqnejad İrandan qayıdan nümayəndə heyətinin üzvlərini görüşə də'vət edir. Ona təşəkkürümü bildirdim.

Ertəsi gün deyilən vaxtda görüş başlandı. Sonra biz Mədəniyyət Mərkəzinin yeni binasını gəzdik, otaqlarla tanış olduq, inşası bitməkdə olan iclaz zalını seyr etdik.

Elə həmin gün, yenə saat 23-dən sonra telefonun zəngi məni yuxudan oyatdı. Dərhal düşündüm ki, bu zəng çalan adam yəqin ki, yenə Əsgər Faresi olacaq. Zənnimdə yanılmamışdım. İranlı dostum məni təbrik edib dedi:

- Ağaye-Şahin, həzrət Fatimeyi-Zəhra səlamullahe-əleyhanın şərəfinə yazdığınız və İran Mədəniyyət Mərkəzi tərəfindən elan olunan şe'r müsabiqəsinə göndərdiyiniz şe'rlər münsiflər heyəti tərəfindən mükafata layiq görülüb.

İndi Əsgər Faresinin zəngindən üç gün keçir. Amma mən yenə də onun növbəti gecə zəngini gözləyirəm. Xoşxəbər Faresi...

Mən sayca doqquzuncu olan bu İran xatirəmi Tehranda yazdığım bir qəzəlin məqtəsi ilə (son beyt) bitirmək istəyirəm:

Y aş çoxaldıqca azalmır həvəsin İranə,
Qoca Şahin, nə çəkir hey qoca İranə səni?

Tehran-Lənkəran-Бак!, 1-17 may 2000

## Doqquzuncu Səfəruamə Şe’rləri

*I*

*QƏZƏL*

*Aƨam idi könlüm, niyə əfğanə yetişdi?*
*Hey vəsl eləyən arizu hicranə yetişdi.*

*Dünya evinin bəxtiqara həndəsiyəm mən,*
*Meylim nə zaman oldu ki, imkanə yetişdi?*

*Məktub ilə ərz eyləmişəm eşqimi yarə,*
*Ərzim, ümidim yoxdu ki, sultanə yetişdi.*

*Comərdliyini ddərk elədi son nəfəsində* -
*Şəmin oduna öylə ki, pərvanə yetişdi.*

*Olsan da şəhid eşqdə qəmlənmə, ey aşiq,*
*Qəmdirmi bəyəm eşq qəməsi canə yetişdi?*

*Çoxdandı yaranmır yeni əfsanəsi eşqin,*
*Бŭ gün görəcəklər yeni əfsanə yetişdi.*

*Ömrüm boyu, billəh, mənə yad oldu soyuqluq,*
*İsti nəfəsim, Şahina, İranə yetişdi.*

*TeЬƨan yo1u*
*1.05.2000*

Fazil *II*

*DÖRDLÜK*

*Sənə vəsiyyətim belədir, ey yar,*
*Ruhum ayrılanda bədən içindən*
*De ki, kəfənimi bağlamasınlar,*
*Bəlkə çıxacağam kəfən içindən?*

*Tehran*
*2.05.2000*

*III*

*QƏZƏL*

*Nuş elə mey ki, fərəhnak edə meyxanə səni,*
*Ürəyin getsə də, saqi gətirər canə səni.*

*Söyləyirlər daha divanəliyin bitmişdir,*
*Qoysa Allah görərik biz yenə divanə səni.*

*Meylin imkanə münasibdi, gətirmiş bəxtin,*
*Qoymasın bəxt tamarzı hələ imkanə səni.*

*Rəğbətin daimidir şəmə də, pərvanəyə də,*
*Həmi şəm cəzb eləyibdir, həmi pərvanə səni.*

*Söz gülüstanı alağdan olacaqdır xali,*
*Taleyin bağiban etmiş o gülüstanə səni.*

*Hindukuş dağlarını gör neçə il gəzmişsən!..*
*Əfqanıstan eləyibdir belə mərdanə səni.*

*Yaş çoxaldıqca azalmır həvəsin İranə,*
*Qoca Şahin, nə çəkir hey qoca İranə səni?*

*Tehran*
*3.05.2000*

*IV*
*QƏZƏL*

*Çarə eləyən şe'r ilə loğmanə mənəm, mən,*
*Sidq ilə verən canım cananə mənəm, mən.*

*Biganəni gördükdə neçin busə edirlər?*
*Biganəyə, əlbəttə ki, biganə mənəm, mən.*

*Əqlim də varımdır, hələ divanəliyim də,*
*Həm aqil olan, həm də ki, divanə mənəm, mən.*

*Məstanələyin həzzini məndən soruşun siz,*
*Zahid nə bilir həzzini, məstanə mənəm, mən.*

*Təhqirə dözən kimsələrin mənliyi olmaz,*
*Gördükdə həqir kəsləri, şahanə mənəm, mən.*

*İstanbulu, Bağdadı gəzən nöqtəbənöqtə,*
*Hərdən də gedən Təbrizə, Tehranə mənəm, mən.*

*On üç baharım ötdü Fəğanıstan elində,*
*Xoş gün diləyən daima əfqanə mənəm, mən.*

*İrandə şahin quşunu görmədi Şahin,*
*Şahinlik edən indisə İranə mənəm, mən.*

*Qum şəhəri*
*4.05.2000*

*V*
*İSTƏMİRƏM*

*Hicran yavıq, vüsal uzaq,*
*Çöhrə saysız, camal uzaq,*
*Haram yaxın, halal uzaq,*
*İstəmirəm.*

*Həsrət qoyub yara məni*
*Tale saldı hara məni?*
*Basacaqdır qara məni*
*İstəmirəm.*

*Həzzi, eyşi, nişatı çox,*
*Şəkəri bol, nabatı çox,*
*Bu yerlərin büsatı çox,*
*İstəmirəm.*

*Hələ ömrün qışı deyil,*
*Bu vətəndaş naşı deyil,*
*Yalan deyən kişi deyil,*
*İstəmirəm.*

*Vətən, çəkir ocaq məni,*
*O bağ məni, o dağ məni,*
*«İstə, - deyir fəraq, - məni»,*
*İstəmirəm! İstəmirəm!*

*Tehran*
*5.05.2000*

*VI*
*QƏZƏL*

*Qəlb evim qəmxanəyə dönmüş yenə,*
*Sevgilim biganəyə dönmüş yenə.*

*Yar tənhadır bu gün, qürbətdəyəm,*
*Xoş vüsal əfsanəyə dönmüş yenə.*

*Surətimdə göz yaşım muncuqlaşıb*
*Dürrə yox, dürdanəyə dönmüş yenə.*

*Qovlamışdım, zar idi qaçqın kimi,*
*Hicrə bax, mərdanəyə dönmüş yenə.*

*Abad idi könlümün hər guşəsi,*
*Abadım viranəyə dönmüş yenə.*

*Şəmlikdən bezdi qızğın xislətim,*
*Şəmə bax, pərvanəyə dönmüş yenə.*

*Ey fələk, Şahin gəzir Leyla çölün,*
*Aşiqin divanəyə dönmüş yenə.*

*Текгап, БеШшО-Зэкга*
*6.05.2000*

*VII*
*QİT'Ə*

*Aləm haqqında deyirlər yeni fərziyyələri,*
*O biliklər ki dərindir, dayaz imiş, bildim.*

*Əl-ayağım yuyulubdur gözümün yaşı ilə,*
*Bu mərasim bu kəsə dəstəmaz imiş, bildim.*

*İki illik meyi, ey saqi, sanırlar köhnə,*
*Meyi çox saxlayanın əqli az imiş, bildim.*

*Tehran*
*7.05.2000*

*VIII*
*QƏZƏL*

*Olmasan, olmayacaqdır mənə aləm göyçək,*
*Mənə heç kimsə deyil, sən kimi həmdəm göyçək.*

*Dilərəm qəm bütün aşiqlərə səndən başqa,*
*Şənliyim qoy sənin olsun, mənəsə qəm göyçək.*

*Məcnunun görkəmi sərsəm qələmə verdi onu,*
*Leyli sevsəydi, olar idi o sərsəm - göyçək.*

*Şirinin eşqi nəsib olsa idi Fərhadə,*
*Həmi asudə olardı, həmi xoş, həm göyçək.*

*Hər sevən qəlbdə hikkə zəif olsun, amma Olsa*
*gər eşqü məhəbbət ipi möhkəm, göyçək.*

*Gözümə dik gözünü naz ilə hərdən, gözəlim,*
*Sevdiyi olsa əgər aşiqə məhrəm, göyçək.*
*Gər düşəm cənnətə yarsız, deyərəm: Ya Rəbbim,*
*Cənnətindən məni rədd eylə, cəhənnəm göyçək!*

*Şahin, İran səfərim daima göyçək keçmiş!*
*Nə təhər yerdi bu İran ki, dəmadəm göyçək!!!*

*Tehran*
*8.05.2000*

*IX*
*QƏZƏL*

*Bağiban, getməliyəm, bağda bəhər qurtardı,*
*Söyləyin tutiyə lal ol ki, şəkər qurtardı.*

*Düşünürdüm ki, fərağın daşını atdıqda Gözdə*
*qəm, üzdə təlaş, canda kədər qurtardı.*

*Amma səhv eyləmişəm, dərd-əbədi sirdaşım,*
*Daha zənn eyləmirəm məndə qəhər qurtardı.*

*Fani dünya fərəhindən elə məhruməm ki,*
*Bu fəna aləmə xoş məndə nəzər qurtardı.*

*Şair olsam da nədir faydası, təbim söndü,*
*Zərgər olsam da, nədir xeyri ki, zər qurtardı.*

*Gəlmək üçün gedirəm mən, yenə hökmən gələrəm,*
*Nə səyahət başa yetdi, nə Xəzər qurtardı.*

*Hafizin yurduna sidq ilə «xudahafiz» de,*
*Bu səfər, Şahina, İranə səfər qurtardı.*

*Tehran*
*9.05.2000*

*QƏZƏL*

*Bilməm görəcəkdirmi gözüm dilbəri bir də?*
*Dil söyləyəcəkdirmi ona «gəl bəri» bir də?*

*Tehranda ikən mili muğamım yada düşdü,*
*Yarəb, eşidərmi qulağım «Şüştər»i bir də?*

*Oldum neçə il sərsəri qürbətdə mən aciz,*
*El söyləyəcəkdir adıma sərsəri bir də.*

*Məcnunsayaq saç uzanıb... Yurda dönüncə*
*Yox məndə meyl də'vət edim bərbəri bir də.*

*İlham görünmür yenə hicran həlğndən,*
*Ey təb, açarammı görəsən dəftəri bir də?*

*Zər söz düzübən şe'rimə zərgərlik edərdim,*
*Heyran edərəmmi təzədən zərgəri bir də?*

*Şahinlərimiz çox yetişər, Azəribaycan*
*Bilməm, yetirər Mirzə Əli Əkbəri bir də?*

*Tehran-Astara yolu*
*10.05.2000*



# ONUNCU SƏFƏRNAMƏ

## *«ŞÄHİN, YENƏ İRÄNÄ YETİŞDİM, GÖZÜM ÄYDIN»*

Mənim çap olunmuş və çap olunmamış səfərnamələrim çoxdur. 23 yaşımdan səfərlərdəyəm. Əfqanıstan, Türkiyə, İran, İraq, Rusiya, Dağıstan, Gürcüstan, Tacikistan, Özbəkistan, Türkmənistan, Qırğızıstan. Ən çox Əfqanıstanda olmuşam və bu gözəl ölkəyə - dağlar və əfsanələr diyarına çox borcluyam. Ona ən böyük borcüm isə «Əfqanıstan səfər - namələrim»dir ki, hələ çap olunmamışdır. Doğrudur, həmin səfərna- mələrin böyük hissəsi bu neçə ildə itib-batdı, beş böyük dəftərimi elə Əfqanıstanda itirdim, yerdə qalanlar isə çap intizarındadırlar, arxivimdə yatıb-qalırlar. Eləcə də başqa səfərnamələrim. Amma, İran təəssüratlarım xoşbəxtlikdən çap olundu. Onlar İran İslam Cümhuriyyəti Mədəniyyət Mərkəzi tərəfindən oxuculara çatdırıldı. 9 İran səfəri və sayı yüzdən çox 9 İran səfərnamələri şe’rləri. Budur, bu da 10-cu səfər.

Məşhur şərqşünas-alim Rüstəm Əliyevə həsr olunan elmi konfransa də’vət olunmuşdum. İran Mədəniyyət Mərkəzinin məsul işçisi ağaye- Rəşadi mənə İranda keçiriləcək Beynəlxalq Kitab Sərgisində iştirak təklifi edəndə sevindim. Çünki, mən həmin münasibətlə bir dəfə də İranda olmuş, oradan çoxlu kitab almışdım. İndi isə yeni səfər - köhnə dostlarla görüş və yeni kitablar naminə.

Budur, may ayının 3-ü. Mədəniyyət Mərkəzinin qarşısındayıq. Saat 12-yə işləyir və ağaye-Rəşadi bərk narahatdır. 7 nəfərdən ibarət heyət üzvlərimizdən bəziləri gecikir (o an «ey dəqiq almanlar» deyə almanlara qibtə elədim). Mənimlə birlikdə yola düşənlər aşağıdakılardan ibarət olmalıdır: Azərbaycan Milli Elmlər akamediyası Füzuli adına Əlyazmalar İnstitutunun direktoru, filologiya elmləri namizədi Məmməd Adilov, AMEA Ədiyyat İnstitutunun əməkdaşı, filologiya elmləri namizədi Lalə Əlizadə, AMEA Nizami Gəncəvi adına Ədəbiyyat Muzeyinin şöbə müdiri Şəfəq Əlibəyli, həmin Muzeyin əməkdaşı Reyhan Aydəmir, Bakı

Dövlət Universitetinin müəllimləri - filologiya elmləri namizədi Nüşabə Əlizadə, fars dili mütəxəssisi Mehman Tarıverdiyev və mən.

Nəhayət yola düşdük. «Jiquli» markalı iki maşın bizi aparır. Maşında bu qəzəli yazdım ki, birinci beyti belə idi:

*Elə bəndə görmüşəm ki, dili var, duası yoxdur.*
*Elə üzlü kəs də var ki, üzü var, həyası yoxdur.*

*Elə zülmə qail insan görürəm yox günahı,*
*Elə zülm edən də var ki, hələlik cəzası yoxdur.*

*Ağa «ağdı» söyləsəm də, qaraya «qara» desəm də,*
*Sözümün ağı görünmür, gözümün qarası yoxdur.*

*Səfərə «xətərli» söylər neçə bixəbər səfərdən,*
*Səfərin səfası çox var, səfərin xətası yoxdur...*[6]

Budur, artıq Azərbaycan və İran Astaraları geridə qalmışdı. Tehranadək 570 km məsafə qət etməliyik. 9 səfərim müddətində gördüyüm onlarla kənd, onlarla şəhər. Gecə saat 23-dür. Rüstəmşəhr şəhəri. Şam yeməyi. Yadıma Firdovsinin «Şahnamə»sindəki Rüstəm düşdü. Zal pəhləvanın oğlu Rüstəm pəhləvan. Bu şəhər onunmu adına qoyulmuşdur? Soruşdum. Bilmədilər.

Bir qədər sonra yenidən yolumuza davam etdik. Bərk yağış yağır. Saat 4-də Tehran şəhərinə çatdıq. Yağış yenə yağır. Yağışı sevirəm. Yağış havanı, ağacları, gülləri, quşları və torpağı yuyur. Yağış çirki təmizləyir. Yağış natəmizliyin qənimidir.

Mehmansaray adlanan «Fars dili və ədəbiyyatı Mərkəzi»nin qonaq evinə gəldik. Bizi gözləyirdilər.

Səhər tezdən durdum. Yağış daha yağmırdı. Mehmansaray bağçasının qızılgülləri artıq çimmişdilər. Torpaq yuyulmuşdu. Bu mürəbbeni yazdım:

*Ey torpağa acgöz kimi bağlı qoca Şahin,*
*Torpağın seyr etməyə gəldim bu diyarın.*

---

[6] Qeyd: Mən əvvəlki «İran səfərnamələri» adlı kitabımda müvafiq səfər şe’rlərimi hər səfərdən sonra ayrıca vermişəm. İndi də o qaydaya əməl edirəm.

*Yer kürəsi torpaq ilə dolmuşsa da, lakin*
*Torpağını seyr etməyə gəldim bu diyarın...*

*Göz var ki, doyub sevdiyi cananı seyrdən,*
*Göz var ki, bezib hurini, qılmanı seyrdən,*
*Şahin gözü doymur niyə İranı seyrdən?*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

4 may, 2004. Sübh tezdən saat 8 radələridir. Mehmansarayın pəncərəsindən bağçaya və küçəyə baxıram. Günəş utancaq gəlin kimi gah görünür, gah gizlənir.

Son vaxtlar məni yapon şe’r janrı olan xokku (cəmi 3 sətirdən və əsasən 17 misradan ibarət şe’r) özünə yaman çəkir. Balaca qafiyəsiz şe’r və müəyyən mə’na. Bakıda yüzədək xokku (hayku) yazmışam. Astara sərhəddini keçəndən sonra ilan kimi qıvrılan və canan teli kimi burulan yola dair belə bir xokku (hayku) yarandı:

*Bakı-Tehran yolu Cananın zülfü kimi*
*Qıvrım bir yol.*

Lap elə indicə, Tehranda, Mehmansarayın pəncərəsindən küçəyə baxa-baxa ikinci xokkunu yazdım:

*«Qorxulu Tehran»*
*Duymadıq qorxu Tehranda,*
*Məmməd Səid!*

Sübh yeməyindən sonra bizim üçün xüsusi ayrılmış avtobusa minib Qum istiqamətində yollandıq. İmam Xomeyninin aramgahına aparırlar bizi. Mən oranı dəfələrlə ziyarət eləmişəm.

Avtobusumuz xarici qonaqlarla doludur: Azərbaycanlı, gürcü, rus, ukraynalı, ərəb, hind, türklərə yaxınlaşıram. Mustafa Çiçəklər məni öz yoldaşları ilə tanış edir: Əli Gözəlyüz, Dərya Ors, Hicabi Kırlanqıç. Mustafanın qıçından tutub soruşdum: Kırlanqıç - yəni Qırılan qıçmı? Dedi: - yox, kırlanqıç,

yəni qaranquş. Mən sonradan Kırlanqıçla daha yaxından tanış oldum və ona dedim:

- Mən şahin, sən qaranquş.

Dedi: - Şahin tutar, qaranquş uçar. Qoy Şahin uçub Türkiyəyə gəlsin və mən qaranquş onu tutub orada saxlayım.

Dedim: - Y ox, hərənin öz vətəni.

Gülüşdük.

Xeyli yol qət edib aramgaha yaxınlaşırıq. Artıq 4 ildir ki, mən bura - da olmamışam. Yaşıllıq xeyli artıbsa, tikinti işləri hələ də davam edir.

Ayaqqabılarımızı çıxarıb aramgaha daxil olduq.

Önümüzdə əllərində əklil tutan əsgərlər. İndi əklilqoyma mərasimi başlanacaq.

Təşrifat sərbazları. Əllərində sıyrılmış qılınclar. Sinələrində iki şüar yazılmış lentlər: «Əs-səlam, ya Ruhullah»; «Allahu əkbər! Canəm fədeyi-rəhbər!» (yəni «Ey Ruhulla (İmam Xomeyninin adı - Ş.F.) salam! Böyük Allah! Canım rəhbərə (yəni Xomeyninin varisi ağaye-Xameneyiyə) fəda olsun»).

Mərasim sona yetdi. Bizi təşrifat otağına gətirdilər. Bizi müşayiət edən Həsən Həsənzadə məndən xatirə kitabına ürək sözlərimi yazmağı xahiş etdi. Dedi ki, bir neçə il bundan əvvəl Heydər Əliyev də bu kitabı öz sözləri ilə bəzəyib imzalamışdı. Mən qələmi əlimə götürüb 21 ölkədən gəlmiş nümayəndə heyətimiz adından fars dilində bir neçə cümlə yazdım və imzaladım.

Mehmansaraya qayıtdıq. Nahar zamanı keçən görüşdən tanıdığım Həsən Didebanı gördüm. O, məni dərhal tanıdı: Ustad Şahin Fazil?

Yaddaşına heyrətləndim. Cavanlıqda elə mənim də yaddaşım güclü idi. Yaş yaddaşı zəiflədir.

Günorta istirahətindən sonra Beynəlxalq kitab sərgisinin təşkil olunduğu yerə gəldik. Onlarla pavilyon, on minlərlə kitab.

Bir pavilyonun qarşısında Bakıdakı «Əl-hüda» kitab mağazasının müdiri, alim dostum Mirzə Rəsul İsmayılzadə ilə görüşdük. Azərbaycan dilində Quranın son tərcüməsi onundur və mən həmin tərcümə barədə «Göydən gələn kitabın yerdə növbəti tərcüməsi» adlı bir elmi məqalə yazıb «Elm» qəzetində dərc etdirmişəm. Bizi görən Mirzə Rəsul sevinib, saat 18-də 5-ci pavilyonun ikinci mərtəbəsində elmi bir seminar keçiriləcəyini bildirdi və bizim

iştirakımızı vacib saydı.

Saat 18-dən bir qədər keçir. Mirzə Rəsulun özü gecikir (Ah alman dəqiqliyi). Nəhayət seminar işə başladı. Sərginin konfrans zalı qonaqlar və jurnalistlərlə doludur. Telekameraların gözləri üzümüzə zillənmişdir. «Əl-hüda» nəşriyyat və mağazalar şəbəkəsinin müdiri ağaye-Novnejad da buradadır. Seminarı giriş sözü ilə açan Mirzə Rəsul Azərbaycan barədə xeyli danışdı, xalqımızı yüksək qiymətləndirdi. Dedi ki, yazıçı Əlibala Hacızadənin əsərləri sovet hakimiyyəti dövründə milyon tirajla çıxardı, amma indi demək olar ki, heç çap olunmur, iqtisadi vəziyyət çətindir. Həm də kiril əlifbasından latına keçdilər ki, bu da vəziyyəti bir qədər çətinləşdirdi. Buna baxmayaraq Azərbaycanda çap işləri getdikcə artmaqdadır. Mirzə Rəsul buna misal olaraq özü tərəfindən həyata keçirilən Şah ismayıl Xətainin ərəb və latın hərfləri ilə çap olunan kitabın adını çəkdi.

Sonra ağaye-Novnejadın çıxışı oldu. O, bizi hərarətlə salamladı. Söz mənə verildi. Azərbaycanlı həmkarlarımı təqdim etdikdən sonra elə bu gün yazdığım «Gözüm aydın» rədifli qəzəlimi oxudum:

*Verdim cam, canam yetişdim, gözüm aydın.*
*Canam yetib cam yetişdim, gözüm aydın...*

*Əl gül sayağı pakizə, pakizə ayaq həm,*
*Bəh-bəh ki, gülüstanə yetişdim, gözüm aydın.*

*İmkan ələ düşmürdü alam busə üzündən,*
*Görcək onu imkanə yetişdim, gözüm aydın.*

*Zənn eyləməsinlər ki, sənəm tərifidir bu,*
*Şahin, yenə İranə yetişdim, gözüm aydın.*

Seminar davam edirdi. Mirzə Rəsul tərəfindən «İranın azərbaycanlı şairi» kimi təqdim olunan Əkbər Azad heca vəznində yazdığı bir şe'rlə çıxış etdi. İkinci azərbaycanlı İran şairi Abdullahi məşhur Gülüstan və Türkmənçay sülh müqavilələri və Azərbaycanın bölüşdürülməsi barədə yazdığı poemadan bir parçanı yana-yana oxudu:

*«Yazıldı qan ilə müqaviləsi,*

*Arzusun daşlara çaldı Gülüstan».*

Lalə Əlizadə bu səfər münasibətilə öz təşəkkürünü bildirdi və sərgi barədə fikirlərini söylədi. Nüşabə Əlizadə isə, məşhur şərqşünas alim, «Şahnamə»nin və başqa əsərlərin farscadan Azərbaycan dilinə tərcümanı olan atası Mübariz Əlizadənin xidmətlərindən danışdı və onun yeni tərcüməsinin yaxın vaxtlarda çap olunacağını bildirdi. Nüşabə atasının İmam Xomeyninin irfani şe'rlərinin Azərbaycan dilinə tərcüməsi barədə də danışmağı unutmadı.

Məmməd Adilov artıq 3-cü dəfə İranda olduğunu, lakin bu kitab sərgisində ilk dəfə iştirak etdiyini bildirdi: «Təəssüratım o dərəcədə böyükdür ki, mən hələ özümə gəlməmişəm, çünki kitab dəryası içərisində qərq olmuşam».

Reyhan Aydəmir işlədiyi Ədəbiyyat Muzeyində «Füzuli ensiklopediyasının» hazırlanması barədə məlumat verərək əsərləri üzərində tədqiqat işi apardığı Bahar Şirvanidən xeyli danışdı.

Mirzə Rəsul İsmayılzadə Astaradakı Azərbaycan gömrük işçilərindən şikayətlənib, onların İranda Azərbaycan dilində nəşr olunan «Varlıq» jurnalının Azərbaycana aparılmasına icazə verməmələrindən bəhs etdi. Ondan sonra danışan Şəfəq Əlibəyli N.Gəncəvi adına Ədəbiyyat Muzeyində özünün rəhbərlik etdiyi «Beynəlxalq əlaqələr» şöbəsi barədə məlumat verdi və əlaqələrin Azərbaycan və İran arasında daha da genişlənəcəyinə ümid etdiyini bildirdi.

Mən fürsətdən istifadə edib və «Əl-hüda» nəşriyyatının geniş imkanlarını nəzərə alaraq, vaxtı ilə Əfqanıstandan gətirdiyim və Azərbaycan dilində çap etdirdiyim «Vaqeate-Mir Veys və Şah Hüseyn» əlyazma nüsxəsi barədə söhbət açdım və XVII əsrin 20-ci illərində İranın əfqanlar tərəfindən işğalına həsr olunan, bir neçə il əvvəl mənim fars dilinə tərcümə etdiyim həmin kitabın Tehranda çap edilməsini rica etdim. Ağaye-Novnejad dərhal razılaşdı və əsəri ona göndərməyimi arzuladı.

5 may. Bu gün mehmansarayda əfqan nümayəndə heyətinin üzvləri ilə yaxından tanış oldum.

D-r Məhəmməd Hüseyn Yəmin - talibançıların süqutundan sonra bir müddət Kabul Universitetinin rektoru olmuş bu alim hal-hazırda həmin universitetin «Dəri departamenti»ndə (fakültəsində) müəllim işləyir. Rusca

bilirsə də yaxşı danışmır. Fars (dəri) və rus dillərinə dair tədqiqat işləri vardır:

Məhəmməd Nəcib - Ali təhsil Nazirliyi Xarici əlaqələr şöbəsinin müdiridir;

Şücaəddin Xorasani - təlim və tərbiyə Universitetinin rektorudur. Dəri dilində şe'r yazır (əsasən sərbəst vəzndə);

Ustad Mehmad - Nəngərhar (Cəlilabad) universiteti ədəbiyyat fakültəsinin ustadıdır.

D-r Məhəmməd Hüseyn Yəmindən vaxtı ilə mənim yaxından tanıdığım və günlərlə işgüzar söhbətlər apardığım bəzi yüksək rütbəli dövlət xadimlərinin aqibətləri barədə məlumatlar aldım. Öyrəndim ki, mənim ən yaxın əfqan dostlarımdan biri olan akademik Əhməd Cavid təlibanın hakimiyyəti dövründə Hindistana qaçmış, bir müddət orada yaşamış və keçən il vəfat etmişdir. «Xorasan» jurnalının əməkdaşı olan şair Mail Herəvi də ölmüş, oğlu Nəcib Mail isə İranda məskən tapmışdır və hazırda Tehrandadır. Nazirlər Süleyman Layiq - Almaniyada, Bareq Şəfi - İngiltərədə, Məhəmməd xan Cəlalər - Amerikada, Əbdülkərim Misaq - İngiltərədə, baş nazir Sultan Əli Keştmənd də İngiltərədədir. Vaxtı ilə ticarət naziri vəzifəsində işləmiş və tezliklə inqilabı hökumət tərəfindən zindana salınmış Məhəmməd Qurbəndi də xarici ölkələrin birində yaşamaqdadır (indi o, lap qoca olar - Ş.F.). yeganə qadın nazir olan Anahita Ratibzad isə, çox güman ki, Rusiyadadır.

Günorta üstü bizi məşhur «Lalə» otelinə gətirdilər. Burada bizim böyük nümayəndə heyətimizlə görüş keçiriləcəkdir. İranda böyük nüfuza malik olan Mahmud Məhəmmədiye - İraqi görünən kimi hamı ayağa qalxdı. Ədəbiyyat və humanitar elmlər fakültəsinin (Tehran universiteti) rəisi d-r Vaiz də rəyasət heyətində əyləşmiş və mehriban baxışlarla hamını süzürdü. Tədbiri fars dili və ədəbiyyatı fərhəngistanın rəisi d-r Məhəmmədxani açdı, kitab sərgisi barədə müfəssəl məlumat verdi.

Sonra bu məclisin aparıcısı d-r Xudayar iştirakçılara məni həm də şair kimi təqdim etdi, fars dilində də şe'rlər yazdığımı bildirdi və tribuniya də'vət elədi. Mən Əfqanıstanda yazdığım və «Mirmən» jurnalında çap etdirdiyim «Qapılar» («Dərvazeha») adlı şe'rimi oxudum və hamıdan çox əfqanlar məmnun oldular. D-r Xudayar isə öz zarafatından qalmadı. Dedi ki, arzu edirik ki, siz İrana 10 dəfə deyil, 40 dəfə gələsiniz. D-r Xudayarın bu sözünün mə'nasını oxuculara çatdırmaq üçün «Qapılar» şe'rinin Azərbaycan dilinə

tərcüməsinin burada verilməsi yerinə düşərdi:

*Səhər gündüzün,*
*Gündüz axşamın,*
*Äxşam gecənin,*
*Gecə səhərin qapısını açar,*
*Hey açılıb-örtülər qapılar.*
*Sən mənim,*
*Mən sənin,*
*O bunun, bu onun Qapısını açar,*
*Hey açılıb-örtülər qapılar.*
*Müxtəlif qapıları açıb-örtməklə*
*Keçir gün,*
*Bəzi qapıları açıram örtməyim deyə,*
*Bəzi qapıları örtürəm Äçmamaq*
*üçün.*

Şe’rimi oxuyub qurtaran kimi dedim ki, qoy İran və Azərbaycan arasındakı qapılar həmişə açıq olsun. Mənim bu sözlərim alqışlandı və d-r Xudayar bizim İrana gəlişimizin arzulandığını bildirdi, dedi ki, qapılarımız həmişə açıq olacaqdır, inşallah.

Məndən sonra Tacikistandan gələn şair Daranecat «Ruh gülü» («Şokufeye-ruh») adlı şe’rini oxudu (şe’r imam Xomeyniyə həsr edilmişdir). Vəcdə gələn Daranecat ikinci şe’rini də təqdim etdi (İmam Əliyə ithaf). Nəhayət ağaye-İraqi ayağa qalxıb sözə başladı (ona əvvəlcə söz verildiyinə baxmayaraq, özü çıxışını axıra saxlamışdı). Sözünə Nizami Gəncəvinin «Məxzənül-əsrar» əsərinin ilk beyti ilə başlayan İran Mədəniyyət və İslam əlaqələri İdarəsinin rəhbəri nümayəndə heyətimizin ünvanına hərarətli sözlər dedi, görüşümüzdən məmnunluğunu bildirdi.

Görüş bitdikdən sonra otelin foyesində vaxtı ilə Bakıda İran Mədəniyyət Mərkəzinin işçisi olmuş ağaye-Faresi ilə xeyli söhbət etdim.

Gecə mehmansarayda bu qəzəli yazdım:

*Ömr uzunu çox yanı alqışladım,*
*Öncə Azərbaycanı alqışladım...*

*Qorxu hanı, ey ulu Məmməd Səid,*
*Qorxusu yox Tehranı alqışladım.*

*Alqışa layiq bu qəzəl, əl çalın,*
*Mən təzədən İranı alqışladım.*

*Sərhədi yox alqışımın, Şahina,*
*Bir də Azərbaycanı alqışladım.*

Bu gün Züleyxa Damyar adlı jurnalist qız («Fars dili və ədəbiyyatının inkişafı Mərkəzi»nin işçisi) mehmansarayda məndən geniş müsahibə götürdü. Mən sonrakı günlərdə Züleyxanı hər görəndə zarafatla ondan soruşurdum: - Ey Zoleyxa, Yusife gomgəşte ku? (yəni, ey Züleyxa, hanı itgin düşən Yusif?). Gülümsünüb deyirdi: İtgin Yusif itib-batdı. (Yusife gomgəşte, gom goşte).

6 may. Bu gün «İran və cahan ədəbi amilləri» adlanan elmi konfransda iştirak etmək üçün «Fars dili və ədəbiyyatının İnkişafı Mər- kəzi»nə getdik. Bakıdan Dini qurumlarla iş Komitəsinin şöbə müdiri Miryəhya Bədirov da gəlib bizə qoşulmuşdu. Aparıcı d-r Xudayar çıxış edib dedi ki, bu günki konfrans say etibarı ilə ikinci Beynəlxalq konfransdır ki, onun işində onlarla xarici ölkə alimləri öz dəyərli çıxışları ilə iştirak edəcəklər.

Qur’an tilavətindən sonra Mərkəz sədrinin müavini Mehdi Sənayi bizi salamladı, kitab sərgisini ən böyük mədəniyyət sərgisi adlandırdı, ədəbiyyatın cahan mədəniyyətlərinə təsirindən danışdı, şe’rin həmişə canlı olduğunu qeyd etdi, maşının, qəzetin, televiziyanın, radionun dünya üzünə gəlməsindən çox-çox əvvəl şe’rin mövcudluğundan söhbət açdı, fars dilinin şe’r dili olduğunu bir daha xatırlatdı.

D-r Xudayar sözü Mərkəzin sədri Əli Əsgər Məhəmmədxaniyə verdi. Cənab Məhəmmədxani mərhum d-r Hədidinin əsərlərindən geniş bəhs etdi, tətbiqi ədəbiyyatın bütövlükdə cahan ədəbiyyatına təsirindən danışdı, dedi ki, dünyada yaranan əksər əsərlər, o cümlədən Avropa, Latın Amerikası, Afrika ölkələrində yazılan kitablar fars dilinə tərcümə olunmaqdadır.

İki gün davam edən bu konfransda maraqlı məruzələr oxundu. Əfqan tədqiqatçısı Məhəmməd Hüseyn Yəmin fars dili və başqa dillər arasındakı oxşar və fərqli cəhətlər barədə, Qatar Ərəb Respublikasından gəlmiş Abdullah Fərəc rübai ustadı Ömər Xəyyam rübailərinin tətbiqi tədqiq olunması haqqında

danışdılar. İran alimi Məhəmməd Bağır Kəmaləddini orta əsrlərin müəyyən dövrlərdə yaşayıb-yaratmış üç məşhur şəxsiyyətin - Şeyx Əbubəkr Kelabadinin, Bəha Vələdin və Əbdürrəhman Caminin irfana dair yazdıqları kitablar («Təərrof», «Maarif» və «Əşə'ətül-səməat») barədə öz tədqiqatından söhbət etdi ki, Cami öz «Əşə'ətül-səməat» əsərini Əlişir Nəvainin xahişi ilə yazmış, nəsrdə də öz ustalığını nümayiş etdirmişdir. Hər üç kitab islam təsəvvüfü və irfan barədədir. İordaniyadan gələn ərəb tədqiqatçısı Məhəmməd Əhməd əl-Zoğul fars dili və ədəbiyyatının Əbu Fərrac Həmədani şe'rinə təsirindən, başqa iordaniyalı Bəstam Əli Robabeə isə öz ölkəsində fars ədəbiyyatının yayılmasında böyük İordaniya şairi Ərrarın göstərdiyi səylərdən danışdı.

Burada bir haşiyə çıxmaq lazımdır. Proqramda mənim adıma yazılmış bir məruzə («Bakı əlyazma nüsxələrinin tədqiqi») mənim təklifimlə Məmməd Adilova həvalə olundu, çünki Bakı əlyazmaları barədə burada ondan yaxşı məlumat verəcək adam yox idi. Mən isə bəzi məruzələr haqqında fikir söyləmək və fars dilində iki şe'rimi oxumaqla kifayətləndim.

Nahar fasiləsindən sonra hollandiya alimi Diving, gürcü Nomadi Bartaya, türk Hicazi Kırlanqıç, suriyalı Səid Rüstəm, rusiyalı Tatyana Markina, Çin tədqiqatçısı xanım Mu-hung-yan, hindistanlı Mariya Bilqeys, azərbaycanlı alimlər Şəfəq Əlibəyli, Lalə Əlizadə, Nüşabə Əlizadə və Reyhan Aydəmir çıxış etdilər.

Saat 11-dir. 20 dəqiqəlik istirahət. Amma, mənim istirahət etməyə macalım olmadı. Qəhvə fincanını təzəcə əlimə götürmüşdüm ki, İran Televiziyasının «Əxbar» («Xəbərlər») proqramının jurnalisti Məhəmməd Rza Fəxxarı mənə yanaşıb özünü təqdim etdi. Söhbət müasir dövrdə Azərbaycan-İran elmi və ədəbi əlaqələri ilə bağlı idi.

İclas zalı. Xitabət kürsüsü. Holland alimi Diving inigilis dilində danışır. Onun çıxışı qurtarar-qurtarmaz mənə yaxınlaşan cavan bir oğlan nəzakətlə dedi: Sizi zalın çıxışında gözləyirlər. Yerimdən durub oğlanın ardınca getdim. Məni bir qız gözləyirdi, yanında da teleoperator. Növbəti müsahibə. Qız özünü təqdim etdi: CNN Televiziya Şirkətinin jurnalisti Əfiyyə Rəbii - Avropa və Asiya ölkələrində yaşayan iranlılar üçün yayımlanan Proqramın əməkdaşı. Söhbətimiz maraqlı alındı. Farsca danışırdıq. Ə.Rəbiini ən çox Azərbaycanda fars dilinin tədrisi maraqlandırırdı.

Saat 15-dir. Mehmansaraydayıq. Axşam yenə nümayişgaha getməliyik. Yorulmuşam. Gedəsi olmadım. Yoldaşlarım getdilər. Mənsə, mehmansarayın qızılgüllərlə dolu kiçik bağçasındakı skamyada oturmuşam. Hovuzda balıqlar o yan bu yana üzürlər. Bakını xatırladım. Tamrida yadıma düşdü. Artıq darıxıram. Nə olub axı: Yoxsa bu 3 gündə İran ilə etdiyim sevdadan bezdimmi? «Sevda» rədifli bir qəzəl yazdım:

*Şadəm, edirəm mən yenə İran ilə sevda,*
*Tək dillə deyil, eyləyirəm can ilə sevda...*

Axşam saat 20-dir. Mehmansarayın I mərtəbəsindəki o qədər də böyük olmayan salona yığılmışıq. Şe'r məclisi olacaq. D-r Xudayar hüznlə dedi : Müasir fars qəzəlinin parlaq ulduzlarından biri olan
Hüseyn Monzəvi dünən vəfat etmişdir. İndi sizə oxuyacağım şe'r o mərhumun şe'ridir.

Oxudu, nə oxudu! Hamımız təsirlənmişdik.

Mehdi Sənayi bizimlə tanışlıqdan böyük sevinc hissi keçirdiyini bildirdi, səfər təəssüratlarımızın gələcəkdə tərəfimizdən yazılmasını və ölkələrimizdə çap olunmasını arzu etdi. Mən dərhal otağıma gedib keçən il çap olunmuş «İran səfərnamələri» kitabımdan bir neçə nüsxə ilə qayıtdım, onların birini M.Sənayiyə təqdim etdim. Varaqladı, «Təəssüf ki, azəricə oxuya bilmirəm» - dedi. Amma, dərhal sözünə davam etdi: «Burada Sizin dili bilənlər çoxdur. Tərcüməçi vasitəsilə tanış olarıq».

Söz mənə verildi. İkisi farsca, biri isə azərbaycanca yazdığım şe'rlərimi oxudum. Bu vaxt üç iranlı qonaq gəldi, onlar da çıxış etdilər. Ədəbi söhbətlərimiz davam edir, vaxtın ötməsini hiss etmirdik. Gürcü alim dostumuz Nomadi Bartaya söz aldı, Şeyx Sədinin bir şe'rinin tərcüməsini gürcü dilində oxudu. Şair Əbdül Cabbar Vakayinin şe'rindən sonra iki nəfər çinli də gəldi. Növbə musiqiçilərə çatdı. Movlana Ruminin və Hafiz Şirazinin sözlərinə həsr olunmuş mahnıların ifası. 3 qəzəl oxuyan xanəndə 4-cüsünə başlamazdan əvvəl dedi: İşin də həddi var, sözün də, musiqinin də. İndi siz deyin: Musiqi bəsdir, ya yox? Mehman farsca dilləndi: Yorulmamışıq. Sübhə qədər (ta sobh) dinləməyə hazırıq. Xanəndə hazırcavab idi: Onda gərək şam yeməyini yox, sübhə yaxın sübh yeməyini gətirsinlər.

İranlılar yaman qonaqpərvərdirlər. Hiss edirdim ki, elə özləri də yorulublar. Amma, bunu əsla büruzə vermirdilər.

Gecə. Otağımdayam. Bu gün oxunan qəzəllərin təsiri canımdan çıxmırdı. Qəzəllərin təsiri məni, qəzəl yazmağa sövq etdi:

*Aşiq görürəm ah ilə əfğan ürəyində,*
*Aşiq dəxi var gül və gülüstan ürəyində...* [7]
*Saçlarımın rəngini yaşıl gördüm yuxuda,*
*Yer tapmayıbmı, saçda yaşıl da rəng*
*olarmı, İlahi?*
*Torpaqda qəşəng olur,*
*Yarpaqda qəşəng olur,*
*Бaşda qəşəng olarmı, İlahi?..*

Sübh yeməyindən sonra maşınlara əyləşib, yenidən «Fars dili və ədəbiyyatının inkişafı Mərkəzi»nə gəldik. Mərkəzin iclas zalında, müxtəlif dünya ölkələrindən təşrif gətirmiş fars dili və ədəbiyyatı üzrə müəyyən uğurları olan xarici və yerli alimləri masa arxasına də'vət etdilər: Nomadi Bartaya (Gürcüstan), Hicabi Kırlanqıç (Türkiyə), Səid Rüstəm (Suriya), Dərya Ors (Türkiyə), Tatyana Markina (Rusiya. Bu qadın bir müddət Bakıda və Düşənbədə işləmiş, sonrakı həyatını isə Moskva ilə bağlamışdır), Mu-hung-yan (Çin), Mariya Bilqeys (Hindistan. O, irnaşünas hind alimi d-r Nəzir Əhmədin qızıdır. Xanım Bilqeysin özü də fars dilini öyrənərək, atası kimi fars ədəbiyyatı üzrə ixtisaslaşdı və Hindistanda sayılıb-seçilən alimlərdən oldu), Əli Gözəlüz (Türkiyə), bayaq xatırlatdığım Mustafa Çiçəklər (Türkiyə) və bizim Azərbaycan nümayəndə heyətimizin bəzi üzvləri: Şəfəq Əlibəyli, Nüşabə və Lalə Əlizadə bacıları, Reyhan Aydəmir və mən.

Aparıcı (adını unutdum) İran alimi xanım d-r Müşərrəfin, şair d-r Məhəmməd Mosəffanın (Tehran Universitetinin ustadları), xanım Zəhra Xosrovinin və d-r Səid Səidpurun da burada olduqlarını xüsusi vurğulayıb onları bizə təqdim etdi.

Alimlərin hər biri məşğul olduqları mövzu üzrə çıxış etdilər.

---

7 may. Bu gün sübh tezdən bu gecə gördüyüm bir yuxunun təsiri ilə bir sərbəst vəznli şe'r yazdım, adı «Yaşıl rəngli saçlar». Adı qəribədir, deyilmi?

Məclis bitdikdən sonra 3 saatlıq istirahət, daha sonra da gəzinti. «Bağe-Cəmşidiyyə»yə gəldik. Dağüstü parkdır. Burada əvvəllər də olmuşdum. Gözəl yerdir. Keyfimiz kök idi, amma bir hadisə üzündən qanımız qaraldı. Bizi bu səfər zamanı həmişə müşayiət edən gözəl xanım Məryəm Mədəni üstü sal daşlarla döşənmiş pilləkənlərdən aşağı düşərkən ayağı sürüşdü və yıxıldı. Bağdan geri qayıtdıqda bütün yol boyu ağrısa da üzündən təbəssüm əskik olmurdu. Elə maşındaca belə bir qit'ə yazdım:

*Bu təravət bağının qönçəsini seyr elədim,*
*Həm gözəllikdə qənirsiz bu gözəl, həm mədəni...*

*Üzünə hansı kəsin bəd nəzəri zilləndi?*
*Sərv tək düşdü qəfildən yerə Məryəm Mədəni.*

*Bu nəzakət ki, var onda, belə fikr eyləyirəm:*
*Ona tay olmayacaq gər ola aləm mədəni...*

Mehmansaraydayıq. Mən bu qit'əni bizim qadınlara oxuyanda Şəfəq Əlibəyli dərhal dedi:

- Nə deyirsən, məgər sənin bizə də şe'r yazmağından ötrü yıxılmağımızmı lazımdır? Eləsə, mən yıxılmağa hazıram.

Hamımız gülüşdük. Amma iki gün sonra qəribə bir əhvalat baş verdi: Şəfəq xanım da yıxıldı. Bu haqda sabahkı təəssüratımda. Mən gecə belə bir şe'r yazdım:

*Azərbaycan, uzun illər*
*vüsal durub, hicran durub,*
*hərdənbir də şeytan durub*
*sənlə İran arasında...*

*aralıqda izzətimiz lakin qalıb, ülfətimiz lakin*
*qalıb, hörmətimiz lakin qalıb.*
*Neçə ildir Şahin qalıb Bakı-Tehran arasında.* [8]

---

8 may. Günortayadək mehmansarayda olduq. Qadınlarımız dükanlara yollandılar. Mehman da təbrizli bir iş adamıyla harasa getdi. Məmməd Adilov

*Necə işdir ki, bizi çərx müdam aldatdı,*
*Məni saqi, səni mey, saqini cam aldatdı.*

*Huri xoşdursa da, yox qılmana rəğbət məndə,*
*Qəznəvi Mahmudu bir adi qulam aldatdı...*

*Şahinin şe'ri də irfaniləşir, ey Xəyyam Məni*
*saqi, səni mey, saqini cam aldatdı...*

Saat 15-də kitab sərgisinə (nomayeşgahe-ketab) getdik. Əlizadə bacıları və Şəfəq Əlibəyli mərhum professorumuz Mübariz Əlizadənin qardaşıgilə getmişdilər. Heyət üzvlərimizdən üçümüz sərgidəydik: Reyhan, Miryəhya və mən. Üç saat pavilyonları, nümayişgahın istirahət yerlərini, sərgi zallarını gəzdik, aldığımızı aldıq. «Əl-hüda» nəşriyyatının kitabları olan pavilyonda Mirzə Rəsul İsmayılzadə Reyhanla məni şərbətə qonaq etdi. Qapıda Miryəhya göründü: - Şahin müəllim, sənin «İran səfərnamələri» kitabın da sərgidədir.

Mirzə Rəsul gülümsündü: - Dostumun səfərnamələrini İrana mən gətirmişəm.

Nümayişgahdan qayıtdıqdan sonra romantik əhvali-ruhiyyədə idim. Bir sevgi şe'ri (qoşma) yazmaq istədim və yazdım da:

*... Şahin, vüsal oxu dəymədi daşa,*
*Qovuşdu yar yara, sirdaş sirdaşa,*
*Fərəh sevinc ilə dayandı qoşa,*
*Dərd bir yana getdi, kədər bir yana.*

Kaş hamının fərəhi sevinc ilə qoşa dayana, dərdi bir yana, kədəri isə başqa yana gedə. Otağımda təkəm. Bakını və dostlarımı xatırladım. Tofiq Cahangirov yadıma düşdü. Gözəl fars dili mütəxəssisidir. Əruz ədəbiyyatını sevir, qəzəl yazmaqda mənim mövqeyimi müdafiə edir. Mövqe isə belədir: Bu günün Azərbaycan qəzəli bu günün dilində də yazılmalıdır! Bu gün Füzulinin, Seyid Əzimin, lap Vahidin də ərəb-fars sözlərindən bəhrələndikləri şe'r dilindən

---

soyuqlamışdı və yataqdaydı. Darıxdım. Nədənsə, böyük fars şairi Ömər Xəyyamı xatırladım. Y axşı ki, xatırladım. Dərhal bir qəzəl yarandı:

qaçmaq və xəlqi qəzəl yazmaq lazımdır. Yazıq canım, neçə illərdir ki, bu yolda qələm işlədirəm, amma əleyhdarlarım çoxdur:

*... Deməyin bir daha Şahin qəzəli sadə yazır,*
*İttiham eyləməyin bir daha təkrar məni.*

*Yazıram şerimi mən azəribaycanlı üçün,*
*Qoy zəif eyləməsin zənn Ələmdar məni...*

Mehmansarayın foyesindəyik. Bizə mehmandarlıq edən ağaye - Həsən Dideban və Həsən Həsənzadə Mehman ilə məni çay içməyə də’vət etdilər. Söhbət əsnasında Dideban «İran səfərnamələri» kitabımı dünən varaqladığını, kitabda verdiyim foto-şəkillərdə çoxlu tanış simalar gördüyünü bildirdi. Əlavə etdi ki, bu kitabı hökmən fars dilində çap etmək lazımdır. Mən öz razılığımı bildirdim. Mehmandarım bu haqda İİR-nin Azərbaycandakı səfirliyindən xahiş və Bakıdakı İran Mədəniyyət Mərkəzinin rəhbərliyinə (cənab Seyid Əli Əkbər Ocaqnejada, onun müavini İbrahim Nuriyə və məsul işçi Mirvəli Musəviyə) müraciət edəcəyini bildirdi. Görək nə olur? Çap edəcəklərmi? Ya Allah!..

9 may. Sübh tezdən Amerikadan Nyu-York Universitetinin Ədəbiyyat və dil üzrə koordinatoru d-r Paul Şiraxman mehmansaraya gəldi.

Saat 10-da «Niyavəran sarayı»na («Kaxe-Niyavəran») doğru üz tutduq. Məşhur bir saray! Daha doğrusu, hal-hazırda məşhur bir muzey. İran qacarlar və pəhləvilər dövründən qalmış qiymətli incəsənət və məişət nümunələrinin, dəyərli mebellərin, nadir qab-qacağın, şahlara bağışlanmış xatirə hədiyyələrinin, silahların, asare-ətiqənin qorunub- saxlandığı iki mərtəbəli bir bina. Mən bu sarayda əvvəllərdə olmuşam.

Otaqları bir-bir gəzirik. Yüngülcə axsayan Məryəm Mədəni də bizimlədir. O da mənim kimi, xanım bələdçinin bu sarayın tarixi haqqında dediklərini öz yaddaş dəftərinə qeyd edir.

Kaxe-Niyavəran. İranın son iki əsr tarixini xatırladan tarixi bir abidə. Bu sarayın hər bucağı tarixin qiymətli yadigarıdır. Buradakı otaqların müxtəsər təsvirini verməyə çalışacağam.

I. Otaqe-monşiye-ələm. Məşrutə dövründə belə adlanırdı bu otaq. Sonradan şahın xüsusi kitabxanasına çevrildi.

2.0taqe-cəng. Hərbi işlərin müzakirəsi bu otaqda aparılırdı. Otağın güllə deşməyən şüşələri.

3. Talare-cəhannoma, yaxud Talare-ayine. Məhəmməd Rza Pəhləvinin iş otağı bura olmuşdur. Bu otağın sol tərəfindəki kiçik bir otaqda münşi (katib), sağ tərəfdəki otaqda isə hakim əyləşərmiş.

4. Şahneşin. Şahın istirahət otağı.

5. Şaha verilmiş medal və başqa təltif əşyaları saxlanan otaq. Burada səfəvi, zəndiyyə və qacarlar dövrünə aid də silahlar vardır.

6. Hamam otağı.

7. Hədiyyələrin rəsmi təqdim olunma otağı.

8. Şah qəbuluna gələn mehmanların gözləmə otağı. Xarici dövlət səfirlərinin gətirdikləri və şaha təqdim etdikləri hədiyyələr.

9. Şahın günorta vaxtı istirahət otağı. Mizin üstündə M.R.Pəhləvinin gözəl tərtibatlı olduqca böyük bir kitabı. Onun ingilis dilinə tərcümə nüsxəsi də buradadır. Kitabın adı: «Məmuriyyət bəraye-vətənəm» («Vətənim üçün görülən işlər»). Divara göz gəzdirirəm. Gözəl bir tablo. Müəllifi Laton familiyalı fransızdır. Adı «Madər və fərzənd» («Ana və övladı») olan bu tablo, mən deyərdim ki, dövrünə görə möcüzəli bir sənət əsəridir: otağın işığı sönəndə tablodan işıq çıxır.

10. Hovuzxana otağı (Qacarlar dövrünə aid).

II. Şahneşin (Qacarlar dövrünə aid).

12. Nasirəddin şah Qacarın kəcavəsi saxlanılan otaq.

13. Məhəmməd Rza Pəhləvi və xanım Fövziyyənin toyu münasibətilə onlara bağışlanmış iri büllur cam.

14. Otaqe-korsixane. Xanım Fərəh Pəhləvinin xarici ölkə nümayəndələrini qəbul etdiyi otaq.

15. Əl sənaye məmulatları otağı.

16. İran dövlətçiliyinin 2500 illiyi münasibətilə Fransadan göndərilən stol və stullar.

17. Qızğın şe’r həvəskarı olan Fərəh Pəhləvinin seçimi ilə xəttatların üzünü köçürdükləri şe’r nümunələriylə bəzənmiş otaq (Sə’di, Hafiz, Xəyyam və s.).

Böyük təəssürat hissi ilə «Kaxe-Niyavəran»ını tərk etdik. Günorta az

müddətlik istirahət. Sonra kitab sərgisi. Saat 18-də Tehran Şəhər Teatrı (Teatre-Şəhriyyeye-Tehran). Lojada əyləşmişik. Məhəmməd Rəhmani adlı bir yazıçının «Atlar» tamaşası. Bu tamaşanın əlimdə tutduğum proqramına göz yetirirəm. Rolları ifa edən bütün aktyorların, habelə rejissorun (Möhsünşah İbrahimi), operatorların (Əsğər Fəridi, Masulə, Abbas Salehi, Əli Səfəri) adları qeyd olunmuşdur. Proqramın üzərində at başı şəkli çəkilmiş son səhifəsində tamaşanın məzmunu ilə bağlı bu cümlələr yazılmışdır: «Allah... at yaratmaq istədiyi üçün küləyə dedi: «Mən sizdən bir xilqət xəlq edəcəyəm». Külək dedi: «Bizdən elə bir xilqət yarat ki, ona atəş içində əzab verəsən». Allah bundan sonra atı yaratdı.».

Tamaşa Kərbəla müsibətinə həsr olunmuşdur.

10 may. Sübh yeməyi yeyirdik. Şəfəqi axsaya-axsaya gələn gördüm. Məni görən kimi dedi: - Xəbərin varmı ki, mən də yıxıldım. Məryəm Mədənidən betər yıxıldım. Zəhmət çək, mənə də şe’r yaz.

Şəfəqin yıxılmağının səbəbini soruşmadım, amma şe’ri yazdım:

*Yıxılmaq və durmaq - adi haldı bu,*
*Yıxılıb duranın yoxdur qorxusu...*

Bu gün də sərginin müxtəlif pavilyonlarında olduq. Bizə xeyli bon (pulu əvəz edən çek) verilmişdi. Xeyli də kitab aldıq. Aldığım kitabların içində d-r Məhəmməd Moinin 6 cildlik «Fərhənge-Moin» («Moin lüğəti») adlı izahlı lüğətdir.

11 may. Səhər tezdən mehmansarayın bağçasına düşdüm. Bağçada təkcə mən, həyətdəki hovuzda isə təkcə bir balıq vardı. Özümə baxdım, balığa baxdım və bu «Ey tənha balıq» adlı sərbəst vəznli şe’ri yazdım:

*Tehranda*
*Mehmansarayın bağçasında tənha*
*gördüm səni, dibi yaşıl boya ilə*
*rənglənmiş hovuzda üzən ey tənha*
*balıq.*
*Sənin də mən kimi çox çəkib başın,*
*Hanı yoldaşın?*
*Hanı sirdaşın?*

*Hanı tənhasızlığın, ey tənha balıq,*
*De görüm, necədir tənhalıq?*

«Argentina mağazası»na («Foruşgahe-Arcentin») gəldik. Sonra kitab mağazasına baş vurduq. I Şah Təhmasib, II Şah ismayıl və Məhəmməd Xodabəndəyə həsr olunmuş kitabları aldım.

Sonra «Fars dili və Ədəbiyyatı fərhəngestanı»ndayıq. Orada məşhur alim və siyasətçi d-r Qulaməli Həddad Adil ilə maraqlı görüşümüz oldu.

Saat 14-də «İran Milli Bankı» («Banke-Melliye-İran») adlanan ən böyük ölkə bankının lap aşağı qatında (zirzəmi hissəsində) yerləşən «Milli cəvahirat xəzinəsi» («Xəzineye-cəvaherate-melli») muzeyinə gəldik. Qacarlar və pəhləvilər dövrünü əhatə edən bu xəzinədə qiymətli daş- qaşlarla zinətlənmiş taxt-taclar, silahlar, bəzək əşyaları, ləl-cəvahirat, geyimlər və s. Göz oxşayırdı (xüsusilə qadınların gözünü!).

Bina başdan-başa elektronlaşdırılmışdır, şəkil çəkmək qadağandır.

Muzeydən çıxıb Fars dili və Ədəbiyyatının məşhur Mərkəzinə gəldik. Bu gün İrana bizdən bir neçə gün gec gəlmiş cənab Botlas (İsveç) və cənab Paul Şiraxman (ABŞ) məruzə etməlidirlər. Elə də oldu. Cənab Botlasla işim yoxdur, amma P.Şiraxman məruzəsini bitirən kimi ona sual verdim: - Mən tarix doktoru olmağıma baxmayaraq, şe’ri də çox sevirəm. Dostumuz ağaye-Məhəmmədxani sizi bizə təqdim edəndə dedi ki, cənab Şiraxman bir neçə əsəri, o cümlədən məşhur İran şairi İrəc Mirzənin «Arifnamə» poemasını ingilis dilinə tərcümə etmişdir. Soruşuram: Niyə bəs «Arifnamə»ni? Məgər İrəc Mirzənin başqa dillərə çevrilməsinə layiq əsərləri azdırmı? «Arifnamə» isə başdan-ayağa erotika ilə dolu olan poemadır.

P.Şiraxmanın cavabı müxtəsər oldu: - Xalqa erotik əsərlər də lazımdır. İrəc Mirzə isə bu sahədə professional bir şair olmuşdur. Nə olsun ki? Qoy ingilisdilli oxucuların Şərq erotikasından da məlumatları olsun.

Cavab məni və başqa azərbaycanlıları qane etmədi.

Mehmansaraydayıq. Qaranlıq düşəndə Tehranda tufan qopdu. Açıq qalmış pəncərələrin şüşələri qırılıb yerə tökülürdü.

Xanım Məryəm Mədəninin ayağı bərk ağrıyır. Reyhan Aydəmir və Dərya Ors onu doktora apardılar.

Mehmansaraya gəldik. Bir neçə hayku (klassik yapon şe’r janrı) yazdım:

*Uçdu,*
*Zəri qaldı əlimdə,*
*Zər borcluyam kəpənəyə.*

***

*Xoşbəxt idi.*
*Puşkinə dəyən güllə,*
*Ey bədbəxt Dantes!*

Saat 20-də «Azadi» («Azadlıq») otelində olduq. İranın Mədəniyyət və İslam İrşadı naziri ağaye-Məscidcamei bizi onunla görüşə və şam yeməyinə də’vət etmişdi.

26-cı mərtəbədəyik. «Hafiz Şirazi» yemək salonu. Ziyafət yüksək səviyyədə bitdi. Geri qayıdırıq. Sabah İrandan geri qayıdacayıq.

12 may. Saat 10-da «İranşünaslıq İnstitutu»na («Bonyade iranşe- nasi») gəldik. Bu ilin payızında da bu instituta gəlməliyəm (Şəfəq Əlibəyli də gələcək). Artıq də’vət almışıq.

13 may. Azərbaycana qayıdış günümüz. Maşınımız bizi Astaraya aparır. Sağ ol, ey ulu İran! Var ol, ey ulu Azərbaycan! Yenə görüşərik.

İndi isə bu qəzəl ilə səninlə sağollaşıram:

*Dolmuş təzədən gör neçə mehman ilə İran,*
*Mehmanıma xidmət eləyir can ilə İran...*

*Şahin eləsin ülfətü ünsiyyəti kimlə?*
*- İran ilə, İran ilə, İran ilə, İran!*

*Бакг-ТеИган-Бакг, 3-13 may 2004*

## Onuncu Səfəruamə Şe’rləri

*I*
*QƏZƏL*

*Elə bəndə görmüşəm ki, dili var, duası yoxdur,*
*Elə üzlü kəs də var ki, üzü var, həyası yoxdur.*

*Elə zülmə qail insan görürəm ki, yox günahı,*
*Elə zülm edən də var ki, hələlik cəzası yoxdur.*

*Ağa «ağdı» söyləsəm də, qaraya «qara» desəm də,*
*Sözümün ağı görünmür, gözümün qarası yoxdur.*

*Səfərə «xətərli» söylər neçə bixəbər səfərdən,*
*Səfərin səfası çox var, səfərin xətası yoxdur.*

*Qonağın çox olmuşam mən, gəlirəm yenə, ey İran,*
*Bu yerin, səlam-əleyküm, belə mübtəlası yoxdur.*

*Yarı tək qoyub bu aşiq yenə şahin oldu, uçdu,*
*Gələrəm yenə, «fərağın, - demə, - intəhası yoxdur».*

*Mənə «Şahinim» desən bəs, demə bir də Qeysü Məcnun,*
*Gözəlim, hələm başımda dəlilik havası yoxdur!*

*Bakı-Astara yolu*
3.05.2004

*MÜRƏBBE*

*Ey torpağa acgöz kimi bağlı qoca Şahin,*
*Torpağım seyr etməyə gəldim bu diyarın.*
*Yer Kürəsi torpaq ilə dolmuşsa da, lakin*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*Dünyadakı çox viranı, abadı da gördüm,*
*Babildəki sahmanı da, bərbadı da gördüm,*
*İstanbulu da, Bəlxi də, Bağdadı da gördüm,*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*Yaylaq ilə, qışlaq ilə orman yada düşdü,*
*Seyr elədiyim bağü gülüstan yada düşdü,*
*Qəzvin ilə, Təbriz ilə Tehran yada düşdü,*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*Göz çəkməməli, çəkməliyəm baş ona tez-tez,*
*Minlərlə qonaqlar gələcək qoynuna tez-tez,*
*Gözmuncuğu lazımdı asım boynuna tez-tez,*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*Göz var ki, doyub sevdiyi cananı seyrdən,*
*Göz var ki, bezib hurini, qılmanı seyrdən,*

*Tehran,*
4.05.2004

*Şahin gözü doymur niyə İranı seyrdən?*
*Torpağını seyr etməyə gəldim bu diyarın?*

*III*
*QƏZƏL*

*Verdim cam, canam yetişdim, gözüm aydın,*
*Canam yetib cam yetişdim, gözüm aydın.*

*Çox var idi sultanı hüsn mülkünün, amma*
*Mən bəndə bu sultana yetişdim, gözüm aydın.*

*Can təşnəliyin çənginə keçmişdi, dodağım*
*Çat-çat idi, ümmanə yetişdim, gözüm aydın.*

*Tə'yin edə bilmirdi mənim dərdimi loğman,*
*Bir sevgili loğmanə yetişdim, gözüm aydın,*

*Əl gül sayağı pakizə, pakizə ayaq həm, Bəh-*
*bəh ki, gülüstanə yetişdim, gözüm aydın.*

*İmkan ələ düşmürdü alam busə üzündən,*
*Görcək onu imkanə yetişdim, gözüm aydın.*

*Zənn eyləməsinlər ki, sənəm tərifidir bu,*
*Şahin, yenə İranə yetişdim, gözüm aydın.*

*Tehran,*
4.05.2004

*IV*
*QƏZƏL*

*Ömr uzunu çox yanı alqışladım,*
*Öncə Azərbaycanı alqışladım.*

*Dərviş olub çıxdım uzaq yollara,*
*Fars-ərəbi, əfqanı alqışladım.*

*Oldu varaq dağ-dərə, orman qələm,*
*Dağ-dərəni, ormanı alqışladım.*

*Ərdəbilə, Təbrizə «əhsən» dedim,*
*Urmiyəni, Zəncanı alqışladım.*

*Qorxu hanı, ey ulu Məmməd Səid?*[1]
*Qorxusu yox Tehranı alqışladım.*

*Alqışa layiq bu qəzəl, əl çalın,*
*Mən təzədən İranı alqışladım.*

*Sərhədi yox alqışımın, Şahina,*
*Bir də Azərbaycanı alqışladım.*

*Tehran,*
5.05.2004

[1] *«Qorxulu Tehran» romanının müəllifi Məmməd Səid Ordubadi*

*V*
*QƏZƏL*

*Şadəm, edirəm mən yenə İran ilə sevda,*
*Tək dillə deyil, eyləyirəm can ilə sevda.*

*Divanə deyirlər adıma, eylədiyimçin*
*Səhra ilə ülfət və gülüstan ilə sevda.*

*Dəryaya girən gərməlidir dalğaya sinə,*
*Ümmanə düşən etməli tufan ilə sevda.*

*Şairlər əcəb xislətə malik, eləyirlər Gəh*
*vəsl ilə sevda, gəhi hicran ilə sevda.*

*Şairləri sevdayə görə etmə məzəmmət,*
*Şairlər edir hurivü qılman ilə sevda.*

*Məntək yenə varmı verə özbəklərə* sevgi,
*Fars ilə məhəbbət qura, əfqan ilə sevda?*

*Dünyamızın aramı üçün saziş edib də,*
*Hətta edərəm bir neçə şeytan ilə sevda.*

*İran eləyir gör neçə gündür ki, ürəkdən*
*Şahin kimi həsrətli qəzəlxan ilə sevda.*

*Tehran,*
6.05.2004

*VI*
*QƏZƏL*

*Aşiq görürəm ah ilə əfğan - ürəyində,*
*Aşiq dəxi var gül və gülüstan - ürəyində.*

*Vardır elə insan onun insanlığı - gözdə,*
*Vardır elə kəs insana heyran - ürəyində.*

*Mən öylə kəsəm sidq ilə qurban edərəm can,*
*Aşiq də var amma yara qurban - ürəyində.*

*Hərdən düşünürlər ki, adamdır bu qəribə -*
*Qeyb etdiyi, basdırdığı canan - ürəyində.*

*Hərdən də deyirlər nə ürək sahibidir bu -*
*Təbriz ilə, Zəncan ilə Tehran - ürəyində.*

*Amma ki, bilən yox bunu: Yoxdur canı artıq,*
*Mən çarəsizin eşqi olub qan - ürəyində.*

*Tehran,*
6.05.2004

*Çox ölkəni görmüş qoca Şahin və unutmuş,*
*Tutmuş yerini amma ki, İran ürəyində.*

*VII*
*YAŞIL RƏNGLİ SAÇLAR*

*Saçlarımın rəngini yaşıl gördüm yuxuda,*
*Yaşıl da rəng olarmı, İlahi?*
*Torpaqda qəşəng olur,*

*Yarpaqda qəşəng olur,*
*БашДа qəşəng olarmı, İlahi?*
*Görəsən nə deyir saçlarıma qonan bu yaşıl rəng mənə?*
*Yoxsa Tehranda öləcəyəm, gətirəcəklər yaşıl çələng mənə?*
*Çöllər, bağlar yaşıllaşıb, dağlar yaşıllaşıb.*
*Бог ağaclar, qalın orman yaşıllaşıb,*
*məzarıstan yaşıllaşıb.*
*Adama*
*yaşıl ləzzət verir yaşıl-yaşıl mənzərələr,*
*Yaşıl rəngə boyanıb dərələr,*
*Amma, mənsə*
*Бitirmişəm ömrümün yaşıl rəngini,*
*Təbiət yaşıllaşıb,*
*Mən isə qış rəngindəyəm,*
*Qış rəngi olan ağ rəngin çəngindəyəm,*
*Amma, duyuram ki, həyatım qaralıb,*
*Saçlarım kəfən rəngini alıb,*
*Lakin, kəfən yarımın oldu qisməti,*
*Üç ildir ki,*
*çəkirəm kəfən həsrəti.*
*Dözməyib üç il çəkdiyim*
*kəfən hicranına,*
*haçan gedəcəyəm onun yanına?*

*.. Saçlarımın rəngini yaşıl gördüm yuxuda...*

*Tehran,*
7.05.2004

*VIII*
*QİTƏ*

*«Бадг-Сэт^Шууэ» adlanan dağüstü parkın seyrinə gəldik. Бш müşayiət edən xamm Məryəm Mədəni sal daşlarla döşənmiş pillələrdən düşərkən yıxıldı. Geri qayıtdığımız zaman maşında zarıyırdısa da, üzündən təbəssüm çəkilmirdi...*

*Бu təravət bağının qönçəsini seyr elədim,*
*Həm gözəllikdə qənirsiz bu gözəl, həm mədəni.*

*Mədəniyyətli gözəllər məni əfv etsinlər,*
*Mədəni çoxlu gözəl var, osa möhkəm mədəni.*

*Danışanda dodağından elə bil bal süzülür,*
*Həmi xasiyyəti incə, həmi görkəm mədəni.*

*Ağrısı olsa da, cəhd eylədi bildirməməyə,*
*Бu qızın gözlərinə çökmüş olan qəm - mədəni.*

*Üzünə hansı kəsin bəd nəzəri zilləndi?*
*Sərvtək düşdü qəfildən yerə Məryəm Mədəni.*

*Бu nəzakət ki var onda, belə fikr eyləyirəm:*
*Ona tay olmayacaq gər ola aləm mədəni!*

*Текган,*
7.05.2004

*IX*
*Neçə ildir Şahin qalıb Бак-Текгаn arasında*

*Azərbaycan, uzun illər*
*vüsal durub, hicran durub,*
*hərdənbir də şeytan durub sənlə*
*İran arasında.*

*Kədər, qüssə*
*gah bir yanda, gah bir yanda,*
*Qəm bir yanda, ah bir yanda,*
*Çar bir yanda, şah bir yanda...*
*Dərya-dərya qanlar axıb iki*
*sultan arasında.*

*Əldən çox imkan vermişik,*
*Əvəzində*
*minlərlə qurban vermişik,*
*Qan vermişik,*
*Can vermişik neçə fərman*
*arasında.*

*Aralıqda*
*izzətimiz lakin qalıb, ülfətimiz*
*lakin qalıb, hörmətimiz lakin*
*qalıb,*
*Neçə ildir Şahin qalıb Бакı-*
*Tehran arasında.*



*Tehran,*
8.05.2004

*Tehran,*
7.05.2004

## *QƏZƏL*

*Necə işdir ki, bizi çərx müdam aldatdı,*
*Məni saqi, səni mey, saqini cam aldatdı.*

*Əyrini əyri yolundan düzə çəkmək - müşkil,*
*Amma, düzlük gəzəni əyri adam aldatdı.*

*Hər haram iş görənin qanı halal olmalıdır,*
*Bir də gördün halalı gəldi haram aldatdı.*

*Huri xoşdursa da, yox qılmana rəğbət məndə,*
*Qəznəvi Mahmudu bir adi qulam aldatdı.*

*İstədim güclü şe’r yazmağı, heyfa ki, məni*
*Fars şerində olan nəzmü nizam aldatdı.*

*Əqlini vermə əlindən, ayıq ol, ey Leyli,*
*Bir də gördün ki, səni İbni-Salam aldatdı.*

*Şahinin şe'ri də irfanıləşir, Xəyyam,*
*Məni saqi, səni mey, saqini cam aldatdı.*

*XI*

*Dərd bir yana getdi, kədər bir yana*

*Bu sevda neçə yol alovlanmadı,*
*Zər bir yana baxdı, zərgər bir yana.*
*Gözümüz bir səmtə baxıb yanmadı,*
*Baxış bir tərəfə, nəzər bir yana.*

*Budur, xəlvət otaq, bir o, bir də mən,*
*Çıxdı neçə-neçə şe'r dilimdən...*
*O, ayağa durdu, düşdü əlimdən*
*Kitab bir tərəfə, dəftər bir yana.*

*Şahin, vüsal oxu dəymədi daşa,*
*Qovuşdu yar yara, sirdaş sirdaşa,*
*Fərəh sevinc ilə dayandı qoşa,*
*Dərd bir yana getdi, kədər bir yana.*

*Tehran,*
8.05.2004


*Tehran,*
8.05.2004

*XII*
*QƏZƏL*

*Alim Tofiq Cahangirova!*

*Xislətim böylədi, zənn etmə günahkar məni,*
*Məni gah yar çəkir, gah çəkir dar məni.*

*Hafizəmdə ilişib qalmada Kabul şəhəri,*
*Bağlayıblar qoca İstanbula aşkar məni.*

*Bağdadın bir günü min bir gecədən üstünmüş,*
*Qubadan ayrılığım eyləmədə zar məni.*

*Gəlirəm, Gəncəni xatırlayıram Təbrizdə,*
*Gedirəm, Qum şəhəri çəkmədə təkrar məni.*

*Bakıda diqqəti gül çəkmədə, Təbrizdə çiçək,*
*Savalanda özünə cəlb eləyir qar məni.*

*Gəhi surət məni çəkməkdə, çəkir gəh mə'na,*
*Nə qədər möcüzədən hali edir tar məni.*

*Günlərin bir günü var qorxu ki, divanə edə*
*Neçə rəmz ilə müəmma, neçə əsrar məni.*

*Deməyin bir daha «Şahin qəzəli sadə yazır»,*
*İttiham eyləməyin bir daha təkrar məni.*

*Yazıram şerimi mən azəribaycanlı üçün,*
*Qoy zəif eyləməsin zənn Ələmdar məni.*

*Şahinəm, saf adamam, şe'ri də saf yazmadayam,*
*Saf əsər eyləyəcəkdir həmişə var məni.*

*Tehran,*
9.05.2004

*Tehran,*
10.05.2004

*Şəfəq Əlibəyli üçün*

*XIII*
*Yıxılmaq və durmaq*

*Yıxılmaq və durmaq - adi haldı bu,*
*Yıxılıb duranın yoxdur qorxusu.*
*Günlərin bir günü qəfil yönəlib*
*Mənim də başıma bu bəla gəlib.*
*Yıxıldım Бакıda üç ay öncə mən,*
*Məşum bir bəlanın çıxdım əlindən.*
*Dərd elə bildi ki, sevinəcəkdir,*
*Qəm elə bildi ki, öyünəcəkdir.*
*Бu il*
*mən yıxıldım,*
*Şəfəq yıxıldı,*
*Məryəm yıxıldı,*
*Бiz ayağa qalxdıq, dərd-qəm yıxıldı.*
*Yerdə yıxılmağa axı nə var ki?*
*Zirvədən yıxılma, zirvədən təki!*
*Qorxuram zirvədən, bax o səbəbdən*
*Zirvə həsrətində olmamışam mən.*

*...Бu il mən yıxıldım,*
*Şəfəq yıxıldı,*
*Məryəm[1] yıxıldı...*

[1] Tehranda bizi müşayiət edən Məryəm Mədəni

*XIV*
*Ey tənha balıq!..*

*Tehranda*
*Mehmansarayın bağçasında tənha*
*gördüm səni dibi yaşıl boya ilə*
*rənglənmiş hovuzda üzən ey tənha*
*balıq.*
*Sənin də mən kimi çox çəkib başın,*
*Hanı yoldaşın?*
*Hanı sirdaşın?*
*Hanı tənhasızlığın, ey tənha balıq?*
*De görüm, necədir tənhalıq?*
*Ay yazıq,*
*Mən yazıq da tənhayam,*
*Amma, mənim tənhasızlığım*
*Yox ola bilər* -
*kömək edərəm mən mənə,*
*Sənsə*
*məhkumsan*
*insanların rəhminə,*
*özün kimi qırmızı bir balıq tutub*
*ata bilərlər yanına*
*səmimi-səmimi,*
*O zaman həyatın yaşıllaşar*
*Tehranda,*
*mehmansarayın bağçasında dibi*
*yaşıl boya ilə rənglənmiş bu hovuz*
*kimi.*

*Tehran,*
10.05.2004

*Ey tənha balıq!..*

*Tehran,*
10.05.2004

XV

*Tehranda yazdığım haykular*

*Uçdu,*
*Zəri qaldı əlimdə,*
*Zər borcluyam kəpənəyə.*

***kkk***

*Üzümə ləkə düşdü.*
*Ürəyimdən qorxuram*
*Ey ləkə.*

***kkk***

*Xoşbəxt idi Puşkinə dəyən*
*güllə, Ey bədbəxt Dantes!*

***kkk***

*Hicri boşayıb On gün siğə*
*etdim Tehranda vüsalla.*

*Tehran*,
11.05.2004

*XVI*
*QƏZƏL*

*Dolmuş təzədən gör neçə mehman ilə İran,*
*Mehmanına xidmət eləyir can ilə İran.*

*Tarix boyu çox mə'rəkələrdən ki çıxıbdır,*
*Dil tapmadadır dövr ilə, dövran ilə İran.*

*Alimləri, şairləri məşhur cahanda,*
*Şöhrət qazanıb elm ilə, irfan ilə İran.*

*Hərgah hücum eyləsələr üstünə, hökmən*
*Azadlığı hifz etməlidir qan ilə İran.*

*İllər boyu inşa eləyib ali qəsrlər,*
*Qiymətlidi Təbriz ilə, Tehran ilə İran.*

*Qardaşları küsdürməyə cəhd eyləməsinlər,*
*Qardaşlıq edir Azəribaycan ilə İran.*

*Şahin eləsin ülfətü ünsiyyəti kimlə?*
*- İran ilə, İran ilə, İran ilə, İran!!!*

*TeЬгan,*
12.05.2004



# ON BİRİNCİ SƏFƏRNAMƏ

## *«BU NƏ HİCRAN Kİ, YETİŞMƏKDƏ VÜSAL ƏTRİ MƏNƏ?»*

17 dekabr 2004. Uzun illərdir ki, xarici ölkələrə etdiyim hər səfərimdən bir səfərnamə yaranır. 2004-cü ilin may ayının əvvəllərində baş tutan onuncu İran səfərimdən xeyli əvvəl Tehrandakı İranşünaslıq fondu (Bonyade-İranşenasi) tərəfindən keçiriləcək Beynəlxalq Elmi Konfransda iştirakım xüsusunda məktub almışdım. Bir il ərzində həmin fondla yazışmamız oldu. Əvvəlcə orada məruzə edəcəyim məqaləmin tezislərini yolladım, məqalənin özünü istədilər, daha sonra onun kompüter disketi tələb olundu və nəhayət son məktub gəldi. Mənə bildirildi ki, konfrans dekabrın 20-dən 24-nədək davam edəcək və həmin müddət ərzində Tehranda olmalıyam.

Qeyd etməliyəm ki, İranşünaslıq fondunun iki il bundan əvvəl təşkil etdiyi I İranşünaslıq Konfransına da elmi məqalə (keçmiş aspirantım Fərəh Hüseynova ilə birlikdə) göndərmişdim. Lakin, təəssüf ki, orada iştirakımız baş tutmamışdı, buna baxmayaraq həmin məqalə konfransın iri həcmli kitabında xülasə şəklində çap olunmuş və bizə göndərilmişdi. Qarşıda isə II konfrans dururdu. Mən bu nüfuzlu fonda göndərəcəyim mövzu seçimi barədə fikirləşməyə başladım. Əlbəttə, tədqiqi ilə məşğul olduğum orta əsrlər İran və Azərbaycan tarixi ilə bağlı mövzular çoxdur və 30 ildən artıqdır ki, həmin əsrlərin (daha dəqiq desəm XV-XVI yüzilliklərin) tədqiqi ilə məşğulam. Lakin Azərbaycan Tarixi Muzeyində şöbə müdiri vəzifəsində işləyən (elə mən özüm də orada əlavə iş kimi yarım ştat vahidi üzrə aparıcı elmi işçi vəzifəsindəyəm) Maya xanım Bağırova bir gün mənə dedi:

- Muzeyimizdə İranın XVIII əsr tarixinin əvvəllərinə dair iki tarixi sənəd mühafizə olunmaqdadır. Biz həmin sənədləri müştərək tədqiq edə və Tehran konfransına göndərə bilərik.

Razılaşdım və həmin tarixi əhəmiyyətli sənədlərin oxunması ilə məşğul oldum.

Bəli iki tarixi sənəd: birincisi, Qacarlar sülaləsindən olan İran hökmdarı Fətəli şah Qacarın oğlu Abbas Mirzənin kəbin (nikah), ikincisi isə məşhur Səfəvi xanədanının son nümayəndələrindən biri olan Heydər Mirzə Səfəvinin evlənmə sənədi idi. İlahi, necə nəfis hazırlanmış iki mənbə - iki evlənmə sənədi. Hər ikisi nəstəliq xətti ilə yazılmış, yazı zamanı qızıl suyundan istifadə olunmuş, nəbati ornamentlərlə naxışlanmışdı. Birinci sənəd hicri-qəməri 1217 - miladi 1802/03-cü illərə aiddir və yuxarıda qeyd olunduğu kimi, Abbas Mirzənin ailə həyatının bir epizodu ilə əlaqədardır. Qeyd olunmalıdır ki, bu məşhur şahzadənin nikah sənədi 15 dekabr 1920-ci ildə Bakı Şəhər Sovetinin mebel anbarından (çox qəribədir!) tapılıb muzeyə verilmişdir (Bax: Muzeyin 4 saylı baş mühafizə kitabı, № 1523). Mətn yazılan nəfis kağızın uzunluğu 173 sm., eni isə 78 sm.-dir.

İkinci nikah sənədi isə hicri-qəməri 1255 (miladi 1839/40) -ci ilin cəmadül-əvvəl ayının 22-də (hicri-qəməri ilin 5-ci ayına, yəni iyul-avqust aylarına təsadüf edir) rəsmiləşdirilən kəbin kağızıdır ki, şahzadə Heydər Mirzə Səfəvinin qızı Nurcahan bəyimə aiddir. Nurcahan bəyimin nikah sənədi 8 iyun 1934-cü ildə vətəndaş F.Vəkilovadan alınmışdır (Bax: muzeyin 22 saylı baş mühafizə kitabı, № 4384). Şahzadə Abbas Mirzə Qacarın nikah sənədi kimi bu sənəd də Azərbaycan Tarixi Muzeyinin Yeni tarix fondunda mühafizə olunur. Bu kəbin kağızı dördbucaq şəklində olub, uzunluğu 145 sm., eni 76 sm.-lik böyük bir varağı əhatə edir.

Xülasə, məqaləni hazırlayıb İİR-in Azərbaycandakı səfirliyinin məsul işçisi ağaye-Bayat vasitəsilə İranşünaslıq fonduna göndərdik. Nəhayət, İrana də'vət üçün də'vətnamə gəldi.

Xanım Maya Bağırova mənə elə əvvəlcədən konfransa gedə bilməyəcəyini bildirmişdi. Odur ki, Tehrandan gələn məktub mənim adıma ünvanlanmışdı və fondun sədr müavini ağaye-Tehranzadə məni rəsmən Tehrana də'vət edirdi.

17 dekabr 2004. Budur, mən artıq bir dəstə alimlə birlikdə hava limanındayam. Gecə saat 12-dir. Uçuş saat birdə olacaq. Tehranda neçə dəfə olduğumu xatırlamıramsa da, dəqiq bilirəm ki, bu mənim İrana on birinci səfərimdir. Üstəlik, hələ iki dəfə də İraq Respublikasına gedərkən bütün İran ərazisindən (1100 km.) keçib Bağdada getdiyimi demirəm.

On birinci səfər və on birinci səfərnamə. Ya Allah! Başladım yazmağa.

Elə təyyarədə. Uçuş bir saat iyirmi dəqiqə çəkəcək.

Nədənsə, birdən-birə böyük fars şairi, «Şahnamə» müəllifi Əbülqasim Firdovsini xatırladım. İran-Turan müharibələri. Real və mifik obrazlar. İranlılar və turanlılar. Onların qarşıdurmaları və döyüşlərdən torpağın bağrında yaranan qan gölməçələri. Kimə lazım idi? Nəyə gərəkdi? Xəyalım XVI əsrə qayıtdı. Səfəvi və osmanlı (İran-Turan) dövlətləri arsında bu əsrdə baş vermiş 6 böyük savaş, 6 qara müharibə. Turanlıların İrana etdikləri 6 yürüş. Yenə qara torpağın bağrında göl - məçələnən qırmızı qan dəryaçaları. Çaldıran vuruşu, Təbriz savaşı, Naxçıvan, İrəvan, Şamaxı, Qarabağ döyüşləri. Turanlılar və iranlılar, iranlılar və turanlılar. Kimə lazım idi? Nəyə gərəkdi? Kim uddu, kim uduzdu? İlahi, qoy bir də baş verməsin. Yeri qan qızartmasın. İnsanlar qırılmasın, güllər güllələnməsin.

Bu fikir-xəyalımın nəticəsi kimi yeni şe’r yarandı. Elə təyyarədə. Bakı-Tehran arasında.

*Çoxdu sehri bu diyarın,*
*Nağıllar aləmi kimi.*
*Canda mehri bu diyarın...*
*Gəlmişəm həmdəmi kimi.*

*İran qanı, Turan qanı...*
*Yuyub aparmaz qan qanı.*
*Qurumayır Çaldıranı*
*Gözlərimin nəmi kimi.*

*İran dağı, Turan dağı...*
*Olarmı uçuran dağı?*
*Aramızda duran dağı*
*Biçmək gərək-zəmi kimi.*

Bəli, əsrlərin müxtəlif dövrlərində illərlə davam etmiş İran-Turan savaşları. Əbülqasim Firdovsi. «Şahnamə»dəki Keykavus, Əfrasiyab surətləri. Müxtəlif tarix kitablarında qarşıdurmaları təsvir olunan Ağ- qoyunlular və Osmanlılar, Səfəvilər və Osmanlılar, Qacarlar və Osmanlılar. Kimə lazım idi?

Nəyə lazımdı?

On birinci «İran səfərnamə»sinin birinci şe’ri bitdi. Elə uçuş müddəti də bitdi. Budur, «Mehrabad» Beynəlxalq təyyarə meydanı. Gecə saat üçün yarısıdır. Bizi qarşıladılar və İran Xarici İşlər Nazirliyinin Mehmansarayına gətirdilər. Rəsmi sənədləşmə və yerləşmə. 14 Saylı otaq. Daha doğrusu otaqlar. Üç səliqə-səhmanlı otaq. Təkəm. Əfqanıstanda birgə işlədiyim Qabil Camalov və akademiyanın Fəlsəfə və Siyasi-hüquqi elmlər institutunun direktoru prof. Yusif Rüstəmov birgə getdilər öz otaqlarına. «Tənhalıq alnıma yazılıb mənim». Bir şe’rimin bir misrasını xatırladım. Son vaxtlar həqiqətən də tənhayam. Tək-tənha. Bakıda tək yaşayıram. Təkliyə, tənhalığa bir növ öyrəncəli olmuşam. Doğrudur, qızlarım və dostlarım tez-tez yanıma gəlirlər. Lakin onlar yanımdan gedəndən sonra yenə də təkəm. Təklik və elmi-bədii yaradıcılıq. Təkliyin bu fəaliyyətə böyük köməyi...

Dünən Bakıda bir qəzəl yazmışdım. Tək olanda, elmi işdən yorulanda sanki darıxmamaq üçün şe’r yazıram. Fərqi yoxdur, istər əruz vəzni olsun, istər heca, istər sərbəst şe’r. Təki şe’r olsun. Axı mən hər gün yazıram. Yazmamaq olmur. Bəzən buna görə məni qınayanlar da tapılır. Qoy qınasınlar. Tənhayam. «Tənhalıq alnıma yazılıb mənim»:

*«Yollarda xətər var» dedilər, gözlərim aydın,*
*«Sərhəddə çəpər var» dedilər, gözlərim aydın.*

*Бax gözdəki aydınlığa sən, ey qoca Şahin,*
*«İranə səfər var» dedilər. Gözlərim aydın!!!*

Yatağa uzandım. Yorğunluğuma və yuxusuz qalmağıma baxmayaraq xeyli oyaq qaldım. Otaq bərk istidir. Tehranda istilik, işıq və su problemi yoxdur.

18 dekabr. Tezdən durdum. Buna adət etmişəm. Bakıda da beləyəm. Yorulanda da beləyəm, yorulmayanda da. Gözüm miz üstündəki Kəbə istiqamətini göstərən, üzərində «qiblə» sözü yazılan və bər-bəzəkli çərçivəyə salınan işarəyə zilləndi. İranın bütün otel və mehmansaraylarında islam inqilabının qələbəsindən sonra belə göstəricilərə ciddi əməl olunur. Namaz qılanlar gərək Kəbə (qiblə) istiqamətincə namazlarını qılıb dua etsinlər. Bu şe’r

mövzusudur, deyilmi? Qiblə mövzusunda şe'r yarandı:

*Tehranda*
*Mehmansaraydakı Yeddi*
*günlük,*
*Üç otaqlı mənzilimdə*
*Namaz əhlinə Və mənə*
*Qiblənin yönünü göstərən*
*İşarə var,*
*Axı namaz qılarkən*
*Qibləyə üz tutarlar.*

«Qiblə»mi təzəcə qurtarmışdım ki, qapım döyüldü və məni müsahibəyə də'vət etdilər. Mehmansarayın geniş zalına daxil olduqda mənimlə birlikdə Tehrana gəlmiş şərqşünas dostlarım Möhsün Nağısoyu və Nəsib Göyüşovu da orada gördüm. «Bonyade-İranşenaseni»nin jurnalistləri Həmid Neda Əfşar cütlüyü (onlar ər-arvaddırlar) tərəfindən verilən suallara cavab verdim (müsahibə fars dilində gedirdi). Əlbəttə bütün suallar İran, iranşünaslıq və Azərbaycanda şərqşünaslığın vəziyyəti barədəydi.

Müsahibədən sonra Möhsün mənə mehmansarayda Cövzcandan (Əfqanıstanın bir şimal vilayəti) Cövzcani təxəllüslü bir əfqanın da olduğunu söylədi. «Şəri Cövzcani olmaya?» deyə soruşdum. Sualım təsdiqləndi. Mənim Kabulda işlədiyim vaxtlarda, daha dəqiq desəm 1978-79-cu illərdə Əfqanıstan Demokratik Respublikasının Ədliyyə naziri və Baş prokuroru işləyən Şəri Cövzcani. Farsca və özbəkcə şe'rlər yazan Şər Cövzcani. Əfqanıstan özbəyi Şəri Cövzcani. 1978 -ci il Səvr (Aprel) inqilabının liderlərindən biri olan Şəri Cövzcani. Bir ləhzədə bir neçə inqilab düşmənini həbs və məhv etməyə qadir olan Şəri Cövzcani.
Bəzi şe'rlərini azərbaycanca tərcümə edib, Bakıda çap etdirdiyim Şəri Cövzcani. Cavan Şəri Cövzcani.

Qocalmışdı. Onu günörta üstü mehmansarayın restoranında gördüm. Əynində nimdaş palto, başında qaragül dərisindən tikilmiş əfqan papağı vardı. Məni tanımadı. Sonra yadına düşdüm: «Tanıdım» - dedi, - Nazirlər Sovetində işləyən Şahin Fazil, - dedi, - «Baş nazir Sultanəli Keşməndin kabinetində

gördüyüm və tanış olduğum Şahin Fazil» dedi. Qucaqlaşdıq. Əhvalını soruşdum. Dedi ki, Daşkənddə yaşayır. Neçə ildir ki, fərar edib gəlib Özbəkistana. Əfqan inqilabında böyük fəaliyyəti olan bu sabiq nazir yeddi il üç ay Kabuldakı «Poli- Çərxi» adlı həbsxanada, sonralar bir müddət də talibançıların məhbəsində yatıb...

Vədələşdik ki, sonra görüşək və yaxından söhbətləşək.

Mən bu qeydlərimi dəftərimə yazdığım əsnada qapımın zəngi çalındı. Fondun üç nəfər işçisi mənə konfrans iştirakçısı kimi bir əl çantası, döş nişanı və proqram təqdim etdi. Onları təzəcə yola salmışdım ki, qapı yenə döyüldü. Bu dəfə xidmətçi qadın meyvə gətirmişdi. Ümumiyyətlə, 2500 ildən çox dövlətçilik təcrübəsi əxz etmiş İran dövləti özünün bütün beynəlxalq elmi yığıncaq, simpozium və konfranslarını ən kiçik bir qonaqpərvərlik də unudulmamaqla olduqca yüksək səviyyədə keçirməyi bacarır. Böyük diqqət və mehribanlıq.

19 dekabr. İran Xarici İşlər Nazirliyinin sərgi salonuna getməliyik. Bu gün orda nazirliyin arxivində saxlanan «Fars körfəzinə dair tarixi xatirələrin sərgisi» adlı geniş bir dövlət tədbiri keçiriləcək. Gəldik. Bizə göstərilən yerlərdə əyləşdik. Bir çox xarici ölkə səfirləri və başqa diplomatik işçilər. İran Xarici İşlər naziri Ağaye-Xərrazi gəldi. Onun çıxışından fraqmentlər:

- Fars körfəzi öz neft və qaz ehtiyatlarına, habelə iqtisadi-strateji əhəmiyyətinə görə, bütün Yaxın və Orta Şərqdə məşhur olan bir məkandır. Bu yer İran tarixinin qədim dövrlərindən etibarən «Fars körfəzi», yaxud «Pars dəryası» adlanmışdı. Buranın «Ərəb körfəzi» adlandırılmasının heç bir hüquqi əsası yoxdur.

- Assuriya, yunan, italyan, ərəb və fars tarixi mənbələrinə görə bu böyük məntəqənin adı üç min ildir ki, Fars körfəzi kimi tanınır.

- Miladdan əvvəlki məlumatlarda (o cümlədən Ptolomeydə), o cümlədən orta əsrlər və müasir dövr də daxil olmaqla bu hövzə «Cənubi İran dənizi», «Fars körfəzi», «Fars bəhri», «Sinus Persikus», «Mare Persikus», «Qolf Persik», «Persian Qolf» və sair adlarla adlandırılmışdır.

- Fars körfəzinin «Ərəb körfəzi» adlandırılmasının heç bir sənədli isbatı yoxdur.

Ağaye-Xərrazinin çıxışından sonra biz sərgiyə tamaşa etməyə də’vət olunduq. Divarlarda onlarla böyük və kiçik, rəngli və ağ-qara xəritələr

asılmışdı. Onlara diqqət yetirirəm: Əbu Musa Xarəzmi (miladi 780-847), Əbu İshaq İbrahim əl-Farsi İstəxri (930-957), Əbülqasim Əhməd ən- Nəsibi ibn Hövqəl (931-988), Həmdullah Mustovfi Qəzvini (1281-1349), Əhməd ibn Şeyb əl-Hərani (1332), Hartman (1440-1514), Martin Müller (1470-1518), Sebastyan Monster (1479-1552), Gerhard Kramer (15121594), Abraham Ortilsu (1527-1597), Adam Oleari (1599-1671), Enqelbert Kempfer (1651-1716), Pyer Mulart Sanson (1695-1730) və başqa müəlliflərin çəkdikləri xəritələr. Onların hamısında, həqiqətən də, bu hövzə «Fars körfəzi» kimi göstərilmişdir.

XVI əsrin bir xəritəsində Ermənistanın İraqın şimalında yerləşdiyi əks olunmuşdur. Bir daha sübut edir ki, ermənilər indi yaşadıqları əraziyə Mesopotamiyadan gəlmədirlər, heç də özlərinin dəfələrlə dedikləri kimi, bu yerlərin meymundan qalma oturaq əhalisi olmayıblar.

XIX əsrə aid olan bir alman müəllifinin xəritəsində Azərbaycan ərazisi Van gölünədək uzanır, Şirvan isə ayrıca göstərilir (məzmunca orta əsrlərə tarixi bir nəzər).

Mən bu sərgi ilə tanışlığımı davam etdirərkən yanımda dayanmış bir nəfər qolumdan tutdu:

- Ağaye Şahin Fazil?
- Ağaye-Bəhram Əmirəhmədi?

Söhbətləşdik. Onunla Gürcüstanda və Türkiyədə keçirilən elmi konfrans və görüşlərdə olmuşuq. İran azərbaycanlısıdır. Əsasən Gürcüstanla bağlı alimdir, tarixi coğrafiya elmi ilə məşğul olur.

İclas salonuna daxil oldum. Fars körfəzi problemlərinə həsr olunmuş konfrans artıq başlanmış, iranlı tədqiqatçılardan Ağaye- Moayeri və Həccəfərinin çıxışları dinlənilmişdi. İndi söz İspaniyanın keçmiş baş naziri Qonzalesindi. O, özünün M.Qorbaçov, J.Andropov və C.Buş (ata) ilə görüşlərindən, dünyanın bugünkü siyasi mənzərəsindən, ABŞ-ın dünya ağalığı uğrundakı cəhdlərindən, İsrailin işğalçı siyasətindən, Berlin divarının uçurulmasından (1989) və s. Məsələlərdən uzun-uzadı danışdı. Onun bir cümləsini dərhal dəftərimə qeyd etdim: «Bəzi dünya böyükləri düşünürlər ki, balığı tutmaqdan ötrü çayın suyunu bulandırmaq lazımdır. Xeyr, balığı qarmağa keçirmək daha asandır. Hal-hazırda ABŞ-ın İraqda dramatik müdaxilə və müharibəsi getməkdədir. Amerika nə irəli gedə bilir, nə də geri

çəkilməyi bacarır». Deməyk, Qonzalesin sözünü təkrar eləsək, «balığı şəffaf suda qarmağa keçirmək daha asan» bir ov əməliyyatıdır. Demək, yeni işğalçılıq siyasəti...

Mehmansaraya qayıtdıq. Yolda mənimlə bir maşında gedən Şəri Covzcanidən keçmiş əfqan tanışlarım barədə bəzi məlumatlar aldım. O dedi:

D-r Məhəmməd Saleh Zirey (Əfqanıstan Demokratik Respublikasının sabiq kənd təsərrüfatı, sonradan isə maarif naziri) İngiltərədə yaşayır. Onun arvadının və qızının başları isə Kabulda mücahidlər tərəfindən kəsildi və onlar d-r Zirey kimi baş götürüb heç yana gedə bilmədilər. Baş nazir Sultanəli Keştmənd İngiltərədə, nazirlər Süleyman Layiq Almaniyada, Bareq Şəfii və Nur Əhməd Nur Hollandiyada, Əbdülvahab Safi (Şəri Covzcaninin o zamankı müavini və sonradan ədliyyə naziri) Almaniyada, Daneş Fransada, Dəstəgir Pənçşiri ABŞ-da yaşayırlar, ticarət naziri Qurbəndi və müdafiə naziri Vətəncar vəfat etmişlər.

Şəri Covzcani öz haqqında da danışdı: O, inqilabın ilk iki ilində, bildiyim kimi, nazir işləmiş, sonra 8 ilədək məhbus olmuş, həbsxanadan buraxıldıqdan sonra, d-r Nəcibulla Nəcibin hakimiyyəti zamanı Əfqanıstan Xalq demokratik Partiyası Mərkəzi Komitəsinin üzvü olmuş, Ali məhkəmənin müavini vəzifəsini icra etmişdir. 1992-ci ildə Daşkəndə gələn Şəri bir müddət hüquq institutunda mühazirə oxumuşdur və hazırda Daşkənd Universitetində «İslam hüququ» kafedrasının müdiridir. Ailəsi Hollandiyada yaşayır.

Mehmansaraya dönüb nahar elədik. Otağıma qayıdıb bir qədər dincəldim. Telefonun zəngi məni yuxudan oyatdı. Özünü Nurani soyadı ilə təqdim edən bir jurnalist təmiz Azərbaycan ləhcəsi ilə mənimlə danışdı və televiziya ilə canlı efirə də’vət etdi. Professor Yusif Rüstəmovla birlikdə onun maşınına əyləşib İran Radio və Televiziya İdarəsinə gəldik.

«Səhər» kanalının iş otaqlarından biri. Prodüser Qəhrəman Nurani bizi veriliş aparıcısı Rüfət Muradlı ilə tanış etdi. Studiyaya gəldik. «Kompas» proqramı. Çıxışımız bir saatadək davam etdi. Araya salınan reklam bizi narazı saldı. Reklamda Azərbaycanda baş verən bir sıra neqativ hallardan məlumat verilirdi. Proqram canlı olduğundan bizim hər ikimiz jurnalistə öz narazılığımızı bildirdik və o bizimlə razılaşdı. Verilişin sonuna yaxın mən İranda yazdığım bir şe’rimi («Sürud») oxudum:

*Tərk edib vəsli yenə qucmadayam hicran,*
*Bu nə hixran ki, yetişməkdə vüsal ətri mənə?*
*Yenə gəldim, yenidən seyr elədim Tehranı,*
*Bu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

*Duymasa şairi mən İrana İran deməräm,*
*«Oluram şe’rinə gündüz-gecə heyran» demərəm.*
*Şahina, mən bu vüsalə daha hicran demərəm,*
*Bu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

20 dekabr. Tezdən oyanmağa vərdiş eləmişəm. «Divan» kitabımda- kı «Quşa dönəcəyəm» adlı bir şe’rimdə bel bir beyt var:

*Nəsə, nəsə duyubmuş mənə quş adı qoyan* -
*Həmişə quşlarla bir oyanıram yuxudan...*

Bəli, Tehranda da səhər tezdən durur, mehmansarayın güllü-çiçəkli bağçasında (qışdırsa da, buranın hər tərəfi güllərlə doludur) bir qədər gəzişir, ilham pərimin mənə diktə etdiyi misraları cib dəftərçəmə qeyd edirəm.

Bu gecə qar yağmışdı. Bağçadan qayıdarkən monqolşünas alim dostum Vaqif Buduqlu-Piriyev və «Bərdə tarixi» monoqrafiyasının müəllifi, AMEA Tarix İnstitutunun «Qarabağ tarixi» şöbəsinin müdiri Qasım Hacıyevi üçüncü bir nəfərlə birlikdə restorana gedən gördüm. Görüşdük. Üçüncü nəfər Naxçıvan Dövlət Universitetinin kafedra müdiri, dosent Əlövsət Quliyevdir. Hər üçü bu gecə avtobusla gəlmişdi. Y olda əziyyət çəkiblər, zarafat deyil, 20 saatdan artıq yol gəliblər.

Yeməkdən sonra İran Televiziya və Radio İdarəsinin konfrans zalına gəldik. Bu gün II Milli İranşünaslıq konfransının açılış günüdür. Ölkə prezidenti ağaye-Məhəmməd Xatəmi, nazirlər və başqa rəhbərlər zala daxil oldular. Ayağa durub onları alqışladıq. Cavan bir qare (Quranı qiraət edən şəxs) xitabət kürsüsünə gəldi və ayə oxudu. Sonra İranşünaslıq Fondunun sədr müavini professor Möhsün Tehranizadə öz geniş məruzəsinə başladı. O keçirilmiş I konfransdan və keçirilməkdə olan II konfrans haqqında danışdı və 422 məruzəçinin daxildən, 100 nəfər aliminsə xarici ölkələrdən də’vət

olunduğunu bildirdi.

Ağaye-Möhsün Tehranizadənin bir saatadək davam edən çıxışından sonra İranşünaslıq Fondunun sədri doktor Həsən Həbibinin çıxışı başlandı. O bizi salamladı, gələcək iclasların gündəliyindəki çıxışlar barədə məlumat verdi, hər elm sahəsinin ayrı-ayrı bölmələrdə təmsil olunacağını bildirdi.

Sonrakı çıxış prezident Məhəmməd Xatəminin oldu. Yığcam danışdı və bizə uğurlar dilədi.

İran alimlərindən doktor Əhməd Eqtedari «Mətn və xəritələrdə Fars körfəzinin adı». Doktor Fəthulla Moctəbayi «Persiya: Persane- farsi?» və doktor Abbas Horri «İranşünaslığın tədqiq bankı» adlı məruzələrlə çıxış etdilər. Söz yenidən doktor Həsən Həbibiyə verildi və konfransın açılış mərasimi qapandı.

Bizi «Kaxe-Hafiziyyə» («Hafiziyyə sarayı») adlanan bir nəhəng binaya gətirdilər. Böyük şair Hafizin adını daşıyan bu sarayda böyük konfranslar keçirilir, təntənəli mərasimlər təşkil olunur.

Nahardan sonra dördüncü mərtəbəyə qalxdıq. «Tarix və tarixi coğrafiya» bölməsi. Rəyasət Heyəti üç nəfərdən ibarətdir: Əsərlərini oxuduğum doktor Ehsan Eşraqi, doktor İbrahim Bastani Parizi və Məhəmmədrza Sərraf. Doktorlar Məhəmməd Həsən (Məhəmməd Dəbirsəyaqi), İrana may ayında etdiyim səfər zamanı tanış olduğum Çin tarixçisi və filoloqu Ven Ye Syun və qədim Ururtu dövlətinin araşdı - rıcılarından biri olan İnayətulla Rza 20 dəqiqəlik məruzələrini bitirdilər. Fasilədə doktor Ehsan Eşraqini Vaqif Buduqlu ilə tanış etdim. Sonra doktor Məhəmməd Dəbirsəyaqi də bizə yaxınlaşdı. Mən onun «Təzkirətül-mülk» («Padşahların təzkirəsi») kitabı üzərində apardığı böyük tədqiqat işindən bir qədər danışdım və mənim onu tanımağımdan (əlbəttə, əsərləri vasitəsilə) xeyli məmnun qaldı.

Axşam saat 20-də «Daneşgahe-pəyamenur» adlanan universitetin klubuna gəldik. Bizim üçün təyin olunmuş yerlərdə əyləşdik və səhnədə bu gecənin «Yəlda gecəsi» («Şəbe-yəlda») olduğu barədə bir lövhə gördük. Lövhənin altındakı iri bir məcməidə çoxlu meyvə, xüsusilə qarpız və nar yığılmışdı. Bir azdan doktor Həsən Həbibi, İranşünaslıq Fondunun rəhbər işçiləri, bir neçə nazir təşrif gətirdi. Konsert başlandı, milli fars musiqisi və mahnıları səsləndi. Konsertdən sonra «Yəlda gecəsi»nin mahiyyəti barədə bir fars aliminin ətraflı çıxışı oldu. O qeyd etdi ki, bu gecə, yəni «Şəbe-yəlda» 365

günün ən uzun gecəsidir. Sanskrit dilində «yəlda» sözünün tərcüməsi «milad» («doğum») deməkdir. Zərdüşt təliminə görə, bu gecə Günəş təzədən doğulur. Böyük mütəfəkkir Əbu Reyhan Biruni «Şəbe-yəlda»nın Həzrət Məsihin (İsanın) milad günü olduğunu bildirmişdi. Yəlda həm də bizim ən mötəbər bayramlarımızdandır. İranda novruza bərabər tutulan xalq bayramıdır. Diqqət edin: qarpız və nar var bu məcməidə (əli ilə səhnəni göstərir), çünki nar cənnət meyvəsidirsə, qarpızda canı yaşadan qanın rəngi var.

Mən bu alimi dinlədikcə artıq qəzəl yazmaqdaydım. Biz şam yeməyinə də’vət olunanadək şe’rimi bitirdim. Əlbəttə, mənim belə az vaxtda «Şəbe-yəlda» xüsusunda yazdığım qəzəlim yanımda oturmuş Vaqif Buduqlunu təəccübləndirməyə bilməzdi.

Bu gecədən aldığım təəssürat nəticəsində bu qəzəli yazdım:

*Yəlda gecəsi gəldi, Tehranda qaranlıq var.*
*Tehranda deyil təkcə, çox yanda qaranlıq var.*

*Yəlda bu gecə, əlbət, tüğyan eləyir şübhə,*
*Şadəm, elə şadəm ki, tüğyanda qaranlıq var.*

Yəlda gecəsini təmtəraqla qeyd edib avtobusla geri qayıtdıq. Qasım Hacıyev birdən-birə çox eşitdiyi, lakin şərtlərini əməlli-başlı bilmədiyi siğə barədə məndən sual etdi və bu sual Vaqif Buduqlunu da maraqlandırdı. Mən bildiyimi dedim, amma onların məqsədlərinin nə olduğunu bilmədim.

21 dekabr. «Kaxe-Hafiziyyə»dəyik. Müxtəlif bölmələr davam edən konfransın bir neçə bölməsinə baş vurdum. Bütün məruzələri dinləmək qətiyyən mümkün deyil. Məcbursan ki, səni maraqlandıran mövzular haqqında müəyyən məlumat almaqdan ötrü dinlədiyin məruzə otağını tərk edib, dinləyəcəyin məruzə otağına gedəsən. Beləliklə bir neçə məruzəni hissə-hissə eşitdim.

Elə özümü də bu gün eşidəcəklər. Mənim məruzəm Azərbaycan Milli Elmlər Akademiyası Tarix Muzeyinin şöbə müdiri, tarix elmləri namizədi Maya xanım Bağırova ilə birlikdə yazılmışdır. Şərikli məqaləmiz fars dilində olan və AMEA Tarix Muzeyində qorunan iki nikah sənədi haqqındadır. Birinci sənəd son səfəvi şahzadələrindən Heydər Mirzə Səfəvinin qızı Nurcahan bəyimə məxsus kəbin kağızıdır. İkinci sənəd isə bu sülalənin beşinci hökmdarı

Fətəli şah Qacarın (1798-1834) dördüncü oğlu və vəliəhdi olan məşhur Abbas Mirzənin nikah sənədidir.

Saat 12-də Şəfəq Əlibəylinin çıxışı dinlənildi. Böyük şairimiz Məhəmməd Füzulinin fars divanı haqqında maraqlı məlumat verdi. Şəfəqdən sonra Fərid Urxan oğlu Ələkbərov. Elmlər doktorudur. Onun müdafiəsində mən opponent olmuşam. İngilis dilində danışdı. Bu dili yaxşı bilir (Şəfəq fars dilini yaxşı bildiyi kimi). Sonra, adını yuxarıda qeyd etdiyim mövzu üzrə mənim çıxışım dinlənildi.

İclaslar arası vestibüldə jurnalist Əkrəm Şərifi ilə müsahibəm oldu. Əkrəm Şərif adını oxuyub onu kişi güman etdiniz. Yox, qadındır. Farslarda, sən demə, Əkrəm həm kişi, həm də qadın adı imiş. Onunla söhbətimiz bitməmişdi ki, X İran səfərnaməmdə barələrində danışdığım Həsən Həsənzadə və Dideban məni uzaqdan görüb yaxın gəldilər və müsahibəmin bitməsini gözlədilər. Görüşdük. Ağaye-Didəban sabah saat onun yarısında mehmansaraya gələcəklərini və vacib bir görüşə gedəcəyimi bildirdi. Etiraz edə bilmədim. Dedi ki, özümlə üç nəfər alim də götürüm.

Onlardan ayrıldım. Dəhlizdəki bir skamyaya əyləşib hələ Bakıda yazmağa başladığım bir qəsidəmi bitirdim:

*Eşq oxları yağdırdın sən canə məhəbbətlə,*
*Etdin məni, ey zalım, divanə məhəbbətlə...*

*Dərviş kimi çox gəzdim, acgöz təki çox baxdım,*
*Rəştə, Quma, Təbrizə, Zəncanə məhəbbətlə...*

*Əhsən adımı Şahin adlandıran insanə,*
*Uçdum təzədən quş tək İranə məhəbbətlə.*

Sonra Eyyub Təqvatələb adlı bir şəxslə tanış oldum. Ərdəbildə «Bonyade-iranşenasi»nin nümayəndəsidir. Ərdəbilə qayıdan zaman gözəl şair Əsgər Şahiyə məndən salam deməsini xahiş etdim.

Sonra isə ağaye-Neqabi. Təbrizin Şəbüstərindəndir. Olduqca savadlı bir ədəbiyyat mütəxəssisidir. Bizim (və İran azərbaycanlılarının) çox sevdiyimiz ölməz şairimiz Mirzə Əli Əkbər Sabirdən çoxlu şe’r bilir, Mirzə Əli Möcüzün əsərlərini tədqiq edir. Ondan soruşdum:

- Ağaye-Neqabi, doğrudanmı Möcüz kimi bir şair Lenini tərifləyərək belə demişdir:

*«Tutaq Lenin ətəyindən, ona pənah aparaq,*
*Zəmanəmizdəki həllala-müşkülat odur».*

Ağaye-neqabi gülümsündü:

- Yox, baba, o şe'ri Möcüz yox, sizdə işləyən Mübariz Əlizadə yazmışdır. Möcüz hara - Lenin hara? Mübariz Əlizadə isə, yəqin ki, xüsusi tapşırıqla o qism şe'rlər yazır və onları klassik şairlərin adına çıxırdı. Məsələn, Əfzələddin Xaqaninin şe'rləri içərisində belə misralar yoxdur:

*«İstəmirəm adımı çağıralar Xaqani,*
*Mən yoxsullar şairi Xəlqaniyəm, Xəlqani».*

Xeyli təəccübləndiyimi bildirdim. Dedi ki, heç də təəccüblənmə. Sovetlər dönəmində Xaqani, Mirzə Əli Möcüz və başqa şairlərin guya zəhmətkeş kütlə nümayəndələrinin və məşhur siyasi rəhbərlərin sosialist ideyalarına xoş gəlsin deyə sizin şairlər bəzi şe'r parçaları yazır və onları klassik şairlərin adlarına çıxırdılar.

Mən Neqabiyə onun sözlərinə inanmadığımı bildirdim. Biz ayrıldıq.

Bu günün iclasları xeyli uzandı. Bərk yorulmuşduq. «Lalə» oteli. D-r Həsən Həbibi şərəfimizə ziyafət təşkil etmişdi.

Ziyafətdən qayıtdıq. Qabil Camalov (iranlılar demişkən «ağaye-Camalzadə») bizimlə İrana gələn gündən xəstədir. O, mənim otağıma zəng vurub iynə vurmağı bacarıb-bacarmadığımı soruşdu. Gedib dərhal ona iki iynə vurdum. Halı məni halsız etdi. Otağıma qayıdıb bu şe'ri yazdım:

*Bu dünya fani dünyadı, bu*
*dünya hədəri.*
*Gəldi-gedəridi,*
*gəldi-gedərib*

*Ehe-y, o biri dünya,*

*Məni indiyəcən*
*Yerdən qopara bilməmisən,*
*Yanına apara bilməmisən...*
*çağır gəlim,*
*Hələ ki, səsini eşitmirəm,*
*bağır gəlim*
*Yerdəki həyatımı verim bada,*
*amma, Tehranda yox, Bakıda!..*

Gecə bir də Qabilin yanına getdim. Dedi ki, yaxşılaşıb. Dedi ki, sənin iynələrin məni sağaltdı. Dedim: - Şe'rlərimlə mühafizəkar qəzəlxanları o qədər iynələyirəm ki. Amma, heç sağalmırlar. Elə hey ədəbi dilimizə yad əcnəbi söz və çoxmərtəbəli izafət tərkibləri ilə yazırlar qəzəllərini. Qabil dedi: - Onları iynələməkdə davam elə. Bəlkə sağaldılar...

22 dekabr. Mehmansarayın həyətinə düşdüm. Məndən və bağbandan başqa kimsə yoxdur. Bir qədər uzaqdan bir güllə səsi eşitdim. Dərhal Kabul şəhəri yadıma düşdü. Orada, 1978-ci ildən sonra, demək olar ki, güllə səsləri eşitmədiyim gün yox idi. Mənsə, nə deyəsən mənə, güldən də ilham alıram, güllədən də. Əfqanıstanda yazdığım və birinci «Di- van»ıma daxil etdiyim iki şe'ri xatırladım, «Son güllə» və «Gül və güllə» şe'rlərimi. Birinci şe'ri əfqan şairi Əzim Şahbal dostuma, ikincisini isə tanımadığım, adını bilmədiyim, lakin üzünü gördüyüm qarayanız bir əfqan əsgərinə ithaf etmişdim. «Gül və güllə» belə idi:

*Kabulda tüfənginin lüləyinə gül taxmış bir əsgər gördüm.*

*Getmə, ayaq saxla, a yolçu, dayan,*
*Tüfəng lüləyində qızılgülə bax.*
*Amma, çox güman ki, elə bir azdan*
*O gül güllələnib tələf olacaq.*

*Lülə dibçək olub bir qızılgülə,*
*A şair, seyr elə bu mənzərəni.*
*Xeyr, seyr eləmə, bunu vəsf elə,*
*Qoy bu hal ilhama gətirsin səni.*

*A rəssam, yaxın gəl, bu lövhəni çək,*
*Gülün necə böyük ecazı varmış -*
*Qızılgül nəinki güldana bəzək,*
*Hətta tüfəngə də bəzək olarmış.*

*Aç not dəftərini, a bəstəkar, sən,*
*Бelə gözəl mövzu düşərmi ələ?*
*Бəşəri zövq alıb güllü tüfəngdən*
*«Gül və tüfəng» adlı nəğmə bəstələ.*

*Car çəkək, aləmə bildirək bunu:*
*Üzməsin canını atəş heç kəsin.*
*O qədər tıxasın güllər yolunu*
*Güllələr lülədən çıxa bilməsin.*

Bəli, Tehranda güllə səsi eşitdim. Olmayan işdir. Tehranda arxayınçılıqdır. Tehran Kabul deyil. Məni fikir aldı. Fikir məndə ilham oyatdı. İlham bu şe’ri yazdırdı:

Şahin öz-özünü güllələyəcək

*Tehranda kimsədən qorxum yoxsa da,*
*Eşitdim qəfildən bir güllə səsi.*
*Canımı ürpətdi o müdhiş səda,*
*Görən kim dəydi əcəl gülləsi?*

*Yataqda ölməyi sanıram hədər,*
*Haçansa mənə də güllə dəyəcək.*
*Günlərin bir günü öldürməsələr Şahin*
*öz-özünü güllələyəcək.*

*Qanımı qovacaq canımdan yaram,*
*Təəccüb etməsin kimsə bu qəsdə.*
*Yataqda ölməyi arzulamıram,*
*Ölsəm öləcəyəm mən ayaq üstdə.*

Sübh yeməyi. Sonra bizi İranda ən nüfuzlu bir mərkəz olan «Sazmane-

fərhəng və ertebatate-eslami» («Mədəniyyət və islami əlaqələr təşkilatı») adlanan müəssisəsinə gətirdilər. Bu müəssisənin tərkibində fəaliyyət göstərən «Bonyade-hekməte-eslamiye Sədra» («Sədra adına islam hikməti Fondu»)nun binasındayıq. «Sazmane-fərhəng»in rəisi cənab d-r Sənaidir. O, bizimlə görüş zamanı həm mərkəz, həm də fond haqqında müfəssəl məlumat verdi: «Məqsədimiz İran mədəniyyətini xaricdə təbliğ etmək və genişləndirməkdir».

Sonra bizim nümayəndə heyətimiz üzvlərindən bir neçə nəfər söz verildi. Şəri Cövzcani və mən şe'rlər dedik (Şəri - fars, mən isə Azərbaycan dilində).

Kiçik bir ziyafət. Bizimlə bu görüşdə iştirak edən bir azərbaycanlı ilə tanış oldum: Həsən Əliyev. Qazaxıstan Xarici Dillər Universitetinin Şərq dilləri kafedrasının müdiridir. Türkoloqdur.

Ötən İran səfərimdə tanış olduğum Hindistan almi xanım d-r Səfəvi də buradadır.

Saat 13-də «Kaxe-Haliziyyə»yə gəldik. Burada professor Yusif Rüstəmovun məruzəsi dinləniləcək. Dinlədik. Prof. Yusif müəllimin Mövlana Cəlaləddin Ruminin sufizmi və ruh aləmi barəsindəki fikirlərini dinləyirdimsə də varağım qarşımda, qələmim əlimdəydi. Kiçik bir qit'ə yazdım. Qit'ənin son beyti belədir:

*Şahına, yoxdu bu aləmdə işim,*
*Mən ki, ruh aləminin şahiniyəm.*

Sonra isə, konfransın «İran dilləri və İran dilçiliyi» bölməsində prof. Təhminə xanım Rüstəmovanın çıxışına qulaq asdıq. Hər iki məruzə yüksək elmi səviyyədə yazıldığından bu konfransa də'vət olunan və müvafiq bölmələrin işində iştirak edən alimlər tərəfindən razılıqla qarşılandı.

Tənəffüs vaxtı Rza Fərasəti adlı bir alim (özünü kitabdar adlandırdı) mənim dünən oxuduğum məruzənin mətnini məndən bir neçə saatlığa götürdü, foto surətini çıxardı və qaytardı.

Köhnə alim dostum Bəhram Mirəhmədi yanıma gəldi, mən onu Qabil, Vaqif və Şəfəq xanımla tanış etdim. O, vaxtı ilə biz Gürcüstanda olarkən mənim ona həsr etdiyim bir qəzəlimi bizə əzbər dedi və öz təşəkkürünü bildirdi.

Sonra isə, yenə müsahibə. Özünü Tehran televiziyasının dördüncü şəbəkəsinin (şəbəkeye-çəhar) rejissoru (kargərdan) və proqramçısı adlandıran

Şiva Heşmətiməneş bu konfransla bağlı suallar verdi və mən onları cavablandırdım. Müsahibə vaxtı elə bu gün mehmansarayda yazdığım və İrana həsr etdiyim bir şe'rimi (Azərbaycan dilində) İran tamaşaçıları üçün oxudum və ümumi məzmunu farsdilli olanlara çatdırılsın deyə şe'rin sonuncu beytini fars dilinə sətri tərcümə etdim:

*Kim söylədi ki, qol yenə Tehranı qucaqlar,*
*Eşqim elə artıbdı ki, hər yanı qucaqlar...*
*Heyrətlə deyirlər məni divanə edib zənn:*
*- Gəh vəsli qucaqlar, gəhi hicranı qucaqlar.*

*İran mənə şövq ilə qucaq açdı, sevindim,*
*Şahin yenə ilham ilə İranı qucaqlar.*

Nəhayət ki, bu günün proqramı başa çatmaqdadır. Dilçilik bölməsində hindli bir alim ingiliscə çıxış etməkdədir.

Xeyli yorğunuq. Amma yorğunluğumuz «ləzzətli yorğunluq»dur. Çox yaxşı məruzələr dinlədik.

Artıq qaranlıq düşüb. İran Xarici İşlər Nazirliyində nazir cənab Xərrazi konfrans iştiraçıları üçün böyük bir ziyafət təşkil etdi.

Mehmansaraya qayıtdıq. Mən bütün Azərbaycan heyətini öz otağıma də'vət etdim və gecə saat 22-dən 12-yədək birgə olduq. İranda bu səfər zamanı yazdığım 11 şe'ri onlara oxudum. Tariximizlə bağlı xeyli söhbətləşdik.

23 dekabr. «Kaxe-Hafiziyyə». Konfransın ümumi iclası. Bu iclasdan sonra çay və qəhvə mərasimi. Sonra yenə iclas. Bu dəfə son iclas (extetamiyyə). İran Milli İslam Şurasının sədri d-r Həddad Adil də gəldi (onunla 5 ay bundan əvvəl Tehranda görüşmüşdük). Extetamiyyə iclasında hər bölmə üzrə hesabat dinlənildi, xarici ölkələrdən gəlmiş bəzi nümayəndə heyətlərinin bir üzvünün çıxışı oldu. Tərəfimizdən prof. Təhminə Rüstəmova konfrans barədə təəssürat və arzularını bildirdi. Sonra d-r Həsən Həbibi və d-r Həddad Adilin çıxışları.

Təhminə müəllimənin fars dilindəki çıxışı mənə hədsiz həzz verdi. Bir Qit'ə yazası oldum:

*Şair neçə gündür ki, Sə'di elinə gəlmiş,*

*Hər lütfünü İranın daim edəcəkdir yad.*

*Şagird ilə ustadı Tehranda edir təmsil*
*Şahin kimi bir şagird, Təhminə kimi ustad.*

24 dekabr. Bu gün Tehranı tərk etdik. Kərəc şəhərinə gedirik. Gəldik. «Karxaneye Coha» («Coha zavodu»). D-r Həsən Həbibinin arvadının zavodu. Burada dərman preparatları hazırlanır.

Dəyirmi masa ətrafında əyləşdik. Aparıcı elan etdi ki, d-r Həbibinin çıxışından sonra gərək hər birimiz II Beynəlxalq İranşünaslıq Konfransı haqqında öz təəssüratlarımızı bildirək.

Elə də etdik. Tacikistandan Kəmaləddin Eyni, Hindistandan Xanım Səfəvi, Azərbaycandan Ziyafət, Şəfəq, Təhminə müəllimə, mən, Vaqif Buduqlu, Vəfa Hacıyeva, Qabil Camalov, Yusif Rüstəmov, Qasım, Fərid, Möhsün Nağısoy, Məğribdən Əhməd Musa və başqa xarici alimlər bir-bir danışdılar. Mən çıxışımın sonunda konfrans iştirakçılarına ağ «şəbe-yəlda» gecəsi arzuladım.

Sonda d-r Həbibi bir də danışdı, öz təşəkkürünü bildirdi: - Ünvanımıza gələn 300 məqalədən 500-ə qədərini seçdik və sizi bu konfransa də'vət etdik dedi.

Beləliklə, Kərəc səfəri də sona yetdi. Yolumuz Vətənədir. Kərəc şəhərində fürsət tapıb on birinci İran səfərnaməsinin on ikinci şe'rini yazdım:

*Gəh gülüstanə səfər, gəh də biyabanə səfər,*
*Əvvəl-axır edəcəkdir məni divanə səfər...*

*Amma çəkməkdə məni indi vətən gülzarı,*
*İstərəm indi edim doğma gülüstanə səfər.*

*Eləyibsən məni pərvanə, ey Odlar yurdum,*
*Gərək etsin yanına indi bu pərvanə səfər.*

*Dedilər: - Sanki cavandır qoca Şahin Fazil,*
*Edəcəkdir hələ çoxmu qoca İranə səfər?*

Kərəcdən çıxdıq. Avtoban. Gözəl və rahat yoldur. İmam Xomeyninin

«Divane-emam» («İmamın divanı») kitabı əlimdədir. Böyük şair imiş İmam Xomeyni. Ustadım Mübariz Əlizadə onun bir sıra şe’rlərini Azərbaycan dilinə çevirib. Bir neçə beytini mən də tərcümə etməyə cəhd etdim. Alınacaqmı? Bilmirəm. Məsələn İmam Xomeyni deyir:

*«Əz ğəme-dust dər in meykəde fəryad keşəm?*
*Dadrəs nist kedər hecre-roxəş dad keşəm».*
*Бu beyti mən belə çevirdim:*
*«Dost qəmindən bu bəzmdə necə fəryad çəkim?*
*Dadrəs yoxdu ki, hicrində onun dad çəkim».*
*İmam Xomeyni yazır:*
*«Бayəd əz rəftəne-u came be tən pare konəm,*
*Dərde-delra be çe əngize təvan çare konəm?»*
*Бu beyt məndə belə alındı:*
*«Gərək hicrində onun paltarımı parə edim,*
*Ürəyin dərdinə bəs mən nə təhər çarə edim?»*
*İmam Xomeyni buyurur:*
*«Aşeqəm, aşeqəm, mərize-toəm,*
*Z-in mərəz mən şəfa nemixahəm».*
*Tərcüməm belə çıxdı:*
*«Aşiqəm, aşiqəm - sənin xəstən!*
*Бu mərəzdən şəfa deyil arzum».*
*İmam Xomeyni ramazan haqqında söyləyir:*
*«Mahe-rəməzan şod, mey-o meyxane bər oftad,*
*Eşq-o tərəb-*o bade be *vəqte-səhər oftad».*
*Бeyti belə başa düşdüm:*
*«Gəldi ramazan, meyxanadan şadlıq ötüşdü,*
*Eşqü meyü neymanə səhər vaxtına düşdü».*

Tərcümə işimi uzada-uzada yolu qısaltdım. Bir də gördüm Astaradayam. Sərhəd. Gömrük. Azərbaycan. Salam, Vətən!

Бакı-ТеЬгап-Aвıага-Бакı, 17-24 dekabr, 2004

## On birinci Səfərnamə Şe'rləri

*I*

*iran, Turan...*

*Çoxdu seyri bu diyarın,*
*Nağıllar aləm kimi*
*Canda mehri bu diyarın,*
*Gəlmişəm həmdəmi kimi.*

*Çox olmuşam Tehranında,*
*Təbriz kimi məkanında...*
*Fikrim tarix ümmanında*
*Üzmədədir gəmi kimi.*

*İran qanı, Turan qanı...*
*Yuyub aparmaz qan qanı,*
*Qurumayır Çaldıranı*
*Gözlərimin nəmi kimi.*

*Diləklə doludur sinəm,*
*Qovsun qəmi o həm, bu həm,*
*At çapacaq yoxsa ələm*
*Qəlbimin ələmi kimi.*

*İran dağı, Turan dağı...*
*Olarmı uçuran dağı?*
*Aralıqda duran dağı Biçmək*
*gərək zəmi kimi.*

*Bakı-Tehran,*
*Təyyarə,*
18.12.2004

*II*
*QƏZƏL*

*«Yollarda xətər var» dedilər, gözlərim aydın,*
*«Sərhəddə çəpər var» dedilər, gözlərim aydın.*

*«Hicran arabir bal kimi şirin görünürsə,*
*Бətnində zəhər var» dedilər, gözlərim aydın.*

*«Şair, bu qədər etmə səfər, qibtə yaratma,*
*Gözlərdə nəzər var» dedilər, gözlərim aydın.*

*«Sevdayə düşənlər arabir dərdə düşürlər,*
*Sevdadə zərər var» dedilər, gözlərim aydın.*

*«Eşq içrə vəfa gördü, daha gözləri gülmür,*
*Əğyarə qəhər var» dedilər, gözlərim aydın.*

*«Tehranı və Təbrizi unutmaqdan uzaqsan,*
*Minlərlə şəhər var» dedilər, gözlərim aydın.*

*Бax gözdəki aydınlığa sən, ey qoca Şahin,*
*«İranə səfər var», dedilər, gözlərim aydın!!!*

*Текгап*
18.12.2004

*III*
*QİBLƏ*

*Tehranda, mehmansaraydakı*
*yeddi günlük, üç otaqlı*
*mənzilimdə namaz əhlinə və*
*mənə qiblənin yönünü göstərən*
*işarə var,*
*axı namaz qılarkən qibləyə üz*
*tutarlar.*

*Məkkə!*
*Müqəddəs Kə'bə!*
*Qiblə!*
*Qiblə istiqaməti!*
*Hər müsəlmana zəruri istiqamət!*
*Uzun müddət*
*Qiblәmin yönünü bilmәdim*
*dinsiz-imansız adamlartək.*
*Amma,*
*günlərin bir günü üzüm qibləyə*
*çevriləcək. Göndərəcəklər*
*ruhumu göyə, Döndərəcəklər*
*üzümü qibləyə O zaman yəqin ki,*
*mə'sum-mə'sum yalvaracağam*
*Yaradana:*
*«Ya Haqq! Ya Haqq!!:»*
*Amma,*
*artıq gec olacaq, sönəcək*

*ömrümün Günü...*
*Ey yol göstərənlər, nə*
*qədər ki gec deyil göstərin*
*mənə qiblənin yönünü,*
*dəstəmaz alım, durum*
*şəriətin itaətində,*
*Vecsiz bir atalar sözümüzdə deyildiyi kimi*
*«Qaçmaq da igidlikdəndir» deyib qaçım*
*səhvimdən və*
*namaz qılım qiblə istiqamətində.*
*Qiblə!..*

*Tehran,*
18.12.2004

*IV*
*SÜRUD*

*Tərk edib vəsli yenə qucmadayam hicranı,*
*Бu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*
*Yenə gəldim, yenidən seyr elədim Tehranı,*
*Бu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

*Deməsəm mən ona gər sevgili canan, ölləm,*
*Görməsə göz onu tez-tez, üzülər can, ölləm,*
*Бu nə hicran ki, desəm gər ona hicran, ölləm,*
*Бu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

*Verməyin badə ələ, badəpərəst olmadayam.*
*Qırmayın könlümü ki, könlü şikəst olmadayam...*
*Бu ətirdən, mey içənlər kimi məst olmadayam,*
*Бu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

*Demişəm mən ki, səmimanə hər an öz sözümü,*
*Aldada bilməmişəm zərrə qədər öz-özümü,*
*Бu nə hicran odHdm qarsılamır üz-gözümü?*
*Бu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

*Domasa şairi mən İrana İran demərəm,*
*«Olmam şe'rinə gündüz-gecə heyran» demərəm,*
*Şahina, mən Бu vüsalə daha hicran demərəm,*
*Бu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?*

*Tehran,*
19.12.2004

*V*
*QƏZƏL*

*Yəlda gecəsi*[9] *gəldi, Tehranda qaranlıq var,*
*Tehranda deyil təkcə, çox yanda qaranlıq var.*

*Yəlda - bu gecə, əlbət, tüğyan eləyir sübhə,*
*Şadəm, elə şadəm ki, tüğyanda qaranlıq var.*

*Şadəm ki, çox imkanə qismət bu gecə fürsət,*
*Çünki, deyə bilməm ki, imkanda qaranlıq var.*

*Şadəm ki, uzun olmuş yəlda saçıtək yarın,*
*Həzz ümmanı var məndə, ümmanda qaranlıq var.*

*Yaylıq sənə göndərdim, bağla o qara zülfün,*
*Qoy söyləməsinlər ki, cananda qaranlıq var.*

*Gizlətmə, açıq bildir meylin mənə vardırsa,*
*Pünhan eləmə meyli, pünhanda qaranlıq var.*

*Sülh arzulayan kəsdə üsyanə maraq olmaz,*
*Sülh arzulasın qəlbin, üsyanda qaranlıq var.*

*Nikbinliyə müştaqəm, bəxş eylə sevincindən,*
*Əlbəttə, sevinc azdır, əfğanda qaranlıq var.*

*Hərçənd qaranlıqda çox mətləb olur hasil,*
*Meylindəyəm ağ vəslin, hicranda qaranlıq var.*

*Təkrar elə, ey Şahin, mətlə'dəki misranı:*
*«Yəlda gecəsi gəldi, Tehranda qaranlıq var».*

20.12.2004

---

[9] *ilin ən uzun gecəsi, payızla qışın arasındakı son gecədir və sanskrit dilində «milad» («doğulma») deməkdir. Novruzda süfrə açıldığı kimi Yəlda gecəsinin də süfrəsi olur. Qarpız və nar var bu süfrədə. Çünki, nar əgər behişt meyvəsidirsə, qarpız canı yaşadan qanın rəngidir. Əbu Reyhan Biruni bu gecənin isa peyğəmbərin təvəllüd günü olduğunu bildirir.*

*VI*
*QƏSİDƏ*

*Eşq oxları yağdırdın sən canə məhəbbətlə,*
*Etdin məni, ey zalım, divanə məhəbbətlə.*

*Heyfa ki, cavanlıqda ifrat elədim eşqi,*
*Çox gül məni etmişdi məstanə məhəbbətlə.*

*Meylim elə çoxdur ki... İmkan elə azdır ki...*
*Yalvarmadayam tez-tez imkanə məhəbbətlə.*

*Amma, yenə var ümmid imdadına Allahın,*
*Etsin yenə lütf aciz insanə məhəbbətlə.*

*Versin canıma qüvvət dərvişi olum ərzin,*
*Qəvvas olum Eşq adlı ümmanə məhəbbətlə.*

*Göydə neçə aləm var... Aşiqləri həm çoxdur...*
*Baş Aşiq olum Yerdə mərdanə məhəbbətlə.*

*Hərdən dönübən şəm 'ə pərvanəyə od vurdum,*
*Hərdən şamı yandırdım pərvanə məhəbbətlə.*

*Etdim neçə yol tövbə, çünki günah etmişdim,*
*Gəldim neçə yol dinə, imanə məhəbbətlə.*

*Şadəm ki, uzaq oldum töhmət və məzəmmətdən,*
*Şahanə olub qəddim şahanə məhəbbətlə.*

*Zənnimcə, cəhənnəmdən üqbadə kənar ollam,*
*Mən ömrümü sərf etdim hər anə məhəbbətlə.*

*İzhar eləyən vardır sevdasım üqbadə Huriyə*
*məhəbbətlə, qılmanə məhəbbətlə.*

*Saf eşqə məhəbbətlə imdadə gəlib Nofəl, Hərdən*
*gəlirəm mən həm tüğyanə məhəbbətlə.*

*Eşqin çölünə düşdüm, çıxdım dağına eşqin,*
*Məcnunə məhəbbətlə, Sən 'anə məhəbbətlə.*

*Kim görməsə hicranı bilməz dəyərin vəslin,*
*Hicr içrə vuruldum mən Tehranə məhəbbətlə.*

*Əlbəttə, əzəllər həm çox mülkə qədəm basdım,*
*Baxdım ərəbə, türkə, əfqanə məhəbbətlə.*

*Həssas ola kim mən tək bir ləhzə belə qalmaz,*
*Ev sahibi baxmazsa mehmanə məhəbbətlə.*

*Dərviş kimi çox gəzdim, acgöz təki çox baxdım*
*Rəştə, Quma, Təbrizə, Zəncanə məhəbbətlə.*

*Yazdım neçə mətləbdən, əlbət, bu qəsidəmdə,*
*Çıxdım neçə dünyanı seyranə məhəbbətlə.*

*Əhsən adımı Şahin adlandıran insanə,*
*Uçdum təzədən quş tək İranə məhəbbətlə.*

*Tehran,*
21.12.2004

*VII*
*GƏLDİ-GEDƏR*

*Bu dünya fani dünyadı,*
*bu dünya hədəri.*
*Gəldi-gedəridi, gəldi-*
*gedəri.*
*Neçin gəlmişik, neçin*
*gedirik,*
*bilə bilmirik.*
*Xilqəti*
*gəldi-gedər,*
*Bəşəri*
*gəldi-gedər,*
*Neməti*
*gəldi-gedər,*
*Zəri*
*gəldi-gedər,*
*Axşamı*
*gəldi-gedər,*
*Səhəri*
*gəldi-gedər.*
*Gülü, çiçəyi*
*gəldi-gedər,*
*Hər şeyi*
*gəldi-gedər...*

*Ehey, o biri dünya,*
*Məni indiyəcən Yerdən*
*qopara bilməmisən,*
*Yanına apara bilməmisən,*

*çünki*
*yüngül olmamışam,*
*həmişə istəmişəm ağır gəlim,*
*gəlişim*
*gedişimdən ötrüymüş,*
*çağır gəlim,*
*hələ ki, səsini eşitmirəm,*
*bağır gəlim,*
*yerdəki həyatımı verim bada,*
*amma, Tehranda yox, Bakıda!*

*...Bu dünya fani dünyadı.*

*Tehran,*
22.12.2004

*VIII*
*Şahin öz-özünü güllələyəcək*

*Tehranda kimsədən qorxum yoxsa da,*
*Eşitdim qəfildən bir güllə səsi.*
*Canımı ürpətdi o müdhiş səda,*
*Görən, kimə dəydi əcəl gülləsi.*

*Gündə doğuluram, ölürəm gündə,*
*Özümdə dağ boyda dözüm görürəm.*
*Mənim qanadım var çiynim üstündə,*
*Onu kimsə görmür, özüm görürəm.*

*Hardasa tuşlanan mənə tətik var,*
*Haçansa edəcək güllə zar məni.*
*Məndən yayındırır onu qanadlar,*
*Sanıram qoruyur qanadlar məni.*

*Yoxdur əzab çəkən şairlər qədər,*
*Həzz də çəkən yoxdur şairlər təki. Qəti*
*əminəm ki, bütün şairlər Qeyri-*
*adilərdir yer üzündəki.*

*Yataqda ölməyi sanıram hədər,*
*Haçansa mənə də güllə dəyəcək.*
*Günlərin bir günü öldürməsələr,*
*Şahin öz-özünü güllələyəcək.*

*Qanımı qovacaq canımdan yaram,*
*Təəccüb etməsin kimsə bu qəsdə.*
*Yataqda ölməyi arzulamıram,*

*Tehran,*
22.12.2004

*Ölsəm öləcəyəm mən ayaq üstdə.*

*IX*
*QİT'Ə*

*Tehranda professor Yusif Rüstəmovun*
*təsəvvüf barədəki çıxışından ruhlanaraq*

*Sanmayın fars-ərəbi bilsəm də,*
*Qəzəlin mübhəminin şahiniyəm.*

*Deməyin bəndəsiyəm qüssə-qəmin,*
*Neçə sevda dəminin şahiniyəm.*

*Şahina, yoxdu bu aləmlə işim,*
*Mən ki, ruh aləminin şahiniyəm.*

*Tehran*, 22.12.2004

*QƏZƏL*

*Kim söylədi ki, qol yenə Tehranı qucaqlar,*
*Eşqim elə artıbdı ki, hər yanı qucaqlar.*

*БадЬанДа məhəbbət görürəm, güldə*
*sədaqət, Güllər sarılıb boynuna bağbanı*
*qucaqlar.*

*Mehmanın əgər niyyəti pak, eşqi təmizsə,*
*Ev sahibi, əlbəttə ki, mehmanı qucaqlar.*

*Mən meylə müvafiq təzə imkanıma yetdim,*
*Qollarda meyl çoxdu ki, imkanı qucaqlar.*

*İqrarı üçün xəstəyə meyl eyləməsinlər,*

*Əlbəttə ki, ümmid ilə loğmanı qucaqlar.*
*Heyrətlə deyirlər məni divanə edib zənn:*
*- Gəh vəsli qucaqlar, gəhi hicranı qucaqlar.*

*İran mənə şövq ilə qucaq açdı, sevindim,*
*Şahin yeni ilham ilə İranı qucaqlar.*

*Tehran*, 22.12.2004

*XI*
*QİT'Ə*

*Konfransın son iclasında professor Təhminə Rüstəmovanın çıxışını dinlədikdən sonra*

*Dünya, səni bezdirdi aşiqlərin əfğanı,*
*Məcnun eləyir nalə, Fərhad eləyir fəryad.*

*Gəlmir gözümə rö'ya, yetmir dadıma xülya,*
*Röya eləmir çarə, xülya eləmir imdad.*

*Sevdayə könül vercək səhv eyləmişəm, çünki*
*Sevda neçə müddətdir qovğa eləyir* icad.

*Rəbbin işini bilmək mümkün deyil insanə,*
*Abadı edir bərbad, bərbadı edir abad.*

*Yoxdur buna şəkk əsla: İlham ikiqat artar*
*Əcdadına bənzərsə əzmində əgər övlad.*

*Şair neçə gündür ki, Sə'di elinə gəlmiş,*
*Hər lütfünü İranın daim edəcəkdir yad.*

*Şagird ilə ustadı Tehranda edir təmsil,*
*Şahin kimi bir şagird, Təhminə kimi ustad.*

*Tehran*, 23.12.2004

*XII*
*QƏZƏL*

*Gəh gülüstana səfər, gəh də biyabana səfər,*
*Əvvəl-axır edəcəkdir məni divanə səfər.*

*Qürbət ellərdə çox oldum, dönürəm yurda tərəf,*
*Tərk edib vəslimi etdim neçə hicranə səfər.*

*Arabir qonşularım etmədə rişxənd mənə:*
*«- Nə həşirdir eləyirsən belə hər yanə səfər?»*

*Söylərəm: «- Getməliyəm Məkkəyə həm inşallah,*
*Şövq ilən etməliyəm mən Ərəbistanə səfər».*

*Amma, çəkməkdə məni indi vətən gülzarı,*
*İstərəm indi edim doğma gülüstanə səfər.*

*Eləyibsən məni pərvanə, ey Odlar Yurdum,*
*Gərək etsin yanına indi bu pərvanə səfər.*

*Dedilər: - Sanki cavandır qoca Şahin Fazil,*
*Edəcəkdir hələ çoxmu qoca İranə səfər?*

*Kərəc şəhəri,*
24.12.2004



# ON İKİNCİ SƏFƏRNAMƏ

## *«ŞAHİNƏ QİSMƏT OLUBDUR YENƏ İRAN SƏFƏRİ»*

Fevralın son günü Təbrizə yola düşməliyəm. Amma, bu səfərna- məmi fevralın son günündən dörd gün qabaq yazmağa başladım. Bəli, ayın 24-də gecə yarısı Bakıdakı İran səfirliyi Mədəniyyət Mərkəzinin məsul işçisi olan höccətül-islam və-l müslimin Seyyid Səid Rəşadi mənə zəng etdi:

- Ağaye-Şahin, evdə tapılmırsan. Mobil telefonunu da söndürmüsən. Neçə saatdır sənə zəng edirəm...

Doğrudan da bu gün evə gec gəlmişdim, həkim Qəninin ad günü münasibətiylə keçirilən tədbirdə idim. Ağaye-Rəşadidən üzr istədim. Dedi:

- Təbrizə getmək imkanın varmı? Səni də’vət edirlər.

Razılığımı bildirdim. Razılığımı bildirməyə bilməzdim. Təbrizdən son dəfə keçən əsrin son ilində qayıtmışdım. Darıxmışdım Təbriz üçün.

Rəşadi dostum dedi:

- Şair Hacı Rza Sərraf Təbrizinin şərəfinə Təbrizdə yubiley tədbiri keçiriləcək. Hazırlaş. Ayın 28-də sübh tezdən bizim Rayzənimizin (Mədəniyyət Mərkəzi - Ş.F.) qabağından yola düşəcəksiniz.

Biləndə ki, Təbrizə yollanacaq nümayəndə heyətimizin tərkibində kimlər var, sevindim: Akademik Bəkir Nəbiyev, akademiyanın tanınmış alimləri Şahin Mustafayev, Teymur Kərimli, İmamverdi Həmidov, «Hafta-press» nəşriyyatının direktoru Hafiz Abıyev, «Nəbz» qəzetinin baş redaktoru Qurban Cəbrayılov, Hacı Rza Sərraf Təbrizi «Divan» ının tədqiqatçısı Özbək Nadirov mənimlə həmrah olacaqlar.

Bəli, fevralın son günü Təbrizə yola düşməliyik. Amma, bu səfərnaməmi fevralın son günündən qabaq yazmağa başladım. Çünki, mən artıq xəyalən Təbrizdəydim. Təbrizi düşündüm, Təbrizdə keçirdiyim xoş günləri xatırladım.

Ağaye-Rəşadi ilə söhbətimdən sonra yuxum çəkildi. Elə çox yaxşı ki çəkildi. Yuxumu itirdimsə də bir qəzəl yazdım:

*Şahinəm, gözləyirəm doğrusu hər an səfəri,*
*Gəh vüsal əzmi müyəssər, gəhi hicran səfəri...*

*Şəhriyar eşqi ilə Təbrizə getdim neçə yol,*
*Neçə yol çəkdi məni yanına Tehran səfəri.*

*İndisə eşqi dolubdur canıma Sərrafın,*
*Şahinə qismət olubdur yenə İran səfəri.*

Qəzəlimi bitirdimsə də yata bilmədim. Kimdir bu Hacı Rza Sərraf? Durub Seyid Əzim Şirvaninin «Təzkirə»sini açdım. Orada Hacı Rza Sərraf yox idi. Orada İsa Sərraf Ərdəbili vardı. «Sərraf bir cavandır İsa nam və Məsihkəlam, fərzəndi-ərcüməndi-Hacı Əbdürrəhim Ərdəbilidir» yazan Seyid Əzim bu Sərrafdan bir neçə qəzəl də gətirir:

*«Çəkilib sinəmə hicran gününün yarələri,*
*Qan verir hər birinin tışrayafəvvarələri...*

*... Sərrafa, hər kimə izhar elədim eşq qəmin,*
*Dedilər cümlə: ölümdür bu qəmin çarələri!»*

Bəli, Təbrizdə yubileyi keçiriləcək Sərraf bu deyil, başqa Sərrafdı...

Ertəsi gün işlədiyim Tarix İnstitutuna getdim və vaxt tapıb beşinci mərtəbəyə - akad. Bəkir Nəbiyevin yanına getdim. O da mənim onlarla gedəcəyimi bilib sevincini gizlətmədi. Hacı Rza Sərraf barədə sual verdim. Dedi ki, elə mən özüm də onu o qədər də yaxşı tanımıram, Seyid Əzimin «Təzkirə»sində də adı yoxdur. Amma, çox ilhamlı bir şair olmuşdur. Divanı bu günlərdə Təbrizdə və Bakıda çap olunub, lakin onlar hələ mənim əlimdə yoxdur. Bakıda çıxan «Divan»ının bütün tirajını dostumuz Mirzə Rəsul İsmayılzadə (İranın Beynəlxalq Əlhüda nəşriyyatı Bakı şöbəsinin direktoru - Ş.F.) özü ilə götürüb aparıb
Təbrizə. Amma, sənə bir söz deyim: Həmin «Divan»m ayrı-ayrı varaqları

İmamverdidə var. İstə ondan, bəlkə verə.

Getdim İmamverdinin şöbəsinə. O, bir müddət mizinin daxılını axtarıb, nəhayət ki, həmin varaqları tapdı və mənə verdi, amma dedi ki, onları elə bu gün də ona qaytarım.

Elə də etdim. Götürdüyüm varaqları təcili oxudum və Hacı Rza Sərrafın necə duzlu bir şair olduğunu dərhal duydum. Döşümə yatdı Sərraf. Əsasən sadə dilindən xoşum gəldim:

*« Yox deyən Sərrafa, ey biçarə, bəsdür, ağlama,*
*Bixəbərsən, göz yaşün aləmdə tufan eyləmiş».*

Sərrafın bir neçə qəzəlinin surətini çıxarıb, İmamverdidən aldığım varaqları geri qaytardım və bu təbrizli şairdən ilhama gəlib bir qəzəl yazdım:

*Ruhi, yarəb, sevinə, şad ola Sərrafımızın,*
*Qəbri nur ilə, işıqla dola Sərrafımızın.*

*Tazəvü tər görünür söz gülü, söz bağında Gülü,*
*zənn eyləmirəm mən, sola Sərrafımızın.*

*Şerinin ətri sərasər yayılıb Təbrizə,*
*Bakıya, Bağdada, İstanbula Sərrafımızın.*

*Təbinin zərrəsini Şahinə versin Sərraf,*
*Bir qulam, rəhmi gələ qoy qula Sərrafımızın.*

Fevral ayının 26-sı. Bu gün Xocalı soyqırımının anım günüdür. Bu gündən düz 14 il qabaq bizim Xocalı adlı bir şəhərimiz vardı. İndi yoxdur. Ermənilər və ruslar yox etdilər onu. Badi-fənayə verildi Xocalı. Ondan heç nə qalmadı, adından başqa.

Təbrizə getməyimə iki gün qalır. Hələlik torpaqdan və xəritədən silinən Xocalı barədə «Hələlik cavabsız suallar» adlı bir şe’r yazdım. Nə edim? Mnıiim də əlimdən bu gəlir. Hələlik cavabsız suallar. Sual verən inadkar, cavab verməli olanlar kar. Hələlik cavabsız suallar:

*Xocalının xocası vardı,*
*cavanı vardı, qocası*
*vardı, hanı bəs?*
*Xocalının evi vardı, daşı*
*vardı, damı vardı,*
*adamı vardı, hanı bəs?*
*...Бm yoxdu, biri vardı,*
*Xocalının yeri vardı,*
*oğlu, qızı vardı, sazı,*
*sözü vardı,*
*Özü vardı, hanı bəs?*
*hanı bəs? hanı bəs?*

Bu gün fevralın 27-sidir. Sabah erkən yola düşəcəyik. Amma, hələ də mənim Hacı Rza Sərraf Təbrizinin mühiti, doğum ili, həyatı və yaradıcılığı barədə dolğun təsəvvürüm yoxdur. Doktor Moinin «Fərhənge-Moin» adlı altı cildliyinə baxdım - yoxdur. Azərbaycan Sovet Ensiklopediyasına baxdım - yoxdur. Hüseyn Əfəndi Qayıbovun «Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir» kitabına baxdım - yoxdur, Seyid Əzim Şirvaninin «Təzkirə»sinə bir də baxdım - yoxdur. Xeyli təəccübləndim. Elə bu əsnada İmamverdi mənə zəng vurdu. Ondan soruşdum - bilmədi. Nə isə... Gedib Təbrizdə öyrənərəm, bilərəm ki, bu duzlu, hikmətli, ilhamlı şair kimdir.

İmamverdinin mənə verdiyi varaqlar arasında Sərrafın bir qəzəlindən bir beyt mənim diqqətimi özünə cəlb etdi. O beyti əsas götürüb bir qəzəl-təzmin yazdım:

*Kim söyləsə ki, eyşü səfa dövlət iləndir,*
*Bilsin bunu ki, dövlət isə qismət iləndir.*

*«Hər kimsə ola rabiteyi-şeʼrdə rəbti,*
*Anlar bu qəzəlqaideyi-hikmət iləndir»...*

*Üç divanı inşa eləyib səy ilə Şahin,*
*Divan ki, yazıbdır, nə qədər zəhmət iləndir.*

Elə bu zaman İmamverdi yenə zəng vurdu. Söylədi ki, Hacı Rza Sərraf 1853-cü ildə Təbrizdə doğulub və 1907-ci ildə elə orada da dünyaya göz yumub. Məşhur tacir övladı olub. Təbrizdə «Səfa» adlı ədəbi məclisin üzvü kimi get-gedə püxtələşib (Yadıma Seyid Əzim dövründə Şamaxıda təşkil edilən «Beytüs-Səfa» («Səfa evi») məclisi düşdü). Ən nəhayət İmamverdi mənə dedi ki, sırağagün mənə verdiyi varaqlar Sərrafın «Divan»ındandır.

Deməli, «Divan». Hacı Rza Sərrafın «Divan» kitabı. Bəs nə əcəb Seyid Əzim onu tanımayıb? Yəqin ki, Hacı Rzanın divanı Seyid Əzimin vəfatından sonra (1888) məşhurlaşıb. Yoxsa, seyid onu hökmən tanıyardı.

Deməli, «Divan». Elə mən də cürət eləyib «Divan» yazmış və onu çap etdirmişəm (1996). «İkinci Divan» adlı kitabımsa elə bu günlərdə işıq üzü görəcək. «Üçüncü Divan»ım bitmək üzrədir.

İmamverdinin verdiyi varaqlara bir də göz gəzdirdim. Hacı Rza Sərrafın «Üstünə» rədifli bir qəzəlini ləzzət çəkə-çəkə oxudum. Oxudum və yeni bir qəzəl-təzmin yarandı:

*Öylə ki, söhbət dolandı - gəldi canan üstünə,*
*Sanki loğmanım məni göndərdi dərman üstünə.*
*«Dilbəra, xəttün çıxub? Ya fitnə bərpa etməyə Ləşkəri-Çingiz olub amadə İran üstünə?»...*

*Şahina, Sərraf olub sərf eylə ömrü sənətə,*
*Yığ yazıb ömrün boyu divanı divan üstünə.*

Yox, bu gün daha yazmayacağam. Heç oxumayacağam da. Yoruldum. Ardı sabah. Bakı-Təbriz yolunda inşallah!

28 fevral. Səhər saat səkkizin yarısında İran Mədəniyyət Mərkəzinin qarşısına gəldim. Hacı Qurban Cəbrayıldan başqa heyətin bütün üzvləri gəlmişdi. Səid Rəşadi öz mobil telefonuylu Qurbanla danışdı və bizdən 5-10 dəqiqə Hacını gözləməyimizi xahiş etdi. Gözlədik. Lakin Hacı gəlib çıxmadı. Hacı Rzanın tədbirinə yollanan Hacı Qurban gecikir. Bir qədər də gözlədik. Akademik göstəriş verdi: İrəli!

Getdik irəli. Qurban Cəbrayıl isə arxada qalmışdı. Nəhayət o, gəlib Salyanda bizi haqladı və onu gətirib bizə çatdıran «Jiquli» markalı maşının

tamahkar sürücüsü ondan yüz min manat çırpışdırdı. Allah gözünü doydursun, ey Qurbanı gətirən kişi. Allah adamından hər kilometr yola min manatalan kişi. Allah gözünü doydursun!

İrəli yollandıq. D-r Teymur Kərimli də arxada qalmışdı, lakin bilirdik ki, o gəlir, özü də Astara Gömrük Məntəqəsi rəisinin maşınındı.

Biz sərhədi onsuz keçdik. O, sabah gələcək. Rəis onu bir günlüyə öz yanında saxladı.

İran Astarasında isə artıq Şərqi Azərbaycan «İncəsənət ocağı»nın («Hovzeye-honəri») məsul işçiləri ağaye-sədr Məhəmmədi Sədr və şair Məhəmməd Rəncbər (şairlik təxəllüsü Rəncidir) bizim gəlişimizə müntəzir idilər. Olduqca səmimanə görüş. Qarşıda Astaradan Təbrizədək yol var.

Astaradan Təbrizədək. Astara iki hissəyə bölünmüş bir şəhərdir (indi iki şəhərdir: necə deyərlər Sovet Astarası və İran Astarası). Təbriz isə birdir. Əvəzsiz Təbriz!

Mən əvvəllər Təbrizi çox seyr eləmişəm. Dəfələrlə Ərk qalasının əzəməti məni heyran qoyub. Bu qalanın inşası təxminən iyirmi il davam edib. Ərk qalası monqol-elxani hökmdarı Sultan Əbu Səidin vəziri
Tacəddin Əlişah Cilani tərəfindən tikilmişdir. Deyilənə görə İran hökuməti indi onun əsaslı təmirinə başlamışdır.

Təbrizin tarixi və görməli yerlərindən biri də hal-hazırda «Elgölü» adlanan və təbrizlilərin istirahət yerlərindən biri olan göldür. Bu gölü ağqoyunlular yaratmış, qacarlar əsaslı şəkildə genişləndirmişlər.

Qala və gölü xəyal güzgümdən ayırıb orada «Məqmərətüş-şüəra» («Şairlər məqbərəsi») adlanan və özündə və əhatəsində 400-dən çox şair dəfn olunun əzəmətli bir qəsri canlandırdım. Xaqani Şirvanidən Məhəmmədhüseyn Şəhriyaradək klassik şairləri ağuşuna alan bu torpaq sahəsini məhz həmin şairlər məşhur etmişlər.

Göy məscid. Cahanşah Qaraqoyunlu yadigarı. «Təbriz bazarı» adlanan üstüörtülü ticarət mərkəzi. Min il bundan əvvəl yaradılmışdır...

Təbrizin o qədər gəzməli-görməli yerləri var ki.

Maşınlarımız isə geniş və rahat şosse yolu ilə irəliləyirlər. «Pejo» markalı maşınlar, arxada Astaralar, öndə isə Ərdəbil şəhəri. Bu tarixi şəhərə çatmağımıza 70 km. yol qalır. Eniş-yoxuşlu yollar. Astaraçay İran ölkəsini mənim məmləkətimdən ayırır. Sağ yan bizim, sol yan İranın. Sağ yan dərə, sol

yan dağ.

Ərdəbilə çatmağımıza hələ yarım saatdan çox var (təxminən 30 km.). heyran aşırımı. Savalan dağının zirvəsi qar içindədirsə də ətəkləri əriməyə başlayıb. Sürücü Y asər Əşrəfi dedi ki, bir həftə bundan əvvəl bu yoldakı qarın hündürlüyü iki metrdən çoxdu, yol dörd gün bağlı qaldı.

«Pejo» şütüyür. Yeraltı tunel. Yadıma Əfqanıstan düşdü. Əfqanıstanın Saləng dağı. Dağın üç km. uzunluğunda olan tuneli. Buradakı tunelinsə uzunluğu təxminən 800 metrdir.

Qaranlıqdan ağa çıxdıq. Yasər Əşrəfi bütün yol boyu Hacıbaba Hüseynov, Rübabə Muradova, Ağaxan Abdullayev, Əlibaba Məmmədov və bir nəfər meyxanaçımızın (şairlikdən zərrə qədər təsəvvürü olmayan bu adam indi yaman dəbdədir) kasetlərini avazlandırır.

Səreyn adlı kurort şəhəri. Savalan dağının ətəyi. Yeri deşib üzə çıxan onlarla bulaq məkanı. Yay zamanı varlıların istirahət guşələrindən biri.

Səreyn sağda qaldı. Öndə Sərab var. Bizim Hüseynqulu Sarabskinin doğulduğu şəhər.

Şahin Mustafayev və Hafiz Abıyev bu yolla ilk dəfədir ki, hərəkət edirlər. Heyran aşırımına heyranlıqla baxan bu həmrahlarım Səraba və Bostanabada da elə heyranlıqla baxırlar.

Bostanabad. Sabiq adı Ucan. Məşhur Ucan şəhəri. Qaraqoyunlu hökmdraı Qara Yusif məhz burada ölmüşdü. Teymuri sultanı Şahruxu öldürməyə yollanan Qara Yusifin canını əcəl burada almışdı. Elə ölən kimi də ordu əmirlərindən birisi onun sağ qulağını kəsib oradan asılan qiymətli bir qızıl sırğanı «yəğmalamışdı». Qaraqoyunlu Yusif və Teymuri Şahrux qarşıdurması. Baş tutmayan müharibə və qaraqoyunlu hökmdarının qəfil ölümü. Qulaq və sırğa (kişi sırğası!). Əmir və yəğma! Tarixi Ucan şəhəri və hal-hazırkı Bostanabad.

Təbrizə çatmağımıza az qalır. Şibli gədiyi...

Nəhayət Təbriz! Gecə düşmüşdüsə də şəhər işıqlıydı. Dirəklərdə yollar boyu üzərində «Ya Hüseyn» yazılmış qara parçalar yellənirdi. Radio ilə məşhur Kərbəla faciəsinə aid bir veriliş səslənirdi.

Gözəl və yaraşıqlı bir mehmansaraya gəldik. Şərqi Azərbaycanın İşıq idarəsinin 5 mərtəbəli mehmansarayı. «İncəsənət ocağı»nın rəisi d-r Mustafa Quluzadə, onun maliyyə müdiri Həmid Pagərd, müdirin müavini Məhəmməd

Niknəfs və alim-şair dostum Hacı Mirzə Rəsul ismayılzadə ilə mehriban görüş.

D-r M.Quluzadə ilə Naxçıvanda tanış olmuşdum. O, orada uzun müddət İran Mədəniyyət Mərkəzinin rəisi vəzifəsində işləyib.

Şam yeməyimizi birlikdə yedik. Sabah istirahət və müxtəlif görüşlər günüdür. Sədr Məhəmmədi Sədrdən Təbriz Universitetinin ustadı d-r Mahmud Pədidəni xəbər aldım. Məlum oldu ki, ölüb. Bu şair-alimi infarkt aparıb dünyadan. Gözlərim yaşardı. Və onun 1992-ci ildə Təbriz görüşümüz zamanı (Şəhriyar konfransı) mənə həsr etdiyi bir şe’ri yadıma düşdü:

*«Salmışdı şure-şe’rin yeksər cəhanə Şahin,*
*Sən tək doğa çətindir mame-zəmanə, Şahin.*

*Hərçənd əyləşibdir başində bərfe-piri,*
*Müşkil vəli otursun təbe-cəvanə, Şahin.*
*Əzbəs salıb şərarə hicran odu bu qəlbə,*
*Ney tək rəvadı gəlsəm hər dəm fəğanə, Şahin.*

*Səndən məni ayırsın hicran məhal işdir,*
*Çün mehrin əyləşibdir bu cismü canə, Şahin.*

*Bir min deyil ki, hüsnün ta mən yazım mədihə,*
*Saydan keçibdi, gəlməz bu yerdə sanə, Şahin.*

*Gündüz səninlə getdi, qaldı gecə mənimlə,*
*Bu ev mənə olubdu bir həbsxanə, Şahin.*

*Qoy sözlərin Pədidə bu növ ilə yetirsin,*
*Qalsın bu şe’r məndən səndə nişanə, Şahin».*

*14.09.1371. Təbriz. Pədidə*

Üçüncü qatdakı 303 saylı otağıma qalxdım. Yorğunluğuma baxmayaraq şe’r yazmaq istədim. Mövzu vardı. Dünya, onun bivəfalığı, üzərində «Y a Hüseyn» yazılmış qara parçalar. «Dünya»nı yazdım:

Dünya

*«Dünya sizi aldatmasın»*
*İmam Hüseyn*

*Hər an gəzir, yaman gəzir,*
*Dünya sizi aldatmasın.*
*Şahiddir asiman, gəzir,*
*Dünya sizi aldatmasın...*

*Əriməyən qar görmədim,*
*Yox olmayan var görmədim,*
*Partlamayan şar görmədim,*
*Dünya sizi aldatmasın.*
*Şahin Fazil çox qəm dadıb,*
*Sitəm görüb, ələm dadıb,*
*Dünya onu çox aldadıb,*
*Dünya sizi aldatmasın,*
*Dünya sizi aldatmasın!!!*

Gecə yarısı oyandım. Təbriz gecəsi. Hər yan çıraqban. Gündüz kimi işıqlı gecə. Yuxun gəlməyə, özü də belə gecə ola, şe'r yazmayasan neyləyəsən? Mövzu yenə Sərraf mövzusudur:

*İsmayılzadə Rəsul söylədi «gəl Təbrizə»,*
*Gəlməyim mən nə təhər bəs bu gözəl Təbrizə?*

*Çağıran olsa məni yollanaram düz Herata,*
*Bağdada həm gedərəm, amma əzəl Təbrizə.*

*Bakıya çox qəzəlim var, yazıram indi isə Ulu*
*Sərrafı anıb türfə qəzəl Təbrizə...*

*Şahinin var Yaradandan diləyi: - Ey Rəbbim,*

*Allahım, qoyma yaxın gəlsin əcəl Təbrizə!* [10]

Gövdəsini ovub pinəçi dükanı düzəltmişdilər. İndi o dükanın yerini çöl tərəfdən suvayıblar. Tarixin əmanətidir, qorumaq lazımdır.

Kəndovana çatdıq. Külünglərlə ovulmuş və içərisində otaqlar yaradılmış qranit qayaları heyranlıqla seyr edirik. Yolun qarı hələ əriməyib.

Qayalar və qaya balaları olan daxmalar. Bura monqolların istila dövrünə aiddir. Vəhşi monqol qoşunlarının həmləsi nəticəsində əhali dağa-daşa qaçıb, uca qayalarda məskən salıblar. Həmin əhalinin varisləri elə indi də bu qayalıqları tərk etməyiblər. Dedilər ki, bu yerlər nəslimizin yadigarıdır. 850 ildir ki, buralar bizimdir.

Hal-hazırda bu daş daxmalarda mindən çox əhali yaşayır. Kəndovanın sağı qayalar, solu bağlar və əkin sahələridir.

Məhəmməd adlı bir kəndovanlı bizi öz qaya ovuğuna də'vət etdi. Bəkir müəllim getməyəcəyini bildirdi. Doğrudan da o sərt qayalara çıxmaq bizim üçün çox xətərlidir. Şəhərli olub getmişik, öyrəşməmişik dağa-daşa... Üstü buz bağlamış darısqal cığırlarla dırmaşmağa başladıq. Zor-bəla ilə üst-üstə uculan daxmaların 4-cü qatına (son qatına) qalxdıq. İmamverdinin çəkmələri (elə mənim də) bərk sürüşürdü. Bizim divarlardan yapışa-yapışa yuxarı çıxdığımız cığırı Məhəmməd əlləri cibində çıxmaqdaydı. Onun ayaqlarına baxıb səbəbini bildim, ayaqqabıları rezin materialındandı.

Məhəmmədin daxmasına daxil olduq. İki səliqə-sahmanlı otaq. Taxçalar. Yerdə kilim. Kilimin altında dairəvi qapaq izləri. Dedi ki, təndirdir, üstünü

---

10 mart. Sübh tezdən balkona çıxdım. Təbrizin Eynalı dağları göz qabağındadır. Zirvələrdə və ətəklərin əksər yerlərində qar parlayır. Şahin Mustafayev fotoaparatını götürüb gəldi. Şəkil çəkdirdik.

Sübh yeməyindən sonra yola düşdük. Kəndovana gedirik. Dedilər ki, təxminən 50 km.-lik yoldur. «Vadiye-rəhmət» qəbristanlığı. Minlərlə məzar. İran-İraq müharibəsi dövründə şəhid olanların qəbirləri gül- çiçəyə qərq olmuşdur. Qəbristanlığın sol tərəfi şəhidlərindir. Bizim «Şəhidlər xiyabanı»mız yadıma düşdü. Yaxşı ki, Azərbaycan öz şəhidlərinin qədrini bilir. O qədər dərdimiz vardır ki...

Xosrovşəhr-Üsku-Kəndovan yolu.

Yol ayrıcında böyük bir qoca palıd yola boylanırdı. 800 il yaşı var.

örtmüşük.

Məhəmməd söylədi ki, monqollar bu qayalara çıxa bilmədilər, gələnlərin hamısını qırıb-çatdıq, siz isə bizim qonaqlarımızsınız. Siz elə bizsiniz.

Əfqanıstanın şimalındakı Bəlx yadıma düşdü. Monqollar oraya da gəlmişdilər. Ora düzəngahdır. Oraya girmək asandır. Əhalinin müqavimətini görən monqol qoşunları Köhnə Bəlxi yandırdılar. İndi həmin Bəlxin kənarında Yeni Bəlx var. Böyük şəhərdir. Mən orada olarkən (keçən əsrin 60-cı illərinin ortaları) yandırılıb-viran edilmiş Köhnə Bəlxin xarabalıqlarını dönə-dönə seyr eləmişdim. Yanıq evlərin hisi indiyədək qalmaqdadır. 8 əsr ötməsinə baxmayaraq ruzgar həmin
hisi və qurumu silib apara bilməmişdir. Ah monqollar, monqollar...

Kəndovan qayalarına çıxmaq düşməkdən asan oldu. Özbək Nadirov yıxıldı.

Kəndovanda «vətən zəfəranı» («zəfərane-vətəni») aldım. Bal və doşab da təklif etdilər. İmtina etdim. Yük daşımaqdan xoşum gəlmir (amma ömrüm boyu yük daşımışam - qürbət yükü, hicran yükü, möhnət yükü, məhəbbət yükü və s.).

Təbrizə qayıdırıq. Kəndovan təzədən gözlərim önündə canlanır. Təbrizlilərin sözünə görə bu tipli üç kənd var dünyada: Amerikada, Türkiyədə və İranda. Amma İran Kəndovanından başqa onların heç birində insan yaşamır.

Qarı artıq ərimiş şosse yoluna çıxdıq. Hafiz Abıyev Hacı Rza Sərrafın bu günlərdə Mustafa Quluzadə tərəfindən Təbrizdə çap olunmuş «Divane-Sərraf Təbrizi» kitabının 1-ci qəzəlini oxumağa başladı. Qəzəlin birinci beyti məni elə tutdu ki, bir də gördüm əlimdə qələm var, dizlərim üstündə dəftər. Yeni bir qəzəl-təzmin yarandı:

*«Ey şam, o geysuye-pərişanə dolaşma,*
*Can riştəsi var orda, çakilyam, dolaşma»...*

*Şahin, ayağın yığ və otur ki, yıxılarsan,*
*Sərraf təkin duzlu qəzəlxanə dolaşma.*

Təbrizə çataçatda bu qəzəl-təzminimi elə maşındaca oxudum və sürücümüz onu məndən istədi. Dedi ki, öz xəttinlə köçürüb mənə ver. Qoy

səndən mənə yadigar qalsın.

Şamdan sonra azacıq istirahət. Sonra «Xaneye-fərhənge-Fədək» («Fədək mədəniyyət evi») adlanan bir saraya gəldik. Bu mədəniyyət evinin rəisi höccətül-islam və-l müslimin elmi-dini tituluna layiq görülmüş Hacı ağaye-İsmaili adlı mömün bir cavandır. Orada başqa bir cavan höccətül-islam da vardı: Hacı ağaye-İsmaili. O, «Xaneye-fərhənge- məşrutiyyət» («Məşrutiyyə mədəniyyət evi») adlanan başqa mədəniyyət sarayının rəisidir və buraya bu gün bizimlə görüşə gəlmişdir. Ağaye- İbrahimi məlumat verdi:

- Bizim bu mədəniyyət evlərimiz yeniyetmə və gənclərin təlim və tərbiyələri ilə məşğul olur. Təbrizdə 8 belə ev var ki, onların rəisi sizin qarşınızdadır.

Ağaye-İsmaili onun fikrini davam etdirdi:

- Məqsədimiz gəncləri dini təlimə daha çox yaxınlaşdırmaqdır. Biz öz mədəniyyət evimizdə Məşrutə tarixində xidmətləri olan şəxslərin fəaliyyətləri barədə, həmçinin tarix, mədəniyyət və s. haqda üç min kitab toplamışıq.

Öyrəndik ki, bu mədəniyyət evlərinin üzvləri olan oğlan və qızlar ayda 100 tümən (kiçik məbləğdir - Ş.F.) üzvlük haqqı ödəyirlər ki, yığılan pullar Bələdiyyə İdarəsinin xəzinəsinə keçirilir.

Sonra hər iki Hacıya bizi maraqlandıran suallarla müraciət edib onların cavablarını dinlədik. Bəkir Nəbiyev öz növbəsində çıxış edərək akademiyamız barədə, onun institutları haqqında məlumat verdi və bizi bir-bir onlara təqdim etdi.

Hər iki höccətül-islamın barmaqlarında üç ədəd üzük vardı. Buna diqqət yetirən Bəkir müəllim bu üzüklərin sayının nə üçün üç olduğunu və nə üçün onların məhz əqiq və firuzə qaşları ilə bəzənməsinin səbəbini soruşdu. Ağaye-İbrahimi dedi:

- Üzüklərimizin sayının üç olması təsadüfidir, o ki, qaldı üzüklərin əqiq və firuzə qaşlarından düzəldilməsinə, məlumunuz olsun ki, əqiq və firuzə insanın göz və beynini işıqlandıran cəvahiratlardandır.

Şahin Mustafayev müavini olduğu AMEA Şərqşünaslıq İnstitutunun fəaliyyətindən danışdı. Mən ağaye-İbrahimidən soruşdum:

- Fədək nə demək?

Cavab:

- Xanım Fatimeyi-Zəhranın Fədək adlı bir bağı olub. O bağ əvvəllər

yəhudilərə məxsus idi. Məhəmməd peyğəmbər həmin bağı onlardan alıb qızına bağışladı.

Görüşümüz bitdi. Hafiz Abıyev bu mədəniyyət evinin xüsusi kitabında (xatirə kitabı - Ş.F.) bizim heyət adından ürək sözlərimizi qeyd etdi.

Biz «İslami Təbliğat Mərkəzi» adlanan böyük bir kluba gəldikdə artıq saat 18 olmuşdu. Orada «şəbe-şe'r» («şe'r gecəsi») keçirilirdi.
Məclisi bu gün «Şəhriyar ədəbi məclisi»nin sədr müavini Əyyub Şahbazi aparırdı (bu məclisin sədri Sədr Məhəmmədi Sədr bu gün öz səlahiyyətini ona vermişdi). Onlar da bizim «Məcməüş-şüəra» ədəbi məclisimiz kimi hər həftə iki-üç saatlığa toplaşıb bir-birlərinə şe'r oxuyur, ədəbi ünsiyyətdə olurlar. Mən və Qurban Cəbrayıl şe'r oxuduq (mən «Uçan adam» və Sərrafa həsr etdiyim bir qəzəlimi, Qurban Cəbrayılsa iki heca vəznli şe'r təqdim etdi). Onun «Qızlar elə gözəldi ki» adlı şe'ri təbrizli qızlar tərəfindən bərk alqışlandı.

Saat 19-da «Bağe-Səba» adlı Parklar və Bağlar İdarəsinə gəldik. Burada Təbriz şəhrdarı (bələdiyyə rəisi) ağaye-Hacipurla görüş olmalıydı.

Fərhud Müqimi adlı bir məmur bizə yaxınlaşıb dedi ki, ağaye- Hacipur televiziya üçün müsahibə verir və görüşümüzə bir neçə dəqiqə gecikəcək. 10-15 dəqiqə də gözlədik. Nəhayət ağaye-Hacipurla görüşdük, şəkil çəkdirdik və ayrıldıq. Sabah onsuz da görüşəcəkdik.

Beləliklə də bu günün görüş və gəzintiləri bitdi. Mehmansaraya qayıtdıq. Yorulmuşduq. Şam yeməyindən sonra hərə öz otağına çəkildi. Saat 21 idi. Səhər saat 9-da Hacı Rza Sərraf konfransının açılış olacaq. Bu fikirlər yeni bir təzmin yazdım:

*Öylə ki, gül çöhrəsindən zülfünü yan eylədi,*
*Aləmi başdan-başa yarım çıraqban eylədi.*

*«Çəkmə zəhmət, dərdimin dərmanı yoxdur, ey təbib,*
*Kim mərizi-eşqə bu aləmdə dərman eylədi?»...*

*Tanrını dərk eyləmək mümkün deyildir adəmə,*
*İrana ad qoydu «iran», şairistan eylədi.*

*Heç həya etmir, utanmır, görməyir Sərraf var?*

*Ortaya Şahin çıxıb qəzəlxan eylədi.* [11]

açılışı mərasiminə yollandıq. Təbrizdə Azərbaycan Respublikasının konsulu vəzifəsini icra edən, hələ mən dekan müavini olarkən Şərqşünaslıq fakültəsində oxuyan, sonra Əfqanıstanda birgə işlədiyim Cavanşir Vəkilov zala daxil olub bizimlə görüşdü. Mən şahidi oldum ki, Təbrizin yüksək rütbəli məmurları və vəzifəli şəxslərinin ona nə qədər böyük ehtiramı var. Yerbəyerdən durub ona yer göstərirdilər. Əlbəttə, onunsa öz yeri vardı.

Quran tilavətindən sonra bu konfransın aparıcısı ağaye-Tahiri iştirakçıları Hafiz Şirazinin bir beyti ilə salamlayıb dedi ki, bu zala çox görkəmli alim, ədib, şair və Sərraf aşiqləri toplaşmışlar ki, biz gərək onlara göz dəyməsin deyə üzərlik yandıraq. O, alqışlardan sonra Sərrafın «etməyim, neylim» rədifli qəzəlini qiraət etdi.

Xitabət kürsüsünə çıxan və iştirakçıları salamlayan d-r Mustafa Quluzadə Sərrafın qiymətini bir daha xatırladı, ağaye-Sobhanallahiyə (onu vacib bir müşavirədə iştirak üçün Tehrana çağırmışdılar) qiyabi olaraq öz təşəkkürünü bildirdi. D-r Quluzadə elan etdi ki, gələn həftənin bu günü Bakıda bu konfransın davamı keçiriləcəkdir. Əlavə edib bildirdi ki, Sərraf konfransı Bakıda üç mərhələdə - Elmlər Akademiyasında, Y azıçılar Birliyində və İranın Mədəniyyət Mərkəzində qeyd olunacaqdır.

D-r M.Quluzadənin çıxışı bitdikdən sonra aparıcı bizim Mirzə Ələkbər Sabirin «Xosrovi-hüsnün, əzizim, sən imişsən tacı» mətləsi ilə başlayan məşhur qəzəlini ifa etdi və bu qəzəl müəllifini bərk təriflədi, ona rəhmət dilədi. Ağaye-Tahiri Cavanşir Vəkilovu da salamladıqdan sonra sözü ostandarın (vali) ictimai işlər üzrə müavini ustad Rəhimiyə verdi. Şərqi Azərbaycan valisinin Tehrana işgüzar bir səfərə təşrif apardığını xatırladan ustad Rəhimi onun adından bir neçə xoş söz söyləyərək, görkəmli Azərbaycan şəxsiyyətlərindən Xiyabani, Səttar xan, Bağır xan, Şəhriyar və başqalarını yad etdi.

Sözü yenə ələ alan ağaye-Tahiri Sərrafın məşhur aşura gecəsi haqqında yazdığı «Güli-gülzari-risalət bu gecə» («Şümrdən istədi möhlət bu gecə») beyti ilə başlayan mərsiyəsini və xanım Siddiqeyi-Tahirənin dilindən İmam Hüseyn əleyhüssalamın kəsik başına müraciətlə söylədiyi «Ey nuri-eynim, mənzil

---

11 mart. Saat doqquzun yarısında «Fərmandariye-şəhre-Təbriz»in konfrans zalına - Hacı Rza Sərraf Təbriziyə həsr olunmuş konfransın

mübarək» («Bikəs Hüseynim, mənzil mübarək») mürəbbesini pərişan-pərişan oxudu. Söz şair Əhməd Xosrovşahiyə verildi. O, «Xətte-səbzin ta enibdir lələxəndan üstünə» misrası ilə başlayan şe'rinin alqışlarından vəcdə gəlib ikinci qəzəlini də ifa etdi:

*«Deməm öz torpağımda şöhrətim, namım, nişanım var».*

İnsafən, yaxşı qəzəllər olsa da bir qədər qəliz dillə qələmə alınmışdı.

Ustad Sərdariniya xitabət kürsüsü arxasında göründü: «Mən çox- çox əvvəllər söz sərrafı Sərraf barədə bir elmi məqalə yazmış və onu çap etdirmişdim. İndi isə ədəbiyyatın uca zirvəsində duran o böyük şair barədə bir neçə kəlmə deməyi özümə borc bilirəm» deyən natiq Sərrafın cəmi 54 il ömür sürdüyünü, astma xəstəliyindən vəfat etdiyini ötəri qeyd etdisə də şairin həyatı və yaradıcılığı barədə ətraflı danışdı, Sərrafın xeyriyyəçilik fəaliyyətini olduqca təriflədi. Şairin bir neçə mədrəsə açdığını da nəzərə çatdıran d-r Sərdarniya onun məşrutə dövrü qəzetlərində tez-tez çıxış etdiyini də bildirdi, məqalələrindən bəhs etdi. «Ustad Sərrafın yaşadığı ev Məqsudiyyə məhəlləsində ədəbi bir ocaq idi. Tezliklə həmin ocaq söndü, çünki Sərraf Təbrizi Məhəmməd peyğəmbərin təvəllüdü günü vəfat etdi» deyən ağaye-Sərdarniya xitabət kürsüsündən endi.

Aparıcı ustad Şəhriyarın «Gözüm aydın, görürəm sevgili qardaşlarımı» misrası ilə sözə başlayıb sözü mənə verdi. Mən konfrans iştirakçılarına Bakı salamı yetirib onlar üçün iki qəzəlimi oxudum («Şahinəm, gözləyirəm doğrusu hər an səfəri» və «Öylə ki, gül çöhrəsindən zülfünü yan eylədi» misraları ilə başlayan qəzəllər).

Söz akad. Bəkir Nəbiyevə verildi. Natiq özünəxas səlis və rəvan nitqi ilə Sərrafın əsərlərinin İranda və Azərbaycan Respublikasında tədqiqindən, onun divanının bu günlərdə Bakıda çap olunmasından, ölkələrimiz arasındakı siyasi, elmi və ədəbi münasibətlərin yüksək səviyyəsindən, şairin «Ey milləti-islam, oyan, vəqti-səhərdir» mətləli şe'rinin bədii dəyərindən, onun sevgi-məhəbbət şairi kimi sevilməsindən, qəsidə və mərsiyələrinin məziyyətindən, Sərrafın Füzulidən bəhrələnməsindən və başqa üstün cəhətlərindən ətraflı danışdı.

Aparıcı ağaye-Tahiri növbəti çıxışçının Ərdəbildən gələn Əsğər Şahi olduğunu bildirəndə çox sevindim. Bakıda dəfələrlə «Məcməüş-şüəra» ədəbi

məclisinin iclaslarına təşrif gətirən dostum Əsğər Şahi. O balaca boylu böyük kişi. Gözəl şair və tədqiqatçı. Ərdəbilli Şahi son bir ildə Bakıya o qədər gəlib-getdi ki, mən onun bu uzunluqda yolda çəkdiyi yorğunluğuna sanki qıymayaraq bir qit'ə şe'r yazdım:

*Şahi gəlibdir deyə bir daha Şirvanıma*
*Sinədəki mən kəsin ahi gedibdir yenə.*

*Şahini evləndirək, qoy deməsinlər daha*
*«Şahi gəlibdir yenə, Şahi gedibdir yenə».*

Doğrusu, mən və məclis üzvlərimiz Şahi qardaşımızın Bakıya gəlişinə həmişə sevinmişik. Y adıma onun Bakıya bir neçə günlük növbəti bir səfərindən sonra yenə Ərdəbilə qayıtması düşmüş və o vaxt bu münasibətlə zarafatyana bir beyt də demişdim:

*Bir də gər qoysa yaxın Şahi hicr bədxahi,*
*Şahina, onda gərək ya mən ölüm, ya Şahi!*

Bəli, indi mən gəlmişəm İrana. İndi mən Şahi qardaşımın qonağıyam. Yəqin ki, Təbrizdə olduğum günlərdə vaxt tapıb onunla görüşəcəyəm.

Əsğər Şahi çıxışının ortasında üzünü mənə tutub salamladı və Bakıdakı görüşlərindən, habelə «Məcməüş-şüəra» məclisimizdən bir neçə kəlmə danışmağı unutmadı, bir neçə şe'r dedi, sondasa irfani bir qəzəlini nəzərə çatdıraraq «Bir Araz gətir // məndə yu məni» misrası ilə qurtaran şe'rini yüksək pafosla ifa etdi, xitabət kürsüsündən enib yanıma gələrək mənimlə görüşdü.

Şair Şahidən sonra şair Şeyda xitabət kürsüsündə göründü. Şeyda! Yəhya Şeyda! Tehranda keçirilən bir elmi konfransda tanış olduğum şair və tədqiqatçı Yəhya Şeyda. O, Seyid Əzimi və Sabiri çox sevir və onların şe'rlərini əzbər deməyi xoşlayır. Yəhya Şeyda mən gördüyüm adamdan fərqlənirdi. Çox qocalmışdı. Dedilər ki, xanımının vəfatı onu bu hala salıb.

«Gözəlliklər yaradan gözəl Allahın adı ilə» deyib sözə başlayan
Yəhya Şeyda ustad Hacı Rza Sərraf Təbrizinin yazdığı qəzəllərin «yer şe'rləri», Məhəmməd Füzuli qəzəllərininsə «asiman şe'rləri» olduğunu

vurğuladı, o da akad Bəkir Nəbiyevin dediyi kimi ustad Sərrafın ustad Füzulidən geniş bəhrələndiyini xüsusən qeyd etdi. Natiq «Sərraf 54 il üzü ağ, başı uca yaşadı» deyərək çıxışına yekun vurdu.

Marağalı şair Rza Paşazadə kürsüdə göründü. Sərraf barədə danışan ağaye-Paşazadə 8 cild əsərlər müəllifi olan Molla Hüseyn Dəxil Marağayidən də söz deməyi unutmadı. Bəli Marağanın və Marağa şairlərinin fəxr etdikləri klassik söz ustadı Dəxil Marağayi. Ustadlar ölməzdirlər!

Mən sonrakı görüşümüz zamanı Rza Paşazadədən öyrəndim ki, o, bizim şeyxülislamımız Hacı Allaşükür Paşazadənin əmisi oğludur və Bakıda 18 dəfə olmuşdur.

D-r Davud Rzayi yarı farsca, yarı türkcə, yarı ərəbcə, yarı ingiliscə danışaraq (o, sanki öz biliyini nümayiş etdirirdi) Sərraf şe'rinin bədii xüsusiyyətlərini nəzərə çatdırdı, Sərrafın poetika dəryasına baş vurdu.

Höccətül-islam və-l müslimin Rəsuli xitabət kürsüsünə qalxdı. Çıxışına «bismillahir-rəhmanir-rəhimlə» başlayan höccətül-islam (doğrusu, buradakı çıxışçıların elə hamısı sözə bismillahla başlayırlar) qəzəl və növhə ustadı Sərrafa həsr etdiyi bir qəzəlini (farsca) bizə çatdırdı.

Beləliklə, konfransın birinci hissəsi bitdi. Fürsətdən istifadə edən bir jurnalist məndən Təbriz televiziyası üçün 20 dəqiqəlik bir müsahibə aldı. Sonra məşhur «Elgölü»nə getdik. Bizə Təbriz Bələdiyyə rəisi ağaye- Hacipur ziyafət verir.

Ziyafət zamanı bizim mərhum Hacı Mailin Təbrizli dostu Məhəmməd Abidi yanıma gəldi. Hal-əhvallaşdıq və Hacı Maili xatırladıq. Söz verdi ki, Bakıda Hacı Mailin 70 illik yubileyi münasibətilə hazırlanan kitab üçün tezliklə məqalə göndərəcək. Söhbətimizə ağaye- Herisi də qoşulub Mail barədə məftunluqla danışdı.

«Elgölü» donmuşdu. Amma, hava o qədər də soyuq deyildi. Görünür gecə düşən şaxta bu gölün hələ ərimısinə imkan vermir. Bir aydan sonrasa onun ətrafı böyük seyrangaha çevriləcək və bura təbriz- lilərin istirahət guşəsinə dönəcəkdir (mən burada yayda da olmuşam).

Saat 16-da konfransın ikinci hissəsi başladı.

Əbu Taleb Allahyari: «Hacı Rza Sərraf öz yaradıcılığında sənaye və bədayedən məharətlə istifadə etmiş, səhle-momtəne, təmsil, məcaz, cinas, iştiqaq, təzad, təlmih, tərsi, təşxis, intaqlar yaradaraq şe'rlərinin bədii dəyərini

artırmışdır».

Ondan sonra aparıcı ağaye-Tahiri bizim Qurban Cəbrayılı çıxışa də’vət etdi. Şair «Əsir qız», «Təbrizin payız lövhəsi», «Tənhalıq» və «On beş yaşın məhəbbəti» adlı şe’rlərini oxudu və xeyli alqışlandı.

Qurban Cəbrayılın heca vəznli şe’rlərindən xoşlanan ağaye-Tahiri Kərim Məşrutəçidən bir şe’r dedi:

*«İlk yarpaq qopmuşdu budaqdan səhər,*
*Yellənə-yellənə yerə düşürdü»...*

Şair Nazir Şərəfxanı xitabət kürsüsünə qalxmadan elə öz yerindən ilk bəndi

*«Söylə görüm, kimsən gözəl,*
*Günəşimsən, ayımsanmı?*
*Ürəyimin çırpıntısı,*
*Sinəmdəki hayımsanmı?»*

olan uzun bir heca şe’rini ifa etdi.

Sonra Hacı Rza Sərraf Təbrizi «Divan»ının Bakı tədqiqatçısı Özbək Nadirov səhnədə göründü. O, çıxışının əvvəlində İran tədqiqatçıları Səməd Sərdarniya və Yəhya Şeydaya, akad. Bəkir Nəbiyevə, Ədəbiyyat İnstitutu Müdafiə Şurasının Elmi katibi İmamverdi Həmidova, prof. Qəzənfər Paşayevə özünün Hacı Rza Sərraf «Divan»ı üzərində işlərkən ona göstərdikləri köməyə görə təşəkkür etdi, Sərraf şe’rlərinin dilindən, dilin xəlqiliyindən söz açdı, şairin klassik Azərbaycan şairlərindən bəhrələndiyini, ədəbi janrlardan (qoşma, rübai, gəraylı və s.) böyük məharətlə istifadə etdiyini vurğuladı. «Sərraf Azərbaycan ədəbiyyatı tarixinə düşdü» deyərək «istəmədiyin halda danışmaq istəyirsən» deyib çıxışını yekunlaşdırmağa cəhd etsə də, şairin barələrində az danışılan iki şe’rindən söz açdı (birinci şe’r 5 yaşlı qızının ölümünə, ikincisi isə özünə həsr olunmuşdu).

Aparıcı yenə Seyid Əzimdən məşhur bir şe’r dedi:

*«Guş qıl, ey ki sanırsan özünü vaqifi-каг»...*

Bu şe’rdə «ləhni-Davudi» («Davud avazı») ifadəsinin olduğunu xatırladan ağaye-Tahiri sözü hal-hazırda «ləhni-Davudi» səsi olan Behruzi adlı bir ifaçıya verdi. Ağaye-Behruzi əvvəlcə farsca «Əbu Əta»mayəsində bir muğam ifa elədi. Onun ləhni həqiqətən də ecazkaranə idi. O, sonra isə Məhəmməd Füzulinin «Leyli və Məcnun» poemasından Məcnunun Leyliyə xitabən dediyi məşhur qəzəlini oxudu:

*«Eşq dərdi, ey müalic, qabili-dərman deyil,*
*Cövhərindən eyləmək cismi cüda asan deyil».*

Naxçıvanlı şair Hüseyn Razidən «Bir yana» rədifli bir şe’ri qiraət edən aparıcı sözü İmamverdi Həmidova verdi. Natiq dedi: «Mənim məqaləm «Sərraf qəzəllərində sənətkarlıq məsələləri» adlanır. Şairin irfani şe’rləri ulu Allaha, onun rəsulu Məhəmməd peyğəmbərə, imam Əliyə ünvanlanmışdır ki, bu da irfan şairi olan Sərrafın müqəddəslərə münasibətini ifadə edir. Quran ayələrinə tez-tez işarələr (təlmihlər) edən Sərraf klassik Azərbaycan şairlərindən Həsənoğlu və Füzuliyə də öz yaradıcılığında istinad etmişdir ki, bununla da onun mütaliə dairəsinin genişliyi sübuta yetir».

Söz Urmiyə şəhərindən gələn şair Bəhram Əsədiyə verildi və vaxtın darlığına görə ondan bircə şe’r oxuması xahiş olundu. Lakin, ağaye- Əsədi dedi ki, mənim şe’r oxumaq niyyətim olmadığı üçün mən fəqət Hacı Rza Sərrafın məcaz və həqiqət barədəki şe’rlərindən müxtəsər söz açacağam və sizin vaxtınızı çox almayacağam.

Hafiz Abıyev çıxışına belə başladı:

«Mən hələ on yaşım olanda «Dur ey dəvalar aslanı Əbülfəzlim, Ələmdarım // Axan su tək qızıl qanı Əbülfəzlim, Ələmdarım» mətləli bir qəsidə eşitmişdim, lakin o zaman bilmirdim ki, o şe’r Hacı Rza Sərraf Təbrizinindir». H.Abıyev Sərrafın klassik Azərbaycan şairləri Nəbati və Racidən də ilhamlandığını xüsusilə qeyd etdikdən sonra Hafiz Şirazinin «Əgər an torke-şirazi be dəst arəd dele ma-ra // Be xale-hinduyəş bəxşəm Səmərqənd-o Boxara-ra» mətləli məşhur qəzəlinin lap elə bu günlərdə özü tərəfindən edilən tərcüməsini nəzərə çatdırdı:

*«Əgər ol türki-şirazi mənə lütf etsə pünhani,*

*Qara xalinə mən verrəm Səmərqəndü Buxaram»...*

Şair Şəbxiz Sərrafın bir qəzəlinə yazdığı təxmisini oxudu.

Mirzə Rəsul İsmayılzadə bu konfransda iştirak edən alim və şairləri salamlayaraq Sərraf tədbirlərinin Bakıda da keçiriləcəyini bir daha bildirdi, indi Sərrafın səsinin Dağıstandan, Türkiyədən, Naxçıvandan gəldiyini vurğuladı və «sərraf insanlar Sərrafa böyük diqqət yetirirlər» dedi. O, sonra bizim adlarımızı bir-bir çəkərək öz təşəkkür və minnətdarlığını bildirdi.

Şair Xələfnejad Sami ustad Sərrafın «Degilsən baxəbər, ey nazənin yarım, əgər məndən, // Verir hər bir səri-muyin nədəndir bəs xəbər məndən?» mətləli qəzəlinə yazdığı təxmisi konfrans iştirakçılarına təqdim etdi.

D-r Mustafa Quluzadə bütün iştirakçılara öz təşəkkürünü izhar etdikdən sonra ostandar Sübhanallahiyə, şəhrdar Hacipura və başqa əlaqədar şəxslərə də öz minnətdarlığını bildirməyi unutmadı. O, bütün çıxışçılara «İslam Cümhuriyyəti sikkəsi»nin təqdim olunacağını bildirdikdən sonra bir neçə natiqi həmin sikkələrlə mükafatlandırdı, onlara Təbriz şəhrdarı Hacipur, Təbriz İslam Şurasının rəisi d-r Hüseynzadə Delirvə özü tərəfindən imzalanmış fəxri fərmanlar təqdim etdi.

Sonda Təbriz Bələdiyyə rəisi ağaye-Hacipur çıxış edərək gələcəkdə keçiriləcək konfranslarda bizi bir də görməklə şad olacağını bildirdi.

Konfrans bitdikdən sonra məni Təbriz radiosuna müsahibə verməyə də’vət etdilər. Diktor Əbülfəz Əlayi ilə etdiyim söhbət bir saatadək davam etdi. Müsahibə zamanı bayaq adını çəkdiyim Səməd Sərdarniyanın oğlu Aydın Sərdarniya və yazıçı-karikaturist Mehdi Nəlbəndi ilə də tanış oldum. M.Nəlbəndi özünün «Bakı-2001» adlanan səfərnaməsini mənə bağışladı.

Axşam mehmansarayda Sərraf konfransında çıxışlarımıza görə Özbək Nadirova, Hafiz Abıyevə, Qurban Cəbrayıla və mənə də sikkə və fəxri fərman təqdim etdilər (akad. Bəkir Nəbiyev və filologiya elmləri namizədi İmamverdi Bağırova həmin mükafatlar konfransın qapanışında təqdim olunmuşdu). Gecə bu Qit’əni yazdım:

Təbriz şəhrdarı ağaye-Hacipura!

*Bir də gəldim yanına, ey ulu Təbriz, sənin,*

*Şahini bir də çağır varsa əgər insafın...*

*Şəhrdar sikkə veribdir mənə, şadəm, amma*
*Ən bəha sikkə isə divanıdır Sərrafın!!!*

3 mart. Səhər saat 10-da Təbrizdəki Azərbaycan Respublikası Konsulluğuna gəldik. Bizi Cavanşir Vəkilov şəxsən də'vət etmişdi. O, məlumat verib dedi ki, 1920-ci ildə burada bizim konsulluğumuz fəaliyyət göstərmişdi. Şadam ki, 84 il keçəndən sonra yenə də bizim Təbrizdə Konsulluq idarəmiz fəaliyyətdədir.

Cavanşirlə görüşümüz çox səmimi keçdi, o, bizi gördüyü işlərlə tanış etdi, görəcəyi işlərdən danışdı.

Görüşdən sonra mən Şahin Mustafayevlə may ayında Təbriz Universitetində keçiriləcək Elxanilər dövrünə həsr olunan elmi konfransda iştirakımızla əlaqədar öz tezis və məqalələrimizi verməkdən ötrü univerisitetin konfrans katibliyinə (ədbirxanə) getdik, məsul katib Məhəmməd Rza Kərimi ilə tanış olduq.

Nahar fasiləsindən sonra bu təzmini yazdım:

*«Hər kimsə bəla navəkini canə yetirdi,*
*Guya özünü çeşməyi-heyvanə yetirdi».*

*Bildim ki, sevirmiş məni Allah-təala,*
*Dürr arizu etdim, mənə dürdanə yetirdi...*
*Sidq ilə edən vəslə ümid yetdi vüsalə,*
*Şəkk eyləyəni talei hicranə yetirdi.*

*Sərraf kimi mötəbər insanı edib yad Şahin bu*
*kiçik şe'rini İranə yetirdi.*

Saat 19-da «Azərpəyam» qəzetinin baş redaktoru Əyyub Nəsiri və «Bonyade-fərhənge-Tuba» («Tuba Mədəniyyət Fondu») adlanan müəssisənin rəisi Seyid Qasim Nazeminin də'vəti ilə mən və Qurban cəbrayıl həmin Fondun yerləşdiyi binaya tərəf yollandıq. Qurban Cəbrayıl ustad Şəhriyarın da dəfn olunduğu «Məqbərətüş-şüəra»nı («Şairlər məqbərəsi») hələ görməmişdi.

Onun xahişi ilə məqbərənin ziyarətinə gəldik. Artıq gec olduğu üçün işçiləri yerlərində görmədik. Mən Qurbana məqbərə önündə əvvəllər gördüyüm Xaqani və Nizaminin büstlərini göstərmək istədim. Xaqaninin büstü yerindəydi, amma Nizami yox idi. Təəccüblənib Seyid Qasimdən bunun səbəbini soruşdum. Elə o da təəccüb içərisindəydi... Fonda söhbətimizi qurtardıqdan sonra mehman- saraya qayıdıb yeni bir şe’r yazası oldum. Hörmətli oxuculara deməliyəm ki, mən mövzunu yox, mövzu məni tapır. «Məqbərətüş-şüəra» qabağında Nizaminin büstünün olmaması məgər mövzu deyildimi? Beləliklə bu İran səfərim zamanı yazdığım şe’rlərin on ikincisi yarandı:

Nizaminin büstü

*Təbriz!*
*«Məqbərətüş-şüəra», yəni «Şairlər məqbərəsi» -*
*Xaqani, Müciráddin, Beyləqani, Qətran Təbrizi!*
*Şahdağ boydadır hərəsi!*

«Məqbərətüş-şüəra» ziyarətindən qayıdıb Tuba Mədəniyyət Fonduna gəldik. Orada Mehdi Nəlbəndini gördüm. «Azərpəyam» qəzetinin müxbiri Rza Şeybani də buradaydı. Onlara geniş müsahibə verdik. Suallar növbə ilə gah mənə, gah da Qurban Cəbrayıla verilirdi.
Müsahibə zamanı şe’r oxumağımı xahiş etdilər. On birinci səfərim zamanı Tehranda qələmə aldığım «Şahin öz-özünü güllələyəcək» adlı heca şe’rimi və bu gün sübh tezdən yazdığım bir qəzəl-təzminimi onlara təqdim etdim. Qəzəlim belə idi:

*«Gözüm yaşın könül qanilə mərcan etməyim, neylim?*
*Bu ağ dürri şəbihi-ləli-canan etməyim, neylim?»*

*«Mənəm xaqan» deyib üç-dörd qəzəl inşa edənlər var,*
*Neçə «xaqan»lara Sərrafı xaqan etməyim, neylim?..*

*Anıb Seyyidi, Sərrafı, salıb yadə çox ustadı,*
*Boğub qəlbimdə fəryadı pərişan etməyim, neylim?*

*Deyirlər Şahinə hərdən nə çox divan yazırsan sən?*
*Mənəm hər gün yazan şe'ri ki, divan etməyim, neylim?*

Biz mehmansaraya qayıdanda saat 23 idi. Sədr Məhəmməd Sədr foyedə kresloda əyləşib bizim gəlməyimizi gözləyirdi. Mənə özünün bir neçə şe'rini oxudu. Qəzəlləri könlümcə oldu. Əsasən təmiz türk sözləri ilə yazır. Məsələn:

*«Sənsiz ürəyim qəmlə dodaqlanmadadır, gəl,*
*Qəmli ürəyim gözdə bulaqlanmadadır, gəl».*

Sədr Məhəmmədi Sədrlə xudahafizləşib sabah görüşmək üçün bu gün ayrıldım. 3-cü qatdakı otağıma qalxıb qeyd dəftərçəmi götürdüm. Sədr Məhəmmədinin sadə dillə yazdığı şe'rlərdən ilhamlanmışdım. Sərrafın bir qəzəlinə təzə bir təzmin yazdım. Gecə saat bir idi:

*«Təaləllah, nə arizdür, belə hüsnü cəmal olmaz,*
*Belə qaşü gözü rəngü rüx olmaz, xəttü xal olmaz»*...

*Yazanlar var ki, hər şe'rin qəliz yazmaqdadır, Şahin,*
*Yazan Sərraf tək yazsa gər asan, qilü qall olmaz.*

4 mart. Sübh hələ hava qaranlıq ikən saat 4-də 3 maşınla Təbrizdən çıxıb Astara səmtinə yola düşdük. Sədr Məhəmmədi Sədr yenə bizi müşayiət edirdi. Ona zəhmət vermək istəməməyimizə baxmayaraq dedi: «Sizi sərhədədək yola salmalıyam».

Sərab şəhəri arxada qaldı. Hava artıq ağarmışdı. Ərdəbilə çatdıq. Şeyx Səli məqbərəsinin yanından keçdik. Heyran aşırımı. İndi sağda dağ, solda dərə. Dərə boş deyildi, buludla doluydu. Buludlar bizdən aşağı, maşınlarımız buludlardan yuxarı idi. Sanki təyyarədəydik. Ərdəbil-Astara yolu. Elə maşındaca bir təzmin yarandı:

*«Naz ilə yarım yenə əzmi-gülüstan eyləmiş,*
*Gül yüzinə sünbüli-zülfün pərişan eyləmiş».*

*İstəsən yazmaq əgər Sərraf tək yaz, yoxsa yox!*
*Şahinə ilham pərisi böylə fərman eyləmiş!*

Günorta üstü gəlib İran Astarasına yetişdik. Gömrük məntəqəsinin yanında bizi ötürən dostlarla xudahafizləşdik. Sədr Məhəmmədi Sədrin gözləri bugünkü hava kimi çiskinliydi.

Qarşıda Bakı görüşləri durur. Yaşasın Hacı Rza Sərraf Təbrizi!

Astara-Bakı yolu. Ustad Sərrafın ustadanə yazdığı bir qəzəlinin mətlə beyti yadımdan çıxmır. Azacıq fikirdən sonra yenə dizimin üstündə dəftər, əlimdə isə qələm gördüm. Yeni qəzəl-təzmin yarandı:

*«Məşuqədə çün işvəvü naz olmasa olmaz,*
*Aşiqdə odur iczü niyaz olmasa olmaz»*[1]*...*

*Qış fəslinin ömrün başa çatdırmada Şahin,*
*Cənnətdə dübarə ona yaz olmasa olmaz.*

28 fevral - 8 mart 2005, Бакы-ТэЬги-Бакы

**On ikinci Səfərnamə Şe'rləri**



[1] Beyt Hacı Rza Sərraf Təbrizinindir.

*I*
*QƏZƏL*

*Şahinəm, gözləyirəm doğrusu hər an səfəri,*
*Gəh vüsal əzmi müyəssər, gəhi hicran səfəri.*

*Səfər ilən səfərin fərqi böyükdür məncə,*
*Kimə quldur, kimə qul, kimsəyə sultan səfəri.*

*Sən'amn qisməti Gürcüstana olmaq sakin,*
*Məcnunun qisməti olmuş Ərəbistan səfəri.*

*Бisütun çəkdisə Fərhadı dəmadəm özünə,*
*Cəzb edib Sindbadı şövq ilə ümman səfəri.*

*Məni Kirman, məni Kaşan və Nişapur çəkdi,*
*«Gəl» dedi Ənzəlisi, «can» dedi Zəncan səfəri.*

*Şəhriyar eşqi ilə Təbrizə getdim neçə yol,*
*Neçə yol çəkdi məni yanına Tehran səfəri.*

*İndisə eşqi dolubdur canıma Sərrafın,*
*Şahinə qismət olubdur yenə İran səfəri.*

*24.02.2005 (səfərdən 4*
*gün əvvəl)*

*II*
*QƏZƏL*

*Ruhi, yarəb, sevinə, şad ola Sərrafımızın,*
*Qəbri nur ilə, işıqla dola Sərrafımızın.*

*Tazəvü tər görünür söz gülü, söz bağında,*
*Gülü, zənn eyləmirəm mən, sola Sərrafımızın.*

*İstiqamət ona düz getmək olub, düz getmiş,*
*Qonmamışdır nəzəri sağ-sola Sərrafımızın.*

*Mən yemək istəyirəm hər qəzəlin, şirindir,*
*Sözləri sanki qarışmış bala Sərrafımızın.*

*Qorxuram ki, yıxılam indi, tutun, çünki sözü*
*Məni salmış yenə haldan-hala Sərrafımızın.*

*Şerinin ətri sərasər yayılıb Təbrizə,*
*Бakıya, Бağdada, İstanbula Sərrafımızın.*

*Təb'inin zərrəsini Şahinə versin Sərraf,*
*Бŭ qulam, rəhmi gələ qoy qula Sərrafımızın.*

*25.02.2005 (səfərdən*
*3 gün əvvəl)*

*III*
*Hələlik cavabsız suallar*

*26 fevral. Xocalı soyqırımının anım günü.*

*Xocalının*
*xocası vardı,*
*cavanı*
*vardı,*
*qocası*
*vardı,*
*hanı bəs?*

*Xocalının*
*evi vardı,*
*daşı vardı,*
*damı vardı,*
*adamı vardı,*
*hanı bəs?*

*Xocalının*
*hasarı vardı, barısı vardı,*
*qocası vardı, qarısı vardı,*
*düşmənini sancmağa,*
*dostuna bal verməyə*
*arısı vardı,*
*hanı bəs?*

*Xocalının*
*bəyi vardı, gəlini vardı,*
*gedəni, gələni vardı,*
*doğulanı, öləni vardı,*
*hanı bəs?*

*Xocalının*

*tərəvəzi vardı, tənəyi vardı,*
*əkənəyi vardı, biçənəyi vardı,*
*buzovu vardı, inəyi vardı,*
*ham bəs?*

*Xocalının*
*qoyunu vardı, quzusu*
*vardı, bərəkəti, ruzusu*
*vardı,*
*hanı bəs?*

*Xocalının*
*daha nəyi vardı?*
*Düşmən başına endirməyə*
*dəyənəyi vardı,*
*hanı bəs?*

*Xocalının*
*həmişə oyaq bildiyim,*
*özümə dayaq bildiyim*
*Təbrizi vardı,*
*Tehranı vardı,*
*İranı vardı,*
*hanı bəs?*

*...Biri yoxdu, biri vardı,*
*Xocalının*
*yeri vardı,*
*oğlu, qızı vardı,*
*sazı, sözü*
*vardı,*
*Özü vardı,*
*hanı bəs,*
*hanı bəs,*
*hanı*

*IV*
*QƏZƏL-TƏZMİN*

*Kim söyləsə ki, eyşü səfa dövlət iləndir,*
*Bilsin bunu ki, dövlət isə qismət iləndir.*

*«Hər kimsə ola rabiteyi-şe'rdə rəbti Anlar*
*bu qəzəl qaideyi-hikmət iləndir»*[1]*.*

*Dərdi, kədəri, həsrəti sevdi neçə şair,*
*Cəngimsə mənim dərd, kədər, həsrət iləndir.*

*Ustadların qiymətinə çox həvəs etdim,*
*Əlbəttə ki, şagird həvəsi qiymət iləndir.*

*Sərf eyləmişəm ömrümü qiymətli nigarə,*
*Sərrafın işi gövhər ilən, sərvət iləndir.*

*Ey Həqq, cavanlıqda əziyyətdən uzaqdım,*
*İndi qocayam, indi işim külfət iləndir.*

*Amma, yenə, ey saqi, sənin eşqinə bəndəm,*
*Görmək o gözəl surətini fürsət iləndir.*

*Şərbət dilin ilə məni dindir yenə şirin,*
*Tutinin işi, bilməlisən, şərbət iləndir.*

*Üç divanı inşa eləyib sə'y ilə Şahin,*
Divan ki *yazıbdır, nə qədər zəhmət iləndir!..*

*26.02.2005 (səfərdən 2 gün əvvəl)*

*V*
*QƏZƏL-TƏZMİN*

*Öylə ki, söhbət dolandı-gəldi canan üstünə,*

[1] *Beyt Hacı Rza Sərraf Təbrizinindir.*

*Sanki loğmanım məni göndərdi loğman üstünə.*

*Gül dodaqdan şipşirin sözlər dedikcə dilbərim,*
*Tutiyəm, fikrim qonubdur şəkkəristan üstünə.*

*«Dilbəra, xəttün çıxıb? Ya, fitnə bərpa etməgə*
*Ləşkəri-Çingiz olub amadə İran üstünə?»*[1].

*Sevgi üçün xəlq olub Yer Kürrəsi, şükr etməyir*
*Naşükürlər qaldırır insanı insan üstünə.*

*Açmasa güllər, çiçəklər bağ-bağatlar məhv olar,*
*Diqqəti bülbüllərin qonmaz gülüstan üstünə.*

*Əğyarı seyr eylədikcə gözlərim, zənn eylərəm*
*Sanki bir qəssabdır, gəlməkdə qurban üstünə.*

*Şahına, Sərraf olub sərf eylə ömrü sən'ətə,*
*Yığ yazıb ömrün boyu divanı divan üstünə.*

*27.02.2005 (*
*səfərdən bir gün əvvəl)*

[1] *Beyt Hacı Rza Sərr*

*VI*
*DÜNYA*

*«Dünya sizi aldatmasın»*
*İmam Hüseyn*

*Hər an gəzir, yaman gəzir,*
*Dünya sizi aldatmasın.*
*Şahiddir asiman, gəzir,*
*Dünya sizi aldatmasın.*

*Hərdən coşur, hərdən əsir,*
*Kimsə bilmir onda nə sirr,*
*Gəzəyən qadın kimidir,*
*Dünya sizi aldatmasın.*

*Din uğrunda əsən hanı?*
*Haqsız kəsi kəsən hanı?*
*Hüseyn hanı, Həsən hanı?*
*Dünya sizi aldatmasın.*

*Gərdişini saya-saya*
*İşığını qoy Gün yaya...*
*Bənd olmayın bu dünyaya,*
*Dünya sizi aldatmasın.*

*Yer, Göy Rəbbin varı kimi!*
*Yer Göydə bir darı kimi!*
*Küpəgirən qarı kimi Dünya*
*sizi aldatmasın.*

*Sözüm açıq, deyil gizli,*
*Sərvaxt olaq sizli-bizli,*
*Ey Bakılı, ey Təbrizli,*
*Dünya sizi aldatmasın.*

*Müvəqqəti güzrərgahdır,*
*Kimi gəda, kimi şahdır,*
*Əbədi təkcə Allahdır,*
*Dünya sizi aldatmasın.*

*Ərimәyən qar görmədim,*
*Yox olmayan var görmədim,*
*Partlamayan şar görmədim,*
*Dünya sizi aldatmasın.*

*Şahin Fazil çox qəm dadıb,*
*Sitəm görüb, ələm dadıb,*
*Dünya onu çox aldadıb,*
*Dünya sizi aldatmasın,*
*Dünya bizi aldatmasın.*

*28.02.2005 (səfər*
*günü)Təbriz*

*VII*
*QƏZƏL*

*İsmayılzadə Rəsul söylədi «gəl Təbrizə»,*
*Gəlməyim mən nə təhər bəs bu gözəl Təbrizə?*

*Çağıran olsa məni yollanaram düz Herata,*
*Bağdada həm gedərəm, amma əzəl Təbrizə.*

*Çaxaram başına söz gülləsini əğyarın,*
*Gər desə «Kəbəyə get, qoyma mahal Təbrizə».*

*Bakıya çox qəzəlim var, yazıram indi isə Ulu*
*Sərrafı anıb türfə qəzəl Təbrizə.*

*Çağırır gül gülü, bülbül gülü, gül bülbülü, bəh,*
*Yaraşır böylə məhəbbətli məsəl Təbrizə.*

*Düşməni səsləməsin gülşənə təbrizlilərim,*
*Bir gəlindir bəzənib, dəyməyə əl Təbrizə.*

*Şahinin var Yaradandan diləyi: Ey Rəbbim,*
*Allahım, qoyma yaxın gəlsin əcəl Təbrizə.*

*28.02.2005*
*Təbriz*

## *VIII*
## *QƏZƏL-TƏZMİN*

*Öylə ki, gül çöhrəsindən zülfünü yan eylədi,*
*Aləmi başdan-başa yarım çıraqban eylədi.*

*«Çəkmə zəhmət, dərdimin dərmanı yoxdur, ey təbib,*
*Kim mərizi-eşqə bu aləmdə dərman eylədi?»*[1].

*As qulaq tə'limimə şövq ilə, ey tərsa qızı,*
*Tə'limim çox namüsəlmanı müsəlman eylədi.*

*Zahida, Məcnunə rişxənd eyləmə, hirsim tutar,*
*Söyləmə «başdan xarabdır, canı qurban eylədi».*

*Bir də sən aşiqlərə qarşı bu cür sözlər desən Bir də*
*gördün asi könlüm əsdi, üsyan eylədi.*

*Cinsifətlər, minsifətlər var ki, gözdən düşdülər,*
*Hər nə etdi insana, əlbət ki, şeytan eylədi.*

*Tanrını dərk eyləmək, mümkün deyildir adəmə, İrana*
*ad qoydu «İran», şairistan eylədi.*

*Heç həya etmir, utanmır, görməyir Sərraf var?* -
*Ortaya Şahin çıxıb ismin qəzəlxan eylədi.*

*1.03.2005*
*Təbriz*

[1] *Beyt Hacı Rza Sər*

*IX*
*QİTƏ*

*Təbriz meri (şəhrdarı)*
*cənab Hacipura!*

*Bir də gəldim yanına, ey ulu Təbriz, sənin,*
*Şahini bir də çağır varsa əgər insafın.*

*Saf adamlar bürüyüb burda bizim dövrəmizi,*
*Sevirəm «saf» sözünü, vurğunuyam mən «saf»ın.*

*Şəhrdar sikkə veribdir mənə, şadəm, amma*
*Ən baha sikkə isə divanıdır Sərrafın!!!*[1]

*2.03.2005*
*Təbriz şəhəri*

[1] *iranda qızıl sikkə ilə mükafatlandırıldım.*

*3.03.2005*
*Təbriz şəhəri*
[1] *Beyt Hacı Rza Sərr*

## *QƏZƏL-TƏZMİN*

*«Hər kimsə bəla navəkini canə yetirdi,*
*Guya özünü çeşməyi-heyvanə yetirdi»*[1].

*Bağbanlıq edib mən elə təcrübə qazandım,*
*Tale, gülümü mən təki bağbanə yetirdi.*

*Bildim ki, sevirmiş məni Allah-taala,*
*Dürr arizu etdim, mənə dürdanə yetirdi.*

*Meylim var idi, amma görünmürdü bir imkan,*
*Şadəm ki, həzin meylimi imkanə yetirdi.*

*Gürcüstana getdi Ərəbistanı edib tərk,*
*Sən 'an özünü sevdiyi cananə yetirdi.*

*Sidq ilə edən vəslə ümid yetdi vüsalə,*
*Şəkk eyləyəni taleyi hicranə yetirdi.*

*Sərraf kimi mötəbər insanı edib yad Şahin bu*
*kiçik şe'rini İranə yetirdi.*

*XI*
*Nizaminin büstü*

*Təbriz!*
*«Məqbərətüş-şüəra», yəni «Şairlər*
*məqbərəsi» - burada dəfn olunub*
*Əfzələddin Xaqani,*
*Müciräddin Beyləqani,*
*Qətran Təbrizi!..*
*Şahdağ boydadır hərəsi!*
*Xaqaninin büstü yerindəydi,*
*Nizami yox idi, büstü yox idi, büstün*
*altlığı vardı, üstü yox idi.*
*Seyid Qasimdən soruşdum səbəbini,*
*bilmədi,*
*«Yəqin tə'mirə aparıblar» dedi.*
*Yəqin ki, kim isə bilir, bilir səbəbini*
*bunun.*
*Ey səbəb bilən,*
*hanı büstü*
*Gəncəli Nizami Yusif oğlunun?*
*Büstün altlığı var, hanı bəs üstü?*
*Məzarı Gəncədə,*

*3.03.2005*
*Təbriz şəhəri*
[1] *Beyt Hacı Rza Sərr*

*heykəli Bakıda, büstü*
*Təbrizdə.*
*Məzar durur, heykəl durur,*
*Altlıq durur,*
*amma,*
*boşdur altlığın üstü, hanı*
*bəs büstü?*
*Nizami elə şairdir ki, elə*
*öldüyü gün də dirildi,*
*Bəs hanı Təbrizdəki büstü?*
*Seyid Qasimdən soruşdum,*
*bilmədi.*
*Nə sirr?*
*Xaqaninin büstü yerindədir.*

*3.03.2005*
*Təbriz şəhəri*

***XIII***
***QƏZƏL-TƏZMİN***
Şahin Fazil

*«Gözüm yaşin könül qaniylə mərcan etməyim, neylim?*
*Bu ağ dürri şəbihi-lə'li-canan etməyim, neylim?»*[1].

*«Mənəm xaqan» deyib üç-dörd qəzəl inşa edənlər var,*
*Neçə «xaqan»lara Sərrafi xaqan etməyim, neylim?*

*İşim yoxdur ləvənd ilə, cahanda xudpəsənd ilə,*
*Tutub namərdi fənd ilə ciyərqan etməyim, neylim?*

*Ömür çoxdan olub yarı, yağıb başə yaşın qarı,*
*Çəkib ülgüc və əğyarı müsəlman etməyim, neylim?*

*Peşiman olsa gər bir gün rəzil qonşum Qərabağda,*
*Peşimanı peşimandan peşiman etməyim, neylim?*

*Anıb Seyyidi, Sərrafi, salıb yadə çox ustadı,*
*Boğub qəlbimdə fəryadı pərişan etməyim, neylim?*

*Deyirlər Şahinə hərdən «nə çox divan yazırsan sən?»,*
*Mənəm hər gün yazan şe'ri ki, divan etməyim, neylim?*



[1] *Beyt Hacı Rza Sərraf Təbrizinindir.*

## *XII*
## *QƏZƏL-TƏZMİN*

*«Təaləlləh, nə arizdür, belə hüsnü cəmal olmaz,*
*Belə qaşü gözü rəngü rüx olmaz, xəttü xal olmaz»*[1].

*Yəqinlik bəlli eşqimdə, yəqinlik varsa hər kimdə*
*Olar qət'iyyətli zahir, o kəsdə ehtimal olmaz.*

*Gəlib xəncərlə yox, kiprik oxuyla tök qanım, ey şux,*
*Əgərçi böylə etməzsən, sənə qanım halal olmaz.*

*Dodağın qönçətək açsın, gözün gülsün, sözün gülsün,*
*Sənin əhvalını qəmgin görən aşiqdə hal olmaz.*

*İşarətdən olar bəlli sözüm məddahə, aqilsə Əyilmək*
*bilməyən şəxsin əlif qəddi sual olmaz.*

*Yazanlar var ki, hər şe'ri qəliz yazmaqdadır, Şahin,*
*Yazan Sərraftək yazsa gər asan, qiylü qal olmaz.*

*4.03.2005*
*Təbriz*
*şəhəri*



[1] *Beyt Hacı Rza Sərrafındır.*

*3.03.2005*
*Təbriz şəhəri*

***XIV***
***QƏZƏL-TƏZMİN***


*«Naz ilə yarım genə əzmi-gülüstan eyləmiş,*
*Gül yüzinə sünbüli-zülfün pərişan eyləmiş»*[1].

*Söylədim: - Zülfün pərişan, mən pərişan, sənsə şad,*
*Çək kənarə zülfünü, ey könlümü qan eyləmiş.*

*Çox çətinlik görmüşəm, üzləşmişəm çox cəbr ilə,*
*Amma, Allah onları axırda asan eyləmiş.*

*Hər zaman dildarı xoş dillərlə dilləndirmişəm,*
*Asi könlüm hər zaman əğyarə üsyan eyləmiş.*

*Yox, bu təzminim zəif oldu, nə tədbir eyləyim?*
*Ya könüldən düşmüşəm, ya təb ' nöqsan eyləmiş.*

*Ya vərəqdən bezmişəm mən, ya qələmdən, neyləyim?*
*Varmı loğmanım ki, müşkil dərdə dərman eyləmiş?*

*İstəsən yazmaq əgər Sərraftək yaz, yoxsa yox! Şahinə*
*ilham pərisi böylə fərman eyləmiş!!!*

*4.03.2005*
*Təbriz şəhəri*

[1] *Beyt Hacı Rza Sərraf Təbrizinindir.*



# ON ÜÇÜNCÜ SƏFƏRNAMƏ

## *ŞAHİNİN GÖZLƏRİ TƏBRİZDƏ QALIBDIR, GÖZƏLİM*

2005-ci ilin may ayında növbəti səfərə çıxacağımı bilirdim. İrana, Təbriz şəhərinə, oradakı universitetin təşkil edəcəyi Elmi Konfransa gedəcəyim barədə irəlicədən xəbərim vardı. Heç də təsadüfi deyil ki, keçmiş səfərlərimin birində gələcəyi görüb demişdim:

*Hələ çox görməliyəm, gəzməliyəm İranı,*
*Mənə bildir görünübdür bu ilin imkanı.*

Bəli, mən bu ilin may ayında qədim Təbriz şəhərində keçiriləcək «Rəbe-Rəşidi»nin bərpa olunan planı və «İlxani dövründə İran mədəniyyəti», habelə iyunda (bəlkə də mayın sonunda) Urmiyə şəhərində olacaq «Xaqanişünaslıq» Elmi Konfranslarında gələcək iştirakımdan artıq xəbərdar idim, çünki 2004-cü ilin dekabr ayının ortalarında Tehranda təşkil edilmiş II Beynəlxalq İranşünaslıq Konfransında iştirakım zamanı, yuxarıda qeyd etdiyim kimi, gələcək konfransların keçiriləcəyi haqda məlumatlandırılmışdım. Bu vaxt ərzində həm Təbriz, həm də Urmiyə yığıncaqları üçün elmi tezis və məqalələrimi yazıb göndərdim və mayın 17-də günorta vaxtı Təbrizdə olmaq niyyəti ilə Bakı-Astara qatarıyla İran səmtinə yola düşdüm. Səfər yoldaşlarım bunlardı: Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü Məşədixanım Nemət, Tarix İnstitutunun qrup müdiri professor Vaqif Buduqlu-Piriyev, həmin institutun Orta Əsrlər tarixi şöbəsinin əməkdaşı, tarix elmləri namizədi Tofiq Nəcəfli və Bakı Dövlət Universitetinin müəllimi Ülviyyə Ağayeva.

Sübh saat 9-da Astarada olduq. Hər iki dövlətin gömrük məntəqələrindən keçib İran Astarasına yetişdik, bir «Pejo» markalı maşına əyləşib, «Ya Allah» deyərək Təbriz istiqamətinə yollandıq.

Sürücümüz Seyid Qəvam Nəqizadə baməzə bir kişiydi. 4 sərnişin yeri olan maşında 5 nəfər gedirdik. Hər halda arxa sırada oturanlar üçün bir qədər darısqallıq idi. Seyid Qəvam bütün yol boyu necə deyərlər «ürək- göbəyini yedi», çünki yol avtomobil müfəttişlərinin maşınımızda 4 sərnişin əvəzinə 5-ni görəcəklərindən ehtiyat edirdi. O, uzaqdan müfəttiş maşınını görən kimi bizə xəbərdarlıq edir, Məşədixanım müəllimə Ülviyyə müəllimənin arxasında «gizlənirdi». Hətta Ərdəbildən çıxdıqdan sonra 2 kilometrlik bir məsafəni piyada gedəsi olduq, çünki öndəki polis postunda ciddi yoxlama gedirdi.

Nəhayət, Həmin, Ərdəbil, Sərab, Bostanabad (Ucan) arxada qaldı və biz artıq Təbrizdəydik.

Təbriz İranın Şərqi Azərbaycan Ostanının (vilayətinin - Ş.F.) paytaxtıdır və ən qədim Şərq şəhərlərindən biri sayılır. Bu şəhərdə aparılan arxeoloji qazıntılar zamanı məlum olmuşdur ki, Təbrizdə məskunlaşmanın tarixi 3-4 min əvvələ gedib çıxır. Bugünkü İranın ən köhnə universiteti - Rəşidiyyə məhz Təbrizdə inşa edilmişdir. Bu şəhər hələ islamdan əvvəl, xüsusən Sasanilər dövründə mühüm hərbi və strateji mərkəzlərdən biri olmuşdur. İslamın zühurundan sonrakı vaxtlarda (rəvvadilər, səlcuqilər, ilxanilər, cəlairilər, qaraqoyunlular, ağqoyunlular və səfəvilər) bu şəhər adları sadalanan bu feodal dövlətlərin rəsmi paytaxtı olmuş, qacarlar dövründə isə şahzadə iqamətgahına çevrilmişdir (məsələn, Fətəli şah Qacarın oğlu Abbas Mirzə bu şəhərdə əyləşib Azərbaycanı idarə edirdi - Ş.F.). Xülasə, Təbrizə daxil olan kimi sanki tarixin ağuşuna düşürsən.

Salam əleyküm, ya Təbriz!

Maşınımızı sürdük birbaşa Təbriz Universitetinə. Bir qədər gözləmədən sonra bizi gətirdilər «Pars» adlanan yaraşıqlı bir otelə. 18 mərtəbəli bu yaraşıqlı binanın 10-cu mərtəbəsində yaşayış nömrələri yerləşir, qalan 8 mərtəbədə isə müxtəlif ofis, xidmət otaqları və restoran üçün (fırlanan restoran) ayrılmışdır.

Sabah konfransın açılışı olacaq, məruzələrin bir qismi dinləniləcəkdir.

Mən elə bu gün tarixmizin XIII-XIV əsrlərini xatırlayıb, öz əvvəlki vərdişimə sadiq qalaraq, bu səfərin başlanğıcı münasibətilə ilk qəzəlimi yazdım, uzaq Monqolustandan çıxıb neçə-neçə ölkəni, o cümlədən İranı və Azərbaycanı fəth etmiş monqollar, onların məşhur hökmdarları və gəldikləri bu yerlərdə məskunlaşmaları haqda müəyyən fikirlərimi həmin şe’rdə əks

etdirdim, həm də İrana ABŞ təhdidlərinə son qoyulması, gələcəkdə bu ölkəyə İraqa edilən kimi hücumun olmaması xüsusunda öz istəyimi ifadə etdim:

*Monqolustan qoşunu eylədi çox yanə hücum,*
*Qoca İranə yürüş başladı, Turanə hücum...*

*Sonra başlandı Hülakü və Qazan xan dövrü,*
*Faidə eyləmədi bir daha ilxanə - hücum...*

*Nə gərəkdir daha həmlə, nəyə lazım basqın?*
*Olacaq faidəsiz Təbrizə, Tehranə hücum.*

*Şahina, qoy yığışa cövrü cəfa dünyadən,*
*Gərək insan balası etməyə insanə hücum.*

Şe'ri bitirmişdim ki, qapı döyüldü və Əlövsət Quliyev peyda oldu. Naxçıvandan gəlmişdi. Mən onunla keçən dəfəki konfrans zamanı Tehranda tanış olmuşdum və həmin tanışlıq mənim «On birinci İran səfərnamə»mdə əksini tapmışdı. Olduqca diribaş və bir qədər də baməzə adamdır.

18 may 2005. Gecə yağış yağdı. Otelin gül-çiçəkli bağına düşdüm. Hava soyuqdusa da, safdı. Otelyanı sahəni dörd tərəfdən bürüyən dağlara nəzər saldım. Hələ ki, ətəklər və zirvələr yaşıla bürünmüşdü. Təbiət «gəl-gəl» deyirdi. Gözəldi. Gözəllikdən ilhama gəlməyim, neylim? Bir qəzəl yarandı:

*Əs-səlam, ey ulu Təbriz şəhəri,*
*Yenə ilhamə gəlibdir Şahin.*

*Göndəriblər ona dəvətnamə,*
*Oxuyub namə, gəlibdir Şahin...*
*Səlam olsun bu müsəlmanlarıma,*
*Səlam islamə! Gəlibdir Şahin...*

Azacıq sonra d-r Bastani Parizi kimi tanınan Məhəmməd İbrahim Parizi ilə tanış oldum. Yaşı həştadı adlamış başı şlyapalı, əli çəlikli bu dünyagörmüş qoca, bu məhsuldar alim nə qədər də sadədir! Bir başqa qoca da bizə yaxınlaşdı, özünü təqdim etdi: Məhəmməd Mənsur Fəlaməki. Onu mən tanımırdım, d-r

Parizi isə yaxşı tanıyırdı. İki alim. Birinin qəddi çox uca (d-r Parizi), o birinin isə çox qısa (d-r Fəlaməki) idi. Birincisi ilə danışanda yuxarı baxırdım, ikincisi ilə aşağı. Birinci tarixçi, ikinci memar. Birinci köhnə dəblə, ikinci isə müasir dəblə geyinmişdi...

Hamı ilə birlikdə bizim üçün ayrılmış avtobuslara minib Təbriz Universitetinə yollandıq.

Budur, Universitet şəhərciyi. On hektarlarla uzanan sahə. Bağbağat. «Talare-vəhdət» sarayında bütün yerlər dərhal tutuldu. Onlarla xarici ölkədən gəlmiş alimlərə ön sıralarda yerlər ayrılmışdı.

Saat 9 oldu. İran İslam Cümhuriyyətinin himni səsləndi. Ondan sonra Şərqi Azərbaycan ostandarı d-r Məhəmməd Əli Sübhanallahi çıxış etməliydi, lakin o Tehrana mühüm iş ardınca getdiyindən bu konfransın katibi d-r Əli Rza Xəzayeli öz məruzəsinə başladı. Təbriz Universiteti tarix fakültəsinin dekanı d-r Daryuş Rəhmaniyanın çıxışından sonra konfransın açılış mərasimi başa yetişdi. Bir qədər sonra isə məruzələr ayrı-ayrı bölmələrdə oxunmağa başladı: Tarix və tarixşünaslıq; Rəşidəddin və Rəb e-rəşidi, Sikkəşünaslıq, Siyasi və ictimai vəziyyət; Ədəbiyyat; Azərbaycan tarixi; Qədim tarix və mədəniyyət; Məzhəb və fəlsəfə; Elmlər və tibb; Memarlıq və şəhərsalma. Maraqlananlar bu bölmələrin hər birində iştirak edə bilərdilər.

Oxunası məqalələrin 48-i xarici ölkə alimlərinin idi.

Tarix və tarixşünaslıq bölməsində bu gün Azərbaycan Milli Elmlər Akademiyasının əməkdaşı Elvin Talışxanovun «Hafiz Əbrunun həyatı və əsərlərinin müxtəsər təhqiqi» mövzusunda məruzsi edilməliydi, lakin o, gəlib çıxmadı. Günorta vaxtıdır. Bir qədər fasilə elan olunmuşdur. Təbriz televiziyasının jurnalisti Kərim Dini Azərbaycandan gəlmiş bizim heyət üzvlərinin hər biri ilə müsahibə etdi və yenidən çıxışlar başlandı. Mən «Tarix və tarixşünaslıq» bölməsində Rəyasət Heyətinin tərkibindəydim və bu bölmə çıxışlarını idarə edirdik (d-r Davud İsfəhaniyan, danimarkalı d-r Kristian Rasmussen, tacik d-r Mirzə Molla Əhmədlə birgə). 5-ci çıxış Akademiya İncəsənət İnstitutunun aparıcı elmi işçisi Cəmilə Həsənzadə tərəfindən olmalıydı, lakin o da prof. Tofiq Mustafazadə və prof. Cəfər Qiyasi kimi hələlik Təbrizə təşrif gətirməmişdi.

Mən yapon alimi Yuka Kaboiyə söz verməzdən əvvəl fürsətdən istifadə

edib «Monqolustan qoşunu eylədi çox yanə hücum» mətləli qəzəlimi oxudum. Sonra növbəti çıxışçı kimi BDU-nun müəllimi Ülviyyə Ağayevanı kürsüyə də'vət etdim. O, öz məruzəsini xülasə şəklində azərbaycanca təqdim etdi və ağaye-Dilavərnejad (açılış mərasiminin aparıcısı) Ülviyyənin məruzəsinin məzmununu fars dilində oxudu.

Sonra yenə fasilə. Sonra yenə dinləmələr. Mən «Ədəbiyyat» bölməsinə getdim, çünki məruzəmi orada oxumalıydım. Məhəmməd ibn Hinduşah Naxçıvaninin «Sihahül-fors» adlı izahlı lüğət kitabının məzmunundan bəhs edib, bu əsər barədə müfəssəl məlumat verdim.

Günün iclasları bitdi. Təbrizli dostlarım məni şəhər gəzintisinə də'vət etdilər. Onlardan Ərk qalasına getməyimizi xahiş etdim. Getdik. İki ay bundan əvvəl gördüyüm Ərkin uca divarı və qala təmiri üçün ucaldılmış taxta və metal konstruksiyalar. Ərk təmir olunacaq. Əgər gələn il yolum bir daha Təbrizə düşərsə, qalanı təmir olunmuş vəziyyətdə görrəm İnşallah. Ərk barədə beynimdə yığılıb qalan fikirlər şe'rə çevrildi:

*Daha söyləmirəm fərağmdayam,*
*Uca bir qalanın qabağındayam.*
*Bu qala Təbrizin qeyrət timsalı,*
*Ehtişam timsalı, şöhrət timsalı.*
*Neçə müxənnəsi yerə səribdir,*
*Dostu dosta layiq üz göstəribdir.*
*Qala əsrlərin yadigarıdır,*
*Qala nəsillərin iftixarıdır...*

Mənimlə qala seyrinə gedən dostlardan biri mənə bir qəzəlini verdi. Elə maşındaca oxudum. Qəzəlin dili çox qəlizdi. Eynən bizim mühafizəkar qəzəlxanlarımızın şe'r dili kimi. Mən bu gün qəliz sözlərlə, dilimizdə vətəndaşlıq hüququ qazanmayan fars-ərəb kəlmə və izafət tərkibləri ilə qəzəllər yazanlara qarşı həmişə sərt mövqe tutmuşam. Onlar başa düşmək istəmirlər ki, bu günün öz ədəbi dili vardır və bu dillə qəzəl yazmaq mümkündür!

Qit'ə

*Xəlqi sözlərlə yazıb xəlqiliyin artırdı Mirzə*

*Sabir və Möcüz ilə Sərraf qəzəlin.*

*Fars-ərəb sözlərinin ziddinəyəm şe'r içrə,*
*Mən sığal çəkmədəyəm zülfünə hər saf qəzəlin.*

Təbrizli dostlarım məni şam yeməyi üçün ayrılmış bir yeməkxanaya gətirib çıxardılar. Konfransa gələn qonaqlar artıq miz arxasında əyləşmişdilər. Ənənəvi İran xörəkləri ortaya düzüldü. Salat, sup və plov.

Avtobusla «Pars» otelinə qayıdırq. Biz maşının sürücüyə baxan istiqamətində, Ülviyyə isə üzü bizə tərəf əyləşib. Ona dedim:

*Mən sənə baxıram,*
*Sən isə hamıya.*

Gülüşdük. Bu iki sərbəst misra dərhal başımda xokkuya (3 misradan ibarət 17 hecalı, qafiyəsiz klassik yapon şe'r janrı - Ş.F.) çevrildi:

*Mən Sənə baxıram,*
*Sən - hamıya,*
*Ey gözəgörünməz Rəbb!*

19 may 2005. Mən bu gün dörd bölmənin işində iştirak etdim. D-r Davud İsfəhaniyan, d-r Əbdülrəsul Xeyrəndiş, d-r Hüseyn Alyaridən sonra Tofiq Nəcəfli «Müasir türkiyə tarixşünaslığında Elxanilər dövründə Azərbaycanda etnik proseslər haqqında» mövzusunda çıxış etdi. Tofiqin məruzəsi xüsusən tələbələr tərəfindən alqışlarla qarşılandı.

Bu Tofiqdən sonra ikinci Tofiqin də çıxışı oldu. Prof. Tofiq Mustafazadə «İlxani-Qızıl Orda rəqabəti və Azərbaycan» adlı məruzəsində tarixşünaslıqda o qədər də çox toxunulmayan bu məsələni konkret faktlarla nəzərə çatdıraraq, həmin rəqabətin siyasi həyatımıza məni təsirini açıqladı. 1 saylı salonda isə prof. Vaqif Buduqlu-Piriyevin «Təbrizdə ali təhsil nə zaman həyata keçirilmişdir?» (mən onun məruzəsinin adını konfransın proqramında yazıldığı kimi fars dilindən dilimizə çevirirəm) adlı çıxışı xüsusi marağa səbəb oldu.

Fasilə zamanı Urmiyə Universitetinin müəllimi d-r Məsud Bayat mənə

heç də gözləmədiyim bir xəbər verdi. Xaqani Şirvaniyə həsr olunacaq Konfrans xordad ayının 5-6-sı tarixində (mayın 25-26-da keçiriləcəkdir). Qanım bir az qaraldı. Demək, mən Bakıya qayıdıb iki-üç gün orada olduqdan sonra yenidən bu uzun məsafəni (Bakıdan Urmiyə şəhərinədək təxminən min km. -lik yoldur) geri qayıtmalıyam. Neyləmək olar, yolçu yolda gərək!

Nahar yeməyini Təbrizin məşhur Elgölü parkındakı restoranda verdilər. Yenə həmin ənənəvi yemək süfrəsi, yenə toyuq, düyü və meyvəcat. Əlövsət Quliyev birdən-birə dedi:

- Qayıdan baş yəqin ki, bütün yol boyu qaqqıldayacağıq.

Onun bu atmacasının mə'nasını başa düşmədim. O, yenə gülə-gülə sözünə davam etdi:

- Bu qədər də toyuq yemək olar? Nahar toyuqplov, şam toyuq- plov...

Təbrizli dostlarla birlikdə biz də gülüşdük.

Nahar bitdi. Restorandan çıxdıq. Güclü yağış yağırdı. Yenidən Universitetə qayıtdıq. Bu gün bir neçə məruzə dinlədikdən sonra Konfransın qapanışı olmalıdır.

Növbəti Tehran səfəri zamanı tanıdığım və dünən məndən müsahibə alan Qəhrəman Nurani prof. Tofiq Mustafazadədən Tehran televiziyası üçün müsahibə verməsini xahiş etdi. Çəkilişdən qabaq ağaye-Nurani Tofiqdən hansı mövzuda danışacağını soruşduqda Tofiq ona məlumatın özünün konfransdakı çıxışı barədə olacağını və İlxani-Qızıl Orda münasibətlərini əks etdirəcəyini bildirdi. Lakin Qəhrəman Nurani həmin mövzunun müasir İranın siyasi tarixi və mədəniyyəti ilə əlaqələndirilməsi barədə də bir alim kimi onun sözünü eşitmək arzusunda olduğunu söylədikdə professor razılaşmadı və çəkilişdən imtina etdi.

Növbəti məruzələri dinləməkdən ötrü müxtəlif bölmələrdə olduq. Yorulmuşdum. Yorğunluğumu şe'r çıxara bilərdi. Bir kənara çəkilib bu qəzəli yazdım:

*Qoca Təbrizlə cavan eşqə giriftar odum,*
*Cism ölməkdə idi, mən təzədən var oldum.*

*Gəldim ilhamə görüb görkəmi Göy Məsciddə*
*Бəs Cahanşahı salıb yadə neçin zar oldum?*

*Qara Yusif kimi bir şahə gümanım artdı,*
*Ağqoyunlu Həsənə sanki ümidvar oldum.*

*Yeni Şah İsmayılın gəlməyinə var ümmid,*
*Elə bil dalmış idim uyquya, bidar oldum.*

Bu qəzəl bir növ Təbriz tarixinin müəyyən dövrlərinin poetik inikası oldu. Göy Məscid 1466-cı ildə Qaraqoyunlu hökmdarı Cahanşahın əmri ilə inşa olunmuş, ona həmçinin «İslamın Firuzəsi» adı verilmişdir. Bu gözəl tarixi abidə 1939-1966-cı illərdə Rza Memaran tərəfindən təmir olunaraq öz əvvəlki simasını təcəssüm etdirmişdir. Bəs adını çəkdiyimiz Cahanşah, Qara Yusif və Uzun Həsən kimlər olmuşlar? Cahanşah ilk Qaraqoyunlu hökmdarı Qara Yusifin üçüncü oğlu olmuş, 1435-1467-ci illərdə Azərbaycanı və habelə bütün İranı idarə etmişdir. O, həm də böyük şair olmuş, Azərbaycan dilində divan bağlamış, 1467-ci ildə Ağqoyunlu padşahı Uzun Həsən tərəfindən qətlə yetirilmişdir. Babək qalası adlanan qala isə hələ islamdan qabaq Kəleybər şəhərciyinin qərbində xalq qəhrəmanı Babək tərəfindən salınmışdır və hal-hazırda da uçuq şəkildə mövcuddur. Əcəmi Naxçıvani isə (XII əsr) Naxçıvan memarlıq məktəbinin banisi olmuş, bir neçə məşhur türbənin (Y usif ibn Qüseyr, Möminə Xatun) memarı kimi bütün Yaxın Şərq ölkələrində ad çıxarmışdır.

Şe’rimi bitirib iclas zalına daxil oldum. Prof. memar Cəfər Qiyasi danışır, tərcüməçi onun sözlərini tərcümə edirdi. Bizim bu məruzəçi 1317-1335-ci illərdə inşa olunmuş Ərk, yaxud Ərke-Əlişah (Sultan Əbu Səid Elxaninin vəziri Tacəddin Əlişah Ceylani tərəfindən tikilmişdir) adlanan məşhur qala haqqında ətraflı məlumat verərək həmin qalanın ayrı-ayrı fraqmentlərinin Bakının Sınıq Qala məscidinin müvafiq hissələri ilə həmahəng olduğunu şəkillərlə əyani şəkildə nümayiş etdirdi.

C.Qiyasinin çıxışından sonra ağaye-Dilavərnejad ilə birlikdə Konfrans iclaslarının keçirildiyi Bəşəri və İctimai Elmlər fakültəsinin bağçasında gəzişərək söhbət etməyə başladıq. O, «Azərbaycan Respublikasının müasir şe’ri» adı altında fars dilinə tərcümə etdiyi bir sıra şairlərimizin (Balaş Azəroğlu, Rəsul Rza, Fikrət Sadıq, Zəlimxan Yaqub, Südabə Şəfa) şe’rlərini mənə verərək onları Anara çatdırmağımı xahiş etdi. Söhbət əsnasında o, mənə özünün fars və Azərbaycan dillərində yazdığı bir neçə şe’rini də oxudu və

məndən də bir neçə şe'r dinləmək arzusunda olduğun bildirdi. Mənim bir neçə beytimi dinləyən Dilavərnejad

*Elə ki, seyr eləyir göz o gözəl cananı,*
*Cavanın səbri çatışmır, qocanın imkanı*

misralarını eşidib təbəssümlə dedi:

- İndiki qocalar cavanlardan daha möhkəmdirlər. Sənin bu beytini belə demək daha doğru olardı.

Zarafatla dedim:

- Birinci divanımın əgər yeni nəşri olarsa bu beytimi sənin düzəlişinlə verərəm.

Geri qayıdıb bir neçə məruzə də dinlədik. Sonra, iki gün davam edən Konfransın qapanış iclasında iştirak etmək üçün bizi yenə «Talare- vəhdət»ə də'vət etdilər. Dilavərnejad səhnəyə çıxaraq bir neçə beyt şe'r dedi, öz təşəkkürünü bildirdi. Quran tilavətindən sonra d-r Şəbani də alimlərə öz minnətdarlığını bildirdi, bu Konfransın hazırlıq işlərində d-r Xəzayelinin zəhmətini yüksək qiymətləndirdi, «gözəl simalı» təbrizlilərin səmimiyyətini xüsusilə vurğuladı. «Gözəl simalı təbrizlilər» sözlərini eşidən bütün təbrizlilər əl çaldılar. Səttar xanı, Bağır xanı və bütün Azərbaycanı xeyli tərifləyən d-r Şəbani hamı tərəfindən öz səmimi çıxışı münasibətilə dəfələrlə alqışlandı. O, elə belə də dedi:

«Azərbaycan ürəyimizdir, ruhumuzdur və qəlbimizin dərinliyində özünə yer tutmuşdur».

D-r Sadeqi səhnəyə də'vət olundu. Konfransın qətnaməsini oxudu və iki gün davam edən bu elmi məclis qapandı. Bizi «Azərbaycan Muzeyi»nə gətirdilər. Mən əvvəllər də bu üçmərtəbəli muzeydə olmuşdum. Şah İsmayıl Səfəvinin qılıncına, nizəsinə, bazubəndinə bir də baxdım. Amma təəssüf ki, qələmi yox idi, çünki qılınc qalar, qələm isə (daha doğrusu - lələk) beş yüz il qalmaz. Lakin qələm qılıncdan üstündür, çünki qılıncın etdiklərindən əsər-əlamət tapılmaz, qələmin yazdıqları isə qalar. Şah İsmayıl Xətainin əsərləri kimi. Çünki qələm yazanı qılınc silib apara bilməz. Bunu Şah İsmayıl öz zəmanəsinin ağıllı bir hökmdarı kimi dərk etmişdi. Lakin feodal dövrünün dövrə layiq böyük bir şahı olan bu əqidəli səfəvi şeyxi, təbii ki, qılıncından da əl çəkə bilməzdi. Onun cəngavərliyi ilə şairliyi arasında tənasüb vardı. Məşhur

Çaldıran müharibəsində (23 avqust 1514) məğlubiyyətə uğrayan Şah İsmayılın keçirdiyi iztirabı mən poetik misralarla öz «Çaldıran» adlı poemamda verməyə çalışmış və o böyük padşahın dili ilə demişəm:

*İsmayıl düşünür: «Yarəb, bu savaş*
*Gərək olmayaydı, tutmayaydı baş...*
*Бu qədər əsgərim qırılmayaydı,*
*Qoşunum, ləşkərim qırılmayaydı.*
*Güllə uçmayaydı, top atmayaydı,*
*Qılınclar başları qopartmayaydı.*
*Qanlar Çaldıranı suvarmayaydı,*
*Ağçay, Zeyvə çayı qızarmayaydı.*
*Min-min qızılbaşın qanı axıbdır,*
*Min-min osmanlının canı çıxıbdır.*
*Döyüşlər, savaşlar daha kifayət,*
*Davalar, dalaşlar daha kifayət.*
*Baş əyir hər iki İraq da mənə,*
*Səcdədə yaxın da, uzaq da mənə.*
*Bir şeyxdə olmamış belə ehtişam,*
*İranı tutmuşam, Şamı tumuşam.*
*Bir əlim Xorasan bağlarındadır,*
*Bir əlim Dəmavənd dağlarındadır,*
*Neçə şövkət mənim, neçə şan mənim,*
*Kürdüstan, Luristan, Xuzistan mənim.*
*Gəlir xələt mənə, axır zər mənə,*
*Bac-xərac yollayır kafirlər mənə.*
*Krallar baş əyir lap qabağımda,*
*Çövkan əlimdədir, top qabağımda.*
*Bunlar öz yerində, yarəb, bu savaş*
*Gərək olmayaydı, tutmayaydı baş.*
*Qazilər, ağlayın halıma indi,*
*İgid sufilərim min-min keçindi.*
*Qazilər, bir müddət eyşi unudun,*
*Mərsiyə oxuyun, təziyə tutun.*

*Qazilər, yas tutun, ələm yaxşıdır,*
*Misri qılıncdansa, qələm yaxşıdır»...*

20 may 2005. Bu gün Marağa şəhərinə yollandıq. Bu gün konfrans iştirakçılarının istirahət günüdür.

Marağa İranın şimal-qərbində yerləşən tarixi bir şəhərdir. Mənbələrdə adı Fraata, Praaspa, Fraaspa, Əfrahrud kimi çəkilir. Şəhərin indiki adının ərəbcə «mərəğə» («otlaq, heyvan qoruğu», «at bəslənən yer») sözündən yarandığı ehtimal edilir. Marağa orta əsrlərdə Azərbaycanın inkişaf etmiş elm və mədəniyyət mərkəzlərindən olmuşdur. 1259-cu ildə inşa olunmuş Marağa rəsədxanası bütün dünyada məşhur idi. Marağa şairlərindən Əvhədi Marağayi, Əşrəf Marağayi, Atəşi Marağayi, Dəxil, Zeynalabdin Marağayi, musiqişünaslardan Əbdülqadir Marağayi, Nurəddin Marağayi məşhur şəxslərdən olmuşlar.

Sübh tezdən Təbrizdən çıxdıq. İlxıçı kəndi. Əhalisi Əliyullahi təriqətlidir. İlxıçıdan 20 kilometrlik məsafədə bir lövhə üzərindəki «Qazi Cahan» sözlərini oxudum. Qazi Cahan. Məşhur səfəvi vəziri Qazi Cahan. Bu Qazi Cahan o Qazi Cahandırmı? Soruşdum, bilən olmadı.

Əcəbşir, Bənab şəhərlərini keçdik, Marağaya yaxınlaşırıq. Şəhərin girəcəyində belə bir şüar yazılmışdı: «Be Şəhre-şəhidpərvəre-mərağe xoş amədid». Bir az irəlilədikdən sonra farsca yazılmış həmin şüarın azərbaycanca başqa bir variantını oxudum: «Marağaya xoş gəlibsiz». Bu şüar mənim marağıma səbəb oldum. Deməli, əgər diqqətlə baxsan Azərbaycan sözləri ilə yazılmış reklam və şüarlara da rast gəlmiş olarsan (İranın rəsmi dili fars dili olsa belə!).

Marağa olduqca yaşıl, olduqca bağ-bağatlı, mənzərəli bir şəhərdir (mən Qubanı və Şəkini xatırladım). Şəhər muzeyinə gəldik: kaşı qab- qacaq, gümüş və qızıl sikkələr, miss ləvazimat. Kiçik bir əyalət muzeyi idi. Muzeyin həyətə açılan qapısından o qədər də böyük olmayan bir bağçaya keçdik: Əvhədi Marağayinin məqbərəsi. Miladın 1271-ci ilində Marağada doğulmuş və 1337-ci ildə elə burada da ölmüş Rüknəddin (Azərbaycan Sovet Ensiklopediyasında bu tarixlər 1274 və 1338-ci illər kimi göstərilmişdir) Azərbaycanın klassik şairi və panteist filosofu olmuş, əsərlərini fars dilində yazmışdır. Bir müddət İsfahanda yazmış və sufi şeyxi Əbu Hamid Əvhədəddin Kirmaninin sadiq

şagirdi kimi onun adını özünə təxəllüs götürmüşdür. Böyük həcmli bir divanı və «Came- Cəm» poeması ilə məşhurdur. O, əsl həyatın cənnətdə deyil, «Kölgələr aləmi» adlandırdığı bu dünyada olduğunu bildirmişdir.

«Qırmızı gümbəz» adlanan səlcuqi dövrünə aid tarixi bir məbəd. Təmir olunur. D-r Məcid Sepehrivənd özünün «Marağe dər seyre-tarix» («marağa tarixinə nəzər») adlı kitabında bu məşhur gümbəz haqqında ətraflı məlumat vermişdir (müəllifin özü ilə elə həmin gümbəzdə tanış oldum).

Məşhur Marağa rəsədxanasına gəldik. Bərpa olunmaqdadır. Təchizatı Tehranda, İran Milli Muzeyində saxlanılır. Şəkil çəkdirdik.

Ziriş dağları. Sufirid (Sufiçay) çayını keçib Əşkanilər (Ərşakilər) dövrünə aid olan «Mehr məbədi»nə gəldik. «Mehr» günəş deməkdir. Bu məbəddə yaşayanlar günəşə sitayiş edirdilər. Məbəd bir neçə yeraltı mağaradan ibarətdir. Divarlarda ilxanilər dövrünə aid ərəb dilində yazılar vardır.

«Göy Məscid». Bu abidəyə «Madərhülaku» məscidi də deyirlər. İlxan Hülakunun anası burada dəfn olunmuşdur.

Səfalı bir bağa gəldik. Bizə dondurma, çay və sulu qəlyan təklif olundu. Tofiq Mustafazadənin könlündən sulu qəlyan çəkmək də keçdi. Biz istəmədik deyə o da istəmədi.

Bağda çoxlu alça, gilas ağacları vardı. Konfrans iştirakçılarının əksəriyyəti alça ağaclarının üstünə cumdu. Bu mənzərəni seyr edən marağalı bir şəxs bizim kimlər olduğumuzu soruşdu. Ona dedilər ki, bunlar monqollara həsr olunmuş konfransa gələn xarici ölkə nümayəndələridir. Həmin şəxs heyrətlə dedi: - Bunlar monqollardan betər qarətgərdirlər...

Bağda iki saatadək dincəldikdən sonra avtobusa əyləşdim. Marağada gördüklərimə heyran olmuşdum. Nə gözəl şəhərdir!.. bir şe’r yazası oldum:

*Gətirin çoxlu qələm vəsfə, varağım çoxalır,*
*Ey Mərağə, sənə baxdıqca marağım çoxalır.*

*Ney səsi, meh səsi, bülbül səsi... Səs dinləmədən*
*Elə zənn eyləyirəm mən ki, qulağım çoxalır.*

*Öpürəm alimi də, arifi də, şairi də,*
*Cüt dodaq var hamıda, sanki dodağım çoxalır.*

*Bu qədər gəzmək olarmı, yorula bilməyirəm,*
*Bəlkə hiss etməyirəm, bəlkə ayağım çoxalır?*

*Sufiçay, Qırmızı Gümbəz elə cəlb etdi məni*
*Marağa şəhrinə getdikcə marağım çoxalır...*

*Ayrılıq dərdi var öndə, gələrəm bir də bura,*
*Şahina, hiss edirəm sinədə dağım çoxalır.*

Marağa-Təbriz yolu. Geri qayıdırıq. Bu gün bu rahat yol boyunca gördüklərimi bir də görməkdəyəm. İçərisindən keçib gəldiyim yerlərdən qayıdıram. Nədənsə, yadıma məşhur bir bayatının iki misrası düşdü və həmin iki misranın təsirindən bir şe’r yazıldı:

Nə oldu?

*Qıcayıblar diş mənə,*
*Бгдадгма nə oldu?*
*Gücüm çatmır düşmənə?*
*Yarağıma nə oldu?*

*İtirdim Qarabağı,*
*İndi gəz, ara bağı...*
*Ey Koroğlu papağı,*
*Papağıma nə oldu?*

*O bağımdı, o dağım...*
*Hərəsi dağım-dağım...*
*Şuşa, hanı ocağım?*
*Ocağıma nə oldu?..*

Gəlib Təbrizə çatdıq. Sübh tezdən Astara istiqamətincə qayıtmalıyıq.

21 may 2005. Yoldayıq. Təbriz get-gedə uzaqda qalmaqdadır. Vüsal hicranla əvəz olunur, hicran vüsalla. Gedirik. Gəlmişdik, qayıdırıq. Bir də gələrik, İnşallah.

Ərdəbil şəhəri. Dəfələrlə gördüyüm qoca bir şəhər. Əlbəttə, ilkin olaraq

«Şeyx Səfi büqəsi»nə gəldik. Ülviyyə buranı görməmişdi. Arzusunu yerinə yetirdik.

Ayaqqabılarımızı soyunub ziyarətgaha daxil olduq. «Allah-Allah» gümbəzi. Şeyz Səfiəddin, Seyid Sədrəddin, Sultan Şeyx İbrahim və Şeyx Heydərin qəbirləri (Məşədixanım Nemət müşayiətçimizə dedi ki, bu qəbir Şeyx Heydərin deyil. Müşayiətçi ona bir söz deyə bilmədi).

Şeyx Səfiəddinin yaşadığı otaq. Qızının qəbri. Arvadı Bibi Fatimənin məzarı. Nəvələri Səlamuddin Xəlilullah, Məhəmməd, Musa ibn Seyid Heydər, adsız başqa bir qəbir.

Çinixana. Çinilərsiz çinixana. Bir vaxt bu çinixananı bəzəyən çini qablar indi Ermitajın bəzəyidir.

Şüşə örtük altında Şeyx Səfiəddinin xirqəsi (əba). Cüssəli adam imiş (yaman böyük xirqədir).

Ahu dərisi üzərində yazılmış nəfis Qurani-Kərim.

Rəşidəddinin «Camiət-təvarix» əsərinin qədim nüsxəsi.

Həyətə çıxırıq. Şah Təhmasib Səfəvinin qadağan işlər barədəki tarixi fərmanı divara hörülmüşdür.

Martanın (Şah İsmayılın anası) tənha məzarı...

Ərdəbildən ayrıldıq. «Pejo»larımız bizi irəli aparır. Keçmişdən qayıdırıq. Şeyx Səfiəddin dövründən.

Astaraya çatar-çatmaz Təbriz təəssüratıyla maşında bu qəzəli yazdım:

*Yenə könlümdə fərəh nəğmə çalıbdır, gözəlim,*
*Təzədən göylərə həzzim ucalıbdır, gözəlim.*

*Təzədən Təbrizə gəldim və cavan oldum mən,*
*Saçlarım ağ idi, sanki qaralıbdır, gözəlim.*

*Mənə qismətmi görüm bir sənin gözlərini?*
*Şahinin gözləri Təbrizdə qalıbdır, gözəlim.*

Budur, Azərbaycan Respublikasının Astarasındayıq. Səfərim də bitdi, 13-cü səfərnaməm də. 13 nəhs rəqəm sayılır. 13-dən çıxdım. Bu günlərdə İrana 14-cü səfərim başlayacaq. On dördüncü səfər ümidiylə!..

## On üçüncü Səfərnamə Şe'rləri

*I*

*QƏZƏL*

*Monqolustan qoşunu eylədi çox yanə hücum,*
*Qoca İranə yürüş başladı, Turanə hücum.*

*Həmlənin vəhşəti vardır, yürüşün dəhşəti var,*
*Etdi abad olunan yerləri viranə hücum.*

*Meşəyə, bağə bəla, gülşənə, gülzarə xəta,*
*Dərəyə, dağə hücum, bərrü biyabanə hücum.*

*Sonra başlandı Hülaku və Qazan xan dövrü,*
*Faidə eyləmədi bir daha ilxanə[1] hücum.*

*Sonda, məskun ola bildi köçəri monqollar,*
*Və dayandı neçə vaxt Azəribaycanə hücum.*

*Edib islamı qəbul, oldu müsəlman* - monqol,
*Etmədi tazə müsəlman müsəlmanə hücum.*

*Elə başlandı tərəqqi ki, tənəzzül bitdi,*
*Olmadı elmü ədəb mülkünə divanə hücum.*

*Ey Süleyman, eləmə bir də qarışqayə yürüş,*
*Ey qarışqa, eləmə bir də Süleymanə hücum.*

*Nə gərəkdir daha həmlə, nəyə lazım basqın?*
*Olacaq faidəsiz Təbrizə, Tehranə hücum[2].*

*Şahına, qoy yığışa cövrü cəfa dünyadən,*
*Gərək insan balası etməyə insanə hücum!*

*Бакı,*
*17.05.2005*

[1] *МондоЛ к0ктйаг1anmn* titulu *«Ихап», уахий «е1хап» аЛатгЖ.*
[2] *Уахт вахТЛагйа 1гапа еЫитаЛ оЛипап Америка кйситипа щагэ<Ир. АЛЛак доршип!*

*II*
*QİTƏ*

*Əssalam, ey ulu Təbriz şəhəri,*
*Yenə ilhamə gəlibdir Şahin.*

*Göndəriblər ona də’vətnamə,*
*Oxuyub namə, gəlibdir Şahin.*

*Çox üzüb canını hicran dərdi,*
*Dərdə əncamə gəlibdir Şahin.*

*Neçə gündə neçə məclis görəcək,*
*Neçə bayramə gəlibdir Şahin.*

*Salam olsun bu müsəlmanlarıma,*
*Salam islamə! Gəlibdir Şahin.*

*Küfrə qarşı o qızılbaş hanı ki,*
*Qopa həngamə, gəlibdir Şahin.*

*Hanı Şeyx Əttara*[12] *məxsus əba?*
*Hanı əmmamə, gəlibdir Şahin.*

*Sə'diya, görməliyəm Şirazı,*
*Camiya, Camə gəlibdir Şahin.*

*Hanı Firdovsiyə məxsus qələm?*
*Hanı «Şahnamə»? gəlibdir Şahin.*

*Təbriz,*
*18.05.2005*

*III*

---

12 *Fəridəddin Məhəmməd ibn ibrahim Nişaburi - klassik iran şairi (1119 - ?). «Məntiqüt-teyr», «Divan», «Muxtarnamə», «Pəndnamə», «Me’racnamə», «Əsrarnamə», «Təzkirətül- övliya» və s. əsərlərin müəllifi.*

## *QALA*

*Daha söyləmirəm fərağmdayam,*
*Uca bir qalanın qabağındayam.*
*Bu qala Təbrizin qeyrət timsalı,*
*Ehtişam timsalı, şöhrət timsalı.*
*Neçə müxənnəsi yerə səribdir,*
*Dosta dosta layiq üz göstəribdir.*
*Qala əsrlərin yadigarıdır,*
*Qala nəsillərin iftixarıdır.*
*Bu qala başından əl çıxarıbdır*
*Göyün sinəsini necə yarıbdır?*
*Gündüz dəlibdirmi, gecə dəlibdir?*
*Bu qala bu göyü necə dəlibdir?*
*Baxıb yerə sarı, torpağa sarı Qaldıran*
*görmüşəm yıxılanları. Qaldıran*
*görmüşəm əzilmişləri,*
*Ağac tək kökündən üzülmüşləri.*
*Qaldıran görmüşəm fəğanı, ahı,*
*Qaldıran görmüşəm ərşə günahı.*
*Qaldıran görmüşəm yalanı göyə.*
*Necə qaldırıblar qalanı göyə?*
*Təbrizin nə möhkəm, bərk qalası var* -
*Ərk qalası var,*
*Ərk qalası var!*

*Təbriz, Ərk qalası,*
*18.05.2005*

*IV*
*QƏZƏL*

*Qoca Təbrizlə cavan eşqə giriftar oldum,*
*Cism ölməkdə idi, mən təzədən var oldum.*

*Gəldim ilhamə görüb görkəmi Göy Məsciddə,*
*Bəs, Cahanşahı salıb yadə neçin zar oldum?*

*Qara Yusif kimi bir şahə gümanım artdı,*
*Ağqoyunlu Həsənə sanki ümidvar oldum.*

*Yeni Şah İsmayılın gəlməyinə var ümmid,*
*Elə bil dalmış idim uyquya, bidar oldum.*

*Mən Kəleybərdəki Babək qalasın seyr etdim,*
*Qala viranə idi, dərdə giriftar oldum.*

*Eşqi inkarə çıxan zahidə tutdum divan,*
*Eşqi təsdiq eləyib inkara inkar oldum.*

*Sevgili yar kimi Təbrizi qucdum neçə yol,*
*Mənə ağyar olana mən dəxi ağyar oldum.*

*Çevirib Ərkə şe’r mülkümü mən, ey Şahin,*
*Naxçıvani Əcəmi timsalı memar oldum.*

*Təbriz,*
*19.05.2005*

*V*
*QƏZƏL*

*Gətirin çoxlu qələm vəsfə, varağım çoxalır,*
*Ey Mərağə, sənə baxdıqca marağım çoxalır.*

*Ney səsi, meh səsi, bülbül səsi... Səs dinləmədən*
*Elə zənn eyləyirəm mən ki, qulağım çoxalır.*

*Öpürəm alimi də, arifi də, şairi də,*
*Cüt dodaq var hamıda, sanki dodağım çoxalır.*

*Bu qədər gəzmək olarmı, yorula bilməyirəm,*
*Bəlkə hiss etməyirəm, bəlkə ayağım çoxalır?*

*Sufiçay, Qırmızı Gümbəz elə cəlb etdi məni,*
*Marağa şəhrinə getdikcə marağım çoxalır.*

*Var rəsədxanə, rəsədxanəçi yoxdur amma,*
*Xacə[13] çoxdan gözünü yumdu, fərağım çoxalır.*

*Burada «Madər Hülaku»[14] deyilən mə'bəd var,*
*Deyəsən ağlayıram, gözdə bulağım çoxalır.*

*«Mehr mə'bədi»nə gəldik, qazılıb dağda oyuq,*
*Burda Əşkanilər haqqında sorağım çoxalır[15].*

---

13 *Xacə Nəsirəddin Tusi*
14 *Azərbaycanın monqol hökmdarı Hülaku xan (1217-1265), Ilxanilər sülaləsi və dövlətinin banisi, Çingiz xanın nəvəsi. Беytdən göründüyü kimi onun anası Marağada dəfn olunmuşdur.*
15 *islamdan əvvəl Xorasan (Part) vilayətinin arilər (arya) irqinə məxsus hökmranları. Miladdan əvvəl 250-ci ildə onlar daha böyük hakimiyyətə çataraq bütün iranda 500 ilədək padşahlıq etmişlər. Бu sülaləni sonralar Sasanilər əvəz etdilər.*

*Bir çıraq oldu muğamatda Əbdülqadir*[16 17].
*Deyə billəmmi yenə öylə çırağım çoxalır?*

*«Əvhədi məqbərə»si2 şairə yüksək qiymət!*
*Hadiyə bəs hanı qiymət ki, qınağım çoxalır.*

*Ayrılıq dərdi var öndə, gələrəm bir də bura,*
*Şahına, hiss edirəm sinədə dağım çoxalır.*

*Marağa,*
*20.05.2005*

[16]*Əbdülqadir əl-Marağİ (1353-1435) - Azərbaycan musiqi nəzəriyyəçisi, bəstəkarı, xanəndəsi. Onun «Cameəl-əlhan» («Melodiyalar külliyyatı»), «Məqasidəl-əlhan» («Melodiyaların məqsədləri»), «Şərhəl-ədvar» (Səfiəddin Urməvinin «Kitabəl ədvar» əsərinə şərh), «Fə- vaidi-əşərə» («On fayda»), «Kənz-əl-əlhan» («Melodiyalar xəzinəsi») və* s. *əsərləri vardır.*
[17] *Rüknəddin Əvhədi Mərağeyi - klassik şair (XIII-XIVəsrlər).*

*VI*
*NƏ OLDU?*

*Qıcayıblar diş mənə,*
*Бгдадгma nə oldu?*
*Gücüm çatmır düşmənə?*
*Yarağıma nə oldu?*

*İtirdim Qarabağı,*
*İndi gəz, ara bağı...*
*Ey Koroğlu papağı,*
*Papağıma nə oldu?*

*O bağımdı, o dağım,*
*Hərəsi dağım-dağım...*
*Şuşa, hanı ocağım?*
*Ocağıma nə oldu?*

*Mehrə bax Təbrizdəki...*
*Tez-tez görüşək təki!*
*O zaman demərəm ki,*
*Fərağıma nə oldu?*

*Getməmişəm uzağa,*
*«Təbriz üstü Marağa,*
*Zülfün gəlməz darağa»,*
*Darağıma nə oldu?*

*Dostlardır solum, sağım,*
*Qələmimdir yarağım,*
*Şahin, hanı varağım,*
*Yarağıma nə oldu?*

*Marağa-Təbriz,*
*20.05.2005*

*VII*
*QƏZƏL*

*Yenə könlümdə fərəh nəğmə çalıbdır, gözəlim,*
*Təzədən göylərə həzzim ucalıbdır, gözəlim.*

*Təzədən Təbrizə gəldim və cavan oldum mən,*
*Saçlarım ağ idi, sanki qaralıbdır, gözəlim.*

*Baxıban ərk ilə Ərk qəl'əsinə fəxr edirəm,*
*Qəl'ə də mən kimi, heyfa, qocalıbdır, gözəlim.*

*Səslədim dağı, səsə əksi-səda vermədi dağ,*
*Bəlkə Heydərbaba həm fikrə dalıbdır, gözəlim.*

*Burda üzlərdə, nəzərlərdə kədər göz dəlmir,*
*Kədərim böylə səbəbdən azalıbdır, gözəlim.*

*Amma, səbrimdən əsər yox ki, neçin sən yoxsan,*
*Səbrimi fikrü xəyalınmı alıbdır, gözəlim?*

*Mənə qismətmi görüm bir də sənin gözlərini?*
*Şahinin gözləri Təbrizdə qalıbdır, gözəlim.*

*Təbriz,*
*21.05.2005*



# ON DÖRDÜNCÜ SƏFƏRNAMƏ

## *«URMİYƏ TORPAĞINA HEYRAN OLUBDUR ŞAHİN.»*

Bir vaxtlar dünyada bir Azərbaycan vardı - İranın şimal-qərbindən başlayıb İrəvan, Naxçıvan, Gəncə və Qarabağ torpaqlarınadək uzanan böyük bir Azərbaycan. Hal-hazırda isə 3 Azərbaycan mövcuddur: Qərbi Asiyada yerləşən İran Azərbaycanları və Zaqafqaziyadakı Azərbaycan Respublikası. 1938-ci ildə İranda keçirilmiş inzibati ərazi bölgüsünə əsasən bu ölkə ostanlara (əyalətlərə) böləndükdə İrandakı Azərbaycan «Şərqi Azərbaycan» və «Qərbi Azərbaycan» ostanlarına ayrılmış oldu.

Mən Şərqi Azərbaycanın (mərkəzi Təbriz şəhəridir) müxtəlif yerlərində dəfələrlə olmuşam. Qərbi Azərbaycanın ostanına getmək və oradakı şəhərlərlə görüşmək imkanım isə bu vaxtadək baş tutmamış və bu Azərbaycanın mərkəzi Urmiyəyə qədəmim dəyməmişdi. İndi isə belə bir imkanın gerçəkləşməsinə ehtimal yaranmış və mən vaxt tapıb o yerləri ziyarət edəcəkdim. Belə ki, may ayının 20-də Urmiyə Universitetindən (bu vaxt mən Təbriz Universitetinin təşkil etdiyi «İlxani dövründə İran mədəniyyəti» adlanan Beynəlxalq Konfransda iştirak etməkdəydim) adıma

*Dear Doctor Pro. Fazil Shahin*

*It is indeed an honor to inform you that your paper has been accepted for oral presentatier in the International congress on the Famous Poet Khaghani held on May 25-26, 2005 The secretary of the conference Dr. Mahboob Talee*

Mən mayın 21-də İrandan Bakıya qayıtdım. Axşamüstü «Məcməüş-şüəra»nın katibi Qiymət Məhərrəmli və həmin məclisin üzvü Reyhan Aydəmir zəng edərək mayın 24-də, yəni sabah yox birigün Bakıdan Urmiyəyə yollanacağımızı bildirdilər. Doğrusu, Təbriz Konfransı gərgin keçmiş və iki gün ərzində şəxsən 30-dan çox məruzə dinləməli olmuşdum. İndi isə yeni bir Elmi Konfrans.

Mənə zəng edənlərə tərəddüdümü bildirdimsə də, sabah yox birigün yola düşməyi qərara aldım. Axı bu Konfrans «Xaqanişünaslıq» adlı Xaqani Şirvani yığıncağı idi.

Mayın 23-də gecə Bakı-Astara qatarı ilə Lənkərana yola düşdüm və sübh saat 8-də Lənkəranda oldum. Oradakı magistrantlarımla bir neçə saat məşğul olduqdan sonra Azərbaycan Milli Elmlər Akademiyası (AMEA) Ədəbiyyat İnstitutunun direktor müavini prof. Məhərrəm Qasımlı ilə birlikdə Astaraya gəldik. Bir qədər sonra ardımızca oraya gələn nümayəndə heyətimizin aşağıdakı üzvləri ilə görüşdük: Professorlar Akif Hüseynov, Roza Eyvazova, Möhsün Nağısoylu, Maarifə Hacıyeva, AMEA Əlyazmalar İnstitutunun əməkdaşları Qiymət Məhərrəmli, Aida Paşayeva, Aynurə Əliyeva, AMEA Ədəbiyyat İnstitutunun şöbə müdiri, f.e.n. İmamverdi Həmidov, həmin institutun əməkdaşı Vəfa Hacıyeva, AMEA Xarici Əlaqələr şövəsinin məsul işçisi Urxun Qalabəyov (məşhur şərqşünas Salman Mümtazın nəvəsi), AMEA Ədəbiyyat Muzeyinin şöbə müdiri, f.e.n. Şəfəq Əlibəyli, həmin muzeyin əməkdaşları Reyhan Aydəmir və Natəvan Mustafayeva, bir də Bakı Dövlət Universitetinin müəllimi Maya Fərəcova.

Bəli, mən və Məhərrəm Qasımlı daxil olmaqla 16 nəfər gəlib çatdıq İran Astarasına. Bizi orada yığcam bir avtobus gözləyirdi. Bu yaxınlarda AMEA Şərqşünaslıq İnstitutunda namizədlik dissertasiyası müdafiə etmiş d-r Əhəd Pişgərlə birlikdə Astara-Ərdəbil-Sərab-Bostanabad- Təbriz yoluna çıxdıq.

Yol çox gözəl olsa da yol boyu söz-söhbət və duzlu zarafatlarla yolu qısaltmağa çalışdıq. Məsələn, Sərab şəhərinə çatdıqda Məhərrəm Qasımlı üzünü bələdçimiz d-r Əhəd Pişgərə tutub belə dedi:

- Ağaye-Əhəd, bu da Sərab. İndi bizə ya şərab, ya kabab, ya da qatıq...

Ə.Pişgər də zarafatından qalmadı:

- Bəlkə hər üçü birlikdə?

Qatığı seçdik və bıçaqkəsməz camış qatığını pəh-pəhlə nuş elədik.

Maşınmız tərpəndi. Ağaye-Pişgər birdən-birə narahatlıqla soruşdu?

- Bəs hanı Məhərrəm müəllim?

Bir dükanın yanında qalan Məhərrəm Qasımlı maşının hərəkətindən xəbər tutmamışdı. O, gəlib maşına əyləşəndə dedim:

- Sən ki, camış qatığından belə məst oldun, bəs kabab və şərabdan necə olardın? Gülüşdük (Təbii ki, İranda şərab içmək qadağandır).

Maşınımız yenə şütüyürdü. Dərələr keçdik, aşırımlar aşdıq. Təbrizə yüz kilometrdən az qalır. Bu müddət ərzində bir neçə dağ-dərəni və aşırımı (Heyran və Şibli) arxada qoymuşduq. Şiblini keçərkən Ə.Pişgər belə bir məlumat verdi: Çar Rusiyasının İrana ikinci yürüşü zamanı (1826) Şibli adlı cəsur bir azərbaycanlı qızı əlinə silah götürüb bu yerdə döyüşmüş və rus gülləsindən həlak olmuşdu. Buna görə də bura Şibli aşırımı adlanır.

Təbrizə çatdıqsa da, Urmiyə gölünün iki sahili boyunca hərəkət edən gəmi-bərəyə çata bilmədik, çünki axşam saat 20-dən sonra həmin su yolu bağlı olur. Buna görə də Təbriz-Səlmas yolunu tutub irəli yollandıq. Təbrizdən çıxaçıxda sürücümüz yol hərəkəti qaydasını pozdu və polis onu maşından düşürdü. Məhərrəm Qasımlı sürücümüzə kömək məqsədilə o yol polisinin (müfəttişin) yanına getdi və sürücümüzün əfvini xahiş edərək Urmiyə şəhərinə elmi konfransa getdiyimizi və sürücünün cəmi bircə dəfə yol qayda-qanununu pozduğunu xüsusi qeyd etdi. Müfəttişin cavabı gözlənilməz oldu:

- Siz bizim əziz qonaqlarımızsınız, istəsəniz lap on dəfə pozun, - söyləyərək sürücünün vəsiqəsini dərhal özünə qaytardı (Görəsən belə halda qayda-qanunu pozan İran sürücüləri ilə bizim müfəttişlər necə rəftar edərdilər?).

Yenə gedirik. Sufiyan şəhəri. Bəlkə də Şah İsmayılın məşhur sufilərinin şərəfinə şəhər belə adlandırılmışdır.

Şəbüstərə 15 km. qalır. Mirzə Əli Möcüz, Mahmud Şəbüstəri, Məhəmməd Tağı Zehtabinin doğma şəhəri. Nədənsə Mirzə Əli Möcüzün bu beytini xatırladım:

*«Məclisi-işrətdə daim sazü tar olsun gərək,*

*Ärizi gülnarə bənzər bir nigar olsun gərək».*

Bir də elə həmin möcüzkar Möcüzün bu misrası yadıma düşdü:

*«Ümidin kəsmə, Möcüz, yaz anan təlim edən dildə».*

Təsuc şəhərinə çatmağımıza yarım saatlıq vaxt var. XVI əsrin sonlarındakı səfəvi-osmanlı döyüşləri zamanı əldən-ələ keçən Məsuc...

Xamnə kəndi. Mirzə Fətəli Axundovun, ustadım Mübariz Əlizadənin, məqame-müəzzəme-rəhbər vəzifəsini daşıyan ağaye- Xamneyinin ana yurdu Xamnə.

Yol haçalandı. Təsuc yolu sağda qaldı. Urmiyə istiqamətincə gedirik. Çehreqan şəhərciyinin kənarı. Mahmud Çehreqani necədir görəsən?

Səlmasa bir saatlıq yol qalır. Səid Səlmasinin doğma şəhəri.

Saat yarımdan sonra Urmiyədə olmalıyıq. İndisə Səlmasdayıq. Məhərrəm Qasımlı bu şəhərlə bağlı bir neçə bayatı dedi:

*O Səlmas,*
*O Xoydu, o da Səlmas.*
*Heç bəndə mənim kimi*
*Özünü oda salmaz.*

*Mən aşiqəm Səlmasa,*
*Xoydan gedək səlmasa.*
*İgidə kimsə neynər*
*Tanrım gözdən salmasa?*

*Səlmasdan gilas al get,*
*Gilənar, gilas al get,*
*Birin saxla nənənə,*
*Birin yar gilə sal, get.*

Quşçu aşırımı. Urmiyəyə 75 km. məsafə qalır. Üzümü Məhərrəmə tutub bədahətən dedim:

*Aşırımlar aşanda Səbrimiz*
*daralmasa,*
*Bağrımız yarılmasa,*
*Ey Məhərrəm Qasımlı,*

*Bir də dönnük Səlmasa.*

Urmiyəyə lap az qalır. Gecə saat birdir. Osmanlı hücumlarından bir vaxtlar bərbad vəziyyətə düşmüş olan Urmiyə görəsən necədir?

*«Doğra» niyə, «vur» niyə?*
*Abadı uçur niyə?*
*Osmanlı basqınından*
*Zillət çəkib Urmiyə.*

Sultanabadı keçib nəhayət ki, gəlib yetişdik Urmiyəyə. Ura!.. Urmiyə çayı. «Mirvari» oteli. Gecə saat iki olmasına baxmayaraq yemək hazırlamışdılar. Yeməkdən imtina edib bizim üçün ayrılan otaqlarda yatağa üzüqoyulu düşdük. Zarafat deyil. Min kilometrədək yol gəlmişdik...

Adətimə görə, bütün səfərlərimdə ilhamım bir neçə qat artır. Bu səfərdə də elə oldu. Qaranlıq yığışmaqdaydı. Əlim dəftər-qələmə uzandı və «Yaxın, uzaq» adlı uzun bir şe’r yazdım:

*İlan kimi*
*qıvrıla-qıvrıla uzanan*
*uzun yollarla,*
*dolambaclarla dolu*
*Bakı-Urmiyə yolu...*

Sübh tezdən durdum. Məhərrəm Qasımlı hələ yuxu bişirirdi. İlhamım «yaz» dedi və bir qəzəl yarandı:

Urmiyə, gördüm səni, göz sənə heyrandır, türklərin ey məskəni, can sənə qurbandır.

*Şərqi nədir Qərbi nə, Qərbi nədir Şərqi nə?*
*Bilməyirəm fərqi nə? Azəribaycandır.*

*Lütf eləsən Şahinə, Urmiyə, gəlləm yenə,*
*Əllərini ver mənə, dost əli İrandır,*

*Äzəribaycandır!*

25 may 2005. Urmiyə Mədəniyyət və İncəsənət sarayı. Binanın önündə ağ parça üzərində Azərbaycan Respublikası və Naxçıvandan gələn nümayəndələrə farsca «Urmiyə şəhərinə xoş gəlmisiniz» sözləri yazılmışdı. Həyət tələbələrlə doluydu. İranın müxtəlif elm mərkəzlərindən çoxlu nümayəndə də'vət olunmuşdu. Orada, cəmi bir həftə bundan əvvəl Təbriz konfransından gördüyüm və tanış olduğum bəzi alimləri gördüm (məsələn d-r Behruz Sərvətyan və d-r Məsumə Mədənkən adlı tədqiqatçıları).

İclas salonuna daxil olub əyləşdik. Səhnə gül-çiçək və müxtəlif plakatlarla bəzənmişdi. Bir lövhədə «Xaqanişünaslıq ədəbi Konfransı. 45 xordad 1384 və 25-26 may 2005» sözləri yazılmış, bu yüksək ədəbi tədbirin təşkilatçılarının adları göstərilmişdi: Urmiyə Universiteti, Qərbi Azərbaycan İrşad və İslam Mədəniyyəti Baş İdarəsi, «Məfaxir» təşkilatı və Qərbi Azərbaycan ostandarlığı.

Arxa tərəfimdə əyləşənlərdən biri mənə müraciət etdi:

- Şahin müəllim, xoş gəlmisiniz.

Tanıdım. Xanəli idi. Xanəli Kərimli. Naxçıvan Dövlət Universiteti «Xarici tələbələr» fakültəsinin dekanı. Millət vəkili. Onunla bir neçə il əvvəl Türkiyədə tanış olmuşdum. Yanında Universitetin dosenti Abbas Mehdiyev və AMEA Naxçıvan bölməsinin əməkdaşı Ramiz Qasımov əyləşmişdi. Xanəli öz şe'rlər kitabını mənə bağışladı. Onun şairliyindən xəbərim yoxdu. Elə oradaca kitabını varaqladım:

*«Bir udum su verdilər,*
*Əvəzində dənizi*
*Ərməğan istədilər,*
*Mən dəniz bağışladım...*
*Di gəl, üzüm gəlmədi Bir*
*damla istəməyə...»*

*(«Təzad» şe'rindən)*

Yaxşı deyib vallah!..

Konfransın açılış mərasiminin başlanmasına hələ var. Bir qəzəl qaraladım:

*Üç gün əvvəl bu diyardan yan olubdur Şahin,*
*İndisə Urmiyəyə mehman olubdur Şahin.*

*Bir yaşıl yarpaq isə töhfəsi dərvişlərin,*
*Siz təsəvvür eləyin sultan olubdur Şahin.*

*Mənə adəmlər içində daha adəm deməyin,*
*Atıb adəmliyini insan olubdur Şahin.*

*Adı Beytullah olan Cəfərini axtarıram,*
*Əmin olsun ki, gözü giryan olubdur Şahin.*

*Şahinin heç nəyə heyranlığı yoxdur, amma*
*Urmiyə torpağına heyran olubdur Şahin.*

Bu qəzəldəki iki mətləbə sevimli oxucularımın fikrini cəlb etmək istərdim: «Bir yaşıl yarpaq isə töhfəsi dərvişlərin...» misrası məşhur bir fars deyimindən qaynaqlanmışdır ki, həmin deyim belədir:

*«Bərge-səbzist töhfeye-dərviş,*
*Çe konəd, binəva həmin darəd».*
Tərcüməsi: *«Dərvişin töhfəsi bir yarpaqdır,*
*Neyləsin binəva, budur olanı».*

Demək istədiyim ikinci mətləb Beytulla Cəfəri ilə əlaqədardır. Mən onunla bir neçə il bundan qabaq Təbrizdə tanış olmuşdum və bir elmi yığıncaqda iştirak edirdik. Oteldə gecə yarısı İran və Azərbaycan şairlərinin müşairə (şe'rləşmə) yığıncağı keçirildi. O gecə Urmiyə şairlərini Beytulla Cəfəri təmsil edirdi. Bu haqda mənim «İran səfərnamələri» kitabımda belə bir qeyd vardır: «Məqbərətüş-şüəra»dan mehmanxanaya gecə saat 3-də qayıtdıq. Marağalı şairlər (Kərimi Marağayi, Asi Marağalı və s. - Ş.F.) müşairəni orada da davam etdirməyi qərara aldılar. Hacı Rafiq, Tofiq Cahangirov, Nazim Rizvan, Nadir Əlincə, Rasim Nəbioğlu və mən səhərə qədər şe'r dedik, bir-birimizi dinlədik (Bax: İran səfərnamələri, Bakı, 2003, səh 129).

Bəli, indi isə biz böyük bir salonda əyləşib «Xaqanişünaslıq» Elmi

Konfransının açılışını gözləyirdik. Səs qurğularından, aramsız olaraq bizim Azərbaycan musiqi və mahnıları səslənirdi. Nəhayət İran İslam Respublikasının dövlət himni çalındı və hamı ayağa qalxdı. Sonra Quran tilavəti. Aparıcı kürsü arxasına keçib hamımızı salamladı və Xaqanidən şe’r dedi. Aparıcını Qərbi Azərbaycan Ostanı İslam İrşadı İdarəsinin Baş Direktoru cənab Cavidani əvəz etdi və o, İran Mədəniyyət və İslam İrşadı nazirinin konfransa salam məktubunu sözbəsöz oxudu. Söz konfransın Elmi Katibi xanım d-r Fatimə Müdərresiyə verildi. Düz 15 dəqiqə çıxış edən bu xanım İran, Azərbaycan və Naxçıvan tədqiqatçılarının məruzələri ilə ziynətlənən «Xaqanişünaslıq» konfransının hazırlığından və s. əlaqədar işlərdən danışdı. D-r F.Müdərresi bildirdi ki, konfransın katibliyinə 210 məruzə göndərilmiş və onların bir hissəsi böyük məmnuniyyətlə qəbul olunmuşdur. O, ostandar Ənsarinin bu toplantıya xüsusi diqqət yetirdiyini xüsusilə nəzərə çatdırdı.

Urmiyə Universitetinin rektoru d-r Sadeqinin çıxışı da səmimi təsir bağışladı (o, hətta bir qədər Azərbaycan dilində danışmağı da unutmadı), mənim Tehran konfranslarından tanıdığım d-r Cəlil Təclilə (nədənsə, o gəlməmişdi), d-r Məhbub Taleiyə və d-r Fatimə Müdərresiyə öz təşəkkürünü bildirdi. D-r Sadeqi gələn həftə Bakıda böyük bir konqresin keçiriləcəyini və Urmiyə Universiteti alimlərinin də orada iştirak edəcəklərini elan etdi. O, sonra mərhum prof. Rüstəm Əliyevin xanımı Ruqiyyə Qənbərqızının vəfatı münasibətilə başsağlığı verdi.

Bizim Məhərrəm Qasımlı xitabət kürsüsünə də’vət edildi və xeyli alqışlandı. Onu Urmiyədə yaxşı tanıyırlar. O, ümumiyyətlə münasibət yaratmağı bacaran insandır, ünsiyyət sevəndir. Xaqani və xaqanişünaslıqdan ürək dolusu danışan bu ədəbiyyatşünas alim söz arası siyasəti və ədəbiyyatı bir-birinə uzlaşdıraraq ölkələrimiz və prezidentlərimiz arasındakı dostanə münasibətlərdən söz açmağı da unutmadı və bu münasibətin daim davam edəcəyini xüsusi vurğuladı. Professorun çıxışından sonra səhnəyə çıxan mütərcim Muradi (şairlik təxəllüsü Bulud Xəzəroğlu) onun çıxışının xülasəsini fars dilində çatdırdı.

Azərbaycan musiqisi səsləndi. Səlmas xanəndəsi Abbas Nikrəvan və onu müşayiət edən musiqiçilər elə ürəklə ifaçılıq etdilər ki, gözlərimiz yaşardı. A.Nikrəvan hətta «Qarabağ» sözünü deyərkən hönkürdü də. «Sarı gəlin» mahnısı. Ermənilərin fikrincə bu mahnıda sözü gedən sarı gəlin erməni

gəlinidir, çünki sarı rəng ermənilərin milli rəng rəmzidir. Erməni sayıqlaması. Ayıq olmaq lazımdır. Ermənilərin bizim mili xörək, musiqi, adət-ənənələrimizi «özəlləşdirmək» iştahları böyükdür!

Mən A.Nikrəvanın ifasına (Fikrət Əmir «Kor ərəbin mahnısı») qulaq asa-asa prof. M.Qasımlının bir az əvvəl mənə dediyi fikri beynimdə götür-qoy etməyə başladım. Düz deyirdi professor: «Bugünkü Azərbaycan mədəniyyətinin (musiqi sahəsində) gücü yox səviyyəsindədir. Bugün bizim burada gördüyümüz güc dünənki gücdür. Aygün Kazımova, Brilyant Dadaşova və Namiq Qaraçuxurlu ilə dünənki işi görmək və dünənki gücə qayıtmaq olmaz».

Musiqiçilərin çıxışı bitdi və «iftitahiyyə» («açılış») iclası qapandı.

Bir qədər istirahətdən sonra məruzələr başlandı. Rəyasət heyətində əyləşən alimlər arasında prof. Maarifə Hacıyeva da vardı. Maraqlı məruzələr dinlənildi, təbii ki, hamı Xaqani böyüklüyündən danışırdı. D -r Behruz Sərvətyan «Xaqani nə deyir və necə deyir?», d-r Cəlaləddin Kəzzazi «Xaqani xəyalının həndəsəsi», d-r Abbas Mahyar «Xaqani- sehirli kimyagər», d-r Məhəmmədəli Xalidyan «Xaqani divanında ulduzlar seyrinə bir baxış» adlı məqalələrində Xaqani mahirsöz ustadı, ədəbiyyat mühəndisi, kimyagər və astroloq kimi göz önündə canlandırıldı.

Nizamişünas alim olan d-r Sərvətyan məruzəsindən əvvəl bizim görkəmli nizamişünas tədqiqatçımız olan Azadə Rüstəmovanın vəfatı münasibətilə öz dərin hüznünü bildirdi, Xaqaninin «Roxsare-sobh» («Sübhün rüxsarı») qəsidəsini ətraflı təhlil etdi.

Qeyd edim ki, ondan sonra sözü mənə verdilər. Mən Xaqaninin adı, ləqəbləri və təxəllüsü barədəki məruzəmi bitirdikdən sonra o böyük şairə həsr etdiyim və fars dilində yazdığım qit’əmi oxudum.

Saat 15-dək fasilə elan olundu. Nahar yeməyinə «Mirvari» otelinə qayıtdıq. Sonra mənzilə girib bir qədər dincəldik. Məhərrəm dərhal yatdı, mənimsə ilhamım oyaq idi. Sol əlim qələmə, sağ əlim varağa uzandı:

*Getsə vəslin dəmi, ey yar, fəğan başlayacaq,*
*Gəlsə hicrin qəmi, ah-zar yaman başlayacaq.*

*Ürəyimdən gözümə dolmada qəm qətrələri,*

*İndi gözdən üzümə azmağa qan başlayacaq.*

*Olacaqdırmı görüşlər yenə, ya olmayacaq?*
*Bəli, bundan belə fərziyyə, güman başlayacaq...*

*Eybi yoxdur, əvəzində Bakımın vəsli gəlir,*
*Mənə qüdrət, mənə şöhrət, mənə şan başlayacaq.*

*Elə bir vəsl idi cənnətdə idim göz görəsi,*
*Şahina, bir də o cür vəsl haçan başlayacaq?*

Nahar və istirahətdən sonra yenidən saraya qayıtdıq. Seyid Cəfər Həmidi, Məhəmmədrza Bərzgər Xaliqi, Seyid Fəzlullah Mirqaderi və Rəhim Kuşeşin məruzələrindən sonra kürsüyə sinə gərən İmamverdi Həmidov «Ərəb ədəbiyyatşünaslarının tədqiqatında Xaqani Şirvaninin öyrənilməsi» mövzusunda elə bir çıxış etdi ki, ondan sonra məruzəyə başlayanların əksəriyyəti İmamverdiyə öz təşəkkürlərini bildirdilər. Vaxtı ilə mən şe'rlərimin birindi bir şair barədə demişdim: «Şe'r belə olsa, şair də belə». İndi isə dodaqaltı pıçıldadım. «Elm belə olar, alim də belə». Əhsən İmamverdi Həmidova və onun kimi alimlərimizə!

Bu günün məruzələri müxtəlif bölmə iclaslarında oxunduğundan mən bir çox tədqiqatçının çıxışlarını dinləyə bilmədim, lakin mənə çatan məlumatlara görə Qiymət Məhərrəmli («Əfzələddin Xaqani və Şirvan»), Aida Paşayeva («Xaqaninin iki qəzəlinin Azərbaycan dilinə naməlum tərcüməsi») və Aynurə Əliyeva («Xaqani divanının əlyazma nüsxələri haqqında»), habelə d-r Fəridə Davudi («Xaqani irfanı haqqında»), d-r Mənuçöhr Təşəkküri («Xaqani şe'rində Quran ayə və işarələrinin inikası»), d-r Əhməd Qənipur Məlikşah («Müasir şe'rdə Xaqani izləri») tərəfindən oxunan məruzələr də qızğın alqışlarla qarşılanmışdı. Bir məsələni də qeyd etməliyəm: Təəssüf ki, vaxtın darlığı və konfrans günlərinin məhdudluğu üzündən edilən məruzələr müzakirə olunmur və geniş diskussiyaya məruz qalmırdı. Amma Türkiyədə keçirilən elmi konfranslarda, əksinə, oxunan məruzədən çox onun müzakirəsi aparılırdı.

Nə isə, bu gün belə keçdi, daha doğrusu bu günün rəsmi hissəsi bu minvalla arxada qaldı. İclas dinləmələrindən sonra mənim tələbələri dinləmək vaxtım başladı. Urmiyəlilər ümumiyyətlə şe'ri çox sevir, şairlərlə təmasda

olmağa can atırlar. Görünür ki, mənim konfrans zamanı oxuduğum şe'rlər tələbələrin diqqətini cəlb etdiyindən onlar tez- tez yanıma gəlir, imkan tapıb öz şe'rlərini mənə oxumaq fürsətini əldən vermirdilər. Həmin gənclərdər Tanrıya Həbibi, Səid Bəgləri, Əli Mirzayi, Həmid Mehdizadə, Mehdi Sərablı, Əmir Hatəmzadə və başqaları ilə dəfələrlə şəkil çəkdirməli oldum.

Axşam isə saat 22-dən 24-dək «Nazlı» adlanan şəhərdən aralı bir yerdə (poetik addır, deyilmi?) bizi «şəbe-şe'r» adlandırdıqları bir mərasimə də'vət etdilər, amma mən bu gecəni «şe'r gecəsi» deyil, «mahnı gecəsi» adlandırardım, çünki gözlədiyimin əksinə olaraq şe'r deyil, mahnı oxundu, musiqi səsləndi. Abbas Nikrəvan üçlüyü və cavan bir fars xanəndəsi (skripkanın müşayiəti ilə) öz məharətlərini nümayiş etdirdilər. Abbasın keyfi heç yoxdu...

26 may 2005. «Mirvari»dəyəm. Üfüq gözəl qızların yanağı kimi qızarmışdır. Sakitlikdir. Durub çaykənarı parka gəldim, bir almanın içərisinə girib oturdum (bu parkda olan bütün oturacaqlar Urmiyənin rəmzi meyvəsi olan alma şəklindədir ki, onların hər birisində iki nəfər rahat əyləşə bilir). Qələm əlimdə, dəftər dizim üstündəydi. Bu gün «Üç gün» adlı sərbəst vəznli şe'rimi yazdım:

*Üç gün bundan qabaq üç*
*günüm keçməmişdi,*
*Bu gün*
*üç gün keçdi.*
*Üç gündə bir məsələ:*
*«Şe'r dünyasının şe'r cahanı -*
*Xaqani Şirvani».*

Urmiyə Mədəniyyət və İncəsənət sarayı yenə yolumuzu gözləyirdi. Gəldik, əyləşdik. Məruzələr biri digərini əvəz edir, məruzəçilər ürək dolusu şövq və həvəslə Xaqani şe'rini tərifləyir, Xaqani yaradıcılığına münasibət bildirirdilər. Bəli, Xaqani Şirvani ölməz şairdir. Y adıma gözəl bir deyim düşdü: O şəxslər ölməzdirlər ki, öləndən sonra ölmürlər! Ey Xaqani, ey Şirvan oğlu, Ey cahan oğlu, Sən ölməmisən! Sən yaşayırsan və yaşayacaqsan! Mən isə...

Ölümümdən əvvəl ölmüşəm

*Şe’ri qalsa da,*
*sözü qalsa da,*
*gözü qalsa da*
*bu fani dünyada,*
*Qalmadı Xaqani dünyada,*
*vaxtı yetdi,*
*getdi...*
*Getdi cənnətə doğru.*
*Yolu*
*müstəqim, düz oldu,*
*Ölümsüz oldu!*

Fikrimi cəmləşdirib bir neçə iranlı doktorun məruzələrini dinlədim (Barat Zəncani, Kavus Həsənli, Yəhya Taleban, Tahirə Xoşhal, Seyid Əhməd Parsa).

Yorulub foyeyə çıxdım. Yuxarıda adlarını çəkdiyim tələbələrdən biri mənə yaxınlaşdı, qəzəl oxudu. Öz qəzəli idi. Qəliz sözlərlə dolu bir qəzəl, eynən bizim «Məcməüş-şüəra»nın bəzi qəlizdil qəzəlxanlarının qəzəlləri kimi. Sonadək dinlədim. Şe’rinin necəliyini soruşdu. Fikrimi gizləmədim, dedim ki, qəlizdir. Deyəsən tənqidim xoşuna gəlmədi (Mən hələ tənqid xoşlayan adam görməmişəm). Ondan ayrıldıq. Köhnə dərdim təzələnmişdi. Bir qit’ə yazıldı:

*Öylə misralar yazırlar türk sözündən heç nə yox,*
*Qadir olsunlar təmiz misraya qadirlər gərək.*

*Köhnə şairlər kimi müşkil qəzəllər yazmıram,*
*Sadə sözlər söyləsinlər tazə şairlər gərək!*

15 dəqiqəlik fasilədən sonra məruzə dinləmələri yenidən başlandı. İki iranlı alimlə birlikdə mən də «heyəte-rəisə» adlanan rəyasət heyətindəyəm və indiki iclası idarə edirik. D-r Qulamrza Rəhmdil və d-r Nəsra İmamidən sonra prof. Möhsün Nağısoyluya söz verdim. Azərbaycan Respublikası Əlyazmalar İnstitutunda saxlanılan Xaqani əsərlərinin əlyazma nüsxələri barədə məlumat

verən Möhsünün çıxışı böyük marağa səbəb oldu. Şirvanda doğulub Təbrizdə ölən bir şairin Bakıda nə çox əlyazmaları varmış!... Möhsün Nağısoylu haqqında, bütün iştirakçılara aydın olsun deyə, mən fars dilində avtobioqrafik məlumat verdim və Urmiyədə yazdığım əvvəlki qəzəllərimdən birini oxudum.

Yuxarıda qeyd etdiyim kimi, məruzələr ayrı-ayrı bölmələrdə dinlənilirdi. Dinləmələrdə, bizimlə Urmiyəyə gələn alimlərdən Aida
Paşayeva Xaqaninin iki qəzəlinin Azərbaycan dilinə naməlum tərcüməsi, prof. Roza Eyvazova Xaqani əsərlərinin tərcümələrində hərflər simvolunun saxlanması, filologiya elmləri namizədi Şəfəq Əlibəyli Xaqani rübailərində təkrarlar sistemi, Vəfa Hacıyeva Nizami və Xaqani əsərlərində xüsusi adların semantikası, prof. Akif Hüseynov müasir ədəbiyyatda Xaqani obrazı, Reyhan Aydəmir Bahar Şirvani və onun Xaqani Şirvaniyə münasibəti, Natəvan Mustafayeva Xaqani dövründə saray şairlərinin status və vəzifələri mövzularında maraqlı məruzələrlə çıxışlar etdilər.

Konfransın bağlanış mərasimi. Gündüz saat 12-dir. Qərbi Azərbaycan ostandarı cənab Ənsari bu konfransı hazırlayan alimlərə öz təşəkkürünü bildirdi, məqalələrimizin çap olunacağını nəzərə çatdırdı. Ostandar söhbətarası dedi: Mən institutda oxuduğum vaxtlarda öz tələbə yoldaşlarımla mübahisə edərdim və bir-birimizdən soruşardıq: Kim daha üstündür, Xaqani ya Sədi? Mən üstünlüyü Xaqaniyə verərdim. Mən həqiqətən də Xaqanini çox sevirəm.

Ostandar Ənsari d-r Ziyaəddin Səccadiyə əsaslanaraq Xaqani barədə daha bir fikir söylədi: O, əgər «Eyvane-Mədain» qəsidəsindən başqa heç bir qəsidə yazmasaydı belə bütün dövrlərin ən böyük qəsidənevis şairi sayılardı.

Konfrans katibliyinin rəhbəri d-r Məhbub Taleiyə söz verildi. O, bir qədər davam edən təşəkkür nitqindən sonra «Azərbaycan Respublikasından gələn alim-tədqiqatçılara İranın dostları kimi» öz minnətdarlığını bildirdi.

Sonra Tehran Universitetinin ustadı d-r Əkbəri «Qətnamə»nin mətnini oxudu. Konfransın Elmi Katibi xanım Fatimə Müdərrisinin çıxışından sonra «Xaqanişünaslıq» konfransı qapandı.

26 may 2005. Günortadan sonra.

Məhərrəm Qasımlının təklifi ilə Urmiyəli aşıqlarla görüşə getdim. Şəhərin geniş xiyabanlarından biri. «Əli Qaraağaci qəhvəxanası». İçəri girərkən «yallah» («ya Allah») dedik və «yallah», «yallah»la qarşılandıq. Bir dəstə aşıq miz arxasında əyləşib hələlik söhbət edirdi, amma bir azdan çal-çağır

başlayacaqdı. Aşıq Bulud, Aşıq Qurban Əliyar, Aşıq Əli Kərimi (Qaraağaci), Aşıq İsməli Lütfi, Aşıq Əyyub Novzad, Aşıq
Nurəddin Əlizadə və Aşıq Hüseynağa Dəstgir. Hələlik bu aşıqlardı.

Dərhal önümüzə çay gəldi. Qəhvə yoxdu. Məhərrəmə dedim ki, buranın adını «çayxana» qoysalar daha düzgün olar, axı qəhvə yoxdur. Dedi ki, görünür əvvəllər qəhvə verərmişlər.

Qəhvəxanaya göz yetirirəm. Divarlardan Aşıq Məhəmmədəli Hurazərin, Aşıq Dərvişin, Aşıq Hacı Əbdürrəhman Dədə Katibin və başqa aşıqların rəngli boya ilə çəkilmiş şəkilləri asılıb.

Aşıq Əli Qaraağaci sazını əlinə götürüb başladı nə başladı. «Kəsmə divani». Bu divani məni kəsdi, nə kəsdi. Bülbül kimi cəh-cəh vururdu Əli. Əlim üzümdə qalmışdı. «Kəsmə divani».

Qapı açılıb-örtülür, başqa aşıqlar da gəlirlər. Özü də hərənin öz sazı (yenə «yallah-yallah»).

Aşıq Əli isə qurtarmaq bilmirdi. O, Aşıq Balovlu Miskinin bir qoşmasının ifasından sonra onun təcnisinə keçdi. Məhərrəm qulağıma pıçıldadı: - Böyük məktəbdir Urmiyə aşıq məktəbi!

Aşıq Əlidən sonra Aşıq Bulud və Aşıq Əyyub ortada var-gəl etməyə başladılar. Aşıqlar dəyişirdilər. Aşıq Bulud «Koroğlu» dastanından «Üstünə» rədifli qoşmanın ilk bəndini oxudu («Cəngi» avazı üstündə), ikinci bəndi isə Aşıq Əyyub davam etdirdi:

*«Sizə deyim, dəlilərim,*
*Üstümüzə paşa gəlir...»*

Üçüncü bənd Buluda qismət oldu: «Düşdüm Bolunun tovuna...». Aldı Aşıq Əyyub: «Yazılanlar başa gəlir.». Aşıq Bulud «Üstünə», Aşıq Əyyubsa «Gəlir» rədifli qoşmaları ifa edirdi. Aşıq Bulud «Üstünə», Aşıq Əyyub «Gəlir». Qoşma bəndləri bir-birinin üstünə gəldi nə gəldi.

Aşıq Dərvişin şagirdi Aşıq İsməli Lütfi «Kəsmə hicran» havasından «Söylə görüm nə məkandan gəlmisən?» (sözləri Qasım Qurbaninindir) deyən kimi Aşıq Hüseynağa Dəstgir onun sözünü davam etdirib özü deməyə başladı (Aşıq Əmrahdan) və beləliklə deyişmə başladı.

Qapı açıldı və Aşıq Dehqan göründü. Bizim bəzi xanəndələr kimi saçı

xınalı Aşıq Dehqan. Məhərrəm dedi ki, Urmiyənin ən məşhur aşığı elə bu kişidir!

Meydan Aşıq Dehqana verildi. «Abdulla xan» dastanından «Tərəkəmə» hissəsi:

*«Ey ağalar, bir zamana gəlmişik*
*Bülbüllər döşənir xar ayağına.*
*Varlı varın verib canın qurtatır,*
*Yoxsulu çəkirlər dar ayağına...».*

Növbə Aşıq Qurbana çatdı və o da başladı nə başladı (Təbriz məktəbi aşıqlarındandır). «Ceyrani Kərəmi» üstündə sanki elə Aşıq Abbas Tufarqanlı kimi «Özün kömək elə, ay ağa, haray» deyə qiyyə çəkdi Aşıq Qurban. Çox məharətlə oxuyurdu:

*«Atasından anasından gül, Gülgəz indi, Gülgəz indi,*
*Sən məni ağlamadan gül, Gülgəz indi, Gülgəz indi».*

Məhərrəm dedi ki, bu tam cinasdır, bəzən adına «bütöv cinas» da deyirlər. O, Aşıq Qurbana sifariş etdi:

- Aşıq Qurban, bir «Qaradağ gözəlləməsi» oxu.

Oxudu nə oxudu. Dedi nə dedi!..

*«Guşeyi-vəhdət nə əcəb ca imiş,*

*Sirri-nihan orda hüveyda imiş».*

Dedikdən sonra yenə də Nəbatidən:

*«Nəbati, nə dəng olubsan,*
*Yoxsa məsti-bəng olubsan,*
*Niyə yenə çəng olubsan,*
*Dur ey divanə, divanə».*

Bəndi ilə qurtaran qoşmanı ifa etdi. Amma Aşıq Qurbanın Nəbatidən əl çəkmək fikri yoxdu. «Ay pəri» rədifli gözəl qoşma. Gözəl şair, gözəl aşıq...

Aşıq Qurban «Şah Xətai» havasını avazlandırdı və dedi ki, bu silsilədən olan şe'rlər Şeyx Heydər Səfəvinin təkyəsində yaranıb. Sonra elan etdi: - «Koroğlu» dastanından «Meydan cəngisi»!Məhərrəm qulağıma dedi: - Bu mahnı «Qaradağ cəngisi» də adlanır. Aşıq Qurban mənim təəccübümə səbəb olan bir söz də dedi: - Bu hava major qamı üstündədir.

Major qamı və aşıq! Görəsən başqa aşıqlar major qamının nə olduğunu bilirmi?

*«Misri qılınc qızıl qana boyansın,*
*Tutulubdu, bir Eyvazım əldədi...».*

Aşıqlardan çox böyük təəssürat hissi ilə ayrıldıq. Saat 21-də Urmiyə ostandarı cənab Ənsarinin qəbulunda olmalıyıq. Şərəfimizə ziyafət verir.

Geniş bir zalın dəyirmi bir mizi. Üzərində şərbət, meyvə və mikrofonlar. Qarşımızda qələm və varaqlar.

Ostandar gəldi və gülə-gülə bizi salamladı. Məhbub Talei fars və Azərbaycan dillərində bir neçə kəlmə danışdı və bizi ostandara təqdim etdikdən sonra sözü nümayəndə heyətimizin rəhbəri Məhərrəm Qasımlıya verdi. Professorumuz da, kiçik bir siyasi preambuladan sonra (bizim dövrdə elm də bir qədər siyasiləşib) «Xaqanişünaslıq» konfransını hazırlayanlara və xüsusilə ostandar cənab Ənsariyə təşəkkürünü bildirdi.

D-r Behruz Sərvətyan (Nizamişünas alimdir. O, hazırda Hinduşah Naxçıvaninin «Dəsturül-katib fi təyinül-məratib» əsəri üzərində tədqiqat işi aparır) hər iki dildə danışaraq bir də mərhumə Azadə Rüstəmovanı xatırladı, sonrasa Hafiz Şirazinin bir qəzəlini öz tərcüməsində oxudu:

*«Dərdi-eşqin çəkib, dayan, dinmə,*

*Dürdi-hicrin içib, aman, dinmə».*

İnsafən yaxşı tərcümə etmişdi. Bu beytin orijinalı belədir:

*«Dərde-eşqi keşideəm ke, məpors,*
*Zəhre-hecri çeşideəm ke, məpors».*

Söz mənə verildi və Urmiyədə yazdığım iki qəzəlimi dedim. Şəfəq Əlibəyli də Hafizdən tərcümə etdiyi bir qəzəli yığışanlara təqdim etdi. Axırda sözünü bildirən ostandar cənab Ənsari Zəncan şəhərində doğulduğunu qeyd edərək Zəncan azərbaycanlılarının dilinin urmiyəlilərin dillərindən fərqləndiyini və bizim Lənkəran ləhcəsinə yaxın olduğunu bildirdi. Məlum oldu ki, o Bakı və Gəncəyə də gəlmiş, prezident Xatəminin keçən il Azərbaycana səfəri zamanı onu müşayiət edənlərin biri olmuşdur.

Ostandarla görüşümüz şam yeməyi ilə başa çatdı. «Mirvari»yə qayıtdıq. Uzun zaman Urmiyə və urmiyəlilər barədə düşündüm, burada tanış olduğum şəxslərin surətləri nəzərimdə canlandı: Hüseyn Ədiban - təbrizli tələbə, şair. Tovhid Məlikzadə - urmiyəli alim-tədqiqatçı. Mehriban bir insan. «Urmiyə» sözünün mə'nasını mənə o açdı: Bu ifadə dörd min il bundan əvvəl yaranmışdır. Aşur kitabələrində bu şəhər «Urmet» kimi göstərilmişdir ki, «ur» - şəhər, «met» isə «mitani», yəni mitanilərin (hur- rilərin) şəhəri mə'nasını verir. Camal Ayrumlu - ədəbiyyatşünas alim. Mahmud Sadiqpur Şami - şair. O, Xaqani barədə yazdığı qəsidəsini mənə verdi. Bu qəsidə «Mədain xərabələri»nin öz vəzn və bəhrində yazılmışdır:

*«БıГ nabiğə şairdir tutmuş adı hər yam,*
*Kimdir o böyük insan? Xaqaniye-Şirvani!*

*Eyvane-Mədaindən bir dəfə görüş etmiş,*
*Yazmış elə sözlər ki, heyran edir insanı.*

*БlГ qüdrəti vardır ki, yoxdur tayı aləmdə,*
*Qaldırmadı heç şair şerində bu tufanı.*

*БlГ süfrəli şairdir «Hafiz»lərə pay vermiş,*
*Qüdrətdə, fəsahətdə tutmuş adı dünyanı.*

*Qartal kimi məğrurdur, baş əgmədi cəlladə,*
*Бu xatirə şirvanşah etdi onu zindani.*

*Бu farsi yazan şair, səhv eyləmə, türk idi,*
*Б1Г farsi tapıb göstər bu türkə ola sani.*
*Bəli, özü türk idi, yazdı ərəbi-farsi,*
*Diqqət elə, şe'rində gör səpke-Xorasani.*

*Al bir oxu divanın, elmin dəniziymiş o,*
*Gördüm daha mat qaldım «Mənzumeye-tərsa»ni.*

*Şe'rindəki təşbihlər bahsan hələ də «nov»durr,*
*Hər kəs oxuyur söylər: - Bəh-bəh, yaşa, Xaqani!*

*Amma bu ulu şair şe'rin elə yazmışdır Öz sözləri*
*altında olmuş özü pünhani.*

*Əşarını dərk etmək el milə hünər istər,*
*Gör bir necə sığdırmış bir kasədə ümmani.*

*Fikri elə üstündür, xəlqi demirəm, hətta Dahilər*
*açanmırlar o gizli müəmmanı.*

*Bir dalğalı dəryadır qərq oldu düşən şair,*
*Yarəb, necə xəlq etdi Xaqani bu divani?*

*Getdi İraqı gəzdi, bir məsnəvi xəlq etdi,*
*Ordan gətirən töhfə sanma ki, ola fani.*

*Vardır bir axar təbi, əşarını kim görsə Hər dəm*
*gətirər yadə bir rude-xoruşani.*

*Bu təbe-lətif ilə əlhəq yeri vardır ki,*
*Qüdrətdə bizim xəlqin olsun o da Həssani.*

*Həm şe'r ilə sənətdə, həm elmi-bəlağətdə*
*Verməzdi məharətdə heç şairə meydani.*

*Xaqani kimi aslan öysə özünü həqdir Orda ki,*
*gəlib tülkü şe'rin ola sultani.*

*Бй1Бй1 necə tab eylər, fəryadü fəğan etməz*
*БадДа gülün üstündə görsə qara qarğanı.*

*Dünya, əcəba, daim alçaqlara yar oldu,*
*Tən etmə əgər şair həcv eyləsə dövrani.*

*Ey Şami, sən ilhami Xaqanidən almışdın,*
*Yoxsa edə bilməzdin meydanda bu cövlani».*

Mahmud Sadiqpur Şami mənə başqa bir şe'rini də verdi. Qoşmadır. Ustad Xəlil Həqiqətgərə ithaf olunmuş heca vəznli bir nəzmdir. Zəifdir.

Yenə xəyalım «Aşıqlar qəhvəxanası»na uçdu. Aşıq Dehqan. O, «Şah İsmayıl» dastanını hər axşam üç saat olmaqla üç axşam danışa bilir. «Abbas və Gülgəz»i danışmaq üçünsə ona iyirmi axşam vaxt lazımdır...

27 may 2005. Saat 10 radələrində Urmiyəni tərk etdik. Gölə doğru gedirik. Urmiyə gölünə. Duzlu göldür. Çimənlər batmır.

Nəhayət göl göründü. Maşınımız bu gölü gəmi-bərədə keçəcək.

Bərədə çoxlu avtomobil, insan və hətta mal-qara var. Gölü 20 dəqiqəyə keçib yolumuzu 2 saat qısaltdıq.

Maşınımız yenə şosse yolu ilə şütüyür. Elə maşındaca bir saatdan çox şe'r dedik. Məni Qiymət, Qiyməti Roza, Rozanı Məhərrəm əvəz etdi. Təbrizə gəlib çatdıq, Bostanabadı ötdük, Sərabdan keçdik. Həmin şəhəri. Əhəd Pişgər burada bizi tərk etdi, lakin o, dəfələrlə İran Astarası Gömrük İdarəsinin rəis müavini ağaye-Səfarudiyə mobil telefonla zəng vurub bizi, geciksək də, qarşılamalarını xahiş elədi.

Budur, İran Astarası. Ağaye-Səfarudi qarşımıza yüyürür. Tez- tələsik sənədləşmə aparılır.

Azərbaycan Astarası. Gömrük İdarəsinin rəis müavini Qadir Abıyev - bizim köhnə dostumuz. Qadir müəllim bizi yola saldı. Bakıya doğru!

Sağ ol, İran! Salam Azərbaycan! Salamat qal, Urmiyə! Sağlıq olsa, yenə görüşərik!!!

Бак1-игт1уэ-Бак1, 24-28 may 2005

**On dördüncü Səfərnamə Şe'rləri**

*I*
*YAXIN, UZAQ...*

*İlan kimi*
*qıvrıla-qıvrıla uzanan*
*uzun yollarla,*
*dolambaclarla dolu Bakı*
*- Urmiyə yolu...*
*...Nəhayət gəlib çatdıq*
*«Mirvari» adlanan*
*çaykənarı otelə.*
*Adı çox gözəldi.*
*Yanımızdan axan çay*
*xoşumuza gəldi,*
*Amma, bu nəydi başımıza gəldi -*
*hər zaman*
*vəsl-vüsal oyunu oynardıq,*
*Urmiyədəsə*
*mən hicran, sən fəraqsan,*
*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*

*Neyləmək,*
*yol uzun olar, kəsə olar,*
*heç düşünüb-eləmirik bu uzaq*
*yollarda bizə nəsə olar,*
*Saçının tellərini bir-birinə*
*calasam keçib-gəldiyimiz yoldan*
*qısa olar.*
*Şükürlər olsun bu günə.*
*Gileylənməyək,*
*Dəyməyək ev sahibinin könlünə,*
*Axı*
*mən də, sən də qonaqsan,*

*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*
*Əlimi uzatsam əlinə dəyər,*
*telim telinə,*
*Bu gün biz*
*həmişəki kimi*
*birgə olsaq*
*da,*
*danışa bilmədik ürək istəyincə,*
*həsrət qaldı dilim dilinə.*
*Çıxarıq əvəzini, çünki mən -*
*qaynar kürə*
*sən - yanar ocaqsan,*
*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*
*Sanmıram ki, köməyim yoxdu,*
*köməyimsən,*
*Eşqimin yetim-yesir gülüstanında*
*gülümsən, çiçəyimsən,*
*Sən mənim əzəli diləyimsən,*
*Su kimi, hava kimi gərəyimsən,*
*Bakıda da, burada da*
*mənə dayaqsan,*
*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*
*Yenicə girmişik mənzilə,*
*amma aramızda*
*sədd var,*
*divar var.*
*Qəlbimizdə bir gecəlik, lap*
*qısa bir gecəlik*
*intizar var,*
*qübar var.*
*Mən oyağam,*

*Sən də oyaqsan,*
*Mən bir azdan*
*oyaq olmayacağam.*
*Sən bir azdan*
*uyuyacaqsan.*
*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*
*Uşaqlıq çağımdan bəri lap*
*ləzgilər kimi*
*tərsəm,*
*inadkaram.*
*Bilirəm ki, bu xislətimlə,*
*xasiyyətimlə*
*həmişəlik varam.*
*Minnət qoymuram sənə, Bilirəm*
*ki,*

*eşqinə minnətdaram.*
*Amma, düşünürəm hərdən*
*qədrimi bilməyəcəksən,*
*«gəl» desəm*
*gəlməyəcəksən,*
*«get» desəm*
*ağlayacaqsan,*
*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*
*Biz elə bu gün*
*Bakıdan Urmiyəyə yönəlmişik,*
*Bilirik neçin yönəlmişik,*
*niyə yönəlmişik,*
*Xaqani Şirvanini yad etmək üçün gözəl*
*bir ölkəyə gəlmişik - Azərbaycandan*
*İrana gəlmişik, Azərbaycandan*
*Azərbaycana gəlmişik. Orda da*
*dayaqdın mənə,*
*Burda da mənə dayaqsan,*
*Amma*
*hal-hazırda*
*Sən mənə nə qədər yaxın,*
*Sən məndən nə qədər uzaqsan.*

*Urmiyə şəhəri*
*24.05.2005*

*II*
*QƏZƏL*

*Urmiyə, gördüm səni, göz sənə heyrandır,*
*Türklərin ey məskəni, can sənə qurbandır.*

*Şərqi nədir, Qərbi nə? Qərbi nədir, Şərqi nə?*
*Бilməyirəm fərqi nə? Azəribaycandır!*

*Düşmən üzə olsa ağ, sinəmizə çəksə dağ,*
*Əldə qələm, həm varaq xəncərü qalxandır.*

*Eylə vida, at qəmi, zar eləmə aləmi,*
*Hər görüşün son dəmi, bəlli ki, hicrandır.*

*Бax çiçəyə, bax gülə, bax gülə, bax bülbülə,*
*Urmiyəni seyr elə, bəlkə son imkandır.*

*Əl «bir olaq biz» deyir, dil «xudahafiz» deyir,*
*Göz -yaşını gizləyir, göz yenə giryandır.*

*Lütf eləsən Şahinə, Urmiyə, gəlləm yenə,*
*Əllərini ver mənə, dost əli İrandır!*
*Azəribaycandır!*

*Urmiyə,*
*25.05.2005*

*III*
*QƏZƏL*

*Üç gün əvvəl bu diyardan yan olubdur Şahin,*
*İndisə Urmiyəyə mehman olubdur Şahin.*

*Zahirən gözlərə sakit dəyirəm göl təhəri,*
*Püskürür amma alov, vulkan olubdur Şahin.*

*Б1Г qələm, bir neçə dəftər və kitab sahibiyəm,*
*Düşünür bəzi gədalər xan olubdur Şahin.*

*Xəlqi söz söyləyirəm xəlqə, şe'r bağımda,*
*Gül-çiçək bəsləyirəm, bağban olubdur Şahin.*

*Б1Г yaşıl yarpaq isə töhfəsi dərvişlərin*[18]*,*
*Siz təsəvvür eləyin sultan olubdur Şahin.*

*Mənə adəmlər içində daha adəm deməyin,*
*Atıb adəmliyini insan olubdur Şahin.*

*Adı Бeytullah olan Cəfərini axtarıram*[19]*,*
*Əmin olsun ki, gözü giryan olubdur Şahin.*

*Şahinin heç nəyə heyranlığı yoxdur, amma*
*Urmiyə torpağına heyran olubdur Şahin.*

*25.05.2005*

---

[18] *«Bərgi-səbzist tohfeyi-dərviş Çe konəd binəva, həmin darəd»*

*Tərcüməsi: «Dərvişin töhfəsi bir yarpaqdır,*
*Neyləsin binəva, budur olanı».*

[19] *Bir neçə ilə əvvəl Tehranda tanış olduğum Urmiyəli şair.*

*IV*
*QƏZƏL*

*Getsə vəslin dəmi, ey yar, fəğan başlayacaq,*
*Gəlsə hicran qəmi, ah-zar yaman başlayacaq.*

*Ürəyimdən gözümə dolmada qəm qətrələri,*
*İndi gözdən üzümə axmağa qan başlayacaq.*

*Olacaqdırmı görüşlər yenə, ya olmayacaq?*
*Bəli, bundan belə fərziyyə, güman başlayacaq.*

*Urmiyə ilə vüsalım mənə ilham verdi,*
*Neçə gün Urmiyə haqqında bəyan başlayacaq.*

*Qələmim eyləyəcək hüsnünü tərif neçə gün,*
*Neçə gün sonrasa hicran, həyəcan başlayacaq.*

*Eybi yoxdur, əvəzində Bakımın vəsli gəlir,*
*Mənə qüdrət, mənə şöhrət, mənə şan başlayacaq.*

*Elə bir vəsl idi cənnətdə idim göz görəsi,*
*Şahina, bir də o cür vəsl haçan başlayacaq?*

*25 may 2005*

*V*
*ÜÇ GÜN*

*Üç gün bundan qabaq Üç*
*günüm keçməmişdi,*
*Bu gün*
*üç gün keçdi.*
*Üç gündə bir məsələ:*
*«Şe'r dünyasının şe'r cahanı -*
*Xaqani Şirvani!»*
*Üç gündə Xaqani söhbəti,*
*Xaqani şeriyyəti və*
*çoxlu məruzə - alimlər*
*eşq ilə*
*öz elm badələrini təqdim*
*etdilər bizə.*
*«Eşq» də üç hərf,*
*«Elm» də.*
*Bu üç gündə Elmdən başqa,*
*Eşqdən başqa gözümüz*
*olmadı heç nədə. Elm - Eşq!*
*Eşq - Elm!*
*Hansı üstündür,*
*nə bilim?*
*Onlarla alim,*
*Onlarla müəllim,*
*Onlarla şair söz*
*söylədilər Elmə dair,*
*Eşqə dair.*
*Arada oldu fasilə Və*
*Xanəndə Abbas Nikrəvan*
*mahnı oxudu eşq ilə -*
*«San gəlin»,*
*«Qaragilə».*

*Amma heç keyfi yoxdu,*
*Bilmədim ki, nə haldır,*
*Eşq bəzən qan qaraldır.*
*Elm eşqi!*
*Eşq elmi!*
*Çıxışçılar*
*alim kimi,*
*aşiq kimi*
*söz söylədilər Və*
*«Xaqani Şirvani»,*
*«Xaqani Şirvani»,*
*«Xaqani Şirvani»*
*dedilər.*
*Elmdə Eşq vardı,*
*Eşqdə Elm.*
*Elm - Eşq!*
*Eşq - Elm!*
*Hansı üstündür?*
*nə*
*bilim,*
*nə*
*bilim,*
*nə*
*bilim...*

*25 may 2005*

*VI*
*Ölümümdən əvvəl ölmüşəm*

*Şeri qalsa da,*
*sözü qalsa da,*
*gözü qalsa da*
*bu fani dünyada,*
*Qalmadı Xaqani dünyada.*
*vaxtı yetdi,*

*getdi...*
*Cənnətə doğru.*
*Yolu.*

*25.05.2005*

*VII*
*QİTƏ*

*Öylə misralar yazırlar türk sözündən heç nə yox,*
*Qadir olsunlar təmiz misrayə qadirlər gərək.*

*Fars-ərəbdən söz dilənmək heç də mahirlik deyil,*
*Çox məharət eyləsinlər indi mahirlər gərək.*

*Saf alınmaz gər zərə bir qeyri ünsür qatsalar,*
*Zivər olmaqçın - təmiz olsun həmişə zər gərək.*

*Köhnə şairlər kimi müşkil qəzəllər yazmıram,*
*Sadə sözlər söyləsinlər tazə şairlər gərək!!![20]*

*Urmiyə - Bakı yolu,*
*26.05.2005*

*VIII*
*QİTƏ*

*«Həmigofiəm ke Xaqani dəriğaguye-mən başəd,*
*Dəriğa, mən şodəm əknun dəriğaguye-Xaqani» Tərcüməsi:*
*«Deyirdim mən ki, Xaqani deyər ağı ölərkən mən,*
*Təəssüflər ki, mən yazdım bugün Xaqaniyə ağı»*
Nizami Gəncəvi

*«Xoda aməd bexabəm, Əfzələddin-ra bepərsidəm,*

---

[20] *Qeyd: Mən may ayının 24-dən 27-dək Urmiyə şəhərində oldum. Məqsəd böyük Xaqanini bir daha yad etmək, onun şərəfinə şe'rlər yazmaqdı. Mən əvvəllər də bu şairin şerlərinə müxtəlif şerlər yazmışam, hətta ona fars dilində bir qitə də həsr etmişəm. Zənn edirəm ki, oxuculara həmin şerləri də təqdim etsəm yerinə düşər.*

*Begofta «Cəm» gəşte dər beheşt orduye-Xaqani».*

*Kəlaməş həmço ətre-gol moəttər saxt donya-ra,*
*Məra həm mikeşəd dər bağe-rezvan buye-Xaqani.*

*Pəsəndidəm mən ahuye-qəsayed-ra, vəli goftənd:*
*Moyəssər şod be Qaani fəqət ahuye-Xaqani!*

*Həme əbyate-vey dorr-o sədəf, lələ-o tela, guyi*
*Xodəş dəft-o vəli baqqi bemand incuye-Xaqani.*

*Təvəggoh-ra, negahəm-ra nəmiduzəm be hosne-gol,*
*Təvəccoh suye-Xaqani, negahem suye-Xaqani.*

*Nezami, ey Nezamoş-şe'r, didi Əfzələddin-ra,*
*Bezudi mən hamixahəm bebinəm ruye-Xaqani.*

## *IX*
## *XAQANİŞE'RLƏRİNƏ TƏZMİNLƏR*

*«Eşqişi vəsl ilə hicrandan keçib,*
*Dərdimiz, eyvah, dərmandan*
*keçib»*[21]*.*

*Бilməyibsən qədrini sən canımın,*
*Atdığın oxlar gəlib candan keçib.*

*Asanım müşkil olur gündən-günə,*
*Müşkilim asan imiş, asan keçib.*

*Qürrələnmə heç zaman, ey sariban,*
*Sən keçən yollarla çox karvan keçib.*

*Tarixin hər dərsi ibrətdir bizə,*
*Ölkəmizdən xan keçib, sultan keçib.*

*Hardadır Şah İsmayıl, Sultan Səlim?*
*Türk elindən sanki şöhrət-şan keçib.*

*Təzim eylə Şirvanın torpağına,*
*Şahina, Xaqani Şirvandan keçib!*

## *X*

*Şirvanı edib tərk elə ki dərbədər*
*oldu, Xaqaniyə şərbət ki içirdi, zəhər*
*oldu.*

---

[21] *«Kare-eşq əz vəsl-o hecran dərgozəşt,*
*Dərde-ma əz dəste-dərman dərgozəşt».*
*Xaqani*

*Mən həm nə qədər ölkəyə etdim səfər, amma*
*İqbal o səfərlərdə mənə həmsəfər oldu.*

*Sonra yox edib şənliyi qəm-qüssəni tapdım,*
*Dildarı itirdim deyə həzzim hədər oldu.*

*İqdam eləyərdim gecə-gündüz şərə qarşı,*
*Labüddü ziyanım deyə xeyrim zərər oldu.*

*«Halım bəd idi, amma ki, şükr eyləmədim mən,*
*Бəd hal dönüb, taleyə bax ki, betər oldu»*[22].

*Amma, qəzəlin saflığı uğrunda döyüşdüm,*
*Saf dilli qəzəl yazmağa məndə təpər oldu.*

*Atdım neçə yad gəlməni dildən bacarıqla,*
*Бədxahlərin cəhdi mənə bisəmər oldu.*

*Бildim elə ki qiymətimi, zərgərə döndüm,*
*Şahin, qəzəlim qədrini artırdı, zər oldu.*

*XI*

*Əldən düşüb əl, olmasa taqət necə yazsın?*
*Etmirsə qələm hökmə itaət necə yazsın?*

*Allah eşidir hər şeyi, Allah görürsə,*
*Xəlvət sözü, ey sevgili afət, necə yazsın?*

*Ey yar, göyərçinlər aparmır daha namə,*
*Yoxsa onu göndərməyə fürsət, necə yazsın?*

[22] *«БэД bud тэга hül, Ье ап шокг пэкэгДэт,*
*Та Ласэгэт ап Ща1 ке ЬэД bud Ье1эг шоД».*
*Хадат*

*«Xaqani sənə yazmayacaqdır daha məktub,*
*Çünki sənə səndən o şikayət necə yazsın?»*
*1.*

*Həsrət çəkirəm Təbrizə, Urmiyyəyə həsrət,*
*Əsdirsə əgər əlləri həsrət, necə yazsın?*

*Hərçənd qiyamət günü başlanmayıb, amma*
*Çox yerdə qopur gündə qiyamət, necə yazsın?*

*Yerdən qova bilmir niyə cahilliyi aləm?*

*Şahin ki, çəkir bunca əziyyət, necə yazsın?*

*XII*

*Nə uca rütbə, nə inci, nə də zər lazımdır,*
*Mənə səndən, gözəlim, cüzi nəzər lazımdır.*

*Eşqə düşmək hələ aşiqliyə ilk mərhələdir,*
*Aşiq olmaq diləyənlərdə hünər lazımdır.*

*Bağda, sərhəddə çəpər istəmirəm mən, amma*
*Aramızda bizim, əğyar, çəpər lazımdır.*

*Mən dəxi sən kimiyəm, ey gözü ağlar Məcnun,*
*Gözlərim Leylimi görməzsə, qəhər lazımdır.*

*«Səfərim Kəbəyə - Bağdadə məni çatdırdı,*
*Barəkallah, hər il böylə səfər lazımdır»2.* [23] [24]

---

[23] *«Name nənevisəd be to Xaqani vo ozrəst,*
*K-əz to be to nətvan gele kərdən, çe nevisəd?»*
*Xaqani*

[24] *«Səfəre-Kəbe be Bağdad rəsanid*
*məra, Barəkallah, həme sal in səfərəm*

*Əfzələddin diləyibdir ki, hər il həccə gedə,*
*İstəyən Kəbəni hər şəxsə zəfər lazımdır.*

*Şahin isə göyə uçmaq diləyir tezliklə,*
*Yara göyqurşağı rəngində kəmər lazımdır.*

*XIII*

*«Eşq imiş hər nə var aləmdə,*
*Elm bir qiylü qall imiş ancaq»*
*Füzuli*

*Aşiqəm, mən Qeysü Leyla görmüşəm,*
*Az deyil sinim ki, dünya görmüşəm.*

*Surətə çox baxmışam arif kimi,*
*Çünki mən surətdə mə'na görmüşəm.*

*«Qarr» edən qarğaləri görmür gözüm,*
*Amma çox görsənməz ənqa görmüşəm.*

*Yer çox dərya var idi, oldu yox,*
*Göz yaşından amma dərya görmüşəm.*

*Var mey üstündə təcəlla axtaran,*
*Mən şeh üstündə təcəlla görmüşəm.*

*«Misrü Bağdadımdı Şirvan, onda mən Həm*
*Zibeydə[1], həm Züleyxa[2] görmüşəm»*[25][26][27].
*Xeyli sözlər var ki, bica dinlədim,*

---

*bayesti».*
*Xaqani*

[25] *Cəfər ibn Mənsurun (vəfatı h.q. 216-m.831) qızı; Xəlifə Harun ər-Rəşidin zövcəsi və xəlifə Əminin anası. Be beytdə Xaqaninin kimi nəzərdə tutduğu mənə aydın olmadı.*

[26] *« Yusif və Züleyxa» dastanı qəhrəmanlıarından biri.*

[27] *«Misrü Bəğdadəst Şirvan, ta dər u,*
*Həm Zibeydə, həm Züleyxa dideəm».*
*Xaqani*

*Xeyli üzlər var ki, bica görmüşəm.*

*Aşikar gördüklərim çox az imiş,*
*Aşikardan çox müəmma görmüşəm.*

*Eşqə üz tut, eşqə, Allah eşqinə,*
*Şahına, elm içrə qovğa görmüşəm.*

*XIV*

*«Əhd Xorasan edim İnşaallah,*
*Yolu asan edim inşaallah»*[28]*.*

*Bu cahanda neçə eşq xəstəsinə*
*Məni loğman edim inşaallah.*

*Tələsindən neçə əğyar olanın*
*Hamım yan edim inşaallah.*

*Yazıram gündə şe'r mən ki, onu*
*Neçə divan edim inşaallah.*

*İstərəm, gərçi dilim şəkkərdir,*
*Şəkkəristan edim inşaallah.*

*Çatdırım şanı şərəf zirvəsinə,*
*Şərəfi şan edim inşaallah.*
*Təbimin ey pərisi, gəl yanıma,*
*Səni mehman edim inşaallah.*

*Gəzirəm cananı ki, canana*

---

[28] *«Бе Xorasan şəvəm inşaallah,*
*An rəh asan şəvəm inşaallah».*
*Xaqani*

*Canı qurban edim inşaallah.*

*Şahina, arizum Xorasandır,*
*Buna imkan edim inşaallah.*

*XV*

*Öylə ki, Xaqaniya, düşdün Xorasan mülkünə,*
*Əlvida etdin o gündən doğma Şirvan mülkünə.*

*Çünki, heyfa ki, səni incitdilər Şirvandə,*
*Həbs olundun, göndərildin həbsə Şabran mülkünə.*

*Eyləyib «həbsiyyə»də şirvanşahın tənqidini Sanki*
*bir bimar çıxdı, gəldi loğman mülkünə.*

*Amma heç yaddan çıxarda bilmədin Şirvanını,*
*Öylə odlandın ki, sən od düşdü hicran mülkünə.*

*Eyləyibsən həm neçə misradə sən Şirvanı yad,*
*Meylini əldən verib yetdikdə imkan mülkünə,*

*«Sındı könlüm əhli-Şirvandan fəqət dil söyləyir:*
*Mumiyadır Şirvanın torpağı İran mülkünə»*[29]*.*

*Şahina, Xaqaninin mülkü şerdir, sən nə cür*
*Eyləyib cürət qədəm basdın o xaqan mülkünə.*

---

[29] *«Mən şekəstexater əz Şirvaniyan və-z ləfze-mən*
*Xake-Şirvan mumiyayi bəxşe-Iran amədə»*
*Xaqani*



# ON BEŞİNCİ SƏFƏRNAMƏ

## *«ON BEŞİNCİ SƏFƏRİM BAŞLADI İRANƏ MƏNİM.»*

Təxminən bir ay bundan əvvəl İran İslam Respublikasının Azərbaycan Respublikasındakı Səfirliyi Mədəniyyət Mərkəzinin sədri Höccətül-İslam və-l müslimin Seyid Əli Əkbər Ocaqnejad mənə ordibeheşt (aprel) ayında Tehran şəhərində Fələstinlə bağlı Beynəlxalq konfrans keçiriləcəyini bildirib, orada iştirak üçün daha iki şairin də adlarını təqdim etməyimi xahiş etdi. Mən heç fikirləşmədən «Məcməüş- şüəra» («Şairlər məclisi») adlı 126 yaşlı Bakı ədəbi məclisinin katibi Qiymət Məhərrəmlini və «Məhsəti» ədəbi məclisinin sədri Fəridə Ləmanı məsləhət gördüm.

Bir neçə gündən sonra hər üçümüz öz «Fələstinnamə»mizlə Mədəniyyət Mərkəzinə gələrək onları Mədəniyyət Mərkəzi İncəsənət şöbəsinin müdiri ağaye Pakrəvana təqdim etdik. Ertəsi gün mənə artıq şe’rlərimizin İrana göndərilməsi barədə məlumat verildi.

Bir həftə keçdi. Ağayi Pakrəvan mənə telefon açıb Fələstinin tarixi ilə əlaqədar bir elmi məqalə də yazmağımı təklif etdi. Onun təklifini də yerinə yetirib «Döyüşkən Fələstin» (Fələstini-rəzmənde) adlı məqalə də hazırladım. Məqaləmdə Fələstin ərazilərində ilk sakinlərin hələ eramızdan əvvəl 9000 il qabaq yaşamaları, orada, elə o vaxtlarda divarla əhatələnən və tarixə ilk məlum olan Yerixon adlı şəhərin yaranması, min illər sonra Fələstin torpaqlarına semit tayfalarından olan başqa tayfaların da (əsasən xanaanlar) gəlmələri, oranın qədim yəhudilərə də qucaq açmasını göstərdim. Yazdım ki, e.ə. VI-IV əsrlərdə Fələstin Fars şahlığının tərkibində olmuş, sonralar Makedoniyalı İskəndər tərəfindən zəbt edilmiş, onun vəfatından sonra Misir Ptolemeyləri və Suriya Seleviklərі arasında mübarizə obyektinə çevrilmişdi. Sonra isə 400 il Roma imperiyasının bir əyaləti şəklində idarə olunan Fələstin eramızın V-VI əsrində Bizansın tərkibinə daxil edildi. Sonralar ərəbləşmə prosesi,

Misir sultanları tərəfindən işğal, 1516-cı ildən etibarən Osmanlı imperiyasının ağalığı, 1917-ci ildən ingilis ordusu tərəfindən zəbt olunması, 1920-1947-ci illərdə Böyük Britaniyanın mandaqlıq ərazisinə çevrilməsi və sair. XX əsrdə yaranmış sionist hərəkatı Fələstinə çoxlu əhali köçürməyə başladı və yeni əhali ilə ərəblər arasında ardıcıl münaqişələr baş verdi. 1947-ci ildə isə BMT Fələstini ərəb və yəhudi dövlətləri, habelə Yerusəlim zonasına bölməyi qərara aldı, beləliklə də 1948-ci ilin mayında İsrail adlı yəhudi dövləti yarandı. Lakin qonşu ərəb dövlətləri Fələstinin bölünməyini tanımadılar, nəticədə isə ərəblərlə israillilər arasında bu gün də davam edən müharibə başladı.

Hörmətli oxucular, diqqət yetirin, İsrail dövləti yarandı, amma Fələstin Ərəb Dövləti yaranmadı, ərazisi İsrail, Transiordaniya (Şərqi Yerusəlimlə İordaniyanın Qərb sahili) və Misir (Qəzzə rayonu) arasında bölündü. Yüz minlərlə fələstinli yaşadıqları doğma torpaqlardan qaçaraq qonşu ərəb ölkələrindəki qaçqın düşərgələrində yerləşdirildi. İsrail isə indiyədək onların nəsillərini geri qaytarmaq hüdudunu tanımır. Fələstinlilər isə döyüşür.

Məqaləmin İrana göndərilməsindən daha bir neçə gün ötdü. Təxminən saat 22 radələrində telefonum səsləndi. Danışan Hacı Qurban Cəbrayıl idi. Dedi ki, evdə yox idin, cib telefonun da söndürülüb. Ağayi Pakrəvanla mən neçə vaxtdır sənə zəng vururuq. Sabah saat 11-də aeroportda olmalıyıq, Tehrana uçuruq. Səfərimizin belə qəfil və təcili elan edilməsindən və Qiymətlə, Fəridə xanımın heyətimizin tərkibində olmamalarından bir qədər narahatlıq hissi keçirdim:

*Yoxdur rahatlığı bircə anımın,*
*Neyləyim, rahatlıq məndən ötüşüb.*
*Mənim yaranmağım Yaradanımın,*
*Deyəsən narahat vaxtına düşüb...*

13.04.2006. Saat 9-da İran Mədəniyyət Mərkəzinə gəldim. Xidməti pasportum viza tələb etmədiyindən gözlənilməz heç nə baş vermədi, bizə maşın verdilər, ağayi Pakrəvanla xudahafizləşdik və saat 10-da Bakı təyyarə limanında olduq.

«İran eyr» reysi ilə Azərbaycandan İrana hər biri bir neçə nəfərdən ibarət üç nümayəndə heyəti yollanırdı: Mazandaranın Sari və Ramsər şəhərlərinə

ezam olunan musiqiçilər və təsviri sənət mütəxəssislərindən ibarət iki heyət və bir də Beynəlxalq Fələstin Konfransında eştirak üçün nəzərdə tutulan bizim heyət. Heyətimizin tərkibi məndən başqa aşağıdakılardan ibarətdir: Hacı Hacıağa Ələsgər oğlu Nuri (Azərbaycan İslam Partiyasının sədri), Tahir Zayid oğlu Kərimli (Vəhdət Partiyasının sədri) və Hacı Qurban Cəbrayıl («Nəbz» qəzetinin baş redaktoru).

Artıq göydə idik, amma fikrim yerdəydi. İrana on beşinci səfərim başlamışdı. Bir saatlıq uçuşdan sonra nəhəng Tehranın İmam Xomeyni adına böyük aeroportunda yerə endik. Son dərəcə müasir üsulda inşa olunmuş bir təyyarə meydanı. Tehrana əvvəlki səfərlərim zamanı həmişə «Mehdiabad» təyyarə meydanında qarşılandığımdan, oradakı yeni təyyarə meydanı barədə heç bir məlumatım yoxdu. Gördüm və xoşladım. İranda inşa işləri son dərəcə sürətli və yüksək keyfiyyətli aparılır.

Bizi təşrifat maşınına əyləşdirib yola saldılar. Budur, Tehrana gedən otoban (geniş şose). 10-15 km. məsafə qət etdikdən sonra İmam Xomeyninin uyuduğu və artıq tarixləşən hərəmi-mütəhhərin (pak məscidin) kənarından ötdük və gəlib beşulduzlu «Azadi» otelinə çatmağımız üçün iki saatdan artıq vaxt keçdi. Bakıdan Tehrana bir saat, Tehrandan Tehrana isə iki saatdan çox bir vaxt.

Tehran olduqca böyük şəhərdir. Bir başından o biri başına getməkdən ötrü 100 km-dən çox məsafə qət olunmalıdır. Küçə və xiyabanları dolduran maşın seli müxtəlif rənglərlə axan dəryanı xatırladır. Bəli, Tehranın eninə və uzununa (amma son vaxtlar hündür binaların sayı da artır) böyüməsi davam edir...

Nəhayət, «Azadi» adlanan otel. Yüksək mədəni səviyyəli qarşılanma. Hacı Hacıağa ilə Tahir Kərimliyə 1411-ci, Hacı Qurbanla mənə isə 1413-cü otaqlar ayrılmışdı. 14-cü mərtəbənin 13-cü otağı. Nəhs adlanan bu rəqəm mənə düşür. Səfərimiz yaxşı keçəcək, inşallah!

Otelin foyesində bizə yaxınlaşan cavan bir qız - xanım Vəziri, hər hansı bir problemimiz olsa ona müraciət etməyimizi xahiş etdi. Azacıq istirahətdən sonra liftlə otelin 1 -ci mərtəbəsindəki «Xəyyam» restoranına endik. Direktoru Pənaheyi-Golşən adlı bir azərbaycanlıdır.

Nahardan sonra xanım Vəzirini axtardıq. Tapa bilmədik. Mən dedim ki, burada bizə xidmət edən qızların elə hamısı bir-birinə oxşayır, xanım Vəzirini

tanıya bilməyəcəyik. Hacı Hacıağa buyurdu: «Tanıyıram!». Zarafatla dedim ki, Hacı deyəsən arvadtanıyandır. Gülüşdük.

İndi isə Bakıdan Tehrana uçuş zamanı yazdığım qit'əmi sizə təqdim edirəm:

*Mən dəmir bir quşa mindim necə rahət gəldim,*
*Бu quşa, tazə zamandır, kəhər üstün gəlməz.*

*Бu səfər yaxşı səfərdir - yeni İran səfəri!*
*Edirəm zənn ona hər bir səfər üstün gəlməz...*

*Neçə günlük bu səfərdən dönərəm inşallah,*
*Əzmi faidə olan şəxsə zər üstün gəlməz.*

*Uçuram hər tərəfə quş kimi, şahin quşuyam,*
*Бülbülə, sərçəyə şahin məgər üstün gəlməz?*

Otelin qapıları üzümüzə açıldı və çölə çıxdıq. Axşam düşmüşdü. Onlarla ağ və qara rəngli polis maşınları, çoxsaylı daxili və xarici jurnalistlər, müxbirlər və teleradio işçiləri dərhal nəzərimizi cəlb etdi. Kimisə gözləyirdilər. Hələlik müəyyənləşdirə bilmədik. Təxminən bir saat sonra çöldə intizarda olanlar arasında bərk vurnuxma düşdü. Kimiyə müşayiət edən maşınlar sürətlə gəlib otelin qarşısında dayandılar və Beynəlxalq Atom Enerjisi Agentliyiinin (MAQATE) baş direktoru cənab Məhəmməd Əl-Baradei maşından yerə düşdü. Kameralar ona tuşlandı və jurnalistlər irəli yeridilər. Müxtəlif suallar. Cənab M.Baradei vəziyyətə dair bir neçə ümidli söz deməklə kifayətləndi və onu gözləyən qapısı açıq liftə tərəf yollandı. Bir neçə müxbir liftin önündə də onu sual atəşinə tutdular. O isə yenə bir neçə söz deməklə kifayətləndi və liftlə yuxarı qalxdı.

Tehrana səfərimizin ilk günü beləcə başa çatdı. Mən otağıma qayıdıb, yorğunluğuma baxmayaraq belə bir qəzəl yazdım:

*Oн beşinci səfərim başladı İranə mənim,*
*Həqq yetirdi yenidən meylimi imkanə mənim.*

*Əfqanıstana səfərlər yadıma düşməkdə,*

*On üç il orda dözübdür canım hicranə mənim.*

*Sonralar Türkiyə də'vət eləyibdir neçə yol Və*
*İraqda qədəmim dəydi Gülüstanə mənim.*

*Hara getdim - hara gəldimsə şəfəqqət gördüm,*
*Və dilim mehr ilə «əhsən» dedi hər yanə mənim.*

*İstiqamət bu gün İrandı yenə, ey Şahin,*
*On beşinci səfərim başladı İranə mənim.*

14.04.2006. Bu gün İranda İmam Xomeyninin təklifi ilə hər il keçirilən «Həftəye vəhdət» («Vəhdət həftəsi») günlərinin başlanmasından 5 gün keçir. Söhbət şiələr və sünnilər arasındakı vəhdətdən (birlikdən) gedir. İslama əsrlərlə ziyan vuran qarşıdurma. Kimə lazımdır? Bu qarşıdurmada əsrlərlə Qərb dövlətləri bəhrələnmiş, müsəlmanı müsəlmana qarşı qaldırmışdır. Belə qarşıdurmaların şahidi olan böyük şairimiz Sabir məhz elə buna görə də «Harda müsəlman görürəm, qorxuram» - deyə fəryad etmiş, «Şiəyəm, əmma nə bu əşkaldən, sünniyəm, əmma nə bu əmsaldən», - söyləyərək Həqqə söykənmiş, «qaili- Quran» olduğunu bütün müsəlmanlara bəyan etmişdir.

Bu gün konfransımız başlayacaq. Sübh tezdən durdum. Qurban Cəbrayıl hələ yatırdı. Pəncərə önünə gəlib Dəmavənd dağlar silsiləsinin qarsız ətəklərini və qarşı zirvələrini seyr etdim. Dağlar qocalmır. Mən inanıram ki, Dəmavənd bir əsr, lap elə on əsr bundan qabaq da bu görkəmdə bir dağ olub. İnsanlarsa... İnsanlarsa daim dəyişməkdədir: cavanlıq, qocalıq. cavan insan, əgər Allah istəsə qocalır. Dağlarsa qocalmır. Şahdağ kimi. Dəmavənd kimi. Əlimə bir ağ vərəq götürüb belə bir şe’r qaraladım:

Oyandım yuxudan lap səhər erkən

*Oyandım yuxudan lap səhər erkən,*
*Dəmavənd dağına hey baxa-baxa.*
*Ömür kitabımı hərisliklə mən,*
*Başladım Tehranda varaqlamağa...*

*Sağ qaldım, ölmədim sevgi yolunda,*

*Həm gənclik, həm ahıl çağım amma sirr.*
*Məni sevənləri sevmirdim onda,*
*İndi mən sevənlər məni sevməyir.*

Bu gün cümə günüdür. Namaz qılmağa yollanırıq. Tehran Universitetinin Cümə məscidinə gəldik. Mərasim artıq başlanmışdı. İran quru qoşunlarının Baş komandanı sərtib (general) Əmir Dadrəs minbərdə xitabət kürsüsünün arxasında dayanıb odlu çıxış edirdi. Doğrusu, mən bu namazxanaya gələnədək dini çıxış gözləyirdim, amma siyasi nitq eşitdim. Bəli, dünya siyasiləşir.

Sərtib Dadrəsin çıxışından: «Dünya artıq təzə dünyadır. Dövrümüz Çingiz dövrü deyil ki, Çingizlərin zülmünə məruz qalsın. Zor daha işə keçməz, çünki dünya daha zor dünyası deyil. Amma təəssüflər ki, zor işlədənlər hələ də var. Lakin biz də çox güclüyük. Zora zor vasitəsilə cavab verməyə hazırıq. İran özünü hər hansı bir düşmənin hücumundan qorumağa qadirdir. Biz düşmənləri qurudan, sudan və havadan dəf etmək iqtidarındayıq. Ordumuz bu gün hər vaxt olduğundan çox-çox güclüdür».

Sərtib Dadrəsi minbərdə əvəz edən çıxışçı (adını bilmədim) İsrailə ölüm dilədi və minbərin sağ tərəfinə vurulmuş parça üzərindəki yazını uca səslə namaza gələnlərə və xalçalar üstündə əyləşənlərə çatdırdı: «Mərg bər İsrail» («İsrailə ölüm»).

Tehran imamcüməsi və xebrəganın (Ali dini şura) üzvü olan Ayətullah Cənnəti minbərdə göründü. O, bu gün burda pişnamaz kimi çıxış edəcək və biz hamımız ona iqtida edəcəyik (bugünkü cümə
namazının rəhbəri odur).

Ayətullah Cənnətinin çıxışından: «İranın atomdan enerji almaq planı bütün xalqımızı sevindirdi... Qoy Amerika unutmasın: Bura Əfqanıstan deyil, bura İraq deyil, bura İrandır! Hamımız fələstinlilərə kömək edəcəyik. İsrailin Fələstin əhlinə etdiyi zülm və sitəmin qarşısı alınacaq. Biz gələcək konfransımızı Qüdsdə keçirəcəyik, inşallah!».

Azan verildi və namazın iqaməsi başlandı. Sonra isə rükü, qnut, sücud və təkbir mərhələləri. Mən bir neçə dəfə təkrar etdim: «niyyət edirəm ki, pişnamaza iqtida edərək cümə namazını qılım, qürbətən ilallah».

Bizim cümə namazımız çıxışlarla birlikdə iki saatdan çox çəkdi. Yüz minədək adam namaz borcunu yerinə yetirib dağılışdı və biz «Azadi»yə

qayıtdıq.

Azacıq istirahətdən sonra «III Beynəlxalq və Fələstin xalqı hüquqlarının müdafiə Konfransı» adlanan tarixi bir yığıncağın açılış mərasimində iştirak üçün Tehranın məşhur Konfranslar sarayına yollandıq. İlkin olaraq nəzərimizi Fələstinin hazırkı rəhbərlərindən biri və Həmas təşkilatının sədri Xalid Məşəl cavab verdi. Konfransa gələnlər növbə ilə ona yanaşıb görüşürdülər.

İranın sabiq xarici işlər naziri Əli Əkbər Vilayəti (Mən onun «Şah İsmayıl Səfəvi dövründə İranın xarici əlaqələr tarixi» adlı kitabının redaktoruyam) də buradaydı. Hacı Hacıağa irəli gedib onun əlini səmimiyyətlə sıxdı və mənlə sabiq nazir arasında bir-iki dəqiqə sürən əhvallaşma oldu.

Bizə ayrılmış yerə qayıtdıq və Cavanşir Vəkilovu yanımızda gördük. O, bir müddət Təbrizdə Azərbaycanın konsulu vəzifəsini icra etmişdi və bizi orda keçən il mehribanlıqla qarşılayıb yola salmışdı. İndi isə Tehranda Azərbaycan səfirliyinin müşaviri vəzifəsindədir.

Qeyd etməliyəm ki, bu konfrans mənim müxtəlif ölkələrdə iştirakçısı olduğum konfransların ən əzəmətlisidir. Fikrimin sübutu üçün buraya təşrif gətirmiş ölkələrin adlarını çəkmək kifayətdir: İordaniya, Qambiya, Qvineya, Ekvator Qvineyası, Yunanıstan, Yəmən, Əfqanıstan, İraq, Tacikistan, Misir, Fələstin, Filippin, Qırğızıstan, Qətər, Əlcəzair, İndoneziya, Suriya, Sierra Leona, Oman, Qabon, Seneqal,
Keniya, Kuba, Küveyt, Madaqaskar, Liviya, Sudan, Bəhreyn, Malayziya, Meksika, Şri-Lanka , Mali, Zimbabve, Mərakeş, Toqo, Mavritaniya, Venesuela, Livan, Rusiya, Cənubi Afrika Respublikası, Uqanda, Tunis, Ermənistan. Konfransın işində 40 ölkənin deputat qrupu, o cümlədən 18 ölkənin parlament spikeri və 12 ölkənin vitse- spikeri iştirak edirdi. Azərbaycan parlamenti isə öz nümayəndəsini göndərməyib və yuxarıda qeyd olunduğu kimi, Azərbaycanı biz 4 nəfər qeyri-rəsmi təmsil edirdik.

Mərasim başlandı. Ayağa durub bura təşrif buyuran «məqami-müəzzəmi-rəhbər», yaxud «rəhbəri-müəzzəmi enqelabi-İslami» («əzəmətli rəhbər məqamı», yaxud «İslam inqilabının əzəmətli rəhbəri») Ayətullah Seyid Əli Xamneyini, eləcə də İran prezidenti Mahmud Əhmədinejadı və İran İslam Şurasının sədri Həddad Adili salamladıq. İranın dövlət himni səsləndi. Qurani-Kərim tilavət olundu.

Konfransın katibi cənab Möhtəşəmi xitabət kürsüsündə göründü,

iştirakçıları salamladı və açılışı rəsmən elan etməyi cənab Xamneyidən xahiş etdi.

S.Ə.Xamneyinin çıxışından: «Fələstinin işğalından 60 ilə yaxın bir vaxt keçir və məzlum Fələstin xalqı müxtəlif əzablı sınaqlar və imtahanlardan çıxmışdır... Elə bu gün də biganə qəsbkar və sionistlər tərəfindən Fələstinə zümlər həyata keçirilir. XX əsrin 40-cı illərini gözləriniz önündə canlandırın: Ərəb dünyasının mərkəzində yerləşən Fələstin. Özü kasıb, hökuməti zəif, xalqı bixəbər, qonşuları oyuncaq istismarçılar. Varlı, ağır silahlara malik olan Qərb dünyası sionistlərin təhrikiylə müsəlmanların əllərindən çıxarıb, onları irqçi, zülmkar və terrorist bir qrupun əlinə verir. Amerika bir vəkil və qəyyum kimi fəaliyyət göstərir, sovet dövləti də yalnız bu məsələdə Amerika ilə müxalifətə girmir.

Ey mənim qardaş və bacılarım! Fələstin xalqı bu gün uzunmüddətli və çətin bir cihad meydanının ortasındadır. Bu cihad təkcə Fələstin cihadı yox, bütün İslam dünyasının cihadıdır. Gərək bu gün bütün İslam dünyası Fələstin müsibətini öz müsibəti bilsin. Fələstin gərək Fələstin xalqına qaytarılsın. Çıxışımın sonunda mən Fələstinin şücaətli və müqavimətkar xalqına ərz edirəm: Siz öz cihadınız, səbriniz və parlaq müqavimətinizlə İslam dünyasını sərəfraz etdiniz. Siz nümunəvi bir millət oldunuz. Bu ağır işin yükü sizin qəddinizi əyə bilmədi... Bu gün siz həmişə olduğundan daha da güclüsünüz. Şeyx Əhməd Yasin, Fəthi Şəqaqi, Rəntasi və başqa şəhidlərin axıdılan qanları indiyədək düşmən qılıncına qalib gəlmişdir. İran İslam Cümhuriyyəti və bütün cahanın müsəlmanları, həmçinin dünyanın azadlıqsevər insanları sizin qəm və möhnətinizə şərikdir. Sizin şəhidləriniz bizim şəhidlərimizdir. Sizin qəm-kədəriniz bizim qəm-kədərimizdir. Sizin qələbəniz bizim qələbəmizdir!».

Ayətullah Xamneyi çıxışını bitirib zala endi, onu əhatəyə alan bəzi adamlarla görüşdü, sonra isə Mahmud Əhmədinejad və Həddad Adilin müşayiətilə zalı tərk etdi. Özü getsə də, müşayiətçilər geri qayıdaraq iclasın davamına başladılar. Həddad Adil rəyasət heyətinə bir sıra ölkə nümayəndələrini də’vət etdi və beləliklə həmin rəyasət heyəti üzvləri öz yerlərini tutdular. Doktor Həddad Adil sözə başladı: «Fələstində Həmas təşkilatının qələbəsi Haqqın qələbəsidir. Mən bu qələbəni təbrik edir, Fələstin xalqına uğur diləyirəm».

İran İslam Şurası sədrinin çıxışı alqışlandı və xitabət kürsüsünə prezident

də'vət olundu. Doktor Mahmud Əhmədinejadın çıxışından: «Hörmətli konfrans iştirakçıları! Ümidvaram ki, yaxın və uzaq ölkələrdən gəldiyiniz zaman sizlərə üz vermiş narahatlıq və yorğunluq bu iclas günlərində yadınızdan çıxacaqdır. Sionist rejim Fələstinin izzətini, təkcə onun deyil, bütün dünya müsəlmanlarının izzətini tapdamaqdadır. Bu rejimin fəaliyyəti İslamın əleyhinə istiqamətlənmişdir. Fələstin 60 ildir ki, fəlakət içərisindədir. Çarə nədir və nicat yolu nədədir? Çarə və nicat Fələstində müstəqil xalq dövlətini təşkil etməkdədir. Sionist rejimi çürük bir ağaca bənzəyir və tezliklə kökündən çıxıb yıxılacaq, amma Fələstin nihalını iman gülləri bəzəməkdədir. Fələstin məsələsi günün ən aktual mövzusudur. Tezliklə haqq qalib gələcək və Fələstin azad olacaqdır. Artıq bunun üçün şərait yaranmışdır. Ulu Allahdan Fələstinin qələbəsini təmənna edirəm!».

Çıxışı gurultulu alqışlarla qarşılanan prezident də getdi. Həddad Adil dedi: «İndi sizin qarşınızda Fələstin Qanunvericilik Məclisinin sədri doktor Əbdül Əziz əd-Dübeyk çıxış etməliydi. Lakin onun İrana səfəri baş tutmayıb. Buna görə də doktor Dübeykin peyk vasitəsilə verilən çıxışını monitor ekranlarda izləyəcəksiniz».

Biz doktor Dübeykin Fələstindən elə bu anda etdiyi ərəbcə çıxışını maraqla dinlədik. Odlu-alovlu bir nitq. Məzmun isə məlumdur.

Konfransın açılış mərasimində doktor Əbdül Həmid Puantahın, Livan parlamentinin sədri, həmçinin Ərəb Parlamentlər Birliyinin rəisi Nəbiyyə Birrinin, Fələstin İslam Cihadı hərəkatının rəhbəri doktor Ramazan Abdulla Şəlhin, Konqo parlamenti sədrinin çıxışından sonra Həmasın İslam Müqaviməti Siyasi Hərəkatı İdarəsinin sədri Xəlil Məşəlin qızğın çıxışı dinlənildi.

Sabah konfransın ümumi iclası keçiriləcəkdir. Proqramı oxuyuram. Kimlərin çıxış edəcəkləri barədə məlumat verilməmiş, sadəcə, müxtəlif məruzələrin ediləcəyi vaxt barədə qeydlər vardır. Cavanşir Vəkilovla birlikdə ayağa qalxıb mənim sabah neçədə çıxış edəcəyimi öyrənməyə çalışsaq da, buna nail olmadıq. Hətta doktor Qulaməli Həddad Adil də konkret bir söz deyə bilmədi. İndi mənə məlum deyil ki, mənim «Döyüşkən Fələstin»im sabahkı gün səslənəcək, ya yox.

Bu müəyyənlik içində olduğum vaxt «Yeddi sualın bir cavabı» adlı şe'rimi yazdım:

*Qələm, ilhamımı ləngitmə, et çarə, tələs, dindir:*
- *O hansı ölkədir ölkəm təkin parə? Tələs, dindir.*
- *Fələstindir!*
- *O hansı bölgədir azadlığa eylər həvəs? Dindir.*
- *Fələstindir!*
- *Nə fəryaddır, nə əfğandır, nə avazdır, nə səs? Dindir.*
- *Fələstindir.*
- *Əzilmişdir, üzülmüşdür, bölünmüşdür əbəs? Dindir.*
- *Fələstindir.*
- *Nə üsyandır ki, aram olmayır illərlə bəs? Dindir.*
- *Fələstindir! Fələstindir! Fələstindir! Fələstindir!!!*

15.04.2006. Saat 9-dur. Konfranslar sarayının ümumi dairəvi zalı. Aparıcı bugünkü iclasların seksiyalar üzrə aparılacağını elan etdi. Belə ki, I salonda Qüds (Beytülmüqəddəs) ilə bağlı məruzələr, II salonda qaçqınlara aid çıxışlar, III salondasa regional dəyişikliklər barədə dinləmələr keçiriləcəkdir.

Quran tilavəti. Rəyasət heyətinə seçilənlər öz yerlərini tutdular. İbrahim ət-Tahir (Sudan), Məhəmməd ben-Mübarək əl-Xəlili (Misir), Kardo Kesala (Kuba), Əbdül Kərim Übeyd (Livan), Əhməd Cibril (Fələstin), Şeyx Abdullah Həbəlla (Əlcəzair), Abdullah Nuri (Tacikistan).

Hər biri 10-15 dəqiqə çəkməklə Zimbabve, Suriya, Qətər, Fələstin (və daha üç fələstinli) nümayəndələrinin çıxışları dinlənildi.

Sarayın foyesindəyəm. Bu zaman Hacı Hacıağanı gördüm. Siması mənə çox tanış gələn bir cənabla mənə sarı gəlirdi. Tanıdım. Seyid Məhəmməd Rza idi. Sabiq Təbriz Mədəniyyət Departamentinin sədri, hazırda isə İran parlamentində Təbriz nümayəndəsi Seyid Məhəmməd Rza. Olduqca mehriban insandır.

Saat 15.00. Ayətullah Təsxiri ilə görüş. Məqami-müəzzəmi-rəhbəri Ayətullah Seyid Əli Xameneyinin beynəlxalq əlaqələr üzrə müavini olan Ayətullah Təsxirinin yaşı məncə səksən olar. Olduqca mədəni və savadlı şəxsdir. Ərəb dilini gözəl bilir. Şairdir. O, sabah İranın ali dini rəhbəri cənab Xameneyi ilə bizim görüşümüz olacağını bildirərək bir qədər söhbətdən sonra getdi. Mənim «Fələstinnamə» silsiləsindən olan 4 şe’rimin və Hacı Qurban Cəbrayılın bir neçə şe’rinin surətlərini çıxarmaqdan ötrü surətçıxarma otağına

apardılar. Dayanıb şe'rlərimizi aparan şəxsin qayıtmasını gözləyirik. Bu vaxt Hacı Qurban əlində qrafin dolu apelsin şirəsi gətirən bir nəfəri bizə göstərib dedi:

- Budur şe'rlərimizin şirəsini gətirirlər.

Y arı zarafatla dedim:

- Yox, bizim şe'rlərimizin şirəsi sarı rəngdə ola bilməz, qıpqırmızı olmalıdır. Çünki onlar Fələstinə həsr olunduğundan özlərində qan rəngini əks etdirməlidir.

Gülüşdük.

Məruzələr oxunan zala qayıdıb beş-altı məruzə dinlədik.

Axşamüstü. Saat 6-ya işləyir. Tehranda hələ keçən səfərimdən məni tanıyan və dəfələrlə müsahibələrə də'vət edən televiziya jurnalisti Qəhrəman Nurani günorta vaxtı oteldəki otağıma zəng vurub «Səhər» proqramıyla canlı yayımlanan «Kompas» verilişində iştirakımı xahiş etmişdi. Buna görə də əsli Salyandan olan və hazırda İranda yaşayan Rüfət adlı mehriban bir azərbaycanlı gənc konfrans sarayına gələrək məni Hacı Hacıağa ilə birlikdə İran Televiziya Mərkəzinə apardı. 45 dəqiqə davam edən çıxışımız Həzrət Peyğəmərimizin (s) mövludu, İranda keçirilməkdə olan «Vəhdət həftəsi» və Fələstin mövzularını əhatə etdi. Mən bir qədər sorğu-sualdan sonra «Fələstin» adlı şe'rimi oxudum. Aparıcı dərhal o şe'rin bir neçə misrasını, məsələn, «Qarabağ da düşdü sənin gününə» və «Köynəyi kəfəndir fələstinlinin» misralarını bir daha tamaşaçıların nəzərinə çatdırdı. Qarabağ və Fələstinə azad və xoş səhərlər arzuladı. Mənə elə gəlir ki, «Fələstin» şe'rimin burda verilməsi maraqsız olmaz:

*Qədim bir diyar var, başı bəlalı* -
*Fələstin.*
*Torpağı cəfalı, daşı bəlalı,*
*Fələstin...*

*Nələr baş vermədi, tarixdə, nələr!..*
*Xeyirlə döyüşdə üstün oldu şər,*
*Didərgin düşdülər fələstinlilər,*
*Fələstin.*

*Sel kimi çağladın, küləktək əsdin,*
*Çin olsun müqəddəs niyyətin, qəsdin,*

*Susma, cihad elə, tələs, tələs, din,*
*Fələstin! Fələstin! Fələstin!!!*

Mən bu gün əzəmətli konfranslar sarayına İranın müxtəlif televiziya proqramları üçün Azərbaycan və fars dillərində üç müsahibə verməli oldum.

İran mərkəzi Televiziya binasından çıxdıq və Qəhrəman Nurani məni və Hacı Hacıağanı öz maşınında «İstiqlal» otelinə gətirib çatdırdı. Buradan İran İslam Şurasının sədri doktor Qulaməli Həddad Adil konfrans nümayəndələrinin şərəfinə ziyafət verməlidir.

Ziyafətdən sonra «Azadi»yə qayıtdıq. Gecə bu şe'ri yazdım:

Qit'ə

*Neçə ildir ki, şe'rlər yazıram,*
*Necə təbdir bu ki, bəs qurtarmır?*

*Səsləyir hey məni ilham pərisi,*
*Qulağımdan hələ səs qurtarmır.*

*O deməkdir ki, bu ilham bitmir,*
*O deməkdir ki, nəfəs qurtarmır.*

Bərk yorğun olduğumdan gecə rahat yatdım. Allaha şükür ki, hələ nəfəs qurtarmır...

16.04.2006. Neçə illərdir ki, hər gün şe'r yazıram. Əruz, heca, sərbəst vəznli şe'rlər. Əsasən lirik əhval-ruhiyyə daşıyan şe'rlər. Qocalmışamsa da lirik ovqat məni tərk etmir. Şükürlər olsun Pərvərdigara ki, ilham pərisini göndərir otağıma və yüyrək ilhamımı daha artıq vəcdə gətirib neçə-neçə bəndi, beyti, misranı pıçıldayır qulağıma və mən də onları köçürürəm varağıma.

Sabah Bakıya qayıdıram. Zirvələri ağaran Dəmavənd dağını seyr edə-edə bu qəzələi yazdım:

*Ey ki, eləyən mehmanı heyran, xudahafiz!*
*Yad eyləyəcək hüsnünü mehman, xudahafiz!*

*Görcək qoca Tehranı sevincim təzələndi,*
*Sıxdım əlini şəst ilə, Tehran, xudahafiz!*

*Hər yanda bu İran kimi ülfət niyə yoxdur -*
*Bir yan mənə gəl-gəl dedi, bir yan xudahafiz!*

*Hicr atəşinə tab eləmək-dərdi çoxaldar,*
*Vəsl oldu bu günlər mənə dərman, xudahafiz!*
*İlham pərisi hey mənə cananəlik etdi,*
*Tehrandakı, ey sevgili canan, xudahafiz!*

*Əlbət, Бakmm sevgisi gözlər məni indi,*
*Бurda daha yox qalmağa imkan, xudahafiz!*

*Mən bir də salam söyləyərəm qoysa Xudavənd,*
*Ey qarlı Dəmavənd, ulu İran, xudahafiz!*

*Fürsət var ikən, Şahina, dərviş kimi gəz, gəz -*
*Бu gün deyəcək cismə həzin can: Xudahafiz!*

Saat 11 -də konfranslar sarayına gəldik. Bir ərəb məruzəçi ərəblərə xas olan temperamentlə özündən çıxmışdı və İsrail əleyhinə sərt sözlər söyləyir, Amerikanı, Avropanı, habelə Rusiyanı yəhudilərin dostları kimi tənqid atəşinə məruz qoyurdu. Fələstinli idi. Qəlbində məzlum bir ölkənin təbii təəssübkeşliyi vardı və özündən çıxmışdı. Aparıcının işarəsi onu özünə qaytardı, çıxış reqlamenti artıq bitmişdi...

Bu gün İranın xarici işlər naziri doktor Mottəkinin, Suriya parlamentinin sədri Mahmud əl-Əbrəşin, Venesuela parlamentinin sədri Nikolas Madoronun, konfransın elmi komitəsinin rəhbəri doktor Vilayətinin, Əlcəzair parlamentinin sədri Əmmar Sədainin, İran İslam Şurasının sədri doktor Qulaməli Həddad Adilin çıxışından sonra III Beynəlxalq Qüds konfransının baş katibi cənab Möhtəşəmpurun ifasında bəyannamə oxunacaqdı. Lakin təəssüf ki, biz burada iştirak edə bilmədik. Çünki tədbir tədbir üstünə düşmüşdü. Biz bir sıra ərəb və fars şairlərilə birlikdə İran ali dini rəhbərinin görüşündə olmalıydıq.

Budur, məqami-müəzzəmi-rəhbər Ayətullah Seyid Əli Xameneyinin qəbuluna gəlmişik. İkinci mərtəbədəki böyük zalın ön sırasındakı stullarda əyləşib ağanı gözləyirik. Ali dini rəhbər gəldi və hamımızı salamladı. O, öz kreslosunda əyləşən kimi bir ərəb şairi ərəb dilində ağanın şərəfinə nəsə dedi

və bütün ərəb şairləri onun dediklərini təkrar etdilər. Elə bu dəm Hacı Hacıağa da ayağa qalxıb Azərbaycanca bir neçə
xoş söz söylədi və ağa başının hərəkəti ilə oпa öz təşəkkürünü bildirdi.

Quranın tilavətindən sonra aparıcı söz aldı. O, burada çıxış edəcək ərəb şairlərinin adlarını bir-bir çəkərək, fars və azərbaycanlı şairlərin də şe’r deyəcəklərini bildirməklə sözünə xitam verdi. Cənab Seyid Əli Xameneyi isə kiçik bir çıxışla kifayətləndi.

S.Ə.Xameneyinin çıxışından: «Bu iclas siyasi deyil, mənəvi və ruhi bir iclasdır. Fələstin qəziyyəsi baş verən vaxtdan bu günədək ərəb şairləri bu məzlum ölkə haqqında çoxlu şe’rlər yazmışlar. Mən hətta elə şair tanıyıram ki, o, Fələstin barədə beş divan yazmışdır. Ərəb dilində və ərəb ölkələrində şe’rin məqamı olduqca yüksəkdir. Ümumiyyətlə, bütün şairlər şe’r dili ilə cəmiyyətin inkişafına təkan vermək niyyətindədirlər».

Elə bu vaxt məşhur Ayətullah Şahrudi gəldi və ali dini rəhbər sözünə ara verib onu ehtiramla salamladı. Sonra yenə sözünə davam etdi. Dedi ki, bizim bugünkü məclisimiz Fələstin və Qüds mövzu - sundadır. Biz sizin şe’rlərinizdən faydalanacağıq.

Söz Suriya şairinə verildi. O da əvvəlcə hamımızı salamladı, sonra öz qəsidəsinin qiraətinə başladı. Başladı nə başladı. Uzun qiraətdən sonra şe’rini bitirdi və bir neçə kitabını Ayətullaha təqdim etdi.

Küveytli şairin də şe’ri təbii ki, mövzu xaricində deyildi.

İran şairi Həmid Səbzəvari də reqlamentə əməl etmədi və aparıcı onun sözünü kəsməyə məcbur oldu.

Xuzistandan gəlmiş bir şairin çıxışından sonra bir ərəb şairinin əruz vəzninin kamil bəhrində olan şe’rini dinlədik.

Sonra iraqlı şair Ayətullah Xameneyiyə və livanlı ərəbsə Fələstinə ithaf etdikləri qəsidələrini təqdim etdilər.

Aparıcının işarəsi ilə bir ərəb müğənnisi ayağa qalxaraq muğam üstündə qəzəl ifa etdi. Ondan sonra başqa bir ərəb aparıcıya əhəmiyyət vermədən ayağa durdu və misralarını gurultuyla səpələməyə başladı. Arxa sıralardakı ərəb şairləri də artıq cuşə gəlmiş, təklif-zad gözləmədən biri digərini əvəz edir, bəzən də xorla şe’r deyirdilər. Mənə elə gəldi ki, məclisi daha idarə etmək mümkün olmayacaq. Lakin söz alan bir Damğan şairi farsca «baş» («ol») rədifli bir qəzəlini qiraət etdi, ayrı-ayrı misralarında türkmən, osmanlı və şirvan

türklərini xatırlayaraq sözünü bitirdi.

Birdən-birə aparıcı özünə söz verdi və məşhur şair, alim, mütəfəkkir Seyid Cəmaləddin Əfqaninin bir şe'rini dedi.

Livanın sabiq mədəniyyət naziri «İldırım» ünvanlı uzun bir qəsidə oxudu və o da reqlamentdən kənara çıxdı.

İranlı bir şairin 36 il bundan əvvəl Fələstin barədə yazdığı şe'ri dinlədikdən sonra növbə mənə çatdı. Doğrusu, mən iki şe'r oxumağı (biri farsca, o biri isə azərbaycanca) müəyyənləşdirmişdim. Hətta farsca bir şe'rimi ifa etməyimi məndən xahiş də etmişdilər. Yanımda əyləşən Hacı Qurban Cəbrayıl və Tahir Kərimli də fars dilindəki şe'rimi oxumağımı israr etdilər, lakin mən reqlamentin cəmi 3-4 dəqiqə qoyulduğunu bildirib, Azərbaycan dilində yazdığım «Dərdin dərdi» adlı qəzəlimlə kifayətləndim:

*Necə mən tab edirəm, var ürəyin min dərdi,*
*Gecə-gündüz cam üzməkdə Fələstin dərdi.*

*İşğal altındadı Qəzzə, zora məruzdur Qüds,*
*Hələ də görmədə çox acizi-miskin, dərdi...*

*Çoxmu tab etməliyəm dərdlərə, ey dərdsizlər?*
*Çoxmu dilləndirəcəkdir məni dərdin dərdi?*

*Bir zaman mən ki, cavandım, vecə almazdım dərd,*
*Qovacaqdır nə zaman bəs qoca Şahin dərdi?*

Şe'rimi bitirdim, «Divan» və «İran səfərnamələri» adlı kitablarımı avtoqraf yazaraq Ayətullah Xameneyiyə təqdim etdim. Bilməyərəkdən, Ayətullahın vaxtı ilə yaralanmış sağ əlini sıxmaq istədim, lakin o, solə lini mənə uzadaraq öz dilimizdə «sağ ol» dedi və Bakı ilə maraqlandı. Söhbətimiz bir dəqiqədən çox çəkmədi və mən yerimə qayıtdım. Burada bir haşiyə çıxmaq istəyirəm: Mən şe'rimin «Qarabağ faciəsindən üzülübdür cismim» misrasını deyərkən, yanımda əyləşən Tahir Kərimli hıçqırdı və hər gözündən bir damla yaş axdı. Olduqca kövrək adamdır. Mən onu heç belə təsəvvür eləmirdim...

Məndən sonra suriyalı bir qadın öz dəftərini ələ götürdü. Aparıcı uzun-uzadı oxuduğu üçün onun sözünü kəsməyə məcbur oldusa da, buə rəb şairə də

şe’rini bitirməmiş dayanmadı.

Fələstinli bir şairsə «Misir fələstinlilərinə məktub» adlanan mənzum məktubu ilə sözünü bitmiş hesab etdi.

Dünən görüşdüyümüz Ayətullah Təsxiri sözünə ərəbcə başladı və ərəb dilində yazdığı qəsidəsini təqdim etdi.

Yenə də iznsiz olaraq yerdən ağ çalmalı və qara saqqalı bir ərəb qalxaraq şe’r oxudu, başqa ərəblər də onun şe’rindəki hər bəndin son misrasını xorla təkrar etdilər. Yenə də ara qarışdı və aparıcı nəhayət, sözü başqa bir şairə verdi.

Bu dəfə isə yerdən iki ərəb qalxaraq bir-birinin ardınca qışqırtı ilə şe’r səsləndirməyə başladılar (Xor isə öz qaydasında davam edirdi).

Osmanlı şairdən sonra küveytli bir şairə xanımın qəsidəsini də dinlədik və səsinin xoşluğundan məmnun olduq.

Bu zaman aparıcının köməkçisi məndən azərbaycanlı şairlərdən hansının çıxışını məsləhət gördüyümü soruşdu. Hacı Qurban Cəbrayılın adını çəkdim. Qurban Cəbrayıl «Fələstin qadınları» və «İlahi, məni də yanına çağır» şe’rlərini təqdim elədi, ali dini rəhbərə öz kitabını bağışladı.

Livanlı şairin Fələstin və Livan barədə şe’rindən sonra şe’r məclisi tamamlandı və biz birinci mərtəbədə yerləşən namazxanaya endik. Ayətullah Xameneyinin pişnamazlığı ilə şam və xiftən namazlarını icra etdik.

Namazdan sonra bizi yerdə fərş üstə salınmış süfrələr ətrafına - şam yeməyinə də’vət etdilər. Hamı rahat əyləşmişdi. Vərdiş yaxşı şeydir. Mən yerdə otura bilmədim. Yemək yeyənlərdən yalnız iki nəfər yerdə oturmamışdı:
Ayətullah Xamneyi (kresloda) və mən (stulda)
əyləşmişdik.

Bu da bitdi. İran xarici işlər nazirinin müavini ağayi Musəvi mənə yaxınlaşıb dedi: Ali rəhbər sizin hamınızı Məşhəd ziyarətinə göndərmək niyyətindədir. Sabah təyyarə ilə uçacaqsınız. Mən ona təşəkkürümü bildirib Məşhədə gedə bilməyəcəyimi (Bakıda işim və dərslərim çoxdur) dedim. Nazir müavininin israrına baxmayaraq, razılaşma əldə olundu.
Belə ki, sabah, aprelin 17-də mən və Hacı Qurban Cəbrayıl - Bakıya, Hacı Hacıağa və Tahir Kərimli başqa konfrans nümayəndələri ilə birlikdə - Məşhədə yollanacaqlar, inşallah.

Otelə qayıtdıq. Y orulmuşdum. Dərhal gözüm yumuldu. Amma gecə yarısı oyandım. Yuxum qaçdı və bir şe’r gəldi:

Ay mələk, qurban olum!

*Çiynimdəki ay mələk,*
*Ol halıma müştərək.*
*Səyahətim çox olub,*
*Əziyyətim beşbetər.*
*Şəfəqqətim çox olub,*
*Məşəqqətim beşbetər.*
*Ziyarətim çox olub,*
*İbadətim beşbetər.*
*Tehranda neçə kərə Mən*
*qılmışam namaz, yaz,*
*Amma günahlarımı Bir az*
*yazma, bir az yaz.*

17.04.2006. Bu gün Bakıya uçmalıyam. Tehranda olduğumuz 4 gün ərzində konfrans iclasları, müxtəlif görüşlər, televiziya çəkilişləri, radio müsahibələri vaxtımı o qədər aldı ki, Tehranı azca da olsa heç bir münasibətsiz-filansız gəzmək imkanı ələ düşmədi.

Bu gün isə Bakıya uçmalıyam. Uçuşa hələ çox var. Hacı Qurban Cəbrayılla maşina əyləşib «Argentina meydanı»na gəldik, oradakı super-marketdən ədviyyat aldıq.

Bizi otelin qapısında gözləyən bir neçə məsul məmur vaxtımızın olduqca az qaldığını dedilər (Biz uçuşumuzun əvvəlki kimi saat 18.00-da olacağını güman etmişdik). Saat birin yarısı idi. Dərhal bizim üçün ayrılmış təşrifat maşını ilə İmam Xomeyni adına təyyarə meydanına yolu düşdük. Ən azı 40-50 dəqiqəlik yolumuz vardı. Sürücümüzsə... erməni. İran ermənisi. Nə o danışdı, nə də biz (Qurban arabir ondan saatın neçə olduğunu soruşurdu). Nəhayət, gəlib çatdıq. Uçuşa on dəqiqə vaxt qalırdı. Təyyarə meydanı işçiləri ehtiramla bizim sənədlərimizlə məşğul oldular və tələm-tələsik təyyarəyə yanaşdıq. Orda Hacı Ələmdar Mahiri gördüm. Məşhəd ziyarətindən qayıdırdı.

Təyyarənin ayaqları yerdən üzüldü, qanadları buludları yardı. Budur, biz artıq havadayıq, bir saat sonrasa torpaqda olacağıq, inşallah, Bakı torpaqlarında.

Dəftərimi əlimə götürdüm, bu səhər Tehranda yazdığım 15-ci İran

səfərnaməmin 8-ci şe'rinə göz gəzdirdim, onu təkmilləşdirdim:

*Min şükürlər, deyirəm mən yenə dildarə, salam,*
*Və yarım Äzəribaycandı, gözəl yarə salam.*

*Ey mənim odlu diyarım, məni odlandırdın,*
*Vətənim, müntəzirəm səndəki rüxsarə,* salam...

*Etməyim mən nə təhər eşq Qarabağ torpağıma?*
*Deməyim mən nə sayaq Qudyala, Qoşqarə salam?*

*Ey vətən, başə yetirdim salamı, sən də elə,*
*Qoca Şahin kimi bir köhnə vəfadərə salam.*

Doğrudan da Vətən Vətəndir. Qarşıda isə sentyabrda İranda keçiriləcək Asiya ölkələri konfransına səfər durur. Gedərik inşallah!

Bakı-Tehran-Bakı, 13-17 aprel, 2006

*Он beşinci Səfəmamə Şe’rləri*

*I*
*QİTƏ*

*Mən dəmir bir quşa mindim necə rahət gəldim,*
*Бu quşa, tazə zamandır, kəhər üstün gəlməz.*

*Бu səfər yaxşı səfərdir - yeni İran səfəri!*
*Edirəm zənn ona heç bir səfər üstün gəlməz.*

*Çox muradım, diləyim vardı ki, çin olmuşdur,*
*Qəlbimə bir daha bəlkə qəhər üstün gəlməz.*

*Gözü tox, qəlbi geniş kəslərə qiymət verirəm,*
*Tamahı olmayan insanə zər üstün gəlməz.*

*Бu qədim məmləkəti gəzməliyəm şadlıqla,*
*Həzzimə, zənn edirəm ki, kədər üstün gəlməz.*

*Бй xeyrxah kimi çox yerdə xeyrlər tapdım,*
*Ola hər kim ki xeyrxah, zərər üstün gəlməz.*

*Neçə günlük bu səfərdən dönərəm inşallah,*
*Əzmi faidə olan şəxsə zər üstün gəlməz.*

*Uçuram hər tərəfə quş kimi, şahin quşuyam,*
*Бülbülə, sərçəyə şahin məgər üstün gəlməz?*

*13.04.2006*

*TeЬгan şəhəri*

*II*
*QƏZƏL*

*On beşinci səfərim başladı İranə mənim,*
*Həqq yetirdi yenidən meylimi imkanə mənim.*

*Əfqanıstanə səfərlər yadıma düşmədədir,*
*On üç il orda dözübdür canım hicranə mənim.*

*Sonralar Türkiyə dəvət eləyibdir neçə yol,*
*Və İraqda qədəmim dəydi gülüstanə mənim.*

*Hara getdim hara gəldimsə şəfəqqət gördüm,*
*Və dilim mehr ilə «əhsən» dedi hər yanə mənim.*

*Deməsinlər ki, bu şair niyə dərvişlik edir?*
*Deyirəm var həvəsim hətta biyabanə mənim.*

*Nə işin var haraya əzm edirəm, ey zahid,*
*Necə məscid sənin olsun, necə meyxanə mənim.*

*Yanıram-yandırıram ömr uzunu mən kimə nə?*
*Od mənim, meyl mənim, bir neçə pərvanə mənim.*

*İstiqamət bu gün İrandı yenə, ey Şahin,*
*On beşinci səfərim başladı İranə mənim.*

*13.04.2006*
*Tehran*

*III*
*Oyandım yuxudan lap səhər erkən*

*Oyandım yuxudan lap səhər erkən,*
*Dəmavənd dağına hey baxa-baxa.*
*Ömür kitabımı hərisliklə mən Başladım*
*Tehranda varaqlamağa.*

*Sanıram gəncliyim Tanrımdan paydı,*
*Б1Г vaxtlar gənc yoxdu bəlkə də mən tək.*
*Б1Г zaman saçımın ağı qaraydı,*
*Б1Г zaman gözümdə yox idi eynək.*

*At sürür ömrümün qocalıq çağı,*
*İndi, əvəz edir sevincimi qəm.*
*Ama, qocalmayır Dəmavənd dağı,*
*İnsan bu dağ-daşdan əskikdir bəyəm?*

*Барışa bilmirəm qocalığımla,*
*Qocalmaq olsa da hamıya məram,*
*Gəncliyim üz-üzə ahıl çağımla Бiri-*
*digərini edir ittiham.*

*Sağ qaldım, ölmədim sevgi yolunda,*
*Həm gənclik, həm ahıl çağım amma sirr.*
*Məni sevənləri sevmirdim onda,*
*İndi mən sevənlər məni sevməyir.*

*14.04.2006*
*Tehran*

IV
*Yeddi sualın bir cavabı*

*Qələm, ilhamımı ləngitmə, et çarə, tələs, dindir:*
- *O hansı ölkədir ölkəm təkin parə? Tələs dindir.*

- *Fələstindir!*

- *O hansı bölgədir azadlığa eylər həvəs, dindir.*
- *Fələstindir!*

- *Nə fəryaddır, nə əfğandır? Nə avazdır, nə səs? Dindir.*
- *Fələstindir!*

- *Əzilmişdir, üzülmüşdür, bölünmüşdür əbəs, dindir.*
- *Fələstindir!*

- *Nə üsyandır ki, aram olmayır illərlə bəs? Dindir.*
- *Fələstindir!*

- *Nə vulkandır ki, sönmür, oddan almaqda nəfəs? Dindir.*
- *Fələstindir!*

- *Nə şahindir ki ram olmur, nədir bilməz qəfəs? Dindir.*
- *Fələstindir! Fələstindir! Fələstindir! Fələstindir!*

*14.04.2006*
*Tehran*

*V*
*QİTƏ*

*Neçə ildir ki, şerlər yazıram, Necə*
*təbdir bu ki bəs qurtarmır?*

*Səsləyir hey məni ilham pərisi,*
*Qulağımdan hələ səs qurtarmır.*

*O deməkdir bu ki, şövqüm ölmür,*
*Şövq vardırsa, həvəs qurtarmır.*

*Deyirəm öz-özümə «ömr bitir»,*
*Deyirəm «bəsdi, tələs», qurtarmır.*

*O deməkdir bu ki, ilham bitmir,*
*O deməkdir ki, nəfəs qurtarmır.*

*15.04.2006*
*Tehran*

*VI*
*QƏZƏL*

*Arif Tofiq Cahangirova!*

*Ey ki, eləyən mehmanı heyran, xudahafiz!*
*Yad eyləyəcək hüsnünü mehman, xudahafiz!*

*Görcək qoca Tehranı sevincim təzələndi,*
*Sıxdım əlini şəst ilə, Tehran, xudahafiz!*

*Hər yanda bu İran kimi ülfət niyə yoxdur - Б^*
*yan mənə gəl-gəl dedi, bir yan xudahafiz!*

*Hicr atəşinə tab eləmək-dərdi çoxaldar,*
*Vəsl oldu bu günlər mənə dərman, xudahafiz!*

*İlham pərisi hey mənə cananəlik etdi,*
*Tehrandakı, ey sevgili canan, xudahafiz!*

*Əlbət, Бakımn sevgisi gözlər məni indi,*
*Бurda daha yox qalmağa imkan, xudahafiz!*

*Mən bir də salam söyləyərəm qoysa Xudavənd,*
*Ey qarlı Dəmavənd, ulu İran, xudahafiz!*

*Fürsət var ikən, Şahina, dərviş kimi gəz, gəz -*
*Б^ gün deyəcək cismə həzin can: Xudahafiz!*

*16.04.2006*
*Tehran*

*VII*
*Ey mələk, qurban olum*

*Çiynimdəki ey mələk,*

*Ol halıma müştərək.*
*Səyahətim çox olub,*
*Əziyyətim beşbetər.*
*Şəfəqqətim çox olub,*
*Məşəqqətim beşbetər.*
*Ziyarətim çox olub,*
*İbadətim beşbetər.*
*Tehranda iki kərə Mən*
*qılmışam namaz, yaz,*
*Amma, günahlarımı Bir az*
*yazma, bir az yaz.*

*Hirsimdən ildırımtək*
*Çaxmışam da arabir.*
*Qur'anın dediyindən*
*Çıxmışam da arabir.*
*Naməhrəm gözəllərə*
*Baxmışam da arabir.*
*Özümü Haqq yolunda Sidq*
*ilə yandırmışam.*
*Yaxmışam da arabir.*
*Ey mələk, qurban olum,*
*Eləmə e'tiraz, yaz,*
*Amma, günahlarımı Bir az*
*yazma, bir az yaz.*

*Bircə-bircə günahım,*
*Savabım sənə bəlli,*

*Sevincim sənə bəlli,*
*Əzabım sənə bəlli.*
*Anla məni, duy məni,*
*İnsanam, ürəyimdə*
*Şeytan yaşayır axı,*
*Şeytanın ucbatından*
*Nalə yaşayır axı,*
*Əfğan yaşayır axı.*
*Mənim savablarımı*
*Əməllər ümmanında*
*Yazsan, özün bilərsən,*
*Dərin yazma, dayaz yaz.*

*Ey mələk, qurban olum...*

*16.04.2006*
*Tehran*

*VIII*
*QƏZƏL*

*Min şükürlər, deyirəm mən yenə dildarə salam*
*Və yarım Äzəribaycandı, gözəl yarə salam.*

*Ey mənim odlu diyarım, məni odlandırdın,*
*Vətənim, müntəzirəm səndəki rüxsarə, salam.*

*Neçə gündür ki, gözüm səndən uzaq olmuşdu,*
*Tutiya ol gözümə, eylə ona çarə, salam.*

*Äxı, viranə olan qəlbi kim abad eylər?*
*Onu abad eləyən sevgili me'marə salam.*

*Şahdağın seyrinə dalmaq dilərəm ləzzətlə,*
*Döşdəki gül-çiçəyə, zirvədəki qarə salam.*

*Etməyim mən nə təhər eşq Qarabağ torpağıma,*
*Deməyim mən nə sayaq Qudyala, Qoşqarə salam?*

*Ey vətən, başə yetirdim salamı, sən də elə Qoca*
*Şahin kimi bir köhnə vəfadarə salam.*

*17.04.2006*
*Текгап*



# ON ALTINCI SƏFƏRNAMƏ

## *«QOCA DƏRVİŞ, YENƏİRÄNƏ SƏFƏR VAR DEDİLƏR,»*

Bu ilin yayında Qubada istirahət edirdim. Mobil telefonumda tanış bir səs eşitdim. Məhəmməd Rza Pakrəvan idi - İran İslam Cümhuriyyəti Mədəniyyət Mərkəzinin məsul işçisi. Dedi ki, cənab Seid Əli Əkbər Ocaqnejad Urmiyə şəhərindən zəng vuraraq, payızda İranda keçiriləcək səkkizinci imama - İmam Rza əleyhissəlama həsr olunmağı nəzərdə tutulan Beynəlxalq Elmi Konfransda iştirakımı arzulayır və mənim orada iştirak etmək imkanımla maraqlanır. Əlbəttə, razılığımı bildirərək İmam Rza barədə bir neçə şe'rimin olduğunu da qeyd etdim. Bu söhbətin üstündən beş aydan bir qədər çox vaxt keçdi. İrandan gələn də'vət məktubunda həmin konfransın noyabrın 21-də başlayacağı bildirilirdi. Dərhal yadıma İrana üçüncü səfərimdə yazdığım qəzəlin bir misrası düşdü: Məşədi Şahini, əlbət, yenə İran çəkdi.

Bəli, Məşədi Şahini İran yenə özünə çəkdi. Qeyd etməliyəm ki, səfərə tək çıxmayacaqdım - «Nəbz» qəzetinin baş redaktoru şair Qurban Cəbrayıl da mənimlə birgə gedəcəkdi. Bu hacı yaxşı həmsəfərdir. Mən onunla əvvəllər də İranda olmuş, müxtəlif İran şəhərlərinə səfərlər etmişəm. Sabah yenə birgəyik. Yolumuz işıqlı, səfərimiz uğurlu olar inşallah.

Gecə sabahdan başlayacaq yeni İran səfərimin - on altıncı səfərnamənin birinci şe'ri yazıldı:

*Qoca dərviş, yenə İranə səfər var, - dedilər,*
*Ləngimə, get, hələ qəlbində təpər var, - dedilər.*

*On beşinci səfərim gendə qalıb çoxdandır,*
*Bixəbərsən, gedişin haqda xəbər var, - dedilər.*

*Oxuyarsan orada şerini şövq ilə yenə,*
*Dikilən yollarına orda nəzər var, - dedilər.*

*Gedəcəkdir Hacı Qurbanda səninlə oraya,*
*Bilməyirsənmi o şairdə nələr var, - dedilər.*

Bəli, bir ilə yaxındı ki, şahin quşu tutiləşmişdi - uça bilmirdi, amma dili şe'r deməkdən qalmırdısa da, səfər şe'rləri yaranmırdı, tutti şəkərsizləşmişdi.

20 noyabr 2006. Bu gün İran Mədəniyyət Mərkəzinin sədr müavini ağaye-Səfərinin yanında oldum. O, sabah saat 12-də İran Astarasında bizim qarşılanacağımızı bildirdi. Yadıma keçən ilki Urmiyə şəhərinə səfərimiz düşdü. O zaman hətta Təbrizdən arxamızca Astaraya gəlib bizi qarşılamışdılar (400 km.). İran mehmannəvazlığa həmişə ciddi riayət edir. Amma vaxtımız xeyli azdır. Hacı Qurban Cəbrayılla məsləhətləşdim və gecə qatarı ilə yola çıxacağımızı qərarlaşdırdıq. Bu qatar sabah saat 9-da Astarada olacaq və biz saat 12-dək İran Astarasına çata biləcəyik. Nədənsə vüsal və hicran barədə düşündüm. Sabahdan bir neçə günlük Bakı hicranı, əvəzindəsə Təbriz və Urmiyyə vüsalı başlayacaq. Amma, getmək lazımdır, qonşu ölkənin şair və alimləriylə görüşmək vacibdir. Təbrizdə mənim bir qəzəllər kitabımın nəşr olunması məsələsi də var. Hicran və vüsal. İnsanı ömür boyu müşayiət edən iki labüd ayrılıq və görüş. Daim hicran vüsalla, ayrılıq görüşlə əvəz olunur. O qədər ayrılmışam ki... o qədər görüşmüşəm ki,.. Əfqanıstan, İran, Türkiyə, İraq səfərlərimdə mənə qismət olmuş hicranlar və vüsallar. yadıma bir qoşmamın iki bəndi düşdü:

*Bir hicran yenə də baxdı gözümdən,*
*Elə bil ildırım çaxdı gözümdən.*
*Ürəyimin yağı axdı gözümdən,*
*Ay aman, yandırdı yağ ayağımı.*

*Quş olub şığıdım hicrana tərəf,*
*Meylim əzm elədi imkana tərəf,*
*Sol ayaq getməsə canana tərəf*
*Mən kəsib ataram sağ ayağımı.*

Gecə saat 23-də Bakını tərk etdik. Qatarımız Astara istiqaməti boyunca bütün gecə yol getdi. Sübh ağarana yaxın belə bir qəzəl qaraladım:

*Qışıdır ömrümün, əlbət, mənə yaz vacibdir,*
*Qocanı dinc eləyən ali cihaz vacibdir.*

*İstərəm uçmağı Urmiyyə təkin gülzarə,*
*Gər uçan xalça tapılmazsa, palaz vacibdir.*

*Ey canım Azəribaycan eli, Odlar Yurdum,*
*Seyr edim hər yerini gündə bir az, vacibdir.*

*Gündə yüz dəfə bu Şahin əyilir qarşında,*
*Neyləsin, çünki müsəlmanə namaz vacibdir.*

21 noyabr 2006. Astaradayıq. Astaranın birincisindəyik. İkinci Astaraya çatmağımızdan ötrü gərək birinci Astara gömrüyündən keçək. Qapı ağzında yüzlərlə adam növbəyə durmuşdu. Bizi isə ikinci Astarada gözləyirdilər. Tələsmək vacibdir. Qadiri xatırladım. Qadir Əbiyevi - bizim gömrük keçid məntəqəsinin sədr müavinini. Gözəl ziyalıdır. Hər dəfə adımızı eşidən kimi dərhal giriş qapısına gəlib bizi qarşılayır...

Bu dəfə də elə oldu. Qadir müəllim gəldi və bizimlə əvvəlki səmimiyyətlə görüşdü. Görüşdü və pasport qeydiyyatı ilə əlaqədar işlər dərhal yerinə yetirildi. Görüşdü və bizi yola saldı. Yenə görüşərik, Qadir müəllim. Heç olmasa üç-dörd gündən sonra. Görüşərik qayıdan baş.

Astaradayıq. İran Astarasında. Maşındayıq. «Pejo» markalı yüngül minik maşınında. Gömrük məmuru Məhəmməd Hadi ilə xudahafizləşdik, bizə göstərdiyi qayğıya görə ona öz təşəkkürümüzü bildirdik və maşınımız hamar yolla şütüdü. Sürücümüzün adı Sərdar, soyadı isə Söhrabidir. Urmiyədən aldığı xüsusi sərəncamla bizi qarşılamaq və
Urmiyəyə çatdırmaq üçün Ərdəbildən gəlib. Mən hələ belə şe'rsevər və sinədəftər sürücü görməmişəm.

Maşın şütüyür. Dəfələrlə keçib-getdiyim yol. Astara-Ərdəbil yolu. Üstü ağaclarla örtülmüş dağların arası ilə irəliləyirik. Sağdakı dağlar bizimdir. Ərdəbilə 80 km. yol var.

Sürücünün mobil telefonu səsləndi. İran Mədəniyyət və İslam İrşadı Baş İdarəsinin Urmiyə şöbəsinin yüksək rütbəli məmurlarından biri sürücüyə bizim qayğımıza qalmaq tapşırığını verdi.

Gedirik. Narahatlığımız yoxdur, amma gərək qarşıdakı 700 km.-lik yolu tez qət edib Urmiyə gölündəki gəmi-bərəyə vaxtlı-vaxtında çataq. Qaş qaralanadək çatmalıyıq. Çatmasaq, yolumuz 100 km.-dən də çox uzanacaq.

Gedirik. Ağacların yarpaq tökümü başlayıbsa da, olub-qalan yaşıl yarpaqlar göz oxşayır. «Baharıstan» məntəqəsi. Sanki bahar «Baharıs- tan»da bitdi, çünki körpünü keçən kimi havanın birdən-birə dəyişdiyini hiss etdik.artıq önümüzdə qış canlanırdı. Biz irəlilədikcə yollarda və dağların yamaclarında qar örtüklərinin qalınlaşdığını, soyuğun çoxaldığını görür və hiss edirdik.

İndiyədək gəldiyimizin yolun arxamızda qalan hissəsi Gilan ostanının nəzarəti altındadır, öndə isə Ərdəbil ostanının nəzarətinə verilmiş yol başlayır. Qeyd edim ki, yolun bir hissəsi daha hamar və səliqə-sahmanlıdır.

Gedirik. Hər on-on beş km.-dən bir yol kənarlarında səyyar təcili yardım məntəqələri diqqəti cəlb edir. İşdi-şayəd qəzaya uğrasan köməyin hazırdır.

Gedirik. Geniş asfalt yolun üstü tər-təmizdirsə də, yan tərəfləri, yəni xam torpaqlar başdan-başa qar içərisindədir. Y ol qara, ətraf ağ. Qara və ağ. Qar və günəş. Biri dondurur, o biri qızdırar. Maşındayıq. Çölün soyuğu içəri dola bilmir. Donmasaq da, qızınırıq. Yaşasın günəş!

Gedirik. Yol ayrı-ayrı məntəqələrə bölünüb. Bayaq adını çəkdiyim «Baharıstan»dan sonra Sici, Heyran gədiyi, Vənəbin və başqa məntəqələr görünməz oldu. Sürücünün telefonu yenidən səsləndi. Bu dəfə zəng Bakıdandı. Ağaye-Behrudi idi. Vəziyyətimizlə maraqlanırdı. Çox sağ olsun. Bakıya təzə gəlib və Pakrəvanı əvəz edir. Bundan sonrakı
mədəni tədbirlər, daha dəqiq desəm, İran Mədəniyyət Mərkəzinin görəcəyi müəyyən işlərin bir hissəsi Behbudi tərəfindən görüləcək. Üz- gözündən ziyalılıq nuru axan bu gənc, görünür, olduqca diqqətcildir.

Gedirik. Həmin şəhərinə 20, Ərdəbilə 45 km. yol qalır. Qara və ağ. Yol və ətrafı. Qara və qar.

Ağaye-Söhrabi bizi darıxmağa qoymur. O, ustad Şəhriyarın vaxtı ilə ustad Süleyman Rüstəmə ünvanladığı şe’rlərdən müxtəlif misra, beyt və bəndlər deməyə başladı. Sonra maqnitofonu işə saldı. Şəhriyarın səsi. Hüznlü bir səs. Şair həyatdan vaxtsız köçmüş həyat yoldaşı Əzizəyə deyirdi:

*«Nə zərif bir gəlin, Əzizə, səni*
*Mənə layiq Tarım yaratmışdı.*

*Bir zərif ruha bir zərif cismi*
*İzdivac hörmətilə qatmışdı.*

*Eşqimin bülbülü səni tutmuş,*
*Hər nə dünyada gül var, atmışdı.*

*... Qara gün qarğası qonanda, mənim*
*Ağ günüm varsa da, qaraltmışdı.*

*... Nə qədər ovdum, açmadın gözünü,*
*Göz sükuti-əbədlə yatmışdı.*

*O ala göz oyanmadı ki, mənim*
*Bəxtimi min kərət oyatmışdı.*

*... Sən nə yaxşı etmədin, balalar «Ana*
*vay» naləsin ucaltmışdı.*

*... Qırxa sən yetmədin, cavan getdin,*
*Mən gedəydim ki, yeddim altmışdı».*

Ustad Şəhriyar, 67 yaşlı dul Şəhriyar 40 yaşında həyatı tərk edən xanımının ölümünə ağlayırdı. Bəli, həssas şair üçün qadın itkisi müsibətdir, bəlkə də Kərbəla müsibəti qədər ağır bir müsibətdir. Bu hissi mən də keçirmişəm və hüznümü iki kitabla bəyan etmişəm. Bir itki və iki kitab: «Qırxnamə, yaxud qırx şe’rdən ibarət Elegiya» və «İlnamə, yaxud Səndən ayrı səninlə» kitabları...

Sürücümüz bir qədərdən sonra maqnitafonu söndürüb yenə öz dilini açdı, Şəhriyarın ilk şe’r misrası. Şair öz atasının xidmətçisi Şahbacıya xitabən belə deyib:

*«Şabacı, səni həzrəti, dur, şamı gəti»*

yəni, Təbriz ləhcəsi ilə belə deyib şair: «Ay Şahbacı, səni and verirəm Həzrət Abbasa, dur, şam yeməyini gətir». Ağaye-Söhrabiyə görə, ustadın farsca dediyi ilk misraları isə belə olub:

*«Ähuyi dər dəşt çegune dəvəda?*
*U yare-biyar çegune bovəda?»*

yəni «Çöldəki ahu nə təhər qaçmada?// Yarsız olan yar nə təhər olmada». Allah sənə rəhmət eləsin, ustad!

Gedirik. Üstü qarlı Savalan dağı göründü. Həmin şəhər yolun sağında qaldı. Mən söhbətarası duzlu-məzəli şairlərdən biri olan Mirzə Əli Möcüzü təriflədim. Sinədəftər Söhrabi sanki bunu gözləyirmiş. Dedi:

*«Dünən cəmaətə söylərdi göldəki qazlar:*
*Keçəl uşaqları minbə'd həmamə qoymazlar».*

Mən də sürücümüzün səsinə səs verib Möcüzün rəhmətlik Sabir tərzində yazdığı şe'rindən bu misraları dedim:

*«Pantalon geyməmişəm, bığlarımı burmamışam,*
*Ä Şəbüstərli dadaşlar, sizə mən neyləmişəm?»*

Ara-sıra Hacı Qurban Cəbrayıl da sürücü ilə mənim aramızdakı söhbətlərə qarışırdı. O da, bəlkə bizdən də çox Şəhriyarı, Möcüzü və Sabiri xoşlayırdı.

Ərdəbil arxada qaldı. Sərab öndəydi. Ərdəbil-Sərab arasında bir qəzəl yazdım:

*Mənə həm cövr eləyir dövr, edir canan həm,*
*Çəkməyir dərdimi biganələşən loğman həm.*

*Qarabağ mülkü yad əllərdə, əlimdən nə gəlir?*
*Deyiləm mən nə xəlifə, deyiləm sultan həm.*

*Getmirəm Kabula, Бağdadə haçandır, amma*
*Məni də'vət eləyir Ankara həm, Tehran həm.*

*Əfqanıstan ilə İranə könül bağlamışam,*
*Əfqanıstan da əzizdir bu kəsə, İran həm...*

Gedirik. Buranın kurort yerlərindən biri olan Səreynə 15 km. qalır. Bakıda işlədiyi müddətdə yaxından tanıdığım şair və filosof Adil Movlayi indi orada imamcümə vəzifəsində işləyir. Ağaye-Movlayi haqqında «Təzkireyi-Şahin» kitabımda məlumat vermişəm. Axı o da «Məcməüş-şüəra» ədəbi məclisinin üzvlərindən biri idi. İlhamı qaynar şairdir. Sürücümüz dedi ki, Adil Movlayi onun həmkəndlisidir və kəndlərinin adı Şaməsbidir.

Səreynin kənarından ötdük. Yol Sərabadır. Təbrizə isə 201 km. qalır. Yenə qara asfalt və qarlı ətraf. Qara və ağ...

Ağaye-Söhrabi yenə Şəhriyardan söz saldı, dedi ki, rəhbərimiz Seyid Əli Xameneyi ilə Şəhriyar dostluq ediblər. İslam inqilabının qələbəsindən sonra Təbrizə səfər edən cənab Xameneyi Şəhriyarla görüşür və ustad ona Tikmədaşlı Xəstə Qasımın bir şe’rinə yazdığı nəzirəsini söyləyir:

*«Sənin bəhrən, yiyən kimdir?*
*Kiminkisən, yiyən kimdir?*

*Sənə doğru deyən kimdir?*
*Yalan dünya, yalan dünya!*

*...Qazanıb, hey talanıbsan,*
*Qalanıb, hey calanıbsan,*
*Əzəldən çalxalanıbsan,*
*Yenə də çalxalan, dünya.*

*İgidlərin başın yeyən,*
*Qocalar bozbaşın yeyən,*
*Qəbirlərin daşın yeyən,*
*Özü yenə qalan dünya.».*

Sonra söhbət Şəhriyarın müasir Azərbaycan (Bakı) şairləri ilə şe'rləşməsindən düşdü və Hacı Qurban Cəbrayıl Bəxtiyar Vahabzadədən bir bənd dedi:

*«Düşündükcə агам-агам*
*Şəhriyarçün göynər yагам.*
*Çox Да ki, mən Бэхйуагат,*
*Биг gül ilə уаз ачйтаг».*

Dodaqaltı «Bir gül ilə yaz açılmaz» misrasını təkrar edən Söhrabi dedi ki, qulaq asın, sizə Şəhriyarın çap olunmamış şe'rlərindən də deyim:

*«Дата nə qəd üzlü olub,*
*Бахт, deyir sel оЛтщат.*
*Məsnui tük ЬашДа əsir,*
*Deyir ki, mən tel оМщат».*

Məsnui tük - yəni parik, süni saç. Ustad yekəxanalığı yaxşı tənqid edib. Bu yerdə onun «Şatır oğlan» şe'ri yadıma düşdü. Şair özündən razı, iddiası bol olan bir nəfərə nə gözəl deyir:

*«İddiası çox olan boş təbilə bənzəyəcək,*

*Neyləmək, zurnaçının boynu gərək yellənsin».*

Sürücümüz Ərdəbilin adlı-sanlı şairlərindən və «Məclisi-Hafiz» ədəbi məclisinin sədri Əsgər Şahidən də danışdı və onu Ərdəbilin ən güclü şairi adlandırdı. Onun dediyində həqiqət vardı. Mən Şahi qardaşımı dəfələrlə «Məcməüş-şüəra»ya də'vət etmiş, onunla söhbətləşmişəm. «Təzkireyi-Şahin»də bu haqda belə bir qeyd var: «Xoşbəxtlikdən Şahi ildə bir neçə dəfə Bakıya gəlir. Burada onu tələbələr, həmyerliləri, dostları və əlbəttə ki, «Məcməüş-şüəra»çılar gözləyir. Tez-tez yığışıb şe'rləşirik. Şahi qardaşımın Bakıya növbəti gəlişinin birində... zarafatyana belə bir dördlük yazdım və onu məclisin «Şirvanşahlar sarayı»ndakı növbəti iclası zamanı oxudum:

*Şahi gəlibdir deyə bir daha Şirvanıma*
*Sinədəki mən kəsin ahi gedibdir yenə.*
*Şahini evləndirək, qoy deməsinlər daha*
*«Şahi gəlibdir yenə», «Şahi gedibdir*
*yenə»».*

*(Бах: Təzkireyi-Şahin, Бakı, 2006, s.383)*

Ərdəbil şairləri Yəhyəvi və Münzəvidən də söhbət açan ağaye- Söhrabi sonra öz şe'rlərindən deməyə başladı. Allahın bəlasıdır bu sürücü. Şairliyi də varmış. Görün o, «sər» (baş) və «dar» (dar ağacı) sözlərindən ibarət olan öz adının mə'nasını nə gözəl izah edir:

*««Sərdar»ın əvvəli «sər»dir, bunu heç kim danmaz,*
*«Dar»ı qoyduq yanına qeyddən azad olsun».*

Vallah yaxşı deyib.

Nəhayət Sərab şəhərinə yetişdik və burada nahar etdik. Sonra Sərab-Təbriz yolu. Ətrafdakı qarlar seyrəlib. Qara və azacıq ağ.

Maşın sürətlə irəliləyir. Məqsəd Urmiyyə gölündəki gəmi-bərəyə vaxtında yetişməkdir.

Sərabdan bir qədər aralandıq. Bəzi yerlərdə günəş qarı tamam əridib. Qara və qara...

Gedirik. Sürücü bir qədər sonra maşını saxlayıb yol kənarındakı polis məntəqəsində yol vərəqəsini növbəti qeydiyyata aldırır. Bütün yolumuz boyu bu «əməliyyat» dörd-beş dəfə davam edəcək. Belə ki, hər polis məntəqəsi qarşıdakı məntəqəyə bizim sağ-salamat yolumuza davam etdiyimizi xəbər verir.

Darıxmayaq deyə sürücü söhbəti yenə Əsgər Şahidən saldı və belə bir məzəli əhvalat danışdı: Əsgər qardaşımız günlərin bir günü Meşkinşəhrə gedir ki, orada təşkil olunan şe’r toplantısında iştirak etsin. Şairlər xalça üstündə əyləşib şe’r oxuduqları üçün hamısı ayaqqabılarını çöldə soyunubmuş. Məclis qurtardıqdan sonra otaqdan çıxan Şahi ayaqqabılarını soyunduğu yerdə tapa bilmir və pərt olub yanında dayanmış bir şair yoldaşına bədahətən bu beyti deyir:

*«Vay dədə vay, leydilə meşkinlilər,*
*Başmağımı geydilə meşkinlilər»*

Necə də şirin yumor hissi ilə deyilmiş iki misra. Şahiyanə misralar. Əruz vəzninin səri bəhrində deyildiyindən «leydilə» və «geydilə» («r» samiti atılmaqla) sözləri bu şe’r parçasına xüsusi bir şirinlik gətirir.

Ağaye-Söhrabinin danışdığı başqa bir əhvalat. Bu dəfə tamamilə ciddi. Bu dəfə şair Yəhyəvi barədə: Yəhyəvi Ərdəbildə məhkəmə hakimi (qazi) vəzifəsində işləyirmiş. Nədənsə onu vəzifədən kənarlaşdırır, hətta şe’r yazmasını belə qadağan edirlər. Şair bu hökmdən qəzəblənərək bu təkbeyti deyir:

*«Təkcə şe’rin dilidir bağlayan idrakə məni,*
*Hökm olubdur mənə ondan da gərək əl götürəm».*

Beləcə şe’rləşə-şe’rləşə, söhbətləşə-söhbətləşə Təbrizə yaxınlaşmaqdayıq. Ətrafı seyr edirəm. Qar yenə çoxalmışdır. Yolumuzun kənar səmtləri yenə ağappaqdır. Yenə qara və qar. Yenə qara və ağ.

Gedirik. Təbrizə 115 km. qalır. Yenə qeydiyyat «əməliyyatı». Yenə zəng: «Haradasınız?» (Urmiyədən maraqlanırlar). Sürücüyə tapşırdılar ki, gəlib yetişən kimi qonaqları «Mirvari» otelinə gətirsin.

Keçən il Urmiyədə Xaqani Şirvaniyə həsr olunmuş elmi konfrans keçirilmişdi. O zaman da «Mirvari»də qalmışdıq. O zamandan gözüm «Mirvari»də qalmışdı. Yenə «Mirvari»də qalacağam. Çox da böyük olmayan gözəl bir oteldir «Mirvari».

Gedirik. Təbrizi keçdik. Təbrizdən çıxdıq. Saat beşin yarısıdır. Urmiyədən növbəti zəng. Sürücü dedi ki, narahat olmasınlar, tezliklə gəmi-bərəyə çatarıq inşallah.

Gedirik. Yenə qeydiyyat. Yeni qeydiyyat. İlxıçı şəhəri.

Gedirik. Neçə vaxtdır ki, günəş bizə baxır, biz günəşə. Baxhabaxdır. Hacı Qurban dedi: Biz Astaradan gələndə isə Xəzər bizə arxadan baxırdı. Xəzər sanki bizi yola salırdı. İndisə, Xəzərdən doğan günəş Urmiyə gölündə qürub etməkdədir.

Gedirik. 95 km. qalır. Ətrafa adda-budda səpələnmiş qar üzümüzə ağarmaqdadır. Budur, Şahin dağı, hündür və yamacı qarlı dağ.

Yolun solunda bir lövhə gördük. Üzərində «İskələ» yazılmışdı. İskələ - yəni bərə. 35 km. qalır. Vaxtında gedib çata bilsəydik yaxşı olardı.

Çatdıq. Maşın növbəsi. Növbəmizin çatmasına və maşınımızın bərəyə girməsinə yarım saatdan çox vaxt itirdik. Bərə yola düşdü. Bayaqdan bizi aparan maşını indi bərə aparırdı.

İyirmi dəqiqəlik yol. İndi istiqamət müstəqim olaraq Urmiyəyədir. Yenə zəng. Gözləyirlər. Urmiyənin girəcəyində Mədəniyyət və İslam İrşadı İdarəsinin sədr müavini ağaye-Camal Abbaszadə bizi öz maşınında gözləyirdi. Sərdar Söhrabinin maşınından çıxıb, Camal Abbaszadənin maşınına əyləşdik.

«Mirvari» oteli. 204 saylı otaq. Bir qədər dincəldik və ağaye- Abbaszadə bizi otelin restoranına də'vət etdi. Mizin dövrəsində daha dörd nəfər əyləşmişdi. Tanış olduq: Şair Mir Cəlal. Naxçıvandandır. Birinci təxəllüsü - Qaraçuğlu. İkincisi Xanaraz. O, hal-hazırda hər iki təxəllüsündən sərfnəzər edib; şair Qafar Qərib. O da Naxçıvandandır. Orada Elmlər Akademiyası nəşriyyatının direktorudur; Ağaye-Həsən Məhəmmədzadə - Maku şəhər Mədəniyyət və İslam İrşadı idarəsinin sədri; Ağaye-Əmir Tabeş - Urmiyyədə dövlət məmuru.

Hacı Qurban Cəbrayıl dərhal sabahkı proqramımızla maraqlandı. Məlum oldu ki, sübh tezdən Türkiyədən iki şair, Təbriz və başqa şəhərlərdənsə 40-45 şair Urmiyəyə gələcək, konfransın açılışı isə axşam saat beşin yarısında

olacaqdır. Mövzu səkkizinci İmam Rza əleyhüssalama həsr olunmuş şe’rlərin oxunması və bir gündən sonra təvəllüd gününü qeyd edəcəyimiz Həzrəti-Məsumə səlamullahi-əleyhanın (İmam Rzanın bacısı) şəninə yazılmış şe’rlərin dinlənilməsidir. Konfransın qapanması isə Təbrizdə olacaqdır.

22.11.2006. Həmişəki adətim kimi sübh tezdən oyandım. Qəzəl yazmaq istədim və yazdım da. Təbii ki, qəzəlin qəhrəmanı İmam Rzadır:

*Ey Rzavü Rezəvi adlanan insan, əhsən,*
*Şə'ninə həsr olunubdur neçə dastan, əhsən.*

*Daima yad eləyir ismini islam əhli,*
*Sənə məclis qurubdur yenə İran, əhsən.*

*Böyük işlər ki edibsən hamıya mə'lumdur,*
*Hamıya örnək olubsan, şərəfü şan, əhsən.*

Qəzəli yazdım və rahat oldum. İndi konfransda arxayınlıqla iştirak etmək olar. Başqa şe’rlərsə başqa günlər yazılacaq.

Sübh yeməyindən sonra ağaye-Cəlal Abbaszadə Hacı Qurban Cəbrayılı, Mir Cəlalı, Qafar Qəribi və məni Urmiyə gəzintisinə də’vət etdi və yolda Qərbi Azərbaycan ostanının dağları, çayları və gəzməli- görməli yerləri barədə müxtəsər məlumat verdi. Öyrəndik ki, maşından seyr etdiyimiz və əgər qismət olarsa uzaqdan-uzağa olsa da görəcəyimiz dağlar bunlardır: Bənd dağı, Sırdağ, Şıxtəpə, Allah-əkbər, Benar, Bürce- Sina, Dalam-Rövzə (yaxud Dərəçay). Bildik ki, Qərbi Azərbaycanda da Qarabağ adlı yer var. Bu yer Urmiyyə gölünün şimalında yerləşir və buradan təxminən 50 km. aralıdır.

Dərhal Əfqanıstandakı Qarabağ qəsəbəsini xatırladım. O Qarabağ Kabulun yaxınlığındadır. Mənə çox doğma olan Kabul və Qarabağ...

Maşın bizi Şəhərçayın «Bənd» adlanan gölünə (daha doğrusu su ambarına) gətirdi. Süni göldür və Urmiyə şəhərinə axan çay həmin göldən ayrılır. Orada hər birimiz bir neçə şe’r dedik. Özümüz dedik, özümüz də qulaq asdıq. Axşam isə bizim şe’rlərimizi yüzlərlə şe’rsevər insan dinləyəcək.

Geri qayıdırıq. Birdən-birə Cəlal Abbaszadə də deyəsən cuşa gəlib özünün türk və fars dillərində yazdığı bir neçə şe’rini söylədi:

*«Əzizinəm, gül səndə,*
*Bülbül səndə, gül səndə.*
*Bu dünya qurtulandı*
*Ağlasan da, gülsən də».*

Budur, şəhərin mərkəzi hissəsindən keçirik. Cənub səmtə gedən küçələrin birində divarda kim tərəfindənsə böyük qara hərflərlə yazılmış bir şüar nəzərimi cəlb etdi: «Torpaqdan pay olmaz!» Azərbaycan dilində ərəb hərfləriylə elə belə də yazılıb: «Torpaqdan pay olmaz!». C.Abbaszadənin izahına görə Urmiyədə çoxlu erməni və kürd yaşayır və həmin şüar Qarabağı işğal edən ermənilərə möhkəm bir şillədir. Mən dedim: Elə bir gün gəlsin ki, işğalçı ermənilərə biz şillə deyil, güllə vuraq!

Maşın irəlilədikcə yol boyunca hüzn əlaməti olan qara parçalar gözə dəyirdi. Məlum oldu ki, Qum şəhərində fəaliyyətdə olan ayətullah Mirzə Cavad Təbrizi dünən vəfat etmişdir və bu münasibətlə İranın bütün yerlərində bir, Təbrizdə isə üç günlük matəm elan olunmuşdur.

Şəhərdən çıxdıq və qarşımıza bir kənd çıxdı: İmamzadə kəndi. Sonrasa başqa kənd: Ləşimli. C.Abbaszadənin bağ evi bu kənddədir. Ev sahibi tərəfindən tez-tələsik bir meyvə süfrəsi bəzəndi. Bir saat sonra yenidən İmamzadə kəndinə gəldik. Böyük və yaşı min ilə yaxın olan İmamzadə məscidi. Yeddinci imam Museyi-Kazımın iki oğlu (İbrahim və Məhəmməd) bu məsciddə uyuyurlar. Onların ziyarətindən sonra, günorta vaxtı olduğundan namazımızı bu məsciddə qıldıq.

Tehranın Şah Əbdüləzim məscidində olduğu kimi bu məscidin həyətyanı sahəsinə də qəbirüstü daşlar döşənmişdir və hamı, o cümlədən biz də həmin daşları tapdaya-tapdaya gedirik. C.Abbaszadə dedi ki, belə gəzinti həmin qəbirüstü daşların altında yatanlara böyük şərəfdir.
Mənim təəccübümə səbəb olan belə qəbirüstü daşların biri də elə indicə adını çəkdiyim Şah Əbdüləzim məscidinin həyətindədir. İran məşrutə inqilabının məşhur rəhbəri Səttar xanın qəbirüstü daşı (Səfərnamələrimin birində bu haqda yazmışam).

Məsciddən çıxıb otelə gəldik. Restorana girdikdə nəzərimi dərhal Urmiyəli şair, bir neçə il İran parlamentinin üzvü olmuş köhnə dostum Beytullah Cəfəri cəlb etdi. İsti görüş, isti söhbətlər. İsti söhbətlərdən isti

şe’rləşməyə keçid. Otelin foyesindəki mizlərin üstünə qoyulmuş çaydanlardakı isti çaydan içə-içə yeni bir müşairə başlandı. Beytullahın dediyi iki bayatıdan xoşum gəldi:

*«Mən aşiq qəmə biçdi,*
*Ox biçdi, qəmə biçdi.*
*Tanrım xələt biçəndə*
*Bizimkin qəmə biçdi».*

*«Mən aşiqəm dilimlən,*
*Kəs qovunu dilimlən.*
*Dilim-dilim kəsilsəm*
*Ayrılmaram dilimdən».*

Beytullah Cəfəri bir neçə ay əvvəl Tehran və Təbriz şəhərlərində qeyd olunmuş Şəhriyarın yubiley konfransı (doğumunun 100 illiyi münasibətilə) barədə də məlumat verdi: Bakıdan da bir neçə Şəhriyarşünasalim təşrif gətirmişdi. Mən o vaxt onlara xitabən bir şe’r dedim ki, onun beytlərindən biri belədir:

*«Niskil oldu Şəhriyarə Gəncə, Bakı, Naxçıvan,*
*Şəhriyarın yurdu Azərbaycana xoş gəlmisiz».*

Müşairə bitdi və hərə öz otağına dağılışdı. Bir qədər istirahət.

Axşam saat beşin yarısıdır. Urmiyə Mədəniyyət və İncəsənət sarayının böyük iclas zalı. Keçən il mənimlə burada tanış olmuş çoxlu tələbə və şairlə görüşdüm. Universitetdə oxuyan Tanrıya adlı gənc öz bacısı və qardaşıyla yanıma gəldi və yaxın günlərdə Bakıya gələcəyini söylədi. Çox mehriban insandır Tanrıya! Tanrı səni qorusun Tanrıya!!! Gün o gün olsun ki, bitirəsən təhsilini və böyük bir şair olasan (Onun şe’rlərinin biri mənə həsr edilmişdir).

Ön sıradakı stullarda əyləşmişdik. Türkiyədən gəlmiş şairlər Kərbəlayi Hüseyn Y alçın, Y alçının arvadı Bəlgin yanımda əyləşmişdilər, Musa Aydınsa bir qədər məndən uzaqdır. Bəlgin Y alçın qulağıma ərinin şairliyini çox təriflədi.

Arxamdakı sırada əyləşmiş başqa bir qadın da özünü mənə təqdim etdi: Ustad Şəhriyarın bacısı Ələviyyə Mirzadənin qızı Fəridə!

İran İslam Cümhuriyyətinin himni səsləndi. Hamı ayaq üstdə. Sonra Quran tilavəti. Aparıcı xitabət kürsüsündə göründü və Məhəmməd Füzulinin tanış misraları onun ifasında çox gözəl səsləndi:

*«Yarəb, həmişə lütfünü etpəhnüma mana,*
*Göstərmə ol təriqi ki, getməz sana, mana.*

*...Bir yolda sabit et qədəmi-etibarımı,*
*Kim rəhbəri-şəriət ola müqtəda mana.*

*Yox məndə bir əməl sənə şayəstə, ah, əgər*
*Əmalıma görə verə ədlin cəza mana.*

*.. .Həbsi-həvadə qoyma Füzulisifət əsir,*
*Yarəb, hidayət eylə təriqi-fəna mana».*

Cənab aparıcı sözü Urmiyə imamcüməsi höccətül-islam və-l müslimin ağaye-Həsəniyə verdi. Alqışlarla səhnəyə çıxan höccətül-islam onun üçün xüsusi gətirilən stula əyləşdi və sözə başladı. Başladı nə başladı!!! Bakıda çap olunan «Sənət qəzeti»ndə getmiş «Avropa və biz» adlı məqalənin müəllifi olan Rafiq Tağının ünvanına şair Beytullah Cə’fəri kimi kəskin sözlər deyərək onu mürtəd adlandırdı, qanının tökülməsini halal buyurdu, tezliklə edam olunmasını məsləhət bildi və qətlinə fitva verdi. Təbii ki, Hacı Qurban Cəbrayıl və mən pərt olmuşduq. Bizi cənab imamcümə deyil, məsuliyyətsiz hərəkət edib zərərli məqalə yazan Rafiq Tağı pərt etmişdi. Bütün dünya tərəfindən pey-ğəmbər kimi qəbul olunan Həzrət Məhəmməd (s.) əleyhinə təhqiramiz cızmaqara qaralayan Rafiq Tağı təkcə peyğəmbərimizi deyil, bütün müsəlman aləmini təhqir etmişdi. Təhqir etmişdi və artıq o yazıdan xəbərdar olan əksər müsəlman ölkələri, həmçinin Urmiyə imamcüməsi tərəfindən onun alnına lənət damğası basılmışdı.

Yuxarıda barəsində danışdığım şair Beytullah Cəfəri çıxışına «Xoş gəlmisiz» rədifli şe’ri ilə başladı, anti-islam mövqe tutan həmyerlimiz Rafiq

Tağını kəskin tənqid atəşinə tutdu ki, onun alovlu sözlərindən sanki bir də alovlandıq. Ah, Rafiq Tağı, Rafiq Tağı!..

Höccətül-islamın qəzəbli çıxışından sonra söz mənə verildi. Zalda əyləşənləri səmimiyyətlə salamlayıb onlara Bakı salamı çatdırdım, Urmiyədə ikinci dəfə olduğumu dedim və İrana üçüncü, Məşhədə isə ikinci səfərim zamanı yazdığım şe'rimi oxudum:

Qəzəl

*Səkkizinci imam Əbülhəsən Əli ibn Musa əl-Rzamn şərəfinə*

*Yoxdu imam olmağa səndə məram, ey imam,*
*Amma imamət sənə oldu məqam, ey imam.*

*Əfv eləki, şe'rimi «ey» deyə ərz eylədim,*
*Mən sənə aciz qulam, sənsə imam, ey imam.*

*Бu neçə gün yad edib uyquda gördüm səni,*
*Sən «xudahafiz» dedin, mənsə «salam», ey imam.*

*Üç bacım xatirə sən gətirib ağladın,*
*Çünki o məsumələr almadı kam, ey imam.*

*Sevgili övladısan sən ki İmam Musanın Ömr*
*uzunu bəsdədin dinə inam, ey imam.*
*Doğma elindən səni sürgünə göndərdilər,*
*Oldu pərişan necə gör o nizam, ey imam.*

*Ötmədi asan günü heç də Xorasanda,*
*Etdi xilafət sənə qarşı qiyam, ey imam.*

*Fikri işıq, əqli nur, zehni ziya, qəlbi gen,*
*Elmi dərin, helmi çox, qayəsi tam, ey imam.*

*Bir neçə il mədhini gərçi xəyal eylədi,*

*Etdi bu Şahin bu gün şe'ri tamam, ey imam.*
*30.05.2000*

Sonra ikinci şe'rimin qiraətinə başladım və təbii ki, bu şe'r də İmam Rza səlamullahi-əleyhin şərəfinə təzəcə yazılmışdı ki, həmin şe'ri, möhtərəm oxucular, bir qədər yuxarıda sizə təqdim etdim.

Səhnədən enib yerimdə təzəcə əyləşmişdim ki, Babəli Cavanmərd adlı bir şair yaxınlaşıb iki kitabını mənə təqdim etdi.

Məndən sonra çıxış edən Urmiyə ostanının ostandarı cənab Qurbaninin məruzəsi əsasən siyasi məzmunlu oldu. O, İmam Rzanın və başqa imamların «məsum» adlanmalarının səbəbini açıqladı və bu xüsusda gələcəkdə məqalələr yazacaq müəlliflərin mükafatlandırılacaqlarını elan etdi. Konkursun qalibini müqəddəs Həcc ziyarətinə göndərəcəyini bildirdi, «qoy İmam Rza əleyhüssəlamın həyatı və fəaliyyəti sizin üçün əməli bir ülgü olsun» deyərək sözünə xitam verdi.

Ostandarın çıxışından sonra «Tuba» ilahi nəğmələr qrupunun ifasında bizə iki nəğmə təqdim olundu.

Davud Beydəqdar. Tehrandan gəlib. Əvvəlcə türkcə bir müsəddəs (altılıq - yəni hər bəndi altı misradan ibarət şe'r janrı), sonra isə xoşagələn avazla bir növhə oxudu. Müsəddəs İmam Rzaya, növhə isə Həzrəti Məsuməyə həsr olunmuşdu.

Qərbi Azərbaycanın ostanının Mədəniyyət və İslam İrşadı İdarəsinin sədri cənab Qəffariazər öz qısa nitqindən sonra belə bir mə'lumat verdi: Bu konfransa onun iştirakçıları və iştirak etmək arzusunda olan başqa şairlər tərəfindən 252 şe'r göndərilmişdir (Azərbaycan Respublikası, Naxçıvan və Türkiyədən gələn şe'rlər istisna olunmaqla). Əlbəttə, bu rəqəm İmam Rza əleyhüssalama böyük ehtiramın bariz bir nümunəsidir.

Seyfi Ərdəbili - bir neçə divan müəllifi səhnədə göründü və uzun bir qəsidə oxudu. Gözləri yaşarmışdı.

Türkiyəli şair və islamşünas Musa Aydın. O, 2 il Urmiyə Universitetində, 17 il Qumda təhsil alıb. Güclü şairdir, amma şe'rləri qəliz ərəb və fars sözləri və bir neçə mərtəbəli izafət tərkibləri ilə zəngindir. Mən onu eşitdikcə sanki bir neçə əsr bundan əvvəl yazıb- yaratmış bir şairi dinləyirdim... Musa Aydın, aparıcının xəbərdarlığına baxmayaraq, uzun şe'rlər qiraət etdi və. uca avazla

dini bir mahnı oxumağa başladı. Xitabət kürsüsündən ayrılmaq istəmirdi buş air və islamşünas. Vəcdə gəlmişdi.

Naxçıvandan gəlmiş Mir Cəlal da yığcamlıqdan uzaq bir şairdir. O, 3 şe'r oxuyacağını dedi və səbrlə dediyinə əməl elədi.

Təbrizdən təşrif gətirən Qulamrza Rəzmidən sonra (mən onu yaxşı tanıyıram, ilhamı yüyrəkdir) bizim Hacı Qurban Cəbrayıl də'vət olundu. Onun çıxışının əvvəli bir növ siyasi xarakter daşıdı. Baş redaktor Qurban Cəbrayıl höccətül-islam və-l müslimin ağaye Həsəniyə - Urmiyə imamcüməsinə və konfransın başqa iştirakçılarına Rafiq Tağının qeyri- məqbul məqaləsi xüsusunda aydınlaşdırıcı məlumat verdi, əlində tutduğu «Nəbz» qəzetinin bu mövzuya həsr olunmuş məqalələrini əyani surətdə nümayiş etdirdi və əlbəttə, Rafiq Tağıya bəraət qazandırmadan, bir nəfərin subyektiv fikrinin heç də ümumi fikir olmadığını dönə-dönə vurğuladı. Baş redaktor, «Nəbz»də «Sənət qəzeti»nin baş redaktoru Samir Sədaqətoğlunun və həmin qərəzli məqalənin müəllifi Rafiq Tağının artıq iki ay müddətinə həbs olunduqlarını da bəyan etdikdən sonra şair Qurban Cəbrayıl kimi çıxışa başladı, özünün «Azıb gəlmişəm dünyaya» və «İlahi, məni də yanına çağır» şe'rlərini təqdim etdi.

Həbib Vahidi, İqbal Mənsuryan, Əhməd Əhmədi kimi şairlərdən sonra Türkiyəli şair Kərbəlayi Hüseyn Yalçın gülümsəyə-gülümsəyə şe'r oxumağa başladı, amma yanımda əyləşən arvadı Bəlgin Yalçın ağlayırdı və ərini aşiqanə nəzərlərlə sanki yeyirdi. Hüseyn Yalçın da çox uzun danışdı («Ayna» adlı şe'r, sonra bir minacat, sonrasa Əli əleyhüssalama həsr olunmuş başqa bir şe'r).

Naxçıvanlı şair Qafar Qərib iki şe'r oxudu: «Bir payız havasında» və «Dərya yolu». Dərhal Urmiyəyə gəlişimizi xatırladım. Biz buraya bir payız havasında göl yolunu keçib gəlmişdik. Yolun aydın olsun, Qafar Qərib!

Əyyub Şahbazi, Kamali, Şəbüstəri və xanım Şükraninin çıxışlarından sonra söz Marağadan gəlmiş Rza Paşazadəyə verildi. Mən onunla bir neçə il bundan əvvəl tanış olmuşdum. Bizim Allahşükür Paşazadənin yaxın qohumlarındandır.

«Ağ gəldi gözə gözlədiyim yar gəlincə» misrası ilə sözə başlayan şair Xodavəndigardan sonra Maku şəhərindən olan Rza Dövlətxah bir şe'r oxudu və bununla da «Rəzəvi Azəri türk şe'rlərinin birinci Beynəlxalq bayramı» adlanan konfransın açılış mərasimi sona yetdi, qapanışı isə sabah Təbriz şəhərində olacaqdır.

Bir neçə qəzet və radio jurnalisti ilə ayaqüstü müsahibədən sonra köhnə tanışım Mustafa Quluzadə mənə bir qəzetin bir neçə sayını təqdim etdi: «Də’vət» qəzeti. Urmiyyədə çıxır. Hicri tarixlə 1385-ci il şəhrivər ayının 22-də (13 sentyabr 2006) «Də’vət»in 19-cu sayında mənim Allahın tərifinə həsr etdiyim minacatımın bir hissəsi və bir neçə təkbeytim dərc edilmişdir. Qeyd etməliyəm ki, həmin qəzetin başqa bir sayında xalq şairimiz Nəbi Xəzridən də dini şe’rlər verilmiş, barəsində xoş sözlər yazılmışdır. «Müasir Azərbaycan şe’rində dini düşüncələr» ünvanı altında bizim şe’rlərimizi çap edən Mustafa Quluzadəyə öz təşəkkürümü bildirərək ondan ayrıldım. Sabah isə Urmiyədən ayrılacaqdım.

«Mirvari»də axşam saat 22-dən gecə saat 2-dək davam edən şe’rləşməmiz olduqca isti keçdi. «Şe’r gecəsi»ni aparmaq Beytullah Cəfərinin təklifi ilə mənə həvalə olundu. Çay mizinin arxasında on nəfərdən çox şair əyləşib növbə ilə öz şe’rlərini oxuyurdu. Beytullah Cəfəri, Seyfi Ərdəbili, Davud Beydəqdar, İlqar Mənsuryan (İran), Musa Aydın (Türkiyə), Mir Cəlal, Qafar Qərib, Hacı Qurban Cəbrayıl və başqa şairlər Qərbi Azərbaycanın paytaxtında qəriblik çəkmədən və qətiyyən darıxmadan bir-birlərinə öz şe’r töhfələrini təqdim etdilər. Yaşasın şe’r!

23 noyabr 2006. Sübh tezdən gecə beynimdə dolaşan dağınıq fikirlərimi bir yerə toplayıb İmam Rza əleyhissəlam barədə yeni bir şe’r yazdım və onu Qurban Cəbrayıla oxudum:

*Şəninə salam, ya İmam Rza!*
*İzzü ehtiram, ya İmam Rza!*

*Şöhrəti böyük, ehtişamı bol,*
*Ehtiramı tam, ya İmam Rza!*

*Ey ki mə'nəvi padişahımız,*
*Biz sənə qulam, ya İmam Rza!*

*Zülmə dözməyən qəhrəman kimi*
*Eylədin qiyam, ya İmam Rza!*

*İslamın gücü olmasın zəif,*
*Bəxş et ehtişam, ya İmam Rza!*

*Eylə kafərin əzmini əbəs,*
*Böylədir kəlam, ya İmam Rza!*

*Tapmasın zaval inqilabımız,*
*Eyləsin davam, ya İmam Rza?*

*Ali ey cənab, arta qoy savab,*
*Qalmaya haram, ya İmam Rza!*

*Eylə bir əlac intizam ola,*
*Getməsin nizam, ya İmam Rza!*

*Qoyma Şahinin ilhamı sönə,*
*Ya imam, imam, ya İmam Rza!*

Sübh yeməyimizi yeyib, cənab Abbaszadənin təklifi ilə şəhərin gəzintisinə çıxdıq. Səfəviyyə dövrünə aid olan Örtülü Bazara baş çəkdik, Zərdüştilik zamanı inşa olunmuş Segonbəddə (Üç gümbəz) olduq. Bizə məlumat verildi ki, vaxtı ilə üç gümbəzdən ibarət olan bu sahədə hal- hazırda bircə gümbəz görürsünüz, onların ikisini zamanın təlatümləri yox etmişdir. Came Məsciddə olduq və dedilər ki, bu məscid də qədim tikililərdəndir.

Vaxtımız azdır. Çox gəzməyə imkan yoxdur. Saat ikinin yarısında Urmiyə-Təbriz istiqaməti boyunca hərəkət etməliyik, axşam isə Rəzəvi Beynəlxalq Konfransının Təbriz şəhərində bağlanışında iştirak etməliyik.

Saat 18-də Şərqi Azərbaycan ostanının gözəl paytaxtı Təbrizə olduq. Təbriz Universitetinin böyük iclas zalında konfrans öz işinə çoxdan başlamışdı. Biz gələnədək artıq Mədəniyyət və İrşad İslamı nazirinin konfransa təbrik məktubu oxunmuş, Şərqi Azərbaycan ostandarı Mühəndis Memarzadənin çıxışı dinlənilmişdi. İndi isə Şərqi Azərbaycanı İran məclisində təmsil edən millət vəkili ağaye-Tacəddini xitabət kürsüsündəydi. Mən onu əvvəlki Tehran və Təbriz səfərlərindən tanıyıram. Olduqca savadlı natiqdir.

Marağalı şair Kərimi Marağeyi və universitetin ustatdı (pedaqoji fakültə) Xəlil Sultanülqürra yanımda əyləşmişdilər. Mən Kərimini keçən əsrin 90-cı

illərindən tanıyıram. Ustad Kərimi o zaman Bakıya tək gəlməmişdi, şairlər Asim pərviz və Əsğər Şahizadə də onunla birgə idi. Mən onları «Məcməüş-şüəra»da qəbul edib, şərəflərinə belə bir qəzəl də demişdim:

*Şövqüylə vüsalın neçə sirdaş gəlibdir,*
*Olsun gözüm aydın, gözümə yaş gəlibdir.*

*Əlbəttə, sevinc yaşları axmaqda gözümdən,*
*Qardaş evinə bir neçə qardaş gəlibdir.*

*İlham pərisi qeybə çəkilmişdi yanımdan,*
*Vəsf etməyə eşqi o qələmqaş gəlibdir.*
*Əflakə ucalmış yenə vəslin başı, amma*
*Hicrin başına dağ uçulub, daş gəlibdir.*

*Təsvir eləyim mən nə təhər? Qəlbimiz içrə*
*Sevdasını nəqş etməyə nəqqaş gəlibdir.*

*Çox gəlsə də izzətli qonaqlar bizə, amma*
*Təbrizli qonaqlar hamıdan baş gəlibdir.*

*Şahin yenə təkrar eləyir öndəki sətri:*
*Şövqüylə vüsalın neçə sirdaş gəlibdir.*

*10.02.1998 (Бах: İkinci Divan,*
*Бакı, 1995, s.327-328)*

Seyid Təqi Seyfi Ərdəbiliyə söz verildi. O, bir qəsidə və bir qəzəl oxuduqdan sonra xitabət kürsüsünə mən də’vət olundum. Çıxışımda təkrarçılığı sevmədiyimi və zala toplaşanlara yeni şe’rlər oxuyacağımı bildirdim. Bu gün Həzrəti-Məsumənin təvəllüd günü olduğunu xatırladaraq, İrana səkkizinci səfərim zamanı Qum şəhərində yazdığım bir qit’əmi söylədim:

*Gəlmişəm səcdənə, ey Mə'sumə,*
*Qəlbimə daimi niskil sənsən.*

*Nurisən gözlərinin dindarın,*
*Dinsizin gözlərinə mil sənsən.*

*Qum sanı var idi dərdim Qumda,*
*Eləyən dərdimi yüngül sənsən.*

*«Sevginin sahili olmaz» dedilər,*
*Бəlkə də sevgimə sahil sənsən.*
*Nur edən məscidi qəndilmi məgər?*
*Bu şərif məscidə qəndil sənsən.*

*Torpaq üstündə bitən gül çoxdur,*
*Torpaq altında bitən gül sənsən.*
*(Qum şəhəri, «Hərəme-mütəhhəre-Həzrəte-Mə'sumə», 20.06.1999)*

Elə güman edirəm ki, qit'ə məni alqışlayanların xoşuna gəlmişdi, xüsusən son beyt onları vəcdə gətirmişdi. Sonra «Y a İmam Rza» rədifli qəzəlimi oxuyub yerimdə əyləşdim.

Söz Davud Beydəqlara verildi və o, təkrarən dünən Urmiyədə oxuduğu şe'rini bir daha Təbriz tamaşaçılarına təqdim etdi. Türk qardaşımız Hüseyn Yalçın da təkrarçılığa yol verərək dünən oxuduğu şe'rlərini bir daha söylədi (xanımı Bəlgin Yalçın yenə də ərinə sakitcə əyləşib baxa bilmirdi. Bu vurğun qadın ərini bəlkə də dünyanın ən böyük şairi sanır və bilərəkdən, ya da bilməyərəkdən bunu hamıya nümayiş etdirirdi).

Beytullah Cəfəri yeni Rafiq Tağıdan danışdıqdan sonra aparıcı sözü Məmi Təbriziyə, Musa Aydına verdi və yığcam danışmalarını xahiş etdi. Lakin onun sözünün zərrə qədər də təsiri olmadı, Musa Aydın uzun müddət səhnəni tərk etmədi.

Konfransı yekunlaşdıran Şərqi Azərbaycan üzrə Mədəniyyət və İslam İrşadı Baş İdarəsinin rəisi cənab Əhmədiməneş çıxışı zamanı bir daha Rafiq Tağı ilə əlaqədar bir neçə kəlmə danışdı və nəhayət aparıcı Xosrov Sərtibi (şair, Təbrizdə ədəbi əncümən üzvü) son sözünü dedi, bizim şərəfimizə xoş kəlmələr söylədi.

Sonra isə... təltiflər. Bir neçə İran şairinə, həmçinin xaricdən təşrif gətirən

şairlərə, o cümlədən bizə təşəkkürnamə və hədiyyə təqdim olundu. Jurnalistlər isə əl çəkmirdilər ki, çəkmirdilər. Cənab Əlayi (Təbriz radiosu) və Rza Şeybani (qəzet redaktoru) məni müsahibəyə də'vət etdilər. Əlayini şe'r, Şeybanini isə Rafiq Tağı maraqlandırırdı. Şe'rimi (üç şe'r) oxudum, Rafiq Tağıya isə öz münasibətimi bildirib jurnalistlərin çəngindən xilas oldum.

Konfransın qapanışından sonra şərəfimizə ziyafət verildi, sonra isə Mədəniyyət və İslam İrşadı Baş İdarəsinin qonaq evində bir daha yüksək səviyyəli mehmannəvazlıqla qarşılandıq. Şair Mir Cəlal və cənab Əhmədiməneş arasında bir saatdan çox çəkən söhbət (Rafiq tağı ilə əlaqədar) qurtarmaq bilmirdi (ara-sıra biz də müdaxilə edirdik). Cənab Əhmədiməneş bizimlə xudahafizləşdi, özümüzə və Azərbaycanımıza uğurlar dilədi və evinə yollandı.

24 noyabr 2006. Qayıdış. Təbriz-Ərdəbil istiqaməti. Sürücümüz Mir Qədrəm Seyid Mortəzəvidir. İxtisasca riyaziyyat müəllimi olan bu kişi həm də öz maşınından taksi kimi istifadə edir.

Bu gün İranda cümə günüdür. Bu gün iş günü olmadığından adamlar necə deyərlər «mədəni» istirahətdədirlər. İmkanlı adamların istirahəti. Vaxtlarını təbiətin qoynunda keçirmək istəyi.

Qurban Cəbrayıl şahiddir ki, yenə yol boyu qələmim əlimdən düşmədi. Adətkərdəyəm. Yazmalıyam. Yol qeydləri və şe'rlər... Yazmalıyam! Vaxtın qədrini bilmək gərəkdir!!! Ağaye-Mortəzəvinin və hacının söhbətlərinə qulaq asa-asa yarı sərbəst, yarı heca vəznli «Etiraf» adlı şe'rimi yazdım:

*Mən*
*hər insana ani*
*sığınacaq olan*
*fani cahana*
*cavankən ölməyə gəlmişdim.*
*axı, bu adam*
*pud-pud dərd uddu,*
*batman-batman qəm çəkdi, axı,*
*dərdlərimə, qəmlərimə*
*ürəyim dözməyəcəkdi.*
*Amma, ölmədim, qocalıq*

*meylinə düşdüm, cavnlığım*
*arxada qaldı.*
*Cavankən ölməyə gəlmişdim!..*
*heyhat, ölümüm*
*qocalığıma qaldı.*
*Başımın üstünü qış aldı,*
*Yaşım altmış altı.*
*Mən*
*Yer Kürəsinə*
*cavankən ölməyə gəlmişdim.*

Beləliklə, mənim İrana on altıncı səfərim arxada qaldı. Bir Astaradan ikinci Astaraya keçdik. Sağ ol, Astara! Salam Astara!..

Bakı-Təbriz-Urmiyyə-Bakı, 20-24 noyabr 2006

## On altıncı Səfərnamə Şe'rləri

*I*
*QƏZƏL*

*Qoca dərviş, yenə İranə səfər var, - dedilər,*
*Ləngimə, get, hələ qəlbində təpər var, - dedilər.*

*On beşinci səfərim gendə qalıb çoxdandır,*
*Bixəbərsən, gedişin haqda xəbər var, - dedilər.*

*Oxuyarsan orada şe'rini şövq ilə yenə,*
*Dikilən yollarına orda nəzər var, - dedilər.*

*Gedəcəkdir Hacı Qurban*[1] *da səninlə oraya,*
*Bilməyirsənmi o şairdə nələr var, - dedilər.*

*Urmiyə torpağına sevgi müdam vacibdir,*
*Yolunuz üstdə nə xovf var, nə xətər var, - dedilər.*

*Ovçuluq həzzi nə müddətdi yadından çıxmış,*
*Sanki qarşında həmin həzzə çəpər var, - dedilər.*

*Sən ki, şahinliyi tərk eyləmisən, indi isə Tutisən,*
*tutiyə Təbrizdə şəkər var, - dedilər.*

*19.11.2006*
*Bakı*

[1] *Hacı Qurban Cəbrayıl - şair, «Nəbz» qəzetinin baş redaktoru.*

*II*
*QOŞMA*

*Bir hicran yenə də baxdı gözümdən,*
*Elə bil ildırım çaxdı gözümdən.*
*Ürəyimin yağı axdı gözümdən,*
*Ay aman, yandırdı yağ ayağımı.*

*Quş olub şığıdım hicrana tərəf,*
*Meylim əzm elədi imkana tərəf,*
*Sol ayaq getməsə canana tərəf Mən*
*kəsib ataram sağ ayağımı.*

*Ayrılıq - meylini bağlar Şahinə,*
*Vüsal - hicri görüb ağlar Şahinə,*
*«Yoruldum» deməsin dağlar*
*Şahinə, Hələ yora bilməz dağ*
*ayağımı.*

*III*
*QƏZƏL*

*Qışıdır ömrümün, əlbət, mənə yaz vacibdir,*
*Qocanı dinc eləyən ali cihaz vacibdir.*

*Səfərim olsa müyəssər həmişə Təbrizimə,*
*Mənə nə Bağdada getmək, nə Hicaz vacibdir.*

*Nə Fərat istəyirəm mən, nə Süveyşü Dəclə,*
*Mənə Kür nəhri gərəkdir və Araz vacibdir.*

*Harada qaldı o üçtelli sazın avazı?*
*Halı saz eyləmək üçün mənə saz vacibdir.*

*İstərəm uçmağı Urmiyyə təkin gülzarə,*
*Gər uçan xalça tapılmazsa, palaz vacibdir.*

*Ey canım Azəribaycan eli, Odlar Yurdum,*
*Seyr edim hər yerini gündə bir az, vacibdir.*

*Gündə yüz dəf’ə bu Şahin əyilir qarşında,*
*Neyləsin, çünki müsəlmanə namaz* vacibdir.

*20.11.2006*
*Bakı-Astara yolu*

*IV*
*QƏZƏL*

*Mənə həm cövr eləyir dövr, edir canan həm,*
*Çəkməyir dərdimi biganələşən loğman həm.*

*Qarabağ mülkü yad əllərdə, əlimdən nə gəlir?*
*Deyiləm mən nə xəlifə, deyiləm sultan həm.*

*Getmirəm Kabula, Бağdadə haçandır, amma*
*Məni də'vət eləyir Ankara həm, Tehran həm.*

*Əfqanıstan ilə İranə könül bağlamışam,*
*Əfqanıstan da əzizdir bu kəsə, İran həm.*

*Ürəyimdən gileyim var bu axır vaxtlarda,*
*Ürəyim bir yana, qəmdən üzülübdür can həm.*

*Mənə dərman içirir gərçi mənim loğmanım,*
*Hələ təsir eləmir dərdlərimə dərman həm.*

*Olacaqmı görəsən Yer Kürəsində elə gün*
*Ki, kədər qeyb ola, ardınca itə əfğan həm?*

*O qədər kəsməyə, öldürməyə vardır qeyzim,*
*Şahina, kəsməyirəm bayrama mən qurban həm.*

*21.11.2006*
Astara-*Təbriz yolu.*

*V*
*QƏZƏL*

*Ey Rzavü Rezəvi adlanan insan, əhsən,*
*Şə'ninə həsr olunubdur neçə dastan, əhsən.*

*Daima yad eləyir ismini islam əhli,*
*Sənə məclis qurubdur yenə İran, əhsən.*

*Böyük işlər ki edibsən hamıya mə'lumdur,*
*Hamıya örnək olubsan, şərəfü şan, əhsən.*

*Sənə yox söyləmək olmaz ki, həmişə varsan,*
*Eləyir fəxr adınla Ərəbistan, əhsən.*

*Səni hərçənd didərgin eləmişlər, amma*
*Bəndə olmuş qabağında neçə xaqan, əhsən.*

*Səni alqışlayıram vəcd ilə mən, ey imamım,*
*Adını yad eləyir sidq ilə Qurban, əhsən.*

*Sözünün əvvəlinə bir də qayıtdı Şahin:*
*Ey Rzavü Rezəvi adlanan insan, əhsən.*

*22.11.2006*
*Urmiyə şəhəri*

*VI*
*QƏZƏL*

*Şəninə salam, ya İmam Rza!*
*İzzü ehtiram, ya İmam Rza!*

*Şöhrəti böyük, ehtişamı bol,*
*Ehtiramı tam, ya İmam Rza!*

*Ey ki mə'nəvipadişahımız,*
*Biz sənə qulam, ya İmam Rza!*

*Zülmə dözməyən qəhrəman kimi*
*Eylədin qiyam, ya İmam Rza!*

*İslamın gücü olmasın zəif,*
*Bəxş et ehtişam, ya İmam Rza!*

*Eylə kafərin əzmini əbəs,*
*Böylədir kəlam, ya İmam Rza!*

*Tapmasın zaval inqilabımız,*
*Eyləsin davam, ya İmam Rza?*

*Ali ey cənab, arta qoy savab,*
*Qalmaya haram, ya İmam Rza!*

*Eylə bir əlac intizam ola,*
*Getməsin nizam, ya İmam Rza!*

*Qoyma Şahinin ilhamı sönə,*
*Ya imam, imam, ya İmam Rza!*

*23.11.2006*
*Urmiyə*

## VII
## E᾽TİRÄF

*Mən*
*hər insana*
*ani sığınacaq olan*
*fani cahana*
*cavankən ölməyə gəlmişdim.*
*Axı, bu adam*
*pud-pud dərd uddu, batman-*
*batman qəm çəkdi, Axı, dərdlərimə, qəmlərimə*
*ürəyim dözməyəcəkdi.*
*Amma, ölmədim, qocalıq*
*meylinə düşdüm, cavanlığım*
*arxada qaldı.*
*Cavankən ölməyə gəlmişdim,*
*Heyhat, ölümüm*
*qocalığıma qaldı.*
*Başımın üstünü qış aldı,*
*Yaşım altmış altı.*
*Mən*
*Yer Kürəsinə*
*cavankən ölməyə gəlmişdim.*

*Deyirdim ki, Allah yoxdu,*
*Allah məni öldürmədi.*
*Günahlarım*
*Adda-budda savabımdan vallah*
*çoxdu, billah çoxdu,*
*Allah məni öldürmədi.*

*Bir zamanlar pionerdim,*
*Bir zamanlar komsomoldum,*
*Yeri, göyü yaradana*
*qafillikdən,*

*cahillikdən*
*yaği oldum,*
asi oldum,
*Allah məni öldürmədi.*

*Məscid vardı -*
*gedən azdı,*
*Ayaqlarım Haqq yolundan*
*cavanlıqda yaman azdı.*
*«Sovet»lərdən savad alan*
*korazehin ağlım mənim*
*peyğəmbərə, imamlara*
*inanmazdı,*
*Allah mənim öldürmədi.*

*Dəli idi -*
*Ölkəmizdə dövran dəli,*
*zaman dəli,*
*insan dəli.*
*O səbirli, hövsələli Allah*
*məni öldürmədi.*

*Neçə günlər, neçə aylar,*
*neçə illər*
*cavan sinndə,*
*gənc yaşımda dərk etmədən*
*günahımı, hafizəmdə, yaddaşımda*
*mən öldürdüm Allahımı,*
*Allah məni öldürmədi.*
*Nəhayət ki, ahıl yaşda*
*qurdalandı ağıl başda,*
*Mən Tehranda,*
*Mən Təbrizdə,*
*Urmiyyədə*

*«Sübhanallah» deyə-deyə Hacı*
*Qurban Cəbrayılla*
*namaz qıldım,*
*amma Allah demədi ki, dəstəmazı nə*
*gec aldın, namazını nə gec qıldın?*
*Allah məni öldürmədi.*

*Amma, sonra,*
*sonra isə*
*Ölkəmizdən*
*qırağa da gedib çıxdım,*
*yaxına da gedib çıxdım,*
*uzağa da gedib çıxdım,*
*Əfqanıstan ölkəsinə, mən*
*İrana,*
*Türkiyəyə,*
*İraqa da gedib çıxdım,*
*Allah məni öldürmədi.*

*Mən*
*hər insana*
*ani sığınacaq olan fani*
*cahana*
*cavankən ölməyə gəlmişdim...*

*24.11.2006*
*Təbriz-Astara yolu*



# ON YEDDİNCİ SƏFƏRNAMƏ

## *«VAXTIN ƏTƏYİNDƏN TUTUB İRANƏ TƏLƏSDİM.»*

10 iyun 2007. Mən İranşünasam. «Şünas» fars sözü olan «şenaxtən» felinin köküdür. «Şenaxtən» - tanımaq, «İranşünas» isə İranı tanıyan, İranı öyrənən, İran məmləkətinin dilini, ədəbiyyatını, tarixini və s. müvafiq məsələlərini araşdıran mütəxəssis, tədqiqatçı, alim deməkdir. Elə buna görə də, bir İranşünas azərbaycanlı kimi, ixtisasıma uyğun olaraq daim İranla maraqlanır, imkanım daxilində bu qədim diyarla bağlı istər Azərbaycanda, istərsə də başqa ölkələrdə keçirilən müxtəlif tədbirlərdə iştirak etməyə, elmi konfrans və simpoziumlarda öz sözümü deməyə çalışıram.

Bu yaxınlarda, Azərbaycan Respublikasında fəaliyyət göstərən İran İslam Cümhurisi Mədəniyyət Mərkəzinin (rayzəni) sədr müavini cənab Səfəri və mərkəzin əməkdaşı cənab Behbudi mənə zəng edib İranın Urmiyə şəhərində keçiriləcək «Füzulişünaslıq» («şünas»a diqqət ye- tirdinizmi?) elmi konfransına də’vət aldığımı bildirdilər.

Böyük Azərbaycan şairi və mütəfəkkiri Məhəmməd Füzuli! Adı və şöhrəti 500 ildən çox bir müddətdə aləmdə məşhur olan və vaxt ötdükcə daha da məşhurlaşan Məhəmməd Füzuli. «Seyti-fəsahət ilə sözüm tutdu aləmi» deyən Məhəmməd Füzuli («seyt - şöhrət» deməkdir - Ş.F.). Mənim universitet müəllimim prof. Mir Cəlal demişkən «Azərbaycan ədəbiyyatında qəzəl şe’rinin əvəzsiz, dahi sənətkarı» Məhəmməd Füzuli. Adı hal-hazırda Urmiyə kimi səslənən («Urmiyə» sözü barədə bir qədər aşağıda danışacağıq) tarixi bir şəhər. Müasir İranın ən gözəl məskənlərindən biri. Urmiyə gölündən yarım saatlıq məsafədə yerləşən bir mədəniyyət mərkəzi və Məhəmməd Füzuli. Məgər təsadüfidirmi ki, İraqda yaşayıb-yaradan azərbaycanlı bir şairin şərəfinə İranda «Füzulişünaslıq» konfransı keçirilir? Əsla yox! Mən bir neçə il bundan qabaq (daha dəqiq desəm 1995-ci ilin dekabr ayında) məşhur alimlərimiz

Ziya Bünyadov, Bəkir Nəbiyev, Kamal Talıbzadə, Yaşar Qarayev, Ağamusa Axundov, Təhminə Rüstəmova, Tofiq Hacıyev, Anya Rzayeva, Nüşabə Araslı, Bəhlul Abdullayev, İmamverdi Həmidov, Teymur Kərimli, Səfurə Quliyeva, Asif Rüstəmli, Azərbaycan Nazirlər Sovetinin sədr müavini İsmayıl Sadıqov, Mədəniyyət nazirinin müavini Şamil Xurşidov, şair Ayaz Vəfalı, müğənni Lütfiyar İmanov, «Şərq-Qərb» mətbəəsinin direktoru Hacı Quliyev və başqaları ilə birlikdə Tehranda keçirilən «Füzuli - 500» elmi konfransının da iştirakçısıyam. İki qonşu dövlət, bu dövlətlərin ədəbi-mədəni əlaqələri... və Füzuli. Burada təsadüfi heç nə yoxdur. Füzuli kimi, Sədi kimi, Hafiz kimi, Cəlaləddin Rumi kimi və başqa adlı-sanlı söz sahibləri ilə bağlı ədəbi tədbirlər dünya durduqca təkcə İranda və Azərbaycanda deyil, bu və ya başqa ölkələrdə keçiriləcək, zaman-zaman onların layiqli qiymətləri veriləcək, əsrlərlə yad olunacaqlar.

Sözümün əvvəlinə qayıdıram. Deməк, yeni bir elmi konfrans. Deməli, Urmiyə şəhəri. Mən son iki ildə üç dəfə bu şəhərdə olmuş, «Xaqanişünaslıq» və «Şe’ri-Rezəvi» məclislərində iştirak etmiş, bunlar haqdı XIV və XVI səfərnamələrimdə geniş məlumat vermişəm. İndisə «Füzulişünaslıq». Özü də Urmiyədə.

Nümayəndə heyətimiz 17 nəfərdən ibarət olmalıydı ki, İran İslam Cümhurisi Mədəniyyət Mərkəzinin sədri cənab Seyyid Əli Əkbər Ocaqnejadın Urmiyəyə - Azərbaycanşünaslıq Öyrənmə və Tədqiqat Mərkəzinin prezidenti cənab Məhbub Taleiyə göndərdiyi rəsmi məktubda 17 nəfərin adlarının göstərilməsinə baxmayaraq 17-ci şəxs - filologiya elmləri doktoru, prof. Mahirə Quliyeva «pasport müşkülü» üzündən (İrana viza müddətinin az qalması) bizimlə yoldaş ola bilmədi (bu dost və qonşu ölkəyə vizasız gediş-gəliş haçansa mümkün olacaqmı?). 16 nəfərsə aşağıdakılardır:

Nəsib Göyüşov, Şəfəq Əlibəyli, Möhsün Nağısoylu, Səadət Şıxı- yeva, İmamverdi Həmidov, Şahin Fazil, Şəhla Abdullayeva, Vüqar Mustafayev, Şahin Mustafayev, Qurban Cəbrayılov, İlqar Fəhmi, Könül Əminli, Nəzakət Məmmədli, Hacı Ələmdar Mahir, Mənzər Hüseynova və Aytən Hacıyeva.

Siqlətli heyətdir. Mən onların bəziləri ilə müxtəlif vaxtlarda İranda olmuşam. Şadam ki, yenə birlikdəyik. Təfsilata keçirəm.

Qeyd etməliyəm ki, İrana 17-ci səfərimi 6 gündə başa vurub geri qayıtdıqdan bir gün sonra, 2 il bundan əvvəl Təbrizdə birlikdə oluduğm Şahin

Mustafayev - AMEA Şərqşünaslıq İnstitutunun direktor müavini - məni bərk sevindirdi. Məlum oldu ki, o, Urmiyədə olduğumuz vaxt imkan tapıb şəhərin kitab mağazalarının birindən «Urmiyə dər gozəri-zəman» («Urmiyə zaman keçidində») adlı bir kitab almışdır və onu səfərnaməmdə istifadəm üçün mənə verə bilər. Həqiqətən çox sevindim. Urmiyənin tarixi və adının mə'nası məni həmişə düşündürürdü. 926 səhifədən ibarət kitabı varaqlamağa başladım. Müəllif Həsən Ənzəli yazır ki, müxtəlif dillərdə Urmiya, Urumi, Ormiyə, Urumiyyə, Urmiyə, Urmi kimi tələffüz olunmuş bu şəhərin adının etimologiyası məşhur alim V.Minorskiyə görə hələ məlum deyildir, amma elə onun fikrincə bu yer adı fars tərkibli söz deyildir. Başqa alimlərin nəzərincəsə bu ad arami dilində «ur» - «şəhər» və «miyah» - «su» sözlərinin birləşməsindən yaranmışdır və «Sulu şəhər» mə'nasındadır. Müəllifə görə, Aşurbanipal (miladdan əvvəl 669-633-cü illərdə yaşamış Assuriya padşahı Asurxaddonun oğlu - Ş.F.) öz qayaüstü yazılarının birində xəbər verir: «Mən Axşe'rinin (Aşurbanipalın müasiri olan bir hökmdar - Ş.F.) möhkəm şəhərləri İzirtu, Urmitəh və İzibanı mühasirəyə aldım, həmin vilayəti başdan-başa əlimə keçirdim, abad yerləri viranlığa çevirdim, yandırdım və bu torpağı 15 gün ərzində bomboş qoydum». H. Ənzəliyə görə, bu mətndə adı çəkilən Urmitəh elə bugünkü Urmiyə şəhərinin köhnə adıdır (Bax: H.Ənzəli. Göst. kitab, s.80).

Ərəb tarixçisi Y aqut əl-Həməviyə əsaslanan çoxcildli «Lüğətnamə» əsərinin müəllifi Əli Əkbər Dehxoda Urmiyə şəhəri haqqında yazır: «Urmiyə - Azərbaycanın böyük və qədim şəhəridir. Şəhərlə Urmiyə gölü arasında 3-4 mil məsafə var. Mən (Yaqut əl-Həməvi - Ş.F.) oranı 617-ci ildə gördüm. Urmiyə - atəşpərəst Zərdüştün şəhəridir. Gözəl, bərəkətli, bol meyvəli, bağ-bağatlı, saf havalı və bol sulu yerdir. Amma, oranın sultanı olan Özbək ibn Pəhləvan ibn Eldəgəz zəif adamdır və şəhərə diqqət yetirmir. Urmiyə və Təbriz arası 3 günlük yoldur» (Bax: Göst. kitab, Tehran, 1383, s.81.).

Xülasə, gedəcəyimiz Urmiyənin yaşı 3 min ildən çoxdur və gedəcəyik. Maşınla gedəcəyik. Yaqut Həməvi dövründəki 3 günlük yolu bir neçə saata qət edəcəyik inşallah.

11 iyun 2007. Sabah qədim İranın indiki Urmiyə ostanının (vilayətinin - Ş.F.) Urmiyə şəhərində olmaqdan ötrü biz bu gecə qatarla Bakı-Astara istiqamətinə yola düşməliyik. Urmiyəni, onun mehriban adamlarını, gəzməli-görməli yerlərini xatırladım. Baranduzçay, Şəhrçay, Rövzəçay və Nazlı çay

sanki gözlərim önündən axmağa başladı. Zaman keçidində bu şəhəri fəth etməkdən ötrü baş vermiş qanlı döyüşlər nəzərimdə canlandı və nəticədə bu şe'r yarandı:

Urmiyədir, Urmiyə!

*Mən gedirəm İrana,*
*Urmiyədir, Urmiyə!*
*Qərbi Azərbaycana* -
*Urmiyədir, Urmiyə!*

*Varlığım var edən,*
*Yar ilə ilqar edən,*
*Düşmənini zar edən*
*Urmiyədir, Urmiyə.*

*Aşiqə heyran yeri,*
*Can yeri, canan yeri,*
*Əhd ilə peyman yeri*
*Urmiyədir, Urmiyə...*

*Urmiyə ər yurdudur,*
*Urmiyə zər yurdudur,*
*Urməvilər yurdudur,*
*Urmiyədir, Urmiyə.*

*Sevgisi alqışlanır,*
*Eşq oxuna tuşlanır,*
*Şahinə bax, xoşlanır,*
*Urmiyədir, Urmiyə!*

Gecə saat 12-yə 10 dəqiqə qalmış qatarmız yola düşdü. Qonşu kupenin sərnişinləri olan Eldar Əşrəfi və Mənuçöhr Kərimi ilə tanış oldum. Eldar dedi ki, Bakıda xanəndə Tələt Qasımovun qonağı idim. 1965-ci ildən azərbaycanlı müğənni və xanəndələrlə şəxsən tanışam. Şövkət Ələkbərova, Hacı Məmmədov, Əbülfət Əliyev, Vasif Adıgözəlov Tehrana gələndə məni tapardılar. Eldarın gözləri yaşardı.

Atası Bakılı, anası Qubalıdır bu iş adamının. Valideynləri hələ azyaşlı

ikən Ərdəbilə köçüblər, orada evləniblər və olublar ərdəbilli. Eldar hal-hazırda Tehranda yaşayır.

Mənuçöhr Kərimi isə Bakını xoşladığını bildirdi. Bu onun paytaxtımıza ilk səfəridir. Şe'rsevərdir. Keçən əsrin 80-ci illərində Bakıda olmuş şair Piruz Dilənçini xatırladı. Dedi ki, Piruz hazırda İsveçrədə yaşayır. Söhbətarası Qəffari Ərdəbilinin bir şe'rini xatırladı:

*«Gövhərin qiymətini xibreyi-əlmasə deyin, Müjdeyi-fəsli-*
*bəhari çəmənü yasə deyin.*
*Müşkülsüz olsa əgər özgəyə yalvarmayasuz,*
*Ağa oğlu ağadı, dərdüzi Abbasə deyin».*

Şe'rdəki «xibreyi-əlmas» - almasın qiymətindən xəbərdar adam, «yas» - gül-çiçək, «Abbas» isə Həzrət Əlinin oğlu Həzrət Abbasdır. Səhərə yaxın bu qəzəli yazdım:

*Vaxt ötdü və Şahin, yenə seyranə tələsdim,*
*Vaxtın ətəyindən tutub İranə tələsdim.*

*Mən Ərdəbili, Təbrizi, Urmiyyəni görmək*
*Şövqüylə iki Azəribaycanə tələsdim.*

*Mən şövq ilə, Şahin, yenə şahin kimi uçdum,*
*Gülşəndən olub ayrı, gülüsanə tələsdim.*

12 iyun 2007. Azərbaycanımızın Astara gömrükxanası. Bu gün əsasən bu tərəfin o tərəfə gediş-gəliş günüdür. Adam çoxdur. Yenə də Qadir müəllim yadımıza düşdü. Qadir Əbiyev. Gömrük idarəsinin rəis müavini. Burada ləngimək imkanımız yoxdur. Yəqin ki, bizi qarşılayacaq maşın artıq o biri Astarada gözləyir. Öndə 8-10 saatlıq yolumuz var.

Gömrükxanaya girişdə Qadir müəllimin adını çəkdik. Ürəyimizi çəkmədilər. Əməkdaşlardan biri növbəsiz-lilansız bizi içəriyə buraxdı (Tanışsız iş keçmir ki!). pasportlarımız yığıldı və bu an Qadir müəllimi gördük. Həmişəkindən də mehriban görüş. Çay dəstgahı...

İran Astarası. Yüzlərlə adam. Uzun növbə sıraları. Yubansaq gecikəcəyik. Yubanmadım. Rəisin yanına getdim. Türk dilini bilmirdi. Fars dilində buraya gəlişimizin məqsədini açıqladım. Füzulinin kimliyi ilə maraqlandı. Şairin böyüklüyünün böyük təsiri oldu. Dedi: «yığ pasportları». Yığdım və onları ikinci böyük adama verdim. Füzulini tanıyırdı. Ayağa durub pasportlarımızı götürdü və 10 dəqiqə keçməmiş onları qaytarıb bizə yaxşı yol dilədi.

Budur, İran Astarası. Gömrükxana divarı arxada qaldı. Urmiyə Universitetinə məxsus mikroavtobus. Yola düşdük. Yadıma Əliağa Vahid düşdü. Bir qəzəlinin mətləsi (ilk beyti) təxminən beləydi:

*«Mən eşitdim ki, edir yar səfər inşaallah,*
*Görüm olsun səfəri bixətər inşaallah».*

Gedirik. Sürücünün adı Pərvizdir. Baməzə kişidir.

Nəzakət Məmmədli narahat idi: görəsən Bakıdan gətirdiyi toyuq (özü də ləvəngi!) istidən xarab olmaz ki? Görünür ki, Nəzakət xanımın İran qonaqpərvərliyindən xəbəri yoxdur, yoxsa yola toyuq-zad götürməzdi.

«Toyuq söhbəti»ndən «Alqışlar və qarğışlar»a keçdik. Professor Bəhlul Abdullanın belə adlanan kitabı. «Xaqanişünaslıq» konfransından tanıdığım Əhəd Pişgəri xatırladıq. O zaman bizə yüksək səviyyədə qayğı göstərmişdi. O da «Alqışlar və qarğışlar» adlı kitab çap edib. Deyilənə görə hər iki kitab arasında bərk oxşarlıq var. Plagiat? Deyə bilmərəm. Qayıdıb Bəhluldan soruşuram.

Ətrafı seyr etməyə başladım. Dağların ətəkləri rəngbərəng xalılarla doluydu. Gül-çiçək xalıları...

*Xalılar örtüb dağı -*
*Gül-çiçək xalıları.*
*Yer səthindən yuxarı,*
*Buludlardan aşağı*
*Gül-çiçək xalıları.*
*Şair, yaz xalıları,*
*Rəssam, çək xalıları.*

Baxdıqca adamın gözü dincəlir. Yadıma Şahdağın, Babadağm xalılı ətəkləri düşdü. Ətəyinizi əlimə uzadın, dağlar, əl mənim - ətək sizin.

Sürücü Pərviz sabahkı konfrans iştirakçılarının adları yazılmış bir siyahını qoltuq cibindən çıxarıb bizə göstərdi. Bakıdan gələn heyət 16, yaxud 17 nəfər yox, 30 nəfərdən ibarət olmalıymış: Akademik Bəkir Nəbiyev, professor Azadə xanım Musayeva, professor-şair Məhərrəm Qasımlı, naşir Hafiz Abıyev və başqaları da də'vət olunmuşdular. Naxçıvandansa akademik İsa Həbibbəyli, AMEA-nın müxbir üzvləri Əbülfəz Quliyev, Hacı Qadir Qədirzadə, Vəli Baxşəliyev, şair Vaqif Məmmədov, tədqiqatçı Oruc Əliyev, Məhəmməd Rzayev, məşirə (?) Quliyeva, Əsgər Qədimov də'vət olunublar. Bu siyahıya görə Türkiyəni Könül Ayan, Hüseyn Ayan, Çətin Dərdiyox, turqut qarabi və Orxan Kamal Tovuqçu (Nəzakət Məmmədlinin toyuğu yadıma düşdü) təmsil etməliydilər. Rusiyadan isə Alfina Sibqatulina (İmamverdi onu o saat tanıdı!) təşrif gətirməlidir.

Siyahıda bizim Qiymət Məhərrəmlinin (şair və tədqiqatçı) adı yoxdur. Amma, o da gəlmək istəyirdi. Görünür, Urmiyəyə yolladığı məqaləsi yoxa çıxıb. Səadət dedi ki, özüm yollamışdım, saytın biri açılmayıb və məqalələr gedib Urmiyəyə çatmayıb. Səfərlər hələ çoxdur, sağlıq olsun, Qiymət!

Ərdəbili keçdik. Sərab şəhəri, «Dərya» restoranı. «Dərya»nın biri Ərdəbildə də var. «Dərya»da dayandıq. Cücəkabab, düyü və Nəzakət Məmmədlinin toyuğu. Xarab olmamışdı.

Nəzakət nəzakətli qadındır. Maşında bizə Bakıdan gətirdiyi gilaslardan da verdi. Qadınlarımız ümumiyyətlə bizə qarşı olduqca diqqətcil və səmimidirlər. Hamısına əhsən!

Təbriz yoluna istiqamətlənən «dəmir at»ın cilovunu əlində tutan Pərviz sürəti artırdı və bizi Təbrizə yetirdi. Təbriz yaxınlığında (Bostanabadda) su və meyvə şirələri nuş etdik.

Təbriz-Urmiyə yolu. İlxıçı kəndi. Səadət dedi ki, ilxıçılıların fikrincə bura İmadəddin Nəsiminin kəndidir. Ola bilər, amma mən bu məlumatın doğru olub-olmadığını bilmirəm. Əgər İlxıçı Nəsiminin kəndidirsə, demək Nəsimi Hələbə getməzdən əvvəl bir müddət İlxıçıda yaşamış və sonra mühacirətə gedibmiş. Doğrusunu Allah bilir...

Az qalır. Limana 65 km. yol var. Uzaqdan Ada dağları gözə dəyir. Möhsün Nağısoylu o dağların birini, ən əzəmətlisini Ağrıdağa bənzətdi. Ağrın

alım, ay Möhsün. İranda da Ağrıdağ yaddan çıxmır.

İskələyə 10 km. qalır. «İmam Rza» məscidi. Çay içdik,

Qeyd edim ki, Şahin Mustafayev gəldiyimiz yolun yarısını ayaq üstdə arxada qoydu. Bu cavan adam oturmağı sevmir. Bu enerjili kişi həmişə hərəkətdədir. Onu çox vaxt kabinetində də ayaq üstdə görürəm. İki şahin, yəni mən və o və eyni xasiyyət. Yadıma hələ Əfqanıstanda yazdığım və 1989-cu ildə «Yenə görüşərik» adlı kitabımda gedən «Ayaq üstdə» adlı şe’rim düşdü. Maşında ayaq üstdə durub «Ayaq üstdə»ni dedim:

*Günlərimin çoxunu mən*
*keçirmişəm*
*ayaq üstdə.*
*Heç təsəvvür eləməzdim,*
*neçə-neçə məsafəni*
*keçərmişəm*
*ayaq üstdə.*
*Yazanda da gəzən mənəm,*
*Ayaqlarım*
*nə qədər ki gəzir yeri* -
*Yerölçənəm.*
*Minnətdaram ayağıma,*
*Qorxutmayır yaxın məni,*
*uzaq məni,*
*Durğunluqdan,*
*ətalətdən uzaq edir ayaq*
*məni.*
*İstəmirəm sükunətdə*
*günüm ötə.*
*Günlərimin çoxunu mən*
*keçirmişəm*
*ayaq üstdə.*
*Lap ölümün önündə də Diz*
*çökmərəm hələm-hələm.*
*Öləndə də gərək öləm*
*ağac kimi*

*ayaq*
*üstdə!*

Gəmiçi kəndi. İskələ. Gəmi-bərə. Budur, Urmiyə gölünü keçib Urmiyəyə gedirik.

Çatdıq. «Mirvari» oteli. Şahinlər bir yerdədir (116-cı otaq). Bir qədər dincəldik.

Axşamüstüdür. «Bənd» adlanan istirahət guşəsində istirahət edirik. Y anaşı əyləşdiyim d-r Mirhaşimi «Danişgahi-tərbiyəti-müəllim» («Müəllim hazırlayan institut») elmi-tədqiqat müəssisəsində işləyir, alimdir. D-r Vəfayi isə 4 il Özbəkistanda İran Mədəniyyət Mərkəzinin rəisi vəzifəsində çalışmışdır. Mənimlə üzbəüz Tehran Universitetinin professoru Cəlil Təclil əyləşmişdir. Onunla yanaşı oturan d-r Əkbəri isə hazırlanmağa başlayan «Böyük İran Ensiklopediyası»nın Baş Redaktorudur. Onun yanındakısa d-r Radfərdir - Humanitar elmlər Tədqiqat İnstitutunun əməkdaşı.

Professor C.Təclillə bir neçə il qabaq bir neçə elmi konfransda görüşmüşük. Mənə dedi: Ağaye-Şahin, saç-saqqalın büsbütün ağarıbsa da, hələ qocalmamısan...

Bu zaman oxuya-oxuya bir aşıq gəldi, bizim mizə yaxınlaşdı, oxumağa başladı nə başladı. Şahin gizlicə onun cibinə pul qoydu. «Sizdən pul almamaq tapşırılıb» desə də, Aşıq Tağı puldan imtina etmədi (Aşıq ki aşıq!..).

«Duymağı bacarsan daş da gözəldi» (Zəlimxan Yaqub), «İtib cəvahiri, ləli könlümün» (Şücaət), «Ölüm sənin qucağında» (Bəhmən Vətənoğlu), «İndi haq danışan dili kəsirlər» (Kərəm kürqıraqlı) misralarını vəcd ilə deyən Aşıq Tağı bizim Göyçə-Borçalı, həmçinin Gəncə-Qazax səpkində çalıb-oxuyur.

Bayaq mənə «qocalmamısan» deyən professor Cəlil Təclilin sözündən ruhlanmışdım. Eləcə mizüstü bu misraları qaraladım:

*Qəlbimi incitməyən*
*Ellər saxlayıb məni.*
*Qarğışımı etməyən*
*Dillər saxlayıb məni.*

*Dərvişəm - Əfqanıstan,*

*Türkiyə, İraq, İran...*
*Ayaqlarımdan tutan*
*Əllər saxlayıb məni.*

*Ey verən adı mənə,*
*Bu qol-qanadı mənə,*
*Bülbül deyin Şahinə,*
*Güllər saxlayıb məni.*

İyun ayının 12-si, Urmiyəyə gəldiyimiz bu günümüz gecə saat 1-də bitdi. «Mirvari»yə qayıtdıq. 24 saatdan çoxdu ki, Bakını tərk etmişdik. Yorulmuşduq.

13 iyun 2007. Sübh tezdən oyandım. Belə bir qəzəl yarandı:

*Məni Urmiyyəyə Urmiyyəyə rəğbət çəkdi,*
*Qardaşın qardaşa göndərdiyi də'vət çəkdi.*

*Bağibanlar neçə müddət barışa bilmədilər,*
*Bağlər öylə səbəbdən neçə zillət çəkdi.*
*Uzun illər boyu ülfətli olub ellərimiz, Bizi İran ilə*
*ünsiyyətə ülfət çəkdi.*

*Ayrılıq tufanı rədd olmalıdır, ey Şahin,*
*Üzərindən qələmim ayrılığın xətt çəkdi.*

Sübh saat 9-da Qərbi Azərbaycan Mədəniyyət və İslam İrşadı idarəsinin Konfrans zalına daxil olduq. Elə indicə konfrans öz işinə başlayacaqdır. Proqramm dünəndən bizə verilib. Üz qabığında «Həmayeşi-Füzulişenasi» («Füzulişünaslıq yığıncağı, yaxud toplantısı») sözləri yazılmış, arxasındasa Füzulinin ən məşhur qəzəllərindən birinin bu beyti verilmişdir:

*«Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,*
*Mən kiməm, saqi olan kimdir, meyü səhba nədir».*

Urmiyədə əvvəlki səfərlərim zamanı iki dəfə olduğum konfrans zalına göz gəzdirirəm. Sağ tərəfimdəki divarda azərbaycanca yazılmış (latın əlifbası ilə) bir yazı dərhal nəzərimi cəlb etdi: «Möhtərəm Azərbaycan Füzulişünas alimlərinə xoşgəldin deyirik». Ürəyimdə «sağ olun» dedim, «yenə gələrik» dedim və əlavə etdim: «Ədəbi-mədəni əlaqələrimizin daha da genişlənməsi naminə yenə görüşərik».

Birinci sırada əyləşmişdim. Elə bu dəm keçən səfərlərimdən tanıdığım şair-müəllim Xəlil Həqiqətgər gəlib yanımda əyləşdi və dərhal belə məlumat verdi: «1918-ci ilin mart ayında ermənilər daşnak Andronikin başçılığı ilə Urmiyə, Xoy və Səlmas bölgələrində 150 min adam qırıblar». Cavabımda ermənilərə xitabən «sizi görüm qırılasınız» dedim və söhbətimiz qırıldı, çünki xitabət kürsüsü arxasında bir qadın göründü. İclasın aparıcısı olan bu qadın Füzulidən farsca bir qəzəl qiraət etdikdən sonra konfrans iştirakçılarını Azərbaycan dilində salamladı və ilk sözü Quran tilavətini ifa edəcək bir qareyə (qiraətçiyə - Ş.F.) verdi. Qare sözünü bitirən kimi zalın işıqları qaraldı, səhnədəki ekransa ağardı. Azərbaycan musiqisinin müşayiəti ilə Urmiyə Universitetinin tarixinə həsr olunmuş sənədli filmə baxdıq.

«Yarəb, bəlayi-eşq ilə qıl aşina məni» deyən aparıcı xanım d-r Məhbub Taleyini səhnəyə də’vət etdi. M.Talei öz yığcam çıxışını farsca başlayıb türkcə qurtardı və əlavə etdi: «Mən bütün konfrans iştirakçılarını, həmçinin Azərbaycan Respublikasından və Naxçıvandan təşrif gətirmiş bütün Füzulişünasları bir daha ürəkdən salamlayıram». M.Taleyinin çıxışından məlum oldu ki, Universitetin ünvanına 120 elmi məqalə göndərilibsə də, onların fəqət 60-ı qəbul olunub və iki gün ərzində 24 məruzə dinləniləcəkdir.

Urmiyə Universitetinin rektoru d-r Sidqi Bəhrmənd də hamımızı salamladı, məruzəsini bitirdi və onu Qərbi Azərbaycan ostandarının müavini d-r Məhəmmədzadə (ostandar d-r Qurbani üzürlü səbəbdən iclasa təşrif gətirməmişdi) kürsüdə əvəz etdi. Fars dili və ədəbiyyatının yayımı üzrə İslami Əlaqələr Cəmiyyəti Şurasının sədri d-r Vəfayi və «Böyük İran Ensiklopediyası»nın rəisi (baş redaktoru) d-r Əkbərinin qısa çıxışlarından sonra üçlüyün ifasında musiqi səsləndi, xanəndə oxudu və 20-25 dəqiqədən sonra iştirakçıları binanın II mərtəbəsindəki yemək salonuna də’vət etdilər.

Köhnə və təzə tanışlarla görüşlər, tələbələrlə söhbətlər...

Bir saat sonra isə iclasımızın davamı. 16 nəfərdən ibarət heyətimizin adından söz demək üçün Şahin Mustafayev xitabət kürsüsünə də'vət olundu. Dünyanın bir çox ölkələrində (Türkiyə, İran, ABŞ, İtaliya, Almaniya və s.) keçirilmiş onlarla elmi konfrans iştirakçısı olmuş Şahin bütün İran xalqını, o cümlədən Qərbi Azərbaycan əhalisini, xüsusən urmiyəliləri, həmçinin bu konfrans iştirakçılarını salamladı və hamıya uğurlar dilədi.

Höccətül-islam və-l müslimin Hacı Kərimi eşq barədə türkcə və farsca özünün yazdığı uzun bir məsnəvini oxudu. Etiraf etməliyəm ki, bu hacı həqiqətən eşq bilicisidir və bu mənəvi məfhumun irfani xüsusiyyətlərini yüksək bədii və məntiqi şəkildə bizə çatdırdı. Və mənim yadıma arif Füzulinin, aşiq Füzulinin, eşq şairi Füzulinin bir qit'əsindəki misralar düşdü:

*«Elm kəsbiylə rütbeyi-rifət*
*Ärizuyi-məhal imiş ancaq.*
*Eşq imiş hər nə var aləmdə,*
*Elm bir qiylü qall imiş ancaq».*

Hacı Kərimidən sonra aparıcı xanımın belə bir məlumatı səsləndi: «Üzrlü səbəbdən İran İslam Cümhurisinin Azərbaycandakı səlahiyyətli və fövqəladə səfiri cənab d-r Nasir Həmidi Zare və İranın Naxçıvandakı konsulu ağaye-Təbatəbai konfransımızın işinə qatıla bilməyəcəklər».

Mən d-r Zare ilə təzəcə tanış olmuşam. İki-üç ay bundan əvvəl səfir təyin olunmuş bu diplomat olduqca savadlı və ziyalı bir şəxsdir. Şe'ri sevir və qiymətləndirməyi bacarır. Təxminən bir ay bundan əvvəl mən xanım Fatimeyi-Zəhraya həsr olunmuş bir şe'r gecəsinin aparıcısı idim. Xatırlayıram ki, Ərdəbildən gələn Əsgər Şahi qardaşımızın «Fatimədir, Fatimədir, Fatimə» sözləri ilə başlayan və tamamlanan şe'ri qiraət olunan vaxt cənab səfirin gözləri yaşarmışdı...

İclasımız davam etməkdədir. D-r Ənvəridən sonra söz Hacı Ələmdar Mahirə verildi. Şair olan bu hacı dedi ki, onu Azərbaycanda «əhli-beyt şairi» kimi tanıyırlar və buna görə də sizə əhli-beytə həsr etdiyim bir şe'rimi oxuyacağam. Dedi və oxudu. Ümumiyyətlə hacının yüksək pafosla şe'r demək bacarığı var.

Beləliklə də konfransın səhər iclası bitdi və bir qədər istirahət elan

olundu. Arada Urmiyə Televiziyasının «Görüş» proqramı məndən geniş bir müsahibə götürdü və jurnalist hətta mənim keçən il Urmiyədə yazdığım uzun bir şe'rimin bir beytini misal da gətirdi:

*Şərqi nədir, Qərbi nə?*
*Qərbi nədir, Şərqi nə?*
*Baxmayıram fərqinə* -
*Äzəribaycandır!*

Şe'rin bu bəndində, əlbəttə, mənim İranın Şərqi və Qərbi Azərbaycan ostanları arasında heç bir fərq qoymamağıma müstəqim işarə olunmuşdu.

İstirahət saatım jurnalistlər və tələbələrlə isti söhbətlərlə bitdi. Keçən səfərlərimdən tanıdığım tələbə Tanrıya (uzun boylu, uzun saçlı Tanrıya) öz bacısı ilə mənə yaxınlaşdı, yadigar olaraq şəkil çəkdirdi, ali təhsilini, bəlkə də, Türkiyədə davam etdirəcəyini bildirdi.

Zala qayıtdıq... «Şəhriyari-Təbriz» musiqi qrupunun üzvləri səhnəyə çıxdılar. Azərbaycan türkcəsi və farsca olan bir neçə mahnı ifası bizim hamımızda xoş ovqat yaratdı.

Konfransın günorta iclası başlandı. Bu hissənin səhnədə əyləşən rəyasət heyəti üzvlərindən biri də mən idim. Buna görə də dəyərli alimlərimiz ərəbşünas İmamverdi Həmidovu və farsşünas Möhsün Nağısoylunu iştirakçılara mən təqdim etməli oldum və onların hər biri haqqında ətraflı məlumat verdim. «Ərəb ədəbiyyatşünaslığında Füzulinin öyrənilməsi» mövzusu ilə çıxış edən İmamverdinin ərəb dilində, «Füzulinin «Hədiqətüs-süəda» əsərinin bədii xüsusiyyətləri» haqda danışan Möhsününsə fars dilində ara-sıra səslənən ifadələri dinləyənlərə olduqca yaxşı təsir bağışladı.

Başqa çıxışlar: D-r, professor Cəlil Təclil, d-r, professor Barat Zəncani, d-r Tahirə Xoşhal. Üç dildə divanlar bağlayan Füzulimiz barədə yüksək fikirlər deyən bu üç alimin üçü də İranın görkəmli ədəbiyyatşünaslarıdır. Cəlil Təclil hətta Füzulinin bir misrasını təkrar edə-edə xitabət kürsüsünü tərk etdi ki, bu da gurultulu alqışlara səbəb oldu.

Nahar fasiləsi. Hamıdan aralandım. Mənə şe'r yazdırmaq üçün yanıma gələn ilham pərimi incitmək istəmədim, bir kənara çəkilib yazmağa başladım. Yazdığım şe'r elə özüm haqdaydı, qocalığım barədəydi, giley-güzar

ovqatlıydı, aləmdəki qara günün ağ gündən çox olması xüsusundaydı. Bədbin əhvali-ruhiyyəli bir qəzəldi və həmin qəzəl beləydi:

*Yarəb, qocalıb-getdim, gözlərdə ziya yoxdur,*
*Dərd ilə bəla vardır, zövq ilə səfa yoxdur.*

*Dördüncü olan sayda «Divan» yarımçıqdır,*
*İlham pərisi gəlmir, neyçün, əcəba, yoxdur?*

*Xaqani də yazmışdır, yazmış o Füzulim də,*
*Şahin də qəzəl yazdı, Şahində həya yoxdur.*

Nahar fasiləsindən sonra işini davam etdirən konfransın rəyasət heyəti üzvləri arasında Şəfəq Əlibəyli və Hacı Qadir Qədirzadə də vardı. İlk söz bizim Nəsib Göyüşlüyə verildi. Şəfəq xanımın təqdimindən sonra o, ömrünü kamal və həqiqət sorağında başa vurmuş Məhəmməd Füzulinin fəlsəfi axtarışlarını təzəcə yazdığı «Füzuli: Kamal və həqiqət axtarışında» adlı məqaləsiylə konfrans iştirakçılarına təqdim etdi.

İran alimi d-r Meybadidən sonra xitabət kürsüsü arxasında görünən Əbülfəz Quliyev (Amanoğlu) «Rus şərqşünaslığında Füzuli irsinin tədqiqi məsələləri» adlı məruzə ilə çıxış etdi və məşhur şərqşünas Yevgeni Bertelsin Füzuli haqqında dediklərinə geniş yer ayırdı.

Yeri gəlmişkən deyim ki, Əbülfəz müəllim bu dəfə keçirilən seçkilərdə AMEA-nın müxbir üzvü seçilmiş və məni, qədirbilən bir adam kimi, çox sevindirmişdi. O, son dərəcə ləyaqətli ədəbiyyatçı, zəhmətkeş alimdir. Türkiyənin elmi dairələrində yaxşı tanınan bu şəxs gözəl də müsahibdir. Səni təbrik edirəm, Əbülfəz Amanoğlu! Səni tezliklə akademik görmək arzusundayam.

İki mazandaranlı alimin (müştərək məqalə) və xanım Nəsrin Əliəkbərinin çıxışlarından sonra Şəfəq Əlibəyli və Hacı Qadir Qədirzadə yanaşı rəyasət heyətində əyləşən Hüseyn Novin adlı bir İran tədqiqatçısı heç gözlənilmədən Füzulini «İranın fars şairi» adlandırdı və çox adamı heyrətləndirdi. H.Novinin sözündən belə məlum oldu ki, Füzulinin əsərlərində işlənən sözlər arasında fars kəlmə və istilahları çoxluq təşkil edir və cənab Novin onların təxminən həştad faiz olduğunu müəyyənləşdirmişdir.

Necə yəni «İranın fars şairi»? Axı Füzulinin Azərbaycan şairi olmasının sübuta heç bir ehtiyacı yoxdur. Doğrudur, Füzulinin şe’ri və nəsrində ərəb-fars

sözləri, izafət tərkibləri çoxdur. Lakin bu heç də onun fars şairi kimi təqdim olunmasına dəlalət etmir. Buna qalsa, elə Seyid Əzim Şirvaninin, Mirzə Ələkbər Sabirin, Məhəmməd Hadinin dilində də fars sözləri çox işlənmişdir və bu hal onların azərbaycanlı olduqlarını qətiyyən şübhə altına almır.

Mən böyük Füzulinin 1995-ci ildə Tehranda keçirilən «Füzuli-500» Beynəlxalq elmi konfransında da iştirak etmişəm və onun iştirakçıları haqqında «İran səfərnamələri» adlı kitabımın dördüncü səfərnaməsində ətraflı məlumat vermişəm. Mən kitabımda yazmışam: «Konfransda iştirak etmək üçün Azərbaycan nümayəndə heyətindən başqa Türkiyədən (Yazarlar Birliyinin sədri Mehmed Toqan, professorlar Mustafa İsən və Ehsan Sürəyya), Tacikistandan (şairlər Aşur Səfərov, Fərzanə Xocəndi, şərqşünas alimlər Curibek Nəzərov, Bürhan Rəhmanov), Türkmənistandan (Aşur Orazov), Özbəkistandan (Həmid Ziyayev) da nümayəndələr gəlmiş, özləri demişkən «ürəklərində bizim Füzulimizə sonsuz məhəbbət gətirmişdilər». Onların içərisində İranın Mədəniyyət və İrşad naziri Mühəndis Mir Səlimin, höccətül-islam ağayi- İjeyinin, d-r Cavad Heyətin, d-r Əli Əsgər Şe’rdustun, d-r Əsgər Fərdinin, d-r Cəlil Təclilin, d-r Xəlicinin, Təbrizdən gəlmiş alim və şair dostum Mahmud Pədidənin, Məşhəd alimləri Ənzabnejadın, Ələvinin, şair və tədqiqatçı Çavuş Əkbərinin, Təbrizli şair Payegozarın, gənc tədqiqatçı xanım Sabitzadənin, höccətül-islamlar Bidarın, Rəşadın və başqalarının adlarını çəkmək olar» (Bax: Şahin Fazil. İran səfərnamələri, Bakı, 203, s.73).

Sonra sözümə davam edib yazıram: «Konfrans günlərində iyirmidən çox elmi məruzə dinlənildi. Müxtəlif məruzəçilərin Füzuli haqqında dediklərindən:

Bəkir Nəbiyev: «Məhəmməd Füzuli öz əsərləri vasitəsilə Bağdad, Təbriz və Bakı türkləri arasında uzun bir ədəbi körpü yaratdı».

Hacı Seyid Cəvadi: «Füzulinin şe’rləri Bosniyadan Kaşğara və Sind çayından Araza qədər bütün ərazidə yayılmışdır. Ana dilinin fars dili olmadığına baxmayaraq, onun bu dildə olduqca gözəl şe’rləri vardır».

Ağamusa Axundov: «Heç bir şək-şübhə yoxdur ki, Füzuli əsərlərinin dili müəllifin ərəb mühitində yaşamasına baxmayaraq məhz Azərbaycan ədəbi dilidir».

Əsgər Fərdi: «Füzulinin yazmış olduğu «səbke-hindi və səbke- İsfahani» adlanan şe’r növlərini «səbke-Azərbaycani» adlandırmaq daha düzgün olardı».

Kamal Talıbzadə: «Bizim Füzulimizdən sonra ərəb, fars və türkdilli

ədəbiyyat aləmində poetik incilər yaradan bir çox şairlər şe'rdə siqlət və məsuliyyət baxımından məhz ona bənzəməyə çalışmışlar».

Mehmed Toğan: «Füzuli qardaş xalqlar arasında bir körpü rolunu oynayır».

İmamverdi Həmidov: «Mən azərbaycanlı ustad şairin ərəb dilindəki şe'rlərini araşdırmışam. Füzulinin ərəbcə qəzəl və qəsidələrini oxuyan ərəblər onunla başqa ərəb şairləri arasında dilin püxtəliyi baxımından heç bir fərq görmürlər, Füzulini ərəb şairi kimi qəbul edirlər»» (Bax: Adı çəkilən səfərnamə, səh.74-75).

Nə isə. D-r Hüseyn Novinin Füzulinin guya fars şairi olması xüsusunda dediyi əsassız fikir bir qədər narahatlığa səbəb oldu. Şəfəq də, Hacı Qadir də d-r Novinə öz etirazlarını bildirdilər və Şəfəq növbəti çıxış üçün sözü mənə verdi.

Məqaləm «Bir şair, iki şah, yaxud Füzulinin Şah İsmayıl Səfəviyə və Sultan Süleyman Qanuniyə münasibətinə dair bir neçə söz» adlanırdı. Mən də d-r Hüseyn Novinə etiraz etməyi özümə borc bildim və Füzulinin xalis türk etnosu bayat tayfasından olduğunu, lakin İraqda yaşadığını xatırlatdım. Dedim ki, Füzuli şe'rlərində ərəb-fars kəlmə və istilahlarının çoxluğu orta əsrlər dövrünün ədəbi dili ilə bağlı bir məsələdir. İnsafən deməliyəm ki, d-r Hüseyn Novin susdu və bir kəlmə də danışmadı.

Seyid Mürtəza Mirhaşimidən sonra xitabət kürsüsünə sinə gərən şair və jurnalist dostum Qurban Cəbrayıl Füzuliyə xitabən yazdığı «Ustad» rədifli şe'rindən sonra əvvəlcə dünya, sonrasa qızlar barədə daha iki şe'r oxudu. Zalda əyləşib onu diqqətlə dinləyənlərin əksəriyyəti gənc olduğundan, təbii ki, Qurbanın şe'rləri gənclərə məxsus ehtirasla və alqışlarla qarşılandı.

Hacı Qurban Cəbrayıldan sonra d-r Bəhram Əsədi «Füzuli şe'rində şe'r və şair» adlı maraqlı bir məruzə ilə çıxış etdi. Ondan sonrakı məqalə də maraqsız deyildi: «Füzuli ənənələri Hüseyn Cavid yaradıcılığında». Müəllifi filologiya elmləri namizədi Lütfiyyə Əsgərovadır. Naxçıvandan gələn heyətin üzvü olan bu qadın görkəmli şairimiz Hüseyn Cavidin yaradıcılığına yaxşı bələddir. Bəlkə də onun namizədlik dissertasiyası elə Hüseyn Caviddəndir.

D-r Yəhya Sotudənin məruzəsini də diqqətlə dinləməkdəydim, birdən-birə sol tərəfimdəki boş yerdə bir nəfərin əyləşdiyini hiss etdim. Qolumdan tutdu. Camal idi. Camal Abbaszadə. Çox isti görüş oldu.

Zalın foyesinə çıxdıq. Hacı Qurban da yaxınlaşıb bizə qoşuldu. Keçən il Urmiyədə keçirilən şe'r konfransında («Şe'ri-Rezəvi») bu adam üç gün bizə xidmət etmiş, ardı Təbrizdə keçirilən bu konfransın davamı zamanı hətta Təbrizdə də bizimlə birgə olmuşdu.

Camal keçən il tələbəydi, amma bu il ali təhsilli bir iqtisadçıdır. Camal Abbaszadə artıq Bakıdakı Cənubi Rusiya Humanitar İnstitutunu bitirmişdir və təhsilini aspiranturada davam etdirmək niyyətindədir. Özü də Bakıda. Milli Akademiyada, yaxud İqtisad Universitetində.

Ona uğurlar dilədim. Bağına də'vət etdi (keçən il şəhər kənarındakı bağında bizə bir ziyafət də təşkil etmişdi). Vaxtımız az, işimizsə çoxdur. Ondan üzr istəyib gedə bilməyəcəyimizi bildirdik. Sağlıq olsun, gələcəkdə görüşərik, ağaye-Camal Abbaszadə. Əgər Urmiyədə də olmasa, Bakıda görüşərik, inşallah.

Zala qayıtdıq. Yaqut xanım Sərdar çıxış edirdi: Yaqut Quliyeva. O da Naxçıvandan gəlib. Olduqca maraqlı bir məruzəsini dinlədik: «Azərbaycan bəstəkarlarının və müğənnilərinin yaradıcılığında Füzuli mövzusu». Əlbəttə, olduqca geniş mövzudur. Bu haqda lap dissertasiya yazmaq olar. Musiqini yaxşı bilən bu qadın bəlkə də böyük məhəbbətlə Füzuli sənət meyxanəsinin məhəbbət meyini huşyarlıqla içərək o dahinin sözlərinə yazılan musiqi barədə yaxşı bir dissertasiya yazacaqdır. Məgər şair deməyibmi ki:

*«Zahidi-xudbin nə bilsin zövqünü eşq əhlinin,*
*Бn əcəb meydir məhəbbət kim, içən hüşyar olur».*

Yaqutu Fərqanə əvəz etdi. Fərqanə Kazımova. O da Naxçıvandandır. Məruzəsi Füzuli və Əliqulu Qəmküsar haqqındadır. Maraqlıdır. Məruzəçi satirik şair Ə.Qəmküsarı lirik söz ustadı M.Füzuli ilə necə əlaqələndirəcək? Yadıma Əliqulu Qəmküsarın oğlu prof. Ələkbər müəllim düşdü. Tibb elmləri doktoru olan bu ağsaqqal, qocaman adam bərk ədəbiyyat vurğunudur, qəzəlxan Həkim Qəninin rəhbərlik etdiyi «Vahid poeziya məclisi»nin üzvüdür. Qeyd edim ki, atası Əliqulu Qəmküsar ona atasının adını vermişdi.

Şair-jurnalist idi Əliqulu Qəmküsar. 1913-14-cü illərdə Cəlil Məmmədquluzadə ilə birlikdə «Molla Nəsrəddin» jurnalının redaktoru vəzifəsində çalışmışdır. Əsərlərində İran əksinqilabını, cəhaləti, qadın

hüquqsuzluğunu tənqid hədəfinə çevirən Əliqulu Qəmküsar sonralar teatr sənəti ilə maraqlanmış və 1916-cı ildə Cəlil Məmmədquluzadənin «Ölülər» komediyasını Bakıda tamaşaya qoymuş və Şeyx Nəsrullah rolunun ilk ifaçısı olmuşdur. Bir neçə ildən sonra o, Tiflisdə qaragüruhçular tərəfindən öldürüldü.

Fərqanə xanımın çıxışına qulaq asa-asa yenə də düşünürdüm: Füzuli hara, Qəmküsar hara? Biri tamamilə ciddi şe'rlər, o birisə tam satirik ruhlu əsərlər müəllifi. Lakin Fərqanə Kazımova məruzəsində o iki şairin yaradıcılıqlarını uzlaşdıra bildi.

Xoy Universitetinin ustadı d-r Nasir Nasiridən sonra bir tələbə qız məni foyeyə də'vət etdi, öz fotoaparatını başqa bir qıza verib mənimlə şəkil çəkdirdi və çoxdan yazdığım bir qəzəlimin bir beytini söylədi:

*«Elə ki, seyr eləyir göz bu gözəl canam,*
*Cavanın səbri çatışmır, qocanın imkanı».*

Bərk təəccübləndim. Soruşdum ki, bu şe'ri haradan bilirsən? Əlindəki qalın dəftərini açdı və onun ilk səhifəsini mənə göstərdi. Xəttimi tanıdım. Bu beyti on dördüncü İran səfərimdə («Xaqanişünaslıq» konfransı zamanı) özüm yazmışammış bu qızın dəftərinə. Ümumiyyətlə Urmiyəli tələbələr şəkil çəkdirməyə və avtoqraf almağa bərk aludədirlər və bu mehriban azərbaycanlılar o azərbaycanlılara (yəni bizlərə) çox böyük diqqət və qayğı ilə yanaşırlar. Allah sizləri xoşbəxt eləsin, ay azərbaycanlılar, ay tələbələr!

Qızlardan ayrıldım və dərhal bir jurnalist tərəfindən müsahibəyə də'vət olundum. Bu dəfə Qərbi Azərbaycan Televiziyasının «Kon- franslar proqramı» üçün. Belə başa düşdüm ki, bu televiziya proqramı yalnız konfransdan konfransa, böyük iclasdan iclasa fəaliyyət göstərir.

Bu gün üçün nəzərdə tutulmuş məruzə dinləmələri bitdi, hər məruzəçi öz məqsədinə yetdi və maşınlara əyləşib «Şıxtəpə» adlanan səfalı bir yerə gəldik.

Şıxtəpə Urmiyə şəhərinin ən yüksək yerlərindən biridir, necə deyərlər, buradan baxanda şəhər «ovcunun içində» görünür.

Şıxtəpədən enib «Çay kafesi» adlanan müasir üslubda inşa olunmuş bağ-bağçalı bir guşədə olduq, dondurmaya, püstə-badama, qoz-fındığa, meyvə şirələrinə və bu kafenin adına tam u yğun çay süfrəsinə «qonaq» edildik. Sonra Urmiyə Universitetinin gül-çiçəkli həyətində şam süfrəsi açıldı. Elə bu vaxt bir

neçə saat bundan əvvəl konfrans zalını tərk etmiş Şahin Mustafayev, Hacı Ələmdar və İlqar Fəhmi də gəlib çıxdılar. Qurban Cəbrayıl dərhal Ələmdarı sevindirdi: İtən əşyaların tapılıb, Hacı.

Keyfi kökələn «itən əşyalar sahibi» bərk sevindi. Məsələ belə olmuşdu: Biz konfransın işini davam etdirdiyimiz vaxt Şahin, Hacı və İlqar bir taksi maşınına əyləşib şəhərin kitab mağazalarına yollanmış və maşından düşərkən Hacının həmişə yanında gəzdirdiyi kiçik əl çantası oturacağın üstündə qalmış və onlar maşını tərk etmişdilər. Bir azdan çantanı itirdiyini bilən Hacı Ələmdar bərk qayğılanmış və ümidini özü demişkən «Allaha bağlamışdı». Axı, onun itkiləri arasında foto-kamera, diktofon və şəxsiyyət vəsiqəsi də vardı. Sən demə onlar maşında şəhərin küçələri ilə hərəkət edərkən etdikləri söhbətdə «Mirvari» oteli, «Füzuli konfransı» sözlərindən sərnişinlərin kimlər olduğunu bilən sürücü dərhal maşınını iclasımızın keçirildiyi Konfranslar Mərkəzinə sürmüş və çantanı təhvil vermişdi. Halallıq və düzlük! Halal olsun halal və düzgün adamlara!

14.06.2007. Konfransın ikinci günü. Zala daxil olduğumuz vaxt iki tələbə qız iki Şahinə yanaşdı. Hər ikisinin əlində bir kitab vardı. Qızlar kitabları bizə təqdim edərək, onları Urmiyə sovqatı kimi qəbul etməmizi xahiş etdilər. Şairə xanım Pərvin Etisaminin «Divan»ıydı hər iki kitab. Cildin üzərindəki şairənin hicablı, sarı rəngli bir şəkli və şəklin aşağısında al qızılgül dərhal nəzərimi cəlb etdi, «Külliyyati-divan» («Divan külliyyatı») sözləri isə qara hərflərlə yazılmışdı. Kitabın üz qabığını çevirdim. Birinci səhifədə qızlar avtoqraf da yazmışdılar: «Urmiyyə Azad Universitetinin Fars ədəbiyyatı fakültəsinin tələbələri Şadi Xəlici və Səmanə Süleymanidən azərbaycanlı dosta təqdim olunur».

Divanın tərtibçi-alim Məhəmməd Təqi Babayi tərəfindən yazılan müqəddiməsinin adı «Dövran nadirəsi xanım Pərvin Etisami» adlanır. Alim İran ədəbiyyat tarixinə qısa bir nəzər salaraq bir neçə qadın şairin - Rabiə bint Kəb, Məhsəti Gəncəvi, Zibənnisa Məxfi, Lalə xatunun adlarını ehtiramla çəkir və Pərvin Etisamini onların arasında «yeganə parlaq ulduz» adlandırır. Neynək, qoy elə olsun. Məhəmməd Təqi Baba- yi tərəfindən adı xatırlanan Məhsəti Gəncəvi (Gəncəvi!!!) kimi şairlər, şübhəsiz ki, təkcə müəyyən bir məkanın deyil, bütün dünyanın şair- ləridirlər.

Qızlara öz minnətdarlığımızı bildirib zala daxil olduq və yeni dinləmələr başlandı. «Təbriz eyşxanəsi sorağında (Füzuli Bağdadinin fikir və etiqadı barədə)» adlı məruzə ilə çıxış edən xanım d-r Məhbubə Mübaşiridən sonrakı çıxışı həm azərbaycanlılar, həm kürdlər, həm giləklər, həm də farslar məftunluqla dinləyirdilər. Xitabət kürsüsü arxasında bizim Şəhla Abdullayeva dayanmışdı. Gözündə eynəyi, üzündə cazibədarlığı, sözündə şirinliyi olan yaraşıqlı bir qız.

Şəhla danışırdı. Farsca danışırdı. Lap elə farslar kimi danışırdı. Bu qızın fars dilini Bakıda öyrənməsi qətiyyən duyulmurdu. Hamı dinləyirdi. Şəhla danışırdı. Füzulinin farsca divanında aşura məktəbindən danışırdı.

Danışdı və çıxışını bitirdi. Çıxışını bitirdi və aşağı düşüb yerində əy - ləşdi, lakin alqışlar səngimirdi. Sevincimdən gözüm yaşarmışdı. Möhsün Nağısoylu iftixar içindəydi, çünki özü demişkən, Şəhla onun yetirməsiy- di. Zəhməti halal olsun, yaxşı yetişdirib Möhsün. Bax, yetkinlik budur! Məhəmməd Füzuli sanki Şəhla Abdullayeva barədə yazıb bu beytini:

*«Бэк, nə qamət, nə qimaət, bun ə şaxi-güli-tərdir,*
*Nə bəladır, nəzər əhlinə nə xoş məddi-nəzərdir».*

Şəhlanın çıxışından sonra söz İlqar Fəhmiyə verildi.

Gənc İlqar Fəhmi. «Məcməüş-şüəra»nın sabiq üzvü. «Ulduz» jurnalının şöbə müdiridir. Bu yaxınlarda mənim ölüm barədəki bir poemamı çap etdi. İstedadlıdır. Bir neçə il bundan qabaq şe’r yazardı (bəlkə elə indi də yazır). Girişib nəsrə. Koroğlu haqda roman yazıb. Yaxşı qəzəl nümunələri olan bir kitabı var...

Mən ondan bu elmi konfransın məzmununa uyğun müvafiq şe’r gözlədiyim halda nə eşitdim? Çoxdan yazdığı «Yağış» rədifli bir qəzəl. Alqışlandı. İlqar cuşə gəldi və ikinci şe’rini də oxudu: Yenə yağış, amma müstəzad formasında. Yenə alqışlandı. Vəcdə gələn şair üçüncü şe’rini deməyə başladı: «Misra-misra» rədifli bir qəzəl. İlqar coşmuşdu. Görünür bu coşğunluq elə Füzulinin təsirindəndi. Yəqin ki, kədərli Füzuli babamızın bəzən yağış tək yağan, misra-misra səpələnən məhzun şe’rlərindən ilhamlanmışdı İlqar. Hər halda yaxşı şe’rlərdir.

D-r İmraninin məruzəsi dinlənildi və səhnəyə bir xanım nəzakətlə

addımlamağa başladı: Nəzakət Məmmədli. Gəlib xitabət kürsüsü arxasında dayanan Nəzakət məqaləsinin adını dedi: «Füzulinin «Leyli və Məcnun» poemasında irfani poetika». Mürəkkəb mövzudur. Gərək irfanı yaxşı biləsən, irfani istilahların mə'nasından agah olasan. Nəzakət də alqışlandı, çünki Füzulinin şah əsərinin irfanını arifanə aça bildi.

D-r Əli Nəcəfi də Füzuli irfanından bəhs etdi: «Füzuli Bağdadinin «Saqinamə»sində şühudi irfan cilvələri». İrfan cilvələri. Özü də şühudi. Mə'nalı və parlaq cilvələrdir. Elə parlaqdır ki, 500 ildən sonra da gözlərimizi qamaşdırdı.

Növbə Aytən Hacıyevaya çatdı: «XIX əsrin Qarabağ sənətkarları Füzuli ədəbi məktəbinin davamçıları kimi». Aytən filologiya elmləri namizədidir və Möhsünün faydalı elmi rəhbərliyinin bəhəri olan bir dissertasiya yazmışdır.

Nəzərlərimi Möhsünə çevirdim. Onun gözləri bu dəfə iftixarla Aytənin üzünə zillənmişdi. Füzuli yadıma düşdü:

*«Səcdədir hər qanda bir büt görsəm ayinim mənim,*
*Xah mömin, xah kafər tut, budur dinim mənim».*

Möhsün qürur hissi keçirir və bunu heç gizlətmirdi də. Bəli, Şəhla kimi, Aytən kimi alimlər yetişdirən Möhsünün sevinməyə haqqı vardı. Onun başqa layiqli yetirmələri də var, amma bu iki qız bu anda həqiqətən də Möhsünün qürur və sevinc mənbəyinə çevrilmişdilər. Yəqin ki, elə Şəhla da, Aytən də ondan razıydılar. Vaxtilə Xorasan hökmdarı olmuş Sultan Hüseyn Bayqara (1469-1506) məlumdur ki, şe'rsevər bir padşah kimi ətrafındakı şairləri, xüsusən vəziri Əlişir Nəvaini yüksək qiymətləndirmiş, onun böyük şair kimi formalaşmasında xüsusi rol oynamışdı. Yetirmələrinin elmi uğurlara yetmələrində Möhsün Nağısoylunun da lap elə Sultan Hüseyn Bayqara kimi xidməti olmuş, nəticədə Şəhla kimi, Aytən kimi alimlər yetişmişdi. Yadıma şair Kişvərinin hafizəmdə aşağıdakı kimi ilişib qalan bir beyti düşdü:

*«Kişvəri şe'ri Nəvai şeridən əskik iməs,*
*Bəxtimə düşsəydi gər Sultan Hüseyni-Bayqara».*

Yəqin ki, Möhsünün hələ müdafiə etməyən başqa aspirant və dissertantları indi şair Kişvəri kimi düşünürlər...

20 dəqiqəlik fasilədən sonra iclasın davamı başlandı. Axşama az qalır. Vaxt məhdudiyyətini nəzərə alan Mənzər Hüseynova («Bədii ədəbiyyatda Füzuli obrazı»), Vüqar Mustafayev («Füzuli tarixi nəsrimizin banisi kimi»), və Günel Eminli («Məhəmməd Füzuli və Həqiri Təbrizi: «Leyli və Məcnun» poemasının müqayisəli təhlili») öz mövzularını oxumaqdan sərf-nəzər etdilər (elə onsuz da məqalələri gələcəkdə «Füzulişünaslıq» məqalələr toplusunda çap olunacaq).

D-r xanım Zəhra Parsapur «Farsca qəsidələrində Məhəmməd Füzulinin tarixi çöhrəsi»ni işıqlandırmağı bacardı və növbəti çıxış üçün söz Şəfəq Əlibəyliyə verildi. Şəfəq də məruzəsini fars dilində oxudu. Bu dili gözəl bilən bu qadın Tehran ləhcəsi ilə yaxşı danışır. Çoxdanın elmlər namizədidir. İndi Füzulinin fars divanı xüsusunda doktorluq dissertasiyası üzərində işləyir və yaxın vaxtlarda müdafiə edəcək inşallah.

Şəfəq xanım danışdı. Yaxşı danışdı. Gözəl sözlər işlətdi. Məntiqi cümlələr dedi. Şəfəqin farsca nitqində əfqan ləhcəsi qətiyyən duyulmur. Mənim danışığımdasa həmin ləhcə açıq-aydın nəzəri cəlb edir. Görünür ki, Əfqanıstanda uzun illər yaşamağım (13 il) mənim fars dilimi bir qədər «əfqanlaşdırıb».

Qayıdaq mətləbə. Bəli, Şəfəq gözəl-gözəl sözlər dedi və mən dərhal Füzulinin «söz» rədifli qəzəlindən bu beyti xatırladım:

*«Xazini-gəncineyi-əsrardır, hər dəm çəkər,*
*Rişteyi-izharə min-min gövhəri-əsrar söz».*

Şəfəq Əlibəylinin məruzəsi bitdi və xitabət kürsüsündə bu bakılı millət alimini urmiyəli millət vəkili d-r Məhəmməd Abbaspur əvəz etdi. Bir qədər siyasi məzmunlu çıxış...

D-r Qulam Rza Salemyan və d-r Naser Naseridən sonra söz saza verildi və sazını qoltuğundan çıxarıb əlinə alan Aşıq Dehqan səhnədə göründü. Saz söz danışmağa başladı.

Mən Aşıq Dehqan barədə əvvəlki Urmiyə səfərnaməmdə yazmışam. Bu aşıq bizim professor Məhərrəm Qasımlının dostudur. Dediyi qoşma xoşuma gəldi aşığın. Əgər Məhərrəm burada olsaydı yaxınlaşıb onu bərk-bərk öpərdi. Aşıqpərəstdir Məhərrəm.

Dehqanı (farsca «əkinçi» deməkdir), alim əvəz etdi. Ötən konfranslarda

iştirakım zamanı tanıdığım isfahanlı bir türk: D-r Həsən Qaranejad. O da d-r Nəzakət Məmmədli kimi, d-r Əli Nəcəfi kimi Füzuli irfanından bəhs etdi, lakin Füzulidə islam irfanından. Məqaləsi eləcə də adlanırdı: «Füzuli şe'rlərində islam irfanı».

Nəhayət bizim Səadət Şıxıyeva kürsü arxasındadır. Nəsimi poeziyası əsasında böyük doktorluq dissertasiyası yazır bu zərif qız. Səadətini elmdə görür Səadət. Nəsimi vurğunu Səadət. Nəsimi dözümlü, Nəsimi qeyrətli Səadət. Allah, bu qıza səadət bəxş et.

Qədirbilən Səadət Şıxıyeva poetik sözün qədrini artıran iki dahidən - Nəsimidən və Füzulidən danışdı. Danışdı və bizi heyran etdi. Füzuli demişkən:

*«Fəğan kim, bağrımın ol lalərüx qan olduğun bilməz,*
*Cigərpərkaləsində daği-pünhan olduğun bilməz...*

*Sanır zahid özün xali xəyalindən, qələtdir bu,*
*Bu heyran olduğundandır ki, heyran olduğun bilməz».*

Səadəti Günel əvəz etdi. Günel Eminli. Məruzə oxumadı Günel, şe'r oxudu. Öz şe'rini dedi Günel. Canım, bu qız da şairmiş ki.

İrana bu dəfəki on yeddinci səfərim zamanı mən ümumiyyətlə yaxşı insanlarla həmsəfər olmuşam. Bu həmsəfərlər içərisində çox yaxşı tanıdıqlarım da var, əvvəl heç tanımadıqlarım da. Şəhla, Aytən və Günel «heç tanımadıqlarımdan» idilər. İndi tanıdım. Şəhla, Aytən və Günel! Və onlara qarşı qəlbimdə rəğbət oyandı. Füzuli gözəl deyir:

*«Dəmadəm xublər cövrilə artar ləzzəti eşqin,*
*Yamandır bu ki, təhqiq etmədən derlər yamandır bu».*

Qoy desinlər. Onsuz da bəzi həsədkar adamlar Şahinin ardınca o qədər yaman danışıblar ki. Şahin eşq Şahinidir. Səfərnaməni səfərnamə, məqaləni məqalə, divanı divan ardınca eşqlə yazır. Şe'r yazmadığı günü yoxdur Şahinin. Sübut? Şe'rlərinin altında qoyulan tarixlər. Vaxtın qədrini bilən adamdır Şahin. Söz - zərdir. Söz zərgəridir Şahin:

*Söz zərgəri oldum deyə zər var qəzəlimdə,*
*Zər var deyə şe'r içrə zəfər var qəzəlimdə.*

*Gül-bülbülü seyr etmədəyəm tazə nəzərlə,*
*Köhnə nəzərə tazə nəzər var qəzəlimdə.*

*Бəzən mənə yar oldu sevinc hissi təbii,*
*Бəzən də ələm, qüssə, kədər var qəzəlimdə.*

*Üstünlüyümü tazə əsrdə biləcəklər,*
*Бu mən bilirəm indi nələr var qəzəlimdə.*

*Бağçamda çəpər görməyəcəklər mənim, amma*
*Yad kəlmələrə qarşı çəpər var qəzəlimdə.*

*Şahin qəzəli tər axıdıb «Divan» edibdir,*
*Vəznim qədəri bəlkə də tər var qəzəlimdə.*

*(Бax: İkinci Divan, Бakı, 2005, s.5)*

Nə isə... İki günlük konfransımız bitdi. Beləliklə, iki gün davam edən iclaslar və dinlənilən onlarla məruzə. Təəssüratım böyükdür. İki gün Azərbaycanlar və Naxçıvan alimlər içərisində. Təəssüf ki, mənə məlum olmayan səbəblər üzündən Türkiyə və Rusiyadan gözlənilən elm adamları gəlib çıxmadılar.

«Mirvari»yə qayıtdıq. Azacıq istirahətdən sonra şəhərin seyrinə yollandıq, müxtəlif yerlərdə, o cümlədən örtülü bazarda və kitab mağazalarında olduq. Otelə döndüyümüz vaxt 4 tələbə və 2 jurnalist məni gözləyirdi. Tələbələr, əgər mümkünsə, Urmiyədə iki gün artıq qalmağımı xahiş etdilər, çünki sabah, yəni iyunun 15-də şəhərdə «şəbe- şe’r» («şe’r axşamı») keçiriləcək və mənim iştirakım arzu olunur. Onlardan üzr istəyərək burada qalmağımın namümkün olduğunu bildirdim. Narazı qalsalar da, razılıqla ayrıldılar və məni başa düşdülər: Mən birgə gəldiyim kollektivdən ayrıla bilməzdim.

Qaş qaralanda yenə Urmiyə Universitetinin həyətinə gəldik. Köhnə dostumuz Mustafa Quluzadə ilə görüş. Onun özünün də bir neçə şe’ri dərc olunan «Nurlu misralar» adlı kitabı mənə verdi və növbəti ziyafət başlandı. Ostandar müavini cənab d-r Məhəmmədzadə, d-r Məhbub Talei və İranın Naxçıvan Muxtar Respublikasındakı Mədəniyyət Mərkəzinin rəisi Davud Hacınasirinin iştirakı ilə növbəti isti görüş və səmimi söhbətləşmə.

Şam süfrəsi arxasında qısa çıxışlar oldu (Şahinlər, AMEA-nın müxbir

üzvü Əbülfəz Quliyev və cənab Məhəmmədzadə).

Şam yeməyi bitdi. Dövrəsində əyləşdiyimiz mizi tərk edib qarşı tərəfdəki mizin dövrəsinə də’vət olunduq. Çay süfrəsi. Ostandarın müavini İranla bağlı ən böhranlı məsələ olan ABŞ-İzrail-İran mövzusu üzrə bir saatdan çox danışdı və hal-hazırda İran İslam Cümhurisinin hərbi cəhətdən üstünlüyünü xüsusi qeyd etdi.

Sonra siyasətdən şe’riyyətə keçdik. Məclisin aparacılığı mənə həvalə olundu. Hacı Ələmdara, Hacı Qurbana, Xəlil Həqiqətgərə, Mustafa Quluzadəyə, İlqar Fəhmiyə bir-bir söz verdim və onların şe’rləri dəfələrlə alqışlandı (bizim xalqlarımız şe’ri çox sevirlər). Şəfəq Əlibəyli və Günel Eminli nədənsə şe’rlərini oxumadılar. Əynində hind sarisinə bənzər libas olan Şəfəq özünün şe’r yaddaşının zəifliyini bildirdi. Mən inanmadım.

Nəzakətin çıxışından sonra mənim replikam («Örpək altında qadınlar varmış») gülüşlə qarşılandı. Görüm ki, həmişə belə xoş əhvali- ruhiyyədə olasınız ay qardaşlar, ay bacılar!

Özünün və İmadəddin Nəsiminin bir neçə şe’rini söyləyən Xəlil Həqiqətgər birdən-birə elə vəcdə gəldi ki, onun mizə dəyən yumruğunun zərbindən qarşı tərəfdə oturan Nəsib Göyüşlü bərk diksindi. X.Həqiqət- gəri yaxşı tanıyan və mizə daha bir neçə yumruğun dəyəcəyini bilən şairlər dərhal mizin üstündəki stəkan-nəlbəkini qırağa çəkdilər və həqiqətən də X.Həqiqətgərin coşğunluqla mizə və kürəyimizə ilişdirdiyi yumruq zərbələri təkrar olundu. Bəli, Xəlil qardaşımız belə şairdir. Cuşə gəlib sözlərini hündürdən ərz edir və ehtiyat hissimizi artırır. Şahin dedi: «Çılğınlıq, görünür, bütün Xəlillərə xas əlamətdir. Rəhmətlik Xəlil Rza Ulutürk də beləydi».

Gecə yarısı otelimizə qayıtdıq. Sabah İranda cümə, Azərbaycan Respublikasında isə Qurtuluş Günüdür. Elə bir gündə 8 saatlıq Urmiyə- Astara yolunu qət edib gömrükxanaya vaxtında çata bilməmə ehtimalını nəzərə alaraq, sübh tezdən Urmiyəni tərk etməyi, Ərdəbilə getməyi və orada gecələməyi qərara aldıq. D-r Məhbub Talei dərhal razılaşdı, dedi ki, mən Ərdəbil Universitetinin rektoru ilə danışıb orada sizə lazımi şərait yaradacağam.

Beləliklə, bugünkü günümüz də bitdi. Deməli, sabah Ərdəbil, o biri günsə Astara və Bakı. Gecəniz xeyrə qalsın! Gecə bu qit’əni yazdım:

*Bitdi bu günlük gözümün mürgüsü,*

*Başladı mənlə ürəyin söhbəti.*

*Bir neçə gündür Bakıdan ayrıyam,*
*Baş-başayam, mən - fələyin söhbəti:*

*Çəkmədə yurdum məni cənnət kimi,*
*Sanki yetişdi mələyin söhbəti.*

*Gendə qalıbdır Xəzərin xəzrisi,*
*Hardadır, ayə, küləyin söhbəti?*

15.06.2007. Tezdən oyandım. Ərdəbilə tez çatmaq arzusu ilə bir şe’r qaraladım. Bu gün xeyli yol qət etməliyik: Urmiyə-Urmiyə gölü-Təbriz-Bostanabad (Ucan)-Sərab-Ərdəbil. Qanadlarımız olsaydı uçardıq və Ərdəbilə tez çatardıq. Şair qardaşımız Əsgər Şahi də oradadır. Əllərimi göyə açdım:

Qanad istəyi

*Yaşayırıq həyatı*
*Qolsuz-qanadsız kimi.*
*Qanad ambarlarında*
*Qanad tükənmişdimi*
*İlahi?*
*Qanad versəydin əgər*
*Biz qol-qanad açardıq,*
*Birbaşa, kəsə yolla*
*Urmiyəyə uçardıq,*
*İlahi...*

Səhər tezdən ağaye-talei və başqa urmiyəli dostlarla xudahafizləşib yola düşdük. Elə bizi gətirən maşın bizi aparırdı.

Urmiyə gölü. Gəmi-bərə. İskələ. Urmiyədən ayrılmışıqsa da Urmiyə yadımdan çıxmır. Birdən-birə nədənsə XVIII əsrin II yarısında İranın şahı olmuş Ağa Məhəmməd şah Qacar yadıma düşdü. Qəribədir, deyilmi? Ağa Məhəmməd. Axtalanmış şah. İki bənddən ibarət bir şe’r yazıldı:

Ağa Məhəmməd şah Qacar

*Taleyə bax, işə bax,*
*Fərəhi qübar oldu.*

*Axtalandı bir uşaq,*
*Axta - hökmüdar oldu.*

*İddiasız şairəm,*
*Şahini adi sayın.*
*Şah olmaq istəmirəm,*
*Məni axtalamayın.*

Yol Təbrizədir. Yaxınlaşırıq. Yol boyu yüzlərlə yaşıl və qara rəngli bayraqlar. Onları dalğalandırır Təbriz küləyi. İranda yollar boyunca qara bayraqların dirəklərə sancılması matəm rəmzidir. İki gün əvvəl İraqda (Samarra şəhərində) şiə məscidində partlayış törədilib və yüzdən çox ərəb məzhəb ixtilafının qurbanı olub (yenə bədnam şiə-sünni qarşıdurması). İranın Qum şəhəri (dini mərkəzdir) bu qırğın münasibətilə bütün ölkədə 3 gün matəm elan etmişdir. Bəli, bir vaxt İraqla müharibəyə təhrik olunan İran indi İraq şəhidlərinə təziyə tutur, yas saxlayır. Hər halda, nə olur-olsun islam ölkələrində məzhəb ayrılığına son qoyulmalıdır. Əsrlərlə davam edən və xristian dövlətlər tərəfindən qızışdırılan şiə-sünni qovğaları kimə lazımdır, bizə yoxsa onlara?

Sürücü Pərviz maşınını 5-10 dəqiqəliyə yol kənarında saxladı. Yerə düşdük və Nəsib Göyüşlü təbrizlilər barədə məzəli bir lətifə danışdı: Təbrizli bir kişi oğluna belə məsləhət verir: «Oğul, çalış ki, yol gedərkən həmişə aşağı baxasan. Əgər belə yerisən, əvvəla, sənə «başıaşağı adam» deyərlər, ikincisi köynəyinin boynu çirklənməz, üçüncüsü isə yerdən nəsə bir şey taparsan».

Gülüşdük və gəzişməyə başladıq, amma heç birimiz yerə baxmırdıq.

Nəzakət əlini yol kənarındakı tut ağacına uzatdı. Mən də tutbazam, amma, Məşədi İbad demişkən «bir o qədər də yox».

Yolumuza davam edirik. Nəsib bizi söhbətdən ayırdı: - Səhənd dağına baxın.

Baxdıq. Başı qarlıydı. Qarpapaq Səhənd mənə bu bayatını yazdırdı:

*Səhəndin qarlı başı,*
*Qarlı, vüqarlı başı.*
*Şahininsə Səhənddən*
*Var intizarlı başı.*

Səraba yaxınlaşırıq. Yenə Nəsibin səsi eşidildi: - Savalan dağına baxın.

Dağbaz Nəsibin göstərdiyi sol səmtə baxdıq. Zirvəsi Səhəndin zirvəsi kimi qarlı Savalan. Bu dəfə bayatını (daha doğrusu, xoyratını) Savalan yazdırdı:

*Savalandır,*
*Zirvəsi övc alandır.*
*İlhamım, yetiş dada,*
*Şahini havalandır.*

Sanki havalandım və Ərdəbilə uçdum. Şe'rlərindən nəhayətsiz həzz aldığım Əsgər Şahi Ərdəbilini xatırladım. Onun mənə ithaf etdiyi qəzəl də yadıma düşdü ki, ilk beyti belədir:

*«Ey dərin şerləri can kimi şirin Şahin,*
*Dolduran ətr ilə söz zülfünü çin-çin Şahin».*
*(Бах: Təzkireyi-Şahin, Бакг, 2006, s.384)*

Qəzəlinə qəzəl yazdım Şahi qardaşımın:

*Gedirəm Şahi olan Ərdəbilə,*
*Elə bir dahi olan Ərdəbilə.*

*Neçə sultanı olan Heydərtək,*
*Neçə padşahı olan Ərdəbilə.*

*Gedirəm şeyxi olan bir yurda,*
*İsmayıl şahı olan Ərdəbilə.*

*Gedirəm Şahi kimi, ey Şahin,*
*Şe'r Allahı olan Ərdəbilə.*

Amma, bəri başdan deyim ki, nə Əsgər Şahi, nə də Adil Movlayi ilə görüş imkanı bizə müyəssər olmadı. Vaxt məhdudluğu...

Ərdəbilə çatdıq. «Mühəqqəq Ərdəbili Universiteti» və bu özəl və gözəl

elm ocağının qonaq evi.

Bir qədər dincəldik. Sonra gəzinti. Şəhərin içindən «Balıqlı çay» adlanan dərya axır. Gözümüz «Yeddigöz körpüsü»nə də sataşdı.

Əhalisinin sayı milyon nəfərədək olan Ərdəbil yaraşıqlı və tarixi bir şəhərdir. İqlimi kontinentaldır (gündüz isti, axşam soyuq).

«Şeyx səfi büqəsi»nə gəldik. Büqə məqbərə, məzar kompleksi deməkdir. Burada bir neçə il bundan əvvəl başlayan təmir işləri qurtarmaq üzrədir.

Kompleksin geniş həyətindəyik. Budur, içərisində Marta (Şah İsmayılın anası Aləmşah bəyim, ağqoyunlu hökmdarı Uzun Həsənin Trabzon imperatoru Kalo İoannes Komnenin əzizi olan Despina xatundan doğulan qızı) uyuyan qəbir. Bir qədər məhzun oldum. Bu xristian təriqətli qadın müsəlman olmadığından büqənin içərisində basdırılmamışdı...

Büqənin giriş qapısı. Ayaqqabılarımızı ayaqqabıçıya təhvil verdikdən sonra içəriyə ayaq basdıq. Baş tərəfdə yaşıl bir bayraq. Deyilənə görə məşhur Çaldıran döyüşündə (1514, 23 avqust) bu bayraq Şah İsmayılın əlində imiş.

Yaşıl bayrağın solunda qızılbaş ələmi. İrəli gedib baş hücrəyə daxil olduq. Şeyx Səfiəddin İshaq (1252-1334) və yaxınları Seyid Sədrəddin Musa (1305-1392), Sultan şeyx İbrahim (1447-ci ildə vəfat etmişdir) və başqaları artıq neçə əsrdir ki, burada uyumaqdadırlar. Böyük bir nəslin fəqət bir neçə nümayəndəsi. Tarixçi alim Oqtay Əfəndiyevə görə Şah İsmayılın şəcərəsi Zərrinkülahdan (Qızılpapaq, Qızılbörk) başlayır. Firuzşah Zərrinkülah. Onun qəbri burada deyil. Elə səfəvilərin çoxusu ayrı-ayrı yerlərdə yatmaqdadırlar. Haralardadır Şeyx Səfiəddinin oğlanları Məhyəddin, Əlaəddin, Şərəfəddin? Bəs Şeyx Sədrəddinin övladları Xacə Əli (1427-ci ildə ölüb), Səlahəddin, Cəmaləddin hanı? Xacə Əlidən törəyən Cəfər, Əbdürrəhman harada? Burada uyuyan Şeyx İbrahimin (1447-ci ildə vəfat edib) uşaqları Əbu Səid, Əhməd, Bayazid, Xacəcan Mirzə, İbrahim Xacəgi, Şeyx Cüneyd (1460-cı ildə öldürülmüşdür) niyə burada yoxdurlar (Cüneydin məzarı Qusar rayonunun Həzrə kəndindədir). Bəs Cüneydoğlu Heydər (1460-1488) hanı? Hanı Heydəroğlu Sultan Əli? Hanı Sultan Əlinin qardaşı İbrahim? Şah İsmayıl isə elə buradadır. Baş hücrənin solundakı kiçik bir hücrədə.

Hücrəyə daxil olduq. Hacı Ələmdar və Hacı qurban fatihə oxudular, hamımız salavat çevirdik.

Bəli, böyük-böyük ölkələr fəth edən, əzəmətli cəngavərlərlə döyüşən

böyük bir fateh kiçik bir hücrədə yatır. Necə sığışmısan bu darısqallığa, ey şah, ey mürşidi-kamil?..

Çinixana. Mən bu barədə əvvəlki səfərnamələrimdə yazmışam. Çinixananm çinilərsiz qalmış divarlarına göz gəzdirirəm. Vaxtilə Şah Təhmasibə (1514-1576) Çin imperatoru tərəfindən hədiyyə göndərilən 1221 ədəd çini qabın, demək olar ki, hamısının yeri boş qalıb. Çar generalı Paskeviç 1828-ci ildə (Türkmənçay sülh müqaviləsinin imzalanmasından sonra) indi boş qalan çinixananın çinilərini talan edərək Ermitaj Muzeyini çinilərlə doldurub. Minlərlə kitab da daşıyıb o general. Haramları olsun. O, hətta Şah İsmayılın sinə daşını da götürüb aparmaq istəyirmiş. Ərdəbillilər qoymayıblar, qiyam ediblər generalın bu hərəkətinə qarşı və həmin qiymətli qara daşı - üstü qızıl və gümüşlə işlənmiş hər tərəfi Quran ayələri yazılmış həmin daşı qoruyublar. Onlar o tarixi daşı qorumaqla böyük bir şahı, tarixin nəhəng bir simasını qoruyublar.

Büqədən çıxdıq. Çıxış qapısının sol tərəfindəki köşkdə minlərlə şam gördüm. Adamlar növbəyə düzülüb niyyət edir, şam yandırırdılar. Bəlkə zərdüştilikdən qalmadır bu etiqad? Bilmirəm...

Yenə maşındayıq. Ərdəbili geridə qoyub yenidən Təbriz istiqamətinə gedirik. Sürücü Pərvizlə Şahin Mustafayevin söhbəti:

- Ərdəbildə Şeyx Səfiəddin, Şah İsmayıl adına küçələr varmı? Şah İsmayıla heykəl qoyublarmı?

- Xeyr.

- Niyə? Şah İsmayıl axı İranı, Ərdəbili bütün dünyaya tanıtdı. Amma Bakıda Şah İsmayıl küçəsi, metrosu var! Bakıda heykəli də var onun. Biz onun ehtiramını saxlayırıq.

- Biz isə onun məqbərəsini və özünü saxlayırıq.

Beləcə söhbətləşə-söhbətləşə gəlib çatdıq Səreyn şəhərinə. Baş xiyaban. Girəcəkdə bir neçə metr uzunluğunda olan və rəngarəng məmulatlardan düzəldilmiş iri bir tovuz quşu.

İrəliləyirik. Çoxlu otellər. Otellərin tarixi mahiyyət daşıyan adları: «Otel Atropaten», «Otel Təxti-Cəmşid» və s.

Səreynlə sağollaşıb Ərdəbilə qayıtdıq, yatdıq.

16 iyun 2007. Gecə öz çadrasını yığışdırmamış oyandım. Şah İsmayıl

oyatdı məni yuxudan. «Dur» dedi. «Şair şairə şe’r yazar» dedi.
Durdum və şaha şe’r yazdım (şair İsmayıla da yazaram inşallah, hərçənd neçə il bundan qabaq onun şairliyi, şahlığı və sərkərdəliyi barədə poema yazıb «Əllərini ver mənə» kitabıma daxil etmişəm). Şe’rim Səfəvi dövlətinin əsasını qoyan bir şeyxə, bir şaha, bir mürşidi-kamilə (kamil təriqət başçısına) xitabən yazıldı:

Mürşidi-kamil

*«Şah İsmayıl» kimi bir ad sahibi*
*Mürşidi-kamil.*
*Təriqət sahibi, irşad sahibi,*
*Mürşidi-kamil,*
*Nə oldu sənə?*

*Ulu əcdadların yatır yanaşı,*
*Ayrı bir hücrəsə sənin «diyar»ın.*
*Sinəmi ağrıtdı sinənin daşı,*
*Gözümü qaraltdı qara məzarın,*
*Mürşidi-kamil,*
*Nə oldu sənə?*

*Şeyx idin, adına «şah» deyə-deyə,*
*Sən ki, sığışmırdın yerlərə, göyə,*
*Бəs necə sığışdın kiçik hücrənə,*
*Nə oldu sənə,*
*Mürşidi-kamil?*

*Səni bundan sonra düşündüyüm dəm,*
*Ərdəbil mülkünün ey iftixarı,*
*Б1Г daha «nə oldu» deməyəcəyəm,*
*Elə şah olub ki, yoxdur məzarı,*
*Mürşidi-kamil,*
*Mürşidi-kamil!*

Sübh tezdən Ərdəbili tərk etdik. Elə maşındaca «Mürşidi-kamil» şe'rimi həmsəfərlərimə oxudum.

Yolda bal aldıq. Bal kimi şirin XVII İran səfərnaməm bitmək üzrədir.

Budur, Astaradayıq (İran). Gömrükxana.

Yenə Astaradayıq (Azərbaycan). Gömrükxana.

Maşınımız Bakı istiqaməti ilə irəliləyir. Maşında məndən və Şahindən başqa üçüncü sərnişin də vardı. Polyak idi. Cazmen idi. Bakıda keçirilən «Caz festivalı»ndan İrana yollanmış, iki gün Şiraz və İsfahanda olmuşdu. İndisə Bakıya qayıdırdı. Azərbaycanı çox xoşlamışdı. Azərbaycanı kim xoşlamır ki?

Bakı-Urmiyə-Bakı, 11-16 iyun, 2007

## On yeddinci Səfərnamə Şe'rləri

*I*

*QƏZƏL*

*Mən gedirəm İrana,*
*Urmiyədir, Urmiyə!*
*Qərbi Azərbaycana -*
*Urmiyədir, Urmiyə!*

*Varlığım var edən,*
*Yar ilə ilqar edən,*
*Düşmənini zar edən*
*Urmiyədir, Urmiyə.*

*Aşiqə heyran yeri,*
*Can yeri, canan yeri,*
*Əhd ilə peyman yeri*
*Urmiyədir, Urmiyə.*

*Asiyə üsyan yeri,*
*Yağıya meydan yeri,*
*Din yeri, iman yeri,*
*Urmiyədir, Urmiyə.*

*Бŭ qaladır hər yeri,*
*Hər küçə səngər yeri,*
*Urmiyə əskər yeri,*
*Urmiyədir, Urmiyə.*

*Fəxrü şərəf-şan yeri,*
*Ka/ərə tüğyan yeri,*
*Urmiyədə qan yeri,*
*Urmiyədir, Urmiyə.*

*Yerdəki cənnət yeri,*
*Şan yeri, şöhrət yeri,*
*Namusü qeyrət yeri*
*Urmiyədir, Urmiyə.*

*Urmiyə ər yurdudur,*
*Urmiyə zər yurdudur,*
*Urməvilər yurdudur,*
*Urmiyədir, Urmiyə.*

*Sevgisi alqışlanır,*
*Eşq oxuna tuşlanır,*
*Şahinə bax, xoşlanır...*
*Urmiyədir, Urmiyə!*

*11.06.2007*
*Бакг*

*II*
*QƏZƏL*

*Vaxt ötdü və Şahin, yenə seyranə tələsdim,*
*Vaxtın ətəyindən tutub İranə tələsdim.*

*Mən Ərdəbili, Təbrizi, Urmiyyəni görmək*
*Şövqüylə iki Äzəribaycanə tələsdim.*

*Əlbəttə, vüsal qədrini artırmada hicran,*
*Üç günlüyə, beş günlüyə hicranə tələsdim.*

*Göz yaşı göz ümmanını hərçənd eləyir tərk,*
*Bir qətrə kimi mən isə ümmanə tələsdim.*

*Görmək dilədim Şirini Fərhad misalı,*
*Leyla yanına gör necə divanə tələsdim.*

*Şəm'in alovundan ki alovlanmada cismim,*
*Şəm' atəşinə yanmağa, pərvanə, tələsdim.*

*Mən şövq ilə, Şahin, yenə şahin kimi uçdum,*
*Gülşəndən olub ayrı, gülüsanə tələsdim.*

*12.06.2006*
*Bakı-Ästara yolu,*
*qatar, sübh çağı*

*III*

*Saxlayıb məni*

*Onunla Urmiyənin məşhur «Mirvari» otelində görüşdük. Şəhərin «Bənd» adlanan istirahət guşəsində şərəfimizə təşkil olunmuş ziyafət zamanı d-r Cəlil Təclil mənə dedi ki, saç-saqqalın büsbütün ağarıbsa da, maşallah, qıvraqsan. Bu şe'ri yazdım:*

*Qəlbimi incitməyən Ellər*
*saxlayıb məni.*
*Qarğışımı etməyən Dillər*
*saxlayıb məni.*

*Dərvişəm - Əfqanıstan,*
*Türkiyə, İraq, İran...*
*Ayaqlarımdan tutan*
*Əllər saxlayıb məni.*

*Divanə şairəm mən,*
*Məcnuna «gəl» söyləyən,*
*Mənəsə «gəlmə» deyən*
*Çöllər saxlayıb məni.*

*Qürbət yükü daşıdım,*
*Həsrət yükü daşıdım...*
*Bu qədər ki, yaşadım,*
*İllər saxlayıb məni.*

*Ey verən adı mənə,*
*Bu qol-qanadı mənə,*
*Bülbül deyin Şahinə,*
*Güllər saxlayıb məni.*

*12.06.2007*
*Urmiyə*

*IV*
*QƏZƏL*

*Məni Urmiyyəyə Urmiyyəyə rəğbət çəkdi,*
*Qardaşın qardaşa göndərdiyi dəvət çəkdi.*

*Bağibanlar neçə müddət barışa bilmədilər,*
*Bağlər öylə səbəbdən neçə zillət çəkdi.*

*Amma, mümkünmü vüsal həsrəti xəlvət qalsın,*
*Xoş vüsal həsrətini hər biri xəlvət çəkdi.*

*Yada Urmiyyədə heyrətli Füzulim düşdü,*
*«Heyrət, ey büt!..» deyə şair niyə heyrət çəkdi?*

*Sonu «Şura» deyilən səltənətin görsəndi,*
*Neçə il gözlərimiz Təbrizə həsrət çəkdi.*

*Uzun illər boyu ülfətli olub ellərimiz,*
*Bizi İran ilə ünsiyyətə ülfət çəkdi.*

*Ayrılıq tufanı rədd olmalıdır, ey Şahin,*
*Üzərindən qələmim ayrılığın xətt çəkdi.*



*13.06.2007*
*Urmiyə*

*V*
*QƏZƏL*

*Yarəb, qocalıb-getdim, gözlərdə ziya yoxdur,*
*Dərd ilə bəla vardır, zövq ilə səfa yoxdur.*

*Əlbəttə, mənim fikrim yalnız mənə məxsusdur,*
*Əsla deməərəm mən ki, mehr ilə vəfa yoxdur.*

*Dünyadakı ağ gündən çoxdur qara gün məncə,*
*Zənn eyləyirəm öylə fikrimdə xəta yoxdur.*

*Tez-tez qalıram heyran, çox vaxt oluram mə'yus,*
*Aləmdə qəra çoxdur, zülfümdə qəra yoxdur.*

*Qəlbim ki pərişandır yoxluq səsi var onda,*
*Əvvəlki səda yoxdur, əvvəlki nəva yoxdur.*

*Dördüncü olan sayda «Divan» yarımçıqdır,*
*İlham pərisi gəlmir, neyçün, əcəba, yoxdur?*

*Xaqani də yazmışdır, yazmış o Füzulim də,*
*Şahin də qəzəl yazdı, Şahində həya yoxdur.*

*14.06.2007*
*Urmiyə*

*VI*
*QİTƏ*

*Bitdi bu günlük gözümün mürgüsü,*
*Başladı mənlə ürəyin söhbəti.*

*Bir neçə gündür Bakıdan ayrıyam,*
*Baş-başayam, mən - fələyin söhbəti:*

*«Orda da var idi gülüstanımız,*
*Burda da var gül-çiçəyin söhbəti».*

*Urmiyəli dostları görməkdəyəm,*
*Arzuya təndir diləyin söhbəti.*

*Amma, düşüb xatirə sirdaşlarım,*
*Gəldi-yetişdi gileyin söhbəti.*

*Çəkmədə yurdum məni cənnət kimi,*
*Sanki yetişdi mələyin söhbəti.*

*Gendə qalıbdır Xəzərin xəzrisi,*
*Hardadır, ayə, küləyin söhbəti?*

*13.06.2007*
*Urmiyə*

*VII*
*Qanad istəyi*

*Həyatı yaşayırıq*
*qolsuz-qanadsız kimi.*
*Qanad anbarlarında*
*qanad tükənmişdimi*
*İlahi?*
*Milçəyə qanad verdin,*
*Sərçəyə qanad verdin,*
*Qartala qanad verdin,*
*Tərlana qanad verdin,*
*Bizə niyə vermədin,*
*İlahi?*
*Cüllütə qanad verdin...*
*Heç olası işdimi?*
*Qanad anbarlarında*
*qanad tükənmişdimi,*
*İlahi?*
*Hey baxıram, baxıram*
*şahinə, sara sarı,*
*O qoşa qanadları*
*Bizə niyə vermədin,*
*İlahi?*


*15.06.2007*
*Urmiyə*

*VIII*
*Ağa Məhəmməd şah Qacar*

*Taleyə bax, işə bax,*
*Fərəhi qübar oldu,*
*axtalandı bir uşaq*
*axta - hökmüdar oldu.*

*İddiasız şairəm,*
*Şahini adi sayın.*
*Şah olmaq istəmirəm,*
*Məni axtalamayın.*

*15.06.2007 Urmiyə,*
*iskələyə (limana) gedən yol*

*IX*
*Bayatı*

*Səhəndin qarlı başı,*
*Qarlı, vüqarlı başı,*
*Şahininsə Səhənddən*
*Var intizarlı başı.*

*15.06.2007 Təbriz-*
*Sərab yolu*

**X**
*Bayatı*

*Savalandır,*
*Zirvəsi övc alandır.*
*İlhamım, yetiş dada*
*Şahini havalandır.*

*15.06.2007*
*Sərab-Ərdəbil yolu*

*XI*
*QƏZƏL*

*Gedirəm Şahi[30] olan Ərdəbilə,*
*Elə bir dahi olan Ərdəbilə.*

*Neçə sultanı olan Heydərtək[31],*
*Neçə padşahı olan Ərdəbilə.*

*Gedirəm şeyxi olan bir yurda,*
*İsmayıl şahı olan Ərdəbilə.*

*Gedirəm Seyyid Əli Əkbərtək[32]*
*Bir xeyrxahı olan Ərdəbilə.*

*Gedirəm Adili-Mövlayi[33] kimi*
*Neçə xoşxahı olan Ərdəbilə.*

*Gedirəm Şahi kimi, ey şahin,*
*Şe'r Allahı olan Ərdəbilə.*

*15.06.2007*
*Səreyn*

*XII*
*Mürşidi-kamil*

*«Şah İsmayıl» kimi bir ad sahibi*
*Mürşidi-kamil.*
*Təriqət sahibi, irşad sahibi,*
*Mürşidi-kamil,*

---

30 *Ərdəbilli şair dostum Əsgər Şahi*
31 *Şah İsmayıl Səfəvinin atası Şeyx Heydər*
32 *Ocaqnejad ağa*
33 *Ərdəbilli şair və filosof dostum*

*Nə oldu sənə?*

*Ulu əcdadların yatır yanaşı,*
*Ayrı bir hücrəsə sənin «diyar»ın.*
*Sinəmi ağrıtdı sinənin daşı,*
*Gözümü qaraltdı qara məzarın,*
*Mürşidi-kamil,*
*Nə oldu sənə?*

*Şeyx idin, adına «şah» deyə-deyə,*
*Sən ki, sığışmırdın yerlərə, göyə,*
*Bəs necə sığışdın kiçik hücrənə,*
*Nə oldu sənə,*
*Mürşidi-kamil?*

*Şə'ninə pərəstiş eləyərdilər,*
*Adına «ən böyük şah» deyərdilər.*
*БцтцДи bu fələk sənin əyninə*
*Murad ülgüsüylə böyüklük donu,*
*İtirdin onu,*
*Nə oldu sənə,*
*Mürşidi-kamil?*
*Ey İraq sahibi, İran sahibi,*
*Ulu Azərbaycan doğma vətənin. Ey*
*şövkət sahibi, divan sahibi, Kitablar*
*yazılır şə'ninə sənin, Nə oldu sənə,*
*Mürşidi-kamil?*

*Səni bundan sonra düşündüyüm dəm,*
*Ərdəbil mülkünün ey iftixarı,*
*Bir daha «nə oldu» deməyəcəyəm,*
*Elə şah olub ki, yoxdur məzarı,*
*Mürşidi-kamil,*
*Mürşidi-kamil!*



# ON SƏKKİZİNCİ SƏFƏRNAMƏ

## *«ŞAHİN TƏZƏDƏNŞÖ VQ İLƏ İRANƏ TƏLƏSDİ»*

30 aprel 2008

İran! Bir neçə min illik tarixi və 2500 il dövlətçilik ənənəsi olan qədim bir məmləkət. Bəşəriyyətə minlərlə şair, alim, rəssam, bəstəkar, dövlət xadimi və başqa ölməz şəxsiyyətlər bəxş edən bir diyar, ölkəmizə qonşu və dost cümhuriyyət.

Mən hələ orta məktəbin aşağı siniflərində oxuyarkən Nizami Gəncəvinin əsərlərini mütaliə edir və «Tərcümə edəni Səməd Vurğun, Süleyman Rüstəm, Rəsul Rza...» sözlərini oxuyanda bərk təəccüblənirdim. Nə üçün tərcümə edəni? Nə üçün tərcümə? Niyə fars dili? Sonralar çox mətləb aydın oldu. Bildim ki, Gəncəli Nizami öz dövrünün ənənəvi yazı tərzinə ciddi riayət edərək «Xəmsə»ni və başqa şe'rlərini fars dilində qələmə almışdır. Fars dili! Təkcə İranda deyil, bir sıra ölkələrdə, o cümlədən Azərbaycanda da əsrlər boyu müraciət edilən fars dili. Şe'r dili.

Fars dilini öyrənmək istəyinə düşdüm. Bu istək məni Universitetə istiqamətləndirdi. İstək! Nizamini fars dilində oxumaq istəyi!

İllər ötdü. Beş il keçdi. Şərqşünaslıq fakültəsinin «Fars dili» şöbəsinin məzunu oldum. Uzun illər Əfqanıstanda mütərcim işlədim. Fars və rus dilləri mütərcimi. Mən həmin ölkədə olarkən «Əfqanıstan ədəbiyyatı» kitabına göz yetirdim. Kitab Nizami Gəncəvinin tərcümeyi- halı və şe'rlərindən seçmələr ilə başlayırdı. Əfqanıstan ədəbiyyatı və Nizami Gəncəvi. Sonralar bir tacik tərcüməçi həmkarım ilə söhbət edərkən, o, mənə Azərbaycanda bir tacik şairinin dəfn olunduğunu yanıqlı-yanıqlı bildirdi: Nizami gəncəvi! Mən tacikin sözündən təəccüblənmədim. Bildim ki, mənim Nizamim, mənim Gəncəmin Nizamisi təkcə Azərbaycanımın deyil, bütün dünyanın şairidir. Əgər Nizami həqiqətən kiçik şair olsaydı, kimdi ona yiyə duran, kimdi onu

«özününküləşdirən»? Əgər Nizami balaca bir şaircığaz olsaydı, kimdi haray-həşir salaraq onun əfqan, tacik, fars şairi olduğunu iddia edən? Sevindim ki, Nizami böyük, həddən böyük şairdir. Fərəhləndim ki, Gəncəli Nizami dünya şairidir, cahan şairidir. Dahi şairlərin müqabilində məkan faktoru nədir ki?..

Bəli, gözəl fars dilinə olan marağım məni Rusiyaya, Tacikistana, İrana, Türkiyəyə, İraqa, Əfqanıstana, Türkmənistana, Özbəkistana, Gürcüstana, Dağıstana apardı. Mən bu ölkələrdə fars mənbələri əsasında hazırladığım məruzələrlə çıxışlar etdim, onlarla Beynəlxalq Elmi Konfransda iştirak etdim. Bütün bu uğurlar məhz fars dilini öyrənməyimin sayəsində oldu.

İndi isə məni yenə qarşıda bir səfər gözləyir - dövlət dilinin fars dili olduğu bir ölkəyə, İrana səfər. Ey mənim həmişə işlək qələmim, hazırlaş səfərnamə yazmağa. İran, on səkkizinci səfər və səfərnamə. On səkkizinci səfərnamə. Sabah başlayacağam onu yazmağa. Bu gün isə hələlik bir qəzəl:

*Ey möcüzələr yurdu, ey İran, gəlirəm mən,*
*Ecazım seyr etməyə heyran gəlirəm mən.*

*On səkkiz olubdur bu səfər İrana sayca,*
*Gəlmiş bu «Səfərnamə»yə imkan, gəlirəm mən.*

*Gülzarını gördüm neçə yol, bağını gəzdim,*
*Gülzarını göstər enə, bağban, gəlirəm mən.*

*Şərq elləri tarix boyu mehmanı sevibdir,*
*Mehmanpərəstsən, sənə mehman gəlirəm mən.*

Bəli, mən sabah İrana gedirəm. Təxminən bir ay bundan qabaq Bakı Dövlət Universiteti Şərqşünaslıq fakültəsi, Fars dili kafedrasının dosenti Tofiq Cahangirov (oxucular onu Tofiq Cahangir və Tofiq Cahangiri kimi də tanıyırlar) mənə dedi ki, may ayında İranda növbəti Beynəlxalq Kitab Sərgisi təşkil olunacaqdır. Kitaba həddsiz marağı olan bir adam kimi çox sevindim. Ürəyimdən keçdi ki, kaş mən də gedəydim.

Ataların «niyyətin hara, mənzilin ora» məsəli çin çıxdı. İran İslam Cümhuriyyətinin Azərbaycandakı Səfirliyinin Mədəniyyət Mərkəzinin sədri, şair və irfan əhli cənab Seyyid Əli Əkbər Ocaqnejad bu niyyəti gerçəkləşdirdi.

Sabah gün göyün ortasında olan vaxt mən Tehranda olaram inşallah.

1 may 2008. Heydər Əliyev adına Binə təyyarə meydanındayıq. Olduqca küləkli bir hava. Arabir çiskinləyir. Bakı Dövlət Universiteti Şərqşünaslıq fakültəsinin dekanı, ərəbşünas tədqiqatçı, şair və nasir Elxan Əzizov, indicə adını çəkdiyim Tofiq Cahangirov və mən uçuşa müntəzirik. İranın «İran AİR» hava yoluna məxsus təyyarəyə əyləşdik. Bu dəmir quşun ayaqları yerdən üzüldü. Göydəyik. Bir saat keçdi. Tehrandayıq. İmam Xomeyni adına Tehran aeroportu. Əvvəllər «Mehrabad» təyyarə meydanında yerə enərdik. Bu isə yeni təyyarə meydanıdır. Müasir üslubda inşa olunmuş və bir neçə hektar ərazidə inşa olunmuş böyük bir tikili!

Təyyarədən düşüb təyyarə meydanında sərnişinlərə xidmət edən avtobusa mindik. İranlı bir tanışı Tofiqə dedi: «Bakıda soyuqdan donduq, indisə istidən bişirik». Hava həqiqətən çox isti idi. Bizi isti də qarşıladılar. Bir kişi əlini verib özünü təqdim etdi: Moqtəderi - XXI Beynəlxalq Kitab Sərgisinin icraçı direktoru.

Cənab Moqtəderi Azərbaycandan Tehrana gəlməli olan dördüncü adamı bizdən soruşdu: İsmayıl Allahverdiyev. Tanımadıq. Bakı elə böyükdür ki...

Cənab Moqtəderi yoldan gələn bizləri yola saldı. «Əlborz» otelinə. Tofiq otelin adını eşidib sevindi. Vaxtı ilə onların evi bu otelin yaxınlığındaymış (Tofiq əlli ilə yaxındır ki, Bakıdadır).

Qum-Tehran magistral avtobus yolu. Tehrana 40 km. var. Yol boyunca məlum şüar: «Əssəlamu-əleyk, ya Ruhullah», yəni «Ey Ruhullah, salam-əleyküm» (Ruhullah - imam Xomeyninin adıdır).

Maşınımız şütüyür. Kəhrizək və Vavan adlı yaşayış məskənlərini keçdik. Yolumuza davam edirik. «Behişte-Zəhra». İmamın dəfn olunduğu böyük bir məscid kompleksi. Mən əvvəlki səfərnamələrimdə bu yer haqqında müfəssəl məlumat vermişəm. Kompleksdəki inşaat işləri hələ də davam edir (19 ildir). Dörd minarə hazırdırsa da, ucalmaqda olan yeni bir gümbəz nəzərimizi cəlb etdi.

Qum-Tehran yolu. Toliqin yadına bu yolun 50 il bundan qabaqkı inşası düşdü. O zaman yolun kənarında bir neft quyusu güclü bir fantan vurubmuş. Tezliklə ətraf torpaqları qalın neft layları örtür. Bir neçə ay sonra quyunu çox çətinliklə bağlayırlarsa da neft başlayır başqa yerdən fantan vurmağa. Tofiqin

sözünə görə, hal-hazırda üstü ilə hərəkət etdiyimiz bu yolun alt təbəqəsində həmin neft quyularının kilometrlərlə qətranı vardır.

Qum-Tehran yolu. Yolumuza davam edirik. Yolüstü iri lövhə- lərdəki yazılardan məlum oldu ki, bu il İranda «Yeniləşmə və çiçəklənmə ili» («Sale-novavəri və şokufayi») elan olunmuşdur.

Şəhərə girdik. Yollar boyunca maşın karvanları və uzun-uzadı tıxaclar. Nəhayət «Əlborz» oteli. 203-cü otaq biz - üç nəfərindir. Azacıq istirahətdən sonra otelin birinci mərtəbəsindəki restorana də’vət olunduq. Nizami gəncəvi adına Ədəbiyyat Muzeyinin direktor müavini, filologiya elmləri namizədi Mübariz Məmmədli, həmin muzeyin əməkdaşı, filologiya elmləri doktoru Kamil Allahyarov və təyyarə meydanında axtardığımız İsmayıl Allahverdiyev adlı bir hacımız ilə - «Nurlar» nəşriyyatının naşiri ilə görüşdük. Naşir sən demə elə bizim təyyarədə gəlibmiş, amma təyyarədən yerə enən kimi oradakı namaz-xanada namaz qılmağa getdiyindən (namazın qəbul olsun, hacı!) onunla tanış olmaq imkanını əldən vermişik. Mömün adamdır və bizim əsl mömünlərə ehtiramımız vardır. Öyrəndik ki, Kamil ilə Mübariz isə Bakı- Tehran quru yolu ilə gəlib yetişmişlər.

Axşam saat 18-də nümayişgaha (sərgiyə) getdik. Saysız-hesabsız kitab köşklərini gəzdik, kitablarına baxdıq, meyvə şirələrindən içdik. Üç saatdan sonra artıq 203 saylı otağımızdaydıq.

Əvvəlki səfərnamələrimdən məlum olduğu kimi, səfərnamə və onun şe’rlərini yazmaq məndə vərdiş halı alıb. Bu iş mənim bir növ şakərimdir. Gecə bu misraları dəftərimə köçürdüm:

*Leyli, qınama Qeysi ki, «divanə tələsdi»...*
*Vəsl arzusuna düşdü və hicranə tələsdi.*
*Gündüz-gecə yandırmadadır cismini odda,*
*Yarəb, nə üçün yanmağa pərvanə tələsdi?*

*Şövq olmasa hərgah nə hasil olacaq ki?*
*Un şövqü ilə danə dəyirmanə tələsdi...*

*Urmiyyə yadımdan çıxa bilmir neçə vaxtdır,*
*Könlüm Əhərə, Təbrizə, Zəncanə tələsdi.*

*Şirazə yolum düşmədi İrandə heyfa,*

*Amma, neçə yol can quşu Tehranə tələsdi.*

*Görmək diləyir dostu olan ölkəni, əhsən,*
*Şahin təzədən şövq ilə İranə tələsdi.*

2 may 2008. Elxanla Tofiq nümayişgaha getdilər. Mənsə yazılarımla məşğul olmağa başladım, arabir də qəzetlərə göz yetirdim. İştirakçısı olduğumuz XX1 Beynəlxalq Kitab Sərgisi barədəki yazıları oxudum. Axı biz sərginin açılışında iştirak edə bilməmişdik. İndisə, bu möhtəşəm sərgi və onun təntənəli açılışı barədə Tehran qəzetləri mənə bol məlumat verdi. Sərgi biz göydə olduğumuz vaxt işini davam etdirməkdəydi. Açılış mərasimində İran Prezidentinin birinci müavini, Mədəniyyət və İslam İrşadı naziri, Mətbuat naziri, Tehran Şəhər Şurasının sədri və başqa görkəmli şəxslər iştirak etmişdilər. Prezidentin birinci müavini d-r Pərviz Davudi iştirakçıları salamlayaraq demişdi: «Ölkənin fikir və mədəni atmosferi (fəzası - Ş.F.) Kitab Sərgisinin sayəsində işıqlanmışdır və inşallah bu sərgi ölkənin bir illik enerjisini və fikri aclığını təmin edəcəkdir».

Mədəniyyət və İslam İrşadı naziri Məhəmmədhüseyn Səffar Herən- dinin çıxışından: «Kitab önündə diz çökməli və onun parlaq nurundan bəhrələnməliyik».

2008-ci ilin XX1 Beynəlxalq Kitab Sərgisinin rəisi Mətbuat və İslam İrşadı nazirinin müavini d-r Möhsün Pərvizdir. O, keçən il İranda 54 min adda kitabın çap olunduğunu və ölkədə 8296 naşirin fəaliyyət göstərdiyini bildirdi. Qəzetdə oxuyuram: «İran keçən il 12 xarici ölkənin kitab sərgilərində iştirak etmişdir. Bu il İranda keçirilən sərgiyə isə 77 ölkədən 770 naşir təşrif gətirmişdir».

Qeyd etməliyəm ki, Tehran Kitab sərgisi yerləşən ərazinin sahəsi 112 min kvadrat metrdir və orada 2000 kitab pavilyonu (köşkü) vardır.

Mən son günlərdə İranda çıxan və sərgi barədə məlumat verən bəzi qəzetlərin mütaliəsi ilə məşğul olmaqdaydım ki, telefon zəng çaldı. Danışan Azərbaycan Respublikasının İran İslam Cümhuriyyətindəki səfirliyinin işçisi Tale Zöhrabov idi. O, səfirimiz Abbasəli Həsənovun adından bizi günorta vaxtı səfirliyə də’vət etdi. Nümayişgaha gedənlər üç-dörd saatdan sonra qayıtdılar. Onların bu qədər ləngimələrinin səbəbi bu günün cümə günü olmasıdır. Bu gün millət cümə namazına yığışmış və yollarda izdihamın çoxluğundan maşınların

hərəkətinə məhdudiyyət qoyulmuşdu. Bu gün cənab Abbasəli Həsənovla görüşümüz hələlik baş tutmadı, amma fürsəti fövt etmədik və də’vət olunduğumuz «Bağe- Cəmşidiyyə» («Cəmşidiyyə bağı») istirahət zonasına getdik. Həştərxandan gəlmiş mehmanlardan Olqa Poşmanova ilə tanış oldum. 25 yaşlı bu yaraşıqlı rus qadını gənc olmasına baxmayaraq artıq elmlər namizədidir. O, məni Həştərxan Dövlət Universitetinin müvafiq fakültəsində bir-iki aylıq mühazirə oxumağa də’vət etdi, «inşallah» dedim...

«Bağe-Cəmşidiyyə»nin təsvirini əvvəlki səfərnamələrimdə vermişəm. Amma, qeyd etməliyəm ki, orada yaxşı dincəldik.

Biz otelə qayıdandan az sonra səfirimiz Abbasəli Həsənov yanımıza təşrif gətirdi, xeyli söhbətləşdik, səfir gecə yarısından çox keçmiş bizi tərk etdi.

Buna baxmayaraq yuxumuz sanki ərşə çəkilmişdi. Tofiq Cahangir bir gündən sonra keçiriləcək elmi konfransda çıxış etmək üçün öz məruzəsinin mətnini yazır, Elxan Əzizli isə neçə gündən bəri üzərində işini davam etdirdiyi «Mələknamə» adlı poemasının qafiyələrini düzəltməklə məşğuldu. Mənsə qəzəl yazırdım. Axı bu günün şe’rini hələ yaza bilməmişdim. Dəftərimi açıb, qələmimi götürüb aləmi qatıb- qarışdırdım bir-birinə. Bu qəzəlimdə şe’rlərimi «divan»a çevirməyimdən, tibb elmindən, bəzi işlərdə naşılığımdan, dava-dərmandan, canandan və candan, dostdan və düşməndən, yad əllərdə qalan torpaqlarımdan, işğalçılardan, bu yaşımda döyüşə can atmağımdan, pis günlərə qalan
Əfqanıstandan və bu münasibətlə əfqan etdiyimdən yazdım, İstanbula, Tehrana, Bağdada münasibətimi bildirdim və belə bir şe’r alındı:

*Meylimə imkan eləyənlərdənəm,*
*Şerimi «Divan» eləyənlərdənəm.*

*Бilməyirəm elmini tibbin, fəqət*
*Şe’r ilə dərman eləyənlərdənəm.*

*Canana mən can nədir verməyim?*
*Canımı qurban eləyənlərdənəm.*

*Dosta nəvaziş eləyib bəs qədər,*
*Dostluğu elan eləyənlərdənəm.*

*Torpağıma asi olub qonşular,*
*Asiyə üsyan eləyənlərdənəm.*

*Qan tökənin tökməliyəm qanını,*
*Qanə görə qan eləyənlərdənəm.*

*Cismimi, Şahin nədi ki, büsbütün*
*Azəribaycan eləyənlərdənəm.*

Mən bu günün qəzəlimi bitirdim, Elxan isə əsərinin ayrı-ayrı fəsilləri üzərində cidd-cəhdini səbrlə davam etdirirdi. O, poema yazırdı. Yuxusunda mələklə ünsiyyətdə olmuş ərəbşünas dostumuz Valeh Tağının həmin romantik ünsiyyəti barədə «Mələknamə» yazırdı... [34]

Təntənəli əklilqoyma mərasimi. Fəxri qarovul. İran İslam Cümhuriyyətinin dövlət himni. Asta addımlarla imamın uyuduğu aramgaha tərəf irəliləyirik. Önümüzdə zərihin (aramgahın) qızılı şəbəkələri parıldayır. Bu nəhəng hərəmin müdiri ağaye-Qacar sıranın önündədir. Mərasimin bu hissəsi bitdi. Geri qayıtmağa başlayırıq. Şəkil çəkdirdik. Sonra təzədən üzümüzü imamın uyuduğu aramgaha tərəf tutub sıraya düzüldük. Yenidən dövlət himni. Yenidən zərihə doğru addımlayırıq. Əklilqoyma mərasiminin təkrarı...

Avtobusumuz geriyə - Tehrana qayıdır. Ağae-moqtəderi bugünkü ziyarət mərasiminin iki dəfə təkrarlanmasının səbəbini açıqladı. Məlum oldu ki, birinci əklilqoyma zamanı buraya gecikmiş İsveçrə filmçəkənləri bu ənənəvi mərasimin yenidən icrasını xahiş etdiklərindən təntənəli ziyarət mərasimi ikinci dəfə keçirildi və əklillərimiz zəhirin önünü ikinci dəfə bəzədi.

Tehrana çatdıq. Otelə daxil olduq. Mənə iki qadın yaxınlaşdı. Onların biri rusca soruşdu:

- Siz məni tanıdınızmı?

Nəzərimi diqqətlə onun üzünə dikdim:

- Bağışlayın, tanımadım.

---

34may 2008. Bu gün Tehranda havanın hərarəti qalxıb. Bürkü olacaq şəhərdə. Qum şəhəri istiqamətinə yollanırıq. Avtobusumuz bizi «Behişte-Zəhra»ya - İmam Xomeyninin ziyarətinə aparır. Mən «hərəm» adlandırılan bu ziyarətgah haqqında əvvəlki səfərnamələrimdə geniş məlumat vermişəm.

- Mən Gülbaxıt V ahidovayam. Buraya ötən gəlişiniz vaxtı siz mənə Miruert Abusaitovaya çatdırmaqdan ötrü kitab vermişdiniz.

Xatırladım. Miruert (bizim dilimizdə yəni Mirvari - Ş.F.) xanım. Qazax qızı. Biz onunla Leninqradda görüşmüşdük. Keçən əsrin 70 -ci illəriydi. Hər ikimiz aspirant idik. İllər ötdü. Miruert Abusaitova indi Qazaxıstan Elmlər Akademiyası Şərqşünaslıq İnstitutunun direktorudur. Savadlı farsşünasdır. Gülbaxıtın (azərbaycanca - Gülbəxt - Ş.F.) bəxti gətirib ki, onunla işləyir.

İkinci xanım özünü Zibo kimi təqdim etdi. Məlum oldu ki, vaxtı ilə mən onun əri Abdulla Tahirovla Əfqanıstanın Məzari-Şərif şəhərində işləmişəm.

Üçüncü nəfər də mənə yaxınlaşdı. Həsən idi. Alma-ata Universitetində kafedra müdiri vəzifəsində işləyən azərbaycanlı Həsən. Onu da indi xatırladım. Qocalmışam. Özlərini təqdim etməyənləri tanımaqda çətinlik çəkirəm. Yadıma - «Çətinlik çəkirəm» rədifli qəzəlimin bir neçə
beyti düşdü:

*Çıxmıram dağə daha, dağda çətinlik çəkirəm,*
*Getmirəm ovlağa, ovlaqda çətinlik çəkirəm.*

*Yaş çoxalmış, gözümün nuri azalmış xeyli,*
*Görmürəm gülləri həm bağda, çətinlik çəkirəm.*

*Gənc ikən, mən ki, xəyalən uçar idim göydə,*
*İşə bax, indisə torpaqda çətinlik çəkirəm.*

*Xoş çağım vardı, çətinlik nə idi bilməzdim,*
*Etməyin şəkk, qocalan çağda çətinlik çəkirəm.*

*Eşq düşdükcə yada, yanmada cismim, billah,*
*Qovrulur sanki canım yağda, çətinlik çəkirəm.*

*Mən ki, çox rəmzi həyatda aça bildim, Şahin,*
*Eşq məfhumini açmaqda çətinlik çəkirəm.*

*(Бах: Divan, Бакı, 1996, s.113-114)*

Günortadan sonra yanımıza, özləri demişkən, «Bakının dostları» Kamyab və Necati gəldilər. Məni onlarla Bakıda Tofiq Cahangir tanış etmişdi. Yüksək

savadlı və mədəni insanlardır. Kamyab bizim Elmlər Akademiyasının dissertantıdır. Uzun illər Səudiyyə Ərəbistanında universitet ustadı olmuş bu şəxs bir neçə xarici dil bilir. Ağaye-Necati isə həm də şairdir. Otelimizdə onlarla xeyli söhbətləşdik.

Axşamüstü isə İrana keçən səfərlərimin birində tanıdığım ərəb alimi Səd Rüstəmlə görüşdük. O, Suriyadandır, Dəməşq şəhərindən gəlmişdir. Kamil Allahyarov ondan azərbaycanlı şair Seyid İmadəddin Nəsimini tanıyıb-tanımadığını soruşdu. Dedi ki, xatırlamır. Kamil ilə Səd Rüstəm arasında belə bir dialoq oldu:

- Dərisini soyublar.
- Niyə?
- Əqidəsinə görə.
- Əqidəyə görə dəri soymazlar.
- Sufi idi.
- Nə olsun ki?
- Hürufiçi idi?
- Nə olsun ki?
- «Ənəlhəqq» deyirdi.
- «Ənəlhəqq» deyənin dərisini soyarlar da.

Səd Rüstəmin son sözləri məni bərk qayğılandırdı. Otağıma qayıdıb «Ey Nəsimi» adlı bir şe’r yazdım:

*Şair görürəm ki,*
*dəri*
*üstündən*
*dəri geyinir,*
*Şah Abbas kimi*
*qumaşı*
*geyir, zəri*
*geyinir.*

Bu gün Əfqanıstandan nümayişgaha gəlmiş üç əfqanla tanış oldum. İkisi (Əhmədşah Rəfiq və Nəzər Məhəmməd Behruz) Kabul Universitetində, üçüncüsü isə (Məhəmməd Fazil Şərifi) Əfqanıstan Elmlər Akademiyasının

elmi orqanı olan «Xorasan» jurnalında işləyir. «Xorasan» jurnalı. Mən Əfqanıstanda olarkən bu jurnalda görkəmli əfqan şairi Mail Herəvi işlərdi (Allah rəhmət eləsin). Mən bir neçə elmi məqaləmi məhz həmin jurnalda dərc etdirmişdim. Əfqanıstan! Əfqanıstanı unuda bilmirəm. Bu ölkə ilə bağlı o qədər şirin-acı xatirələrim var ki...

Otağıma qayıtdım. Elxan poemasını bitirməkdəydi. Qapı döyüldü. Abbasəli Həsənov idi. Yenə xeyli söhbətləşdik. Elxan «Mələknamə»nin bəzi fəsillərini («Şərəfnamə» və s.) ona oxudu, şəkil çəkdirdik, çay içdik. Səfir sabah yenə yanımıza gələcəyini bildirdi. Çox diqqətcil adamdır. Səfiri yola salandan sonra gecə yarısına qədər otelimizin yerləşdiyi Vüsal Şirazi xiyabanında gəzişdik.

Sabah nümayişgahın «Əhli-qələm sarayı»nda («Səraye-əhle-qələm») bir neçə elmi məruzə dinləməliyik.

4 may 2008. Nümayişgahın bu sarayında toplaşdıq. Elmi məclis öz işinə başladı. Bu gün saat 12-dək 6 məruzə dinləyəcəyik.

Məclisi «Fars dilinin daha geniş öyrənilməsi (göstəreş) Mərkəzi»nin prezidenti cənab Abbasəli Vəfayi açdı, hamımızı salamladı. İlk söz Ermənistandan gəlmiş Varaq Nersesyana verildi. Bu erməninin elmi məqaləsi «İran və Erməni ədəbiyyatında gül və bülbül mövzusu» adlanırdı. Gözləyirdik ki, o, indicə bülbül kimi dil açacaq. Amma əsl dili onun mütərcimi açdı. Varaq varaqdan ermənicə oxuyur, mütərcim isə onun dediklərini cümlə-cümlə fars dilinə çevirirdi. Mübariz Məmmədli dərhal salonu tərk etdi. O, məruzəçinin öz çıxışını erməni dilində danışıb fars dilinə tərcümə etdirib - qurtarmayınca salona qayıtmadı.

Növbəti çıxışçı «Azad Universiteti»nin Fars dili və Ədəbiyyatı kafedrasının müdiri d-r İsmayıl Azər oldu. O, «Fars dili və cahan» adlandırdığı məruzəsində əsasən İran müəlliflərinin Qərb ədəbiyyatı ilə bir-birlərinə qarşılıqlı təsirindən danışdı, Dantenin «İlahi» komediyasının «Cəhənnəm» hissəsindəki (yadıma Elxanın «Mələknamə»si düşdü) bəzi epizodları farsdilli ədəbi nümunələrlə müqayisə etdi və çıxışı böyük diqqətlə dinlənildi.

Sonrakı çıxışçı Livan alimi d-r Viktor Əl-Kik idi. Beyrut Universitetinin ustadı olan cənab Əl-Kik İran mədəniyyətinin XX əsr Livan şairlərinin yaradıcılıqlarına təsirindən bəhs etdi.

Masa arxasında növbəti erməni məruzəçi əyləşdi: D-r Azad Yegizaryan.

Məruzəsi «Tumanyan və İran ədəbiyyatı» adlanırdı. O da həmkarı Varaq Nersesyan kimi varaqdan ermənicə oxudu və dediklərini yenə həmin tərcüməçi fars dilinə çevirdi. Mənim məlumatıma görə bu hər iki erməni farsca bilirdi, amma onların niyə ermənicə danışmalarının səbəbini bilmədim.

Nəhayət sonuncu məruzəçi Bakı Dövlət Universiteti «Fars dili» kafedrasının dosenti Tofiq Cahangirov oldu. «Azərbaycan və İran ədəbi əlaqələri» mövzusu ilə tərtəmiz fars dilində nitqə başlayan və məruzəsini ermənilər kimi varaqlardan oxumayan Tofiqin heç bir tərcüməçiyə ehtiyacı yoxdu. Fars dilini farslar kimi bilən Tofiq vaxtı ilə bizə fars dili və ədəbiyyatını tədris etmiş müəllimlərimizdən Rəhim sultanovun, Mübariz Əlizadənin, Nəyyerzəman Səqəfi-Hatəminin ölkəmizin İranla ədəbi əlaqələrinin genişlənməsindəki xidmətlərindən danışdı, Mübariz müəllimin poetik tərcümələrinin uğurlu alındığını dönə-dönə vurğuladı, fars ədəbiyyatından dilimizə bir çox ədəbi nümunələr tərcümə etmiş mütərcimlərdən Əbülfəz Hüseyninin, Şahin Fazilin, Mir Cəlal Zəkinin zəhmətlərini qeyd etməyi də unutmadı. Tofiq Cahangirov ölkəmizdə əruz vəzninin mahir bilicisi Mir Cəlal Zəkinin orijinala müvafiq əruzun səri bəhrində azərbaycancaya çevirdiyi «Məxzənül-əsrar» poemasının hələlik sonuncusu və ən uğurlusu olan tərcüməsini ağaye-Abbasəli Vəfaiyə təqdim etdi.

Məruzələr bitdi. «Milli Kitabxana» ilə tanışlığa yollandıq. Bizi direktor cənab Əşərinin müavini qarşıladı.

Olduqca böyük kitabxanadır. 4 ildir ki, fəaliyyət göstərir. Elmin ən müasir texniki nailiyyətləri əsasında inşa olunmuş bu kitabxana bizi, sözün əsl mə'nasında heyran etdi.

Günorta vaxtı gəlib yetdi. Kitabxana ilə tanışlığımız bitdi. Biz cənab Əşərinin şərəfimizə təşkil etdiyi ziyafətdə iştirak etdik və otelə qayıtdıq.

Axşam Abbasəli Həsənov yenə otağımıza gəldi. Elxan Əzizli öz məlum poemasnın yeni hissələrini oxudu və Abbasəli müəllim bu əsərin gələcək çapı ilə maraqlandı.

Səfir getdikdən sonra mən də Elxan şe'rinin təsiri ilə bu qəzəli yazdım:

*Hələ çox nət olacaqdır və minacat olacaq,*
*Gələcək öylə yazarlar ki, bəşər mat olacaq.*

*Gedərəm İsfahana, Şiraza həm inşallah,*

*Çox səfər şe'rim hələ İrana sovqat olacaq.*

*Həzrəti-Abbası gördüm yuxuda, söylədi ki,*
*Meyxana olmasa da var, muğamat olacaq.*

*Deyəcək şeyx həqiqət, yazacaq mola dürüst,*
*Nə yalan söyləyəcəklər, nə xurafat olacaq...*

*Sevgi haqqındakı hər rəmzi bəyan etməliyəm,*
*Şahina, gör nə uzunluqda bəyanat olacaq!*

5 may 2008. Bu gün Elxan, Tofiq və mən Bakıya qayıtmalıyıq. XXI Beynəlxalq Kitab Sərgisi isə hələ üç gün də davam edəcək. Kamil, Mübariz və Hacı İsmayıl sərginin sonuna qədər Tehranda qalacaqdır. Bizim Bakıda görüləsi işlərimizsə çoxdur, lap çoxdur...

İmam Xomeyni adına təyyarə meydanı. Dəmir quş Bakıya tərəf götürüldü. İranla 5 günlük görüşümüz geridə qaldı. İrəlidə isə Odlar diyarımız Azərbaycan, istəkli vətənimiz.

Uğurlu səfər oldu. Yeni tanışlar, təzə ünsiyyətlər. Tofiq məruzə etdi, mən səfərnamə yazdım, Elxan isə «Mələknamə»nin ilk variantını tamamladı (yeri gəlmişkən, biz Bakıya qayıtdıqdan sonra o, həmin əsəri məşhur şərqşünas alim Vasim Məmmədəliyevə də oxudu və poema akademik tərəfindən təqdir olundu).

Deməli İranla yeni ayrılıq. Amma, yeni görüşlər də olacaq, inşallah. Bir də gedərik, bir də görüşərik.

Təyyarədə dəftərimi açıb, gözlərimi yumdum. İlham quşum pərvaza başlamışdı. Axı bu gün şe'r yazmamışdım. On səkkizinci İran səfərnaməmin 6-cı şe'ri təyyarədə dünyaya gəldi:

*Başlaram bir daha «Bismillah»a Allah qoysa,*
*Gedərəm İrana mən bir daha Allah qoysa.*

*Yenə görsənsə əgər diqqəti xoşxahlərin,*
*Hey dua eyləyərəm xoşxaha Allah qoysa.*

*Hər iki ölkədə ülfət nəsimi əsməkdə,*
*Daha yer qalmayacaqdır aha Allah qoysa.*

*Yazaram bir də səfərnamə ki, on doqquz olar*
*Və şükür eyləyərəm Allaha Allah qoysa!*

Bakı-Tehran-Bakı, 1-5 may 2008
**On səkkizinci Səfərnamə Şe'rləri**

*I*
*QƏZƏL*

*Ey möcüzlər yurdu, ey İran, gəlirəm mən,*
*Ecazım seyr etməyə heyran gəlirəm mən.*

*On səkkiz olubdur bu səfər İrana sayca,*
*Gəlmiş bu «Səfərnamə»yə imkan, gəlirəm mən.*

*Gülzarını gəzdim neçə yol, bağını gəzdim,*
*Gülzarını göstər yenə, bağban, gəlirəm mən.*

*Şərq elləri illər boyu mehmanı sevibdir,*
*Mehmanpərəstsən, sənə mehman gəlirəm mən.*

*Kim görmədi ki, çox yerə getdim mən ürəksiz?*
*Kim gördü ki, İranə pərişan gəlirəm mən?*

*Tək göydə deyil, yerdə də var huri və qılman,*
*Ey huri, səni sevməyə qılman gəlirəm mən.*

*Mehmandarı incitməyə qıymaz qoca Şahin,*
*Bir gün də deyər: «Azəribaycan, gəlirəm mən».*

*30 aprel, 2008*

*II*
*QƏZƏL*

*Leyli, qınama Qeysi ki, «divanə tələsdi»...*
*Vəsl arzusuna düşdü və hicranə tələsdi.*

*Gündüz-gecə yandırmadadır cismini odda,*
*Yarəb, nə üçün yanmağa pərvanə tələsdi?*

*Şövq olmasa hərgah nə hasil olacaq ki?*
*Un şövqü ilə danə dəyirmanə tələsdi...*

*Əlbəttə, xəyalı həmişə seyrə yönəlmiş,*
*Çox yaxşı ki, şair yenə seyranə tələsdi.*

*Meylim var idi, indisə imkan ələ düşdü,*
*Meylim elə coşğundu ki, imkanə tələsdi.*

*Urmiyyə yadımdan çıxa bilmir neçə vaxtdır,*
*Könlüm Ə hərə, Təbrizə, Zəncanə tələsdi.*

*Şirazə yolum düşmədi İrandə heyfa,*
*Amma, neçə yol can quşu Tehranə tələsdi.*

*Görmək diləyir dostu olan ölkəni, əhsən,*
*Şahin təzədən şövq ilə İranə tələsdi.*

*1 may, 2008*

*III*
*QƏZƏL*

*Meylimə imkan eləyənlərdənəm,*
*Şerimi «Divan» eləyənlərdənəm.*

*Бilməyirəm elmini tibbin, fəqət*
*Şe’r ilə dərman eləyənlərdənəm.*

*Canana mən can nədir verməyim?*
*Canımı qurban eləyənlərdənəm.*

*Dosta nəvaziş eləyib bəs qədər,*
*Dostluğu elan eləyənlərdənəm.*

*Torpağıma asi olub qonşular,*
*Asiyə üsyan eləyənlərdənəm.*

*Qan tökənin tökməliyəm qanını,*
*Qanə görə qan eləyənlərdənəm.*

*Qoy vətən uğrunda qızarsın*
*sinəm, Köksümü əlvan*
*eləyənlərdənəm.*

*Düşdü neçin pis günə əfqan eli?*
*Pis günə tüğyan eləyənlərdənəm.*

*Meylimi sövq eyləyib İstanbula,*
*Səmtimi Tehran eləyənlərdənəm.*

*Qan gölüdür sanki İraq torpağı,*
*Бağdada «can, can» eləyənlərdənəm.*
*Amma, darıxdım vətənimçün yaman,*
*Vəsl üçün əfğan eləyənlərdənəm.*

*Cismimi, Şahin nəbi ki, büsbütün*
*Azəribaycan eləyənlərdənəm.*

*2 may, 2008*

*IV*
*Ey Nəsimi!*

*Şair görürəm ki,*
*dəri*
*üstündən*
*dəri görünür.*
*Şah Abbas kimi*
*qumaşı*
*geyir, zəri*
*geyinir.*
*Barmaqlarında brilyant*
*üzük, qüssə çəkməyir, həzzlə*
*öyünür.*
*Laqeyddir kədərə, laqeyddir*
*aha,*
*Dönüb məddaha.*
*Dərisi soyulan şair yox daha.*
*Şair görürəm ki,*
*dəri*
*üstündən*
*dəri*
*geyinir...*

*3 may, 2008*

*V*
*QƏZƏL*

*Hələ çox nət olacaqdır və minacat olacaq,*
*Gələcək öylə yazarlar ki, bəşər mat olacaq.*

*Gedərəm İsfahana, Şiraza həm inşallah,*
*Çox səfər şe'rim hələ İrana sovqat olacaq.*

*Həzrəti-Abbası gördüm yuxuda, söylədi ki,*
*Meyxana olmasa da var, muğamat olacaq!*

*Deyəcək şeyx həqiqət, yazacaq mola dürüst,*
*Nə yalan söyləyəcəklər, nə xurafat olacaq.*

*Hələlik bir sıra işlərdə görünmür gücümüz,*
*Əzmimiz, qüdrətimiz get-gedə ifrat olacaq.*

*Bu qədər ki, çəkirəm dərd ürəyə çat düşüb,*
*Bilirəm ki, ürəyimdə hələ çox çat olacaq.*

*Məni eşq fəlsəfəsi daima məşğul eləyir,*
*Vəsl vardırsa əgər, hicr də heyhat, olacaq.*

*Tək ərəblərdə deyil, bizdə də vardır aşiq,*
*Fikrimin düzlüyü, əlbəttə ki, isbat olacaq.*

*Sevgi haqqındakı hər rəmzi bəyan etməliyəm,*
*Şahina, gör nə uzunluqda bəyanat olacaq!*

*4 may, 2008*

*VI*
*QƏZƏL*

*Başlaram bir daha «Bismillah»a Allah qoysa,*
*Gedərəm İrana mən bir daha Allah qoysa.*

*Yenə görsənsə əgər diqqəti xoşxahlərin,*
*Hey dua eyləyərəm xoşxaha Allah qoysa.*

*Hər iki ölkədə ülfət nəsimi əsməkdə,*
*Daha yer qalmayacaqdır aha Allah qoysa.*

*Azad olsa Qarabağ, üz tutuban Allahə*
*Gedərəm şövq ilə Beytullaha Allah qoysa.*

*Ulu öndərləri hər yerdə ziyarət vacib!*
*Gedərəm çoxlu ziyarətgaha Allah qoysa.*

*Yad edib bir də şərafətli olan Məşhədi mən*
*Açaram əl o uca dərgaha Allah qoysa.*

*Yazaram bir də səfərnamə ki, on doqquz olar,*
*Və şükür eyləyərəm Allaha Allah qoysa!*

*Bakı-Tehran-Bakı*
*1-5 may, 2008*



# ON DOQQUZUNCU SƏFƏRNAMƏ

## *«GÖRDÜM NƏ QƏDƏR TƏNTƏNƏ TƏBRİZ ŞƏHƏRİNDƏ»*

Mən indiyədək İranda 18 dəfə olmuş və 18 «İran səfərnaməsi» yazmışam. O səfərnamələrimdən 9-u 2003-cü ildə bir kitab şəklində cəmlənib çap olundu.

Təxminən iki ay bundan əvvəl Bakıya Təbriz Universitetində bir məktub gəldi. Şərqşünas alim və tədqiqatçıları Təbrizə də'vət edirdilər. Mövzu çox cəlbedici idi: «Qafqazda - tarix beşiyində». Bu haqda düşünməyə başladım... Yəqin ki, söhbət Cənubi Qafqazdan gedirdi. Yadıma İskəndər bəy Münşi düşdü. XVI əsrin II yarısında doğulan, XVII əsrin I yarısında yaşayan İskəndər bəy Azərbaycanın türkman tayfasına mənsub idi. O İskəndər bəy ki, I Şah Abbas Səfəvinin sarayında münşi və baş münşi vəzifələrində işləmişdi. O İskəndər bəy ki, bu səfəvi hökmdarı ilə illərlə təmasda olmuş, müxtəlif səfər və hərbi yürüşlərdə onu müşayiət etmişdi. O İskəndər bəy ki, «Tarixe aləmaraye- Abbasi» adlanan 3 cild və 2 kitabdan ibarət «aləmi bəzəyən» Abbasın tarixindən yazmışdı. O İskəndər bəy ki, yazdıqları qarşıdakı konfrans üçün bircə məqalə deyil, yüzlərlə məqalə silsiləsi yazmağa material verirdi. Beləliklə, İskəndər bəy Münşi və Şah Abbas. Şah Abbasın hökmdarlıq səriştəsi və idarəçilik qabiliyyəti. Şah Abbasın qalibiyyətləri və məğlubiyyətləri. Şah Abbasın Cənubi Qafqaz üzərinə yürüşləri. Şah Abbas və Gürcüstan. Beləliklə, İskəndər bəy Münşi, Şah Abbas və Gürcüstan.

«Şah Abbas və Gürcüstan» adlı məqalə yazmağı qərara aldım. İskəndər bəy Münşi bu barədə o qədər zəngin məlumatlar verir ki.

Məqalənin tezislərini Təbriz Universitetinin Təşkilat komitəsinə göndərdim. Bu günlərdə İran İslam Respublikasının Mədəniyyət Mərkəzinin məsul işçisi cənab Behbudi mənə zəng vurub tezislərimin qəbul olunduğunu bildirdi. Dərhal məqalənin özünü yazmağa başladım,

bitirdim və Təbrizə göndərdim.

Daha bir neçə gün keçdi. Sabah Təbrizə yollanmalıyam. Də'vət olunanlar arasında Azərbaycan Milli Elmlər Akademiyası A.A.Bakıxanov adına Tarix İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, tarix elmləri doktoru, professor Yaqub Mahmudov, AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunun direktoru, filologiya elmləri doktoru, professor Məmməd Adilov vəz əmin institutun şöbə müdiri, filologiya elmləri doktoru Nəsib Göyüşov da vardı.

Sabah yola düşməliyik. Axşam məlum oldu ki, vacib işi çıxdığından Yaqub müəllimsiz gedəcəyik.

19 oktyabr, 2009. Səhər saat 11 radələrində biz artıq Mədəniyyət Mərkəzindəyik: Mən, Məmməd və Nəsib. Mərkəzin sədri cənab İbrahim Nuri və cənab Əlirza Behbudi «Mersedes» markalı maşınla bizi yola saldılar. Biləsuvar səmtinə yollandıq.

Həmin gün sübh tezdən bir qəzəl yazdım:

*Bəh, yenə artıb səhərin şöləsi,*
*Sanki parıldar səfərin şöləsi.*

*Təbrizə yollanmadayam mən bu gün,*
*Parlayacaqdır nələrin şöləsi...*

*Dostları gördükdə, gözüm nurini*
*Artıracaqdır nəzərin şöləsi.*

*Qardaşı qardaş qucacaqdır yenə,*
*Yanmayacaqdır kədərin şöləsi...*

Salyan arxada qaldı. Qarşıda isə Biləsuvardı. Təbrizə getdiyimizi bilən sürücü dərhal adının Təbriz olduğunu dedi. Məşədi Təbriz. Məşədi İbad yaşında, zarafatcıl bir adamdı. Yaman söhbətcildir.

Biləsuvara yetişdik. Yadıma yazıçı və şair Əlibala Hacızadə düşdü. Axı Biləsuvardan idi Əlibala - bizim mərhum dostumuz. Həyat yoldaşı özündən əvvəl dünyasını dəyişdi. Qırxı təzəcə çıxmışdı...

Əlibala ilə Əfqanıstanda mütərcim vəzifəsində işləmişik. Aramızda dostluq münasibəti yaranmışdı. Müxtəlif münasibətlərlə bir-birimizə o qədər şe’r yazmışdıq ki. Əlibalanın mənə yazdığı şe’rlərin birində belə sözlər var:

*... «Бaшmm üstündə Allah var» deyib,*
*«Düşmənə düşmənəm, yara yar» deyib...*
*«Sərvətim, xəzinəm düz ilqar» deyib İlahi*
*bir nura bələndi Şahin.*

*Onun kimi həmdəm ara, həyan gəz,*
*Məhəbbəti yerə, göyə edər bəs.*

*Şahin yaxşı deyib: «Sevənlər ölməz»,*
*Məgər bu eşq ilə öləndi Şahin?*

Çox təəssüf ki, sevənlərdən biri öldü. Əlibala dünyasını dəyişdi. Elə yaşamaq istəyirdi ki... Vəfatından iki-üç həftə əvvəl «Space» telekanalında birgə çıxış etmişdik. Mövzu sevgi və sevənlər haqqındaydı. Heyif Əlibaladan. Onunla bir neçə yol Biləsuvara da gəlmişdik, İrana da getmişdik. Biləsuvar adını eşidən kimi yadıma hələ məktəb illərində oxuduğum bir beyt şe’r düşür:

*Бu tayda Бiləsuvar, o tayda Бiləsuvar,*
*Vətən xəritəsində axtarsan beləsi var.*

Y axşı cinasdır: Biləsuvar - beləsi var. Kimin sözləridir, unutmuşam.

Mən Astara gömrük məntəqəsindən İrana çox gedib-gəlmişəm. Adətən orada İrana gedən və İrandan gələn adam çox olur, sərhədi keçmək «əməliyyatı» çox vaxt aparır. Bu dəfə isə biz Biləsuvardan keçəcəyik. Biləsuvardan Biləsuvara. Astara kimi iki hissəyə ayrılmış Biləsuvara. İki dərzi yaman qayçılayıb Biləsuvarı (Yaxşı mövzudur, bu barədə şe’r yazmaq olar). Tarix boyu o qədər qayçılanmışıq ki. Dərzilər 4də dədə malı kimi şəhərləri bölüblər. «Ürək yaman şeydir» deyən Əkrəm Əylislinin sözü olmasın, siyasət yaman şeydir...

Gedirik. Maşınımız Biləsuvarın mərkəzi küçəsindən əvvəlcə sağa, sonra

isə sola döndü. İran Biləsuvarına 18 km var. Muğan kəndi. Yuxarı Ağalı kəndi. Yuxarı Ağalının yuxarı tərəfində su anbarı (bənd).

Sərhəddəyik. Azərbaycan «Şərqi Azərbaycan» adlanırsa da İrandır. İranda hələ Qərbi Azərbaycan (paytaxtı Urmiyə) da var.

Sərhəddi keçdik. «Pejo» markalı maşının sürücüsü bizi gözləyir. Maşın Təbriz Universitetinindir. Sürücünün adı Vəlidir. Bizi Təbrizə aparacaq.

Yol. Biləsuvar - Ərdəbil yolu. Astara yolu ilə çox keçmişəm Ərdəbildən. İndisə Biləsuvar - Ərdəbil yolu. Keçib getdiyim kənd, qışlaq, şəhristan (kiçik şəhər) və başqa yaşayış yerlərinin adlarını dəftərimə qeyd edirəm. Həmişəki kimi qələmim əlimdə, dəftərim dizimin üstündədir. Cənubi Azərbaycandakı yaşayış məntəqələrinin adları mənim üçün toponimik baxımdan maraqlıdır: Zərgər, Qara qoçlar, Göytəpə, Gönpapaq, Fuladlı, Odlu, Muradlı, Xoruzlu, Bəybağlı, Narqışlağı, Əkbər Davud, Əjdərli, Sarı Nəsir, Nəcəfqulukənd, Şəkərab, Keçəllər, Aran- çı Germi, Şəhrəke-vəliəsr, Onbirbəyli, Dizac, Onqut, Ağdaş, Əli Məhəm- mədli, Hacı Əhməd kəndi, Nəsrulla kəndi, Budaqlı, Qalabərzənd, Əmir kəndi, Alışansuyu, Seyidlər, Keçibulağı, Rəzi. Meşkin şəhəri sağ tərəfdə qaldı. Nağılçılar demiş, sağ getdik, sol getdik, gəlib Ərdəbilə çatdıq.

İndi yolumuz Sarabadır. Bir qədər istirahət. Restoranda yemək yedik. Yola düşdük. Bostanabad (sabiq Ucan). İkinci qəzəlim artıq hazırdır. Neyləyim, darıxanda şe’r yazıram:

*Meyli münasib bilib məndəki imkanə mən,*
*Sözlərimi yazmışam bir neçə «Divanə» mən.*

*Gah yetib vəslimə şükr elədim, gah da*
*Ayrılığa dözmüşəm zülm eləyib canə mən...*

*Gah xəyalən səfər eləmişəm Məkkəyə,*
*Gah Çinə getmişəm, Gah Ərəbistanə mən.*
*Çox da uzun yol deyil, xoş görüş olsun təki,*
*БИДтғэм eşqimi, Təbrizə, Zəncanə mən.*

*Şahin üçün, bəh, bu yol körpü yolu, gəlmişəm,*
*Azərbaycandan Azəribaycanə mən.*

Təbrizə çatdıq. «Təbriz» adlı dörd ulduzlu otel. Yorğun idik. Dərhal yatdıq.

20 oktyabr. Sübh. Otelin I mərtəbəsindəki restoran. Bir nəfər yanıma gəldi. Əmir Əhmədi idi. Bəhram Əmir Əhmədi. Onunla bir neçə il əvvəl Gürcüstanda tanış olmuşduq. Yaxşı alimdir. Çoxlu kitab və məqalələri var. Tarix və tarixi-coğrafiy sahəsində çalışır. Azərbaycan (Azərbaycan Xalq Cümhuriyyəti) və Gürcüstan haqqında kitablar yazıb. Biz Tiflisin Tabaxmela adlı kəndindəki istirahət evində olarkən ona bir qəzəl ithaf etmişdim. Dedi ki, həmin şe'r dr. Cavad Heyətin «Varlıq» jurnalında çap olunub.

Konfransın keçiriləcəyi binaya tərəf yollanırıq, özü də piyada. Çünki Universitet otelin yaxınlığındadır. Çatdıq. Yox, hələ çatmadıq. Biz hələ tibb fakültəsinin konfrans zalına getməliyik. Fakültəyə isə hələ çox var. Universitetin sahəsi bir neçə hektardır. Xeyli getdik. Yorulduq. Yanımızda bir avtobus dayandı və sürücü qapını açdı. Təsəvvür edin ki, universitet ərazisində tələbələri avtobus aparır fakültədən-fakültəyə.

Bu gün İran təqvimi ilə mehr ayının 28-dir. Saat 10-un yarısı. Konfransın açılış mərasimi. Geniş zal. Böyük səhnədə 19 gənc. Onlar (9 qız və 10 oğlan) İranın himnini oxuyurlar. Sonra isə Quran tilavəti. İndi söz Universitetin rektoruna verilir. Seyid Məhəmmədtağı Ələvi. Orta yaşlı adamdır. Təbriz Universitetinin hüquq fakültəsini bitirdikdən sonra tədris və tədqiqatla məşğul olmuş, dissertasiya müdafiə etmiş, dörd il hüquq fakültəsinin dekanı, üç il universitet mərkəzi kitabxanasının müdiri, sonra bir neçə ilə prorektor vəzifəsində işləmişdir.

D-r Ələvi Təbriz Universitetinin tarixindən danışdı və söylədi ki, təhsil ocağı Tehran Universitetindən sonra 1326-cı ildə (miladi 1953) təsis olunmuşdur. O zaman cəmi iki fakültəsi vardısa, hazırda burada 77 ixtisas üzrə tələb hazırlanmaqdadır.

Xatırladım ki, d-r Ələvi məruzəsini əsasən fars dilində oxudu, amma ara-sıra azərbaycanca da danışırdı. Çıxışının əvvəlində Azərbaycan, Gürcüstan və Dağıstandan gəlmiş alimləri Azərbaycan dilində salamlayaraq dedi: «Konfransın keçirilməsində məqsəd bu regionda fəaliyyət göstərən alimləri bir-birinə yaxınlaşdırmaqdır». D-r Ələvi daha sonra söylədi: «Qafqaz son vaxtlarda cənglər meydanına çevrilmişdir... Əsas mübarizə neft və qaz uğrunda gedir. Qafqaza hətta İsrailə də göz dikmişdir». Ölkəmiz barədə isə bunları

eşitdim: «Azərbaycan və İran müştərək din və mədəniyyətə malikdir. Heç bir xarici qüvvə bizi bir-birimizdən ayrı sala bilməz». Rektorun bu sözləri zalda əyləşən tələbə və alimlərin sürəkli alqışları ilə qarşılandı.

Şərqi Azərbaycan ostandarı (vilayət başçısı - Ş.F.) d-r Əlirza Beygi və Ərdəbil ostandarı d-r Həqiqətpur da Qafqazda cərəyan edən hadisələrdən danışdılar. Ərdəbil ostandarı xüsusi vurğuladı: «Qarabağ heç vaxt ermənilərin olmayıb! Füzuli və Ağdamda haçan erməni yaşayıb? Heç vaxt! Qarabağ müsəlmanlarındır! Qarabağ azərbaycanlılarındır!».

Konfransın aparıcısı da bəzən azərbaycanca danışır və Şəhriyarın şe’rlərindən misra və beytlər söyləyirdi. O yenə də bayaq himni oxuyan 19 müğənnini səhnəyə də’vət etdi. İran və Azərbaycan haqqında mahnı ifası:

*İran, iran! Canım qurban.*
*Azərbaycan! Canım qurban...*

Sonra xitabət kürsüsündə ağaye Həsən Goli göründü. O, bir müddət Bakıda işləmişdir. Hazırda prorektordur və bu konfransın təşkilatçılarındandır. Çıxışının sonunda azərbaycanca belə dedi: «Azərbaycan Respublikasından gələn hörmətli alimlərimizə öz isti salamlarımı yetirirəm. Qoy bizim əlaqələrimiz daha da çoxalsın».

Bu arada məni müsahibəyə də’vət etdilər. Jurnalist qadın sonda bir şe’r söyləməyimi xahiş etdi. «Meyli münasib bilib məndəki imkanə, mən.» misrası ilə başlayan yuxarıdakı qəzəlimi söylədim.

Nahar fasiləsi. Tələbələrə bir neçə kitab bağışladım. Yenə zaldayıq. D-r Əli Əkbər Cəfəri, Xanım Sima Salur, d-r Nəstun Təvəkkoli, xanım Mənijə Sədrinin çıxışlarından sonra mənə söz verildi. Yuxarıda yazdığım kimi, məqaləm Şah Abbas Səfəvinin Gürcüstana yürüşü və gürcü-səfəvi münasibətlərinə həsr olunmuşdu. Çıxışımda həmin münasibətlərin gah dostluq, gah da düşmənçilik məqamlarına toxundum.

Yarım saatlıq fasilə. Həsən Goli iclası açaraq məni daha iki alimlə birgə növbəti iclası aparmaqdan ötrü rəyasət heyətinin tərkibində səhnəyə də’vət etdi. D-r Hüseyn Əhmədi, Əmir Hüşəng Ənvəri, d-r Aleksandr Çolixadze çıxış etdilər. Gürcü həmkarım A.Çolixadzenin çıxışını qiymətləndirmək mənə həvalə olundu. Gürcü aliminin özü və sözü haqqında bir neçə xoş söz dedim.

Konfransın bugünkü məruzələri oxunub qurtardı. Qeyd etməliyəm ki, heç bir məruzə müzakirə olunmur və çıxışlarda sual verilmir.

Elmi toplantıya Naxçıvan Muxtar Respublikasından gəlmiş Elbrus İsayevlə tanış olduq. O, Naxçıvan Dövlət Universitetinin «Magistratura və aspirantura»sına rəhbərlik edir. Xoşqılıq, cavan bir adamdır, elmlər namizədidir. Dedi ki, akademik İsa Həbibbəyli də buraya gəlməliydi, amma son məqamda ona məsul bir işin icrası tapşırıldığı üçün gələ bilmədi və bundan olduqca təəssüfləndi.

21 oktyabr. Bu gün əvvəlcə dörd məruzə dinləniləcək, sonra bir neçə dəqiqə istirahət veriləcək, alimlərin daha beş çıxışı olacaq, namaz və nahar üçün ayrılan saat yarımlıq vaxtdan sonra daha altı məruzə dinləniləcək, axşamüstü konfransın qapanma mərasimi başlanılacaqdır. Beləliklə, Gilandan dr. Yusif Zeynalabdin, Gürcüstandan S.Culava, Dağıstandan Murtuzəli Kacıyev, Tamerlan Aytberov, Təbriz Universitetindən Əmin Nəvaxti, Müqəddəm, Dərbənddən Gülçöhrə Seyidova, Tehrandan d-r Məsud İrfaniyan, Əz-Zəhra Universitetindən d-r Ümmülbəni Çabəki və başqalarının çıxışları dinlənildi.

Bugünkü iclasın ikinci hissəsində rəyasət heyəti üzvləri arasında Nəsib Göyüşov əyləşmişdi. Füzulişünasdır və farsca nitqinə söz yoxdur. Ağaye Goli böyük mehribanlıq göstərir.

Məruzələrin oxunuşu bitdi. Ötən səfərlərimin birində Təbrizdə tanış olduğum d-r Nəqib bizi - Azərbaycan, Gürcüstan və Dağıstan alimlərini Təbriz Milli Arxivinə də’vət etdi. Təbrizin mərkəzi küçələri ilə getməkdəyik. Naxçıvanlı həmkarımız Elbrus İsayev mənim diqqətimi Ərk qalasına cəlb etdi. Qala keçən il gördüyüm vəziyyətdədir. Təmiri nədənsə yubanır. Və gecə Ərk haqqında bu şe’ri yazmışdım, çünki eşitmişdim ki, təmiri bitməyib:

Ərk qalası

*İbrət qalasıdır, görk qalasıdır,* -
*Ərk qalasıdır.*
*Ən bərk qalaların bərk qalasıdır,* -
*Ərk qalasıdır.*

*Şöhrət qalasıdır, şövkət qalası,*
*Qüdrət qalasıdır, qüvvət qalası.*
*Heyrət qalasıdır, qeyrət qalası,*
*Basılmaz, yenilməz Şərq qalasıdır* -
*Ərk qalasıdır...*

*Üstünə od-alov saçılıbsa da,*
*Damı təmir üçün açılıbsa da,*
*Divarının biri uçulubsa da,*
*Bizi etməyəcək tərk, qalasıdır* - *Ərk*
*qalasıdır.*
*Ərk qalasıdır.*

Təbriz Milli Arxivinin həyətindəyik. İkimərtəbəli yaraşıqlı binadır. Əvvəllər burada İraqın konsulluq idarəsi yerləşirmiş. İkinci Dünya müharibəsi zamanı sovet qoşunları Təbrizə girdikdən sonra, binanın blokunda dayanıb, fotoaparatla rus qoşununun şəklini çəkən konsulu güllə ilə vurub öldürmüşdülər. Sonra bu binada ruhi xəstələr yerləşdirildi. İndi isə Mərkəzi Arxivdir. D-r Nəqibin sözünə görə, bütün sənədlər kompüterləşdirilib. Muzeydə bir neçə şöbə fəaliyyət göstərir: tarixi sənədlər şöbəsi, ekspertiza, restovrasiya, laboratoriya və sair.

D-r Nəqibin kabineti. Çay və meyvə gətirildi. «Məhde-azadi» («Azadlıq beşiyi») qəzetini və «Körpü» jurnalının naşiri və baş redaktoru ağaye Peyman bizi özünün atadanqalma redaksiya və nəşriyyat binasına də’vət etdi. 5 mərtəbəli hündür evdir, 3 mərtəbəsi yerin altındadır ki, mətbəə orada yerləşir. Naharı burada yedik. Zəng vurub bir şairi çağırdılar: Nəsir Paygozar. Ağaye Peyman dedi ki, buş air İranın məşhur təcnis yazanıdır. Başqa bir səsdə eşitdim: - Nəsir Paygozar şeyxi-cinas, sultani-cinas, ümmül-cinasdır. Bu tərifləri eşidən Paygozar başladı, nə başladı:

*Qurban kəsim gündə sənə,*
*Kölgədə yox, gündə sənə,*
*Bata bilməz gün də sənə,*
*Bir gül sənsən, bir də güldür,*

*Sən gülləri bir də güldür.*

Şair bir qədər pauza verdi. Gözləri gülürdü. Şe’rindən biz də məmnun olmuşduq, özü də. Yenə gülə-gülə gül mövzusuna keçdi:

*Mən aşiqəm, gözəl, gülə,*

*Əl vurmazlar gözəl gülə.*

Nasir Paygozarın gül mövzusu bitib tükənmək bilmirdi:

*Tanrı sizə verib gül gözəlliyi?*
*Yoxsa sizdən alıb gül, gözəlliyi?*

Ağaye Peymanın təşkil etdiyi bu ziyafətdən sonra yenidən universitetin konfrans zalına qayıtdıq. İndi konfransın qapanışı olacaq. Keçirilən iclaslar barədə d-r Hüşəng Tale geniş məlumat verib bütün çıxışçılara uğur dilədi, təşkilatçılara təşəkkürünü bildirdi. Ondan sonra xitabət kürsüsündə görünən ağaye Goli elan etdi: «İndi isə d-r Şahin Fazil Təbrizə həsr etdiyi bir şe’rlə çıxış edəcəkdir».

Ona təşəkkürümü bildirib, dünən yazmağa başladığım, bu gün isə vaxt tapıb tamamladığım «Təbriz şəhərində» rədifli qəzəlimi oxudum:

*İmkan olacaqdır yenə Təbriz şəhərində,*
*Dostlarla görüşmək mənə Təbriz şəhərində.*

*Daim bir olan ellərimiz ayrıca qaldı,*
*Qaldı gözümüz çox sənə Təbriz şəhərində.*

*Qalmış Бakıda bir baba, tarixmi günahkar,*
*Amma ki, qalıbdır nənə Təbriz şəhərində.*

Təbrizlilər ümumiyyətlə poeziyanı çox sevirlər. Alqışlar. Bir neçə tələbə qız və oğlan ayağa qalxıb əl çalırdı.

Yerimdə yenicə əyləşmişdim ki, bir nəfər mənə yaxınlaşıb jurnalist

Əlayinin xahişini çatdırdı. Keçən səfərlərdən tanıdığım ağaye Əlayi məni müsahibəyə də'vət edirdi. Nə edim, sözündən çıxa bilmədim və sonda ona «Ərk qalası» şe'rimi oxudum. Elə bu vaxt Əlayi mənə dedi ki, indicə sizin adınızı çəkdilər, konfrans sizi mükafatlandırıbdır. Zala qayıtdım. Məni görən kimi səhnəyə də'vət etdilər və rektor cənab Ələvi və səhnədə sıra ilə dayanan başqa məsul şəxslər əlimi sıxdılar. Qeyd etməliyəm ki, təkcə mən yox, proqramda adları yazılan və elmi məruzələrlə çıxış edən bütün alimlər mükafatlandırıldılar.

Konfrans bağlandıqdan sonra Təbriz Şəhər Şurasının üzvü, «Təbriz ümidi» qəzetinin məsul redaktoru cənab Həbib Şiri-Azər öz xidməti maşınını bizə verdi və Təbrizin görməli yerlərini gəzintiyə başladıq.

22 oktyabr. Sübh tezdən Təbriz Ərdəbil istiqaməti ilə yola düşdük. Bizi aparmaq Universitetin tələbəsi Bəhram Cəfəriyə tapşırılmışdır.

Şəhərdən çıxdıq. Qarşımızda arxa şüşəsində azərbaycanca «Gözəlim, gözlə məni» sözləri yazılmış yüksək sürətlə gedən bir yük maşını şütüyür. Ürəyimdə deyirəm: «Səni gözləyən gözəlin yanına sağ - salamat dönmək istəyirsənsə, asta sür».

Bəhram Cəfəri, Məmməd Adilov və Nəsib Göyüşovla söhbətləşə-söhbətləşə Bostanabadı və Sərabı keçdik. Nəsib o qədər lətifə danışdı ki...

Ərdəbil. İslam İrşadı Nazirliyinin Ərdəbil şöbəsinin binası qarşısındayıq. Bu gün burada bizim şərəfimizə müşairə (şe'r məclisi) təşkil olunacaq. Tədbir bu idarənin rəisi ağaye İbrahimpurun və «Əncümənе- hafiz» ədəbi məclisin sədri Əsgər Şahinin təşəbbüsü ilədir. Əncümənin üzvləri bir-bir, iki-iki gəlib bizimlə görüşürlər. Şairlər Raşed, İskəndər Nəcəfi Soxənvər, Adil Movlayi, Əsgər Şahi, Pərviz Asim, Şəkiba Tağızadə, Tovhid Dilavətqəvam, Cahandilə və mən bir neçə şe'r oxuduq. Məclisin aparıcısı Əsgər Şahi idi. Bir neçə ay əvvəl onun Bakıda «Füzuli qəzəllərinin irfani şərhi» adlı kitabının birinci cildi çapdan çıxıb. Bu qəliz kitabın redaktoru mənəm. Müəllif indi onun son iki cildinin üzərində işləməkdədir. Müşairə və ziyafət məclisi bitdi. Ağaye İbrahimpur və şairlər bizimlə xudahafizləşdilər. Təxminən bir aydan sonra Ərdəbildə mərhum şair Abbasqulu Yəhyavi Ərdəbilinin (tacüs-şüəra) şərəfinə elmikonfrans keçiriləcəkdir. Mənim iştirakımı xahiş etdilər və Yəhyəvinin 4 cildlik əsərlərini mənə bağışladılar. Onlara dedim ki, konfransınızda iştirak edərəm və Yəhyəvinin şərəfinə bir neçə şe'r də yazaram, inşallah.

Ərdəbil-Biləsuvar yolu. Germi şəhərinə çatdıq. İndi yol iki qola ayrılır: Germi-Biləsuvar, Parsabad-Biləsuvar. Bu yerlər, bu geniş ərazi Parsabaddan tutmuş Germiyə qədər «Şahsevənlər yurdu» adlanır. Şahsevənlər isə Şah Abbasa xidmət və bu səfəvi hökmdarlarına pərəstiş edən türk tayfaları olmuşlar. Əlbəttə, bəzi gürcü əyanlarının da şahsevən olmaları xüsusda məlumat az deyildir.

Yolumuz davam edir. Uzun bir tuneldən keçirik. Şübhələndim. Nədənsə bu yol mənə tanış gəlmir. Yox, bu yol bizim keçib gəldiyimiz yol deyil. Üzərində «Qəhqəhə qalası» sözləri yazılmış yolgöstərən bir lövhə. Təəccübüm daha da artdı. Canım, nə Qəhqəhə qalası? Tarix kitablarında adını oxuduğum tarixi Qəhqəhə qalası Təbriz yaxınlığında olmuşdur. O qala haqqında mənim hətta elmi məqaləm də çap olunub.

Nə isə... Yolumuz davam edir. Allahyarlı, Seyidli, Mircəfərli, Mirzə Həsənkəndi, Azadegan, Qaraxanbəyli, Zeyvə, Yağışlı, Ağaməhəm- mədbəyli, Sarıqışlaq, Tağıkəndi, Oltan, Salmankəndi, İbadabad, Ağdam adlı kənd və qışlaq adları. Parsabad şəhəri. Əcirli, Mürtəzakəndi, Cəfərabad, Ruhkəndi, Dəmirçi. Nəhayət məlum oldu ki, sürücümüz bizi uzaq Parsabad yolu ilə aparır. Aparır-aparsın, görmədyimiz yerləri
gördük, amma görün başımıza nə gəldi.

Biləsuvar gömrük idarəsinə çatdıqda sərhəd xətlərindəki bayraqlar artıq endirilmişdi. Bu da o deməkdir ki, gömrükxanalar bağlıdır. Hamımız pərt olduq. Hətta sürücümüz İslam da.

Yenidən Ərdəbilə qayıdasıyıq. Qayıdırıq da. Bir neçə saat bundan əvvəl Ərdəbil İrşad İdarəsində müşavirə keçirilərkən, Əsgər Şahi bir nəfər barədə, bayaq adını çəkdiyimiz Pərviz Asim haqqında olduqca xoş sözlər demişdi. Məlum oldu ki, Asim də elə mənim kimi təmiz Azərbaycan dilində şe’rlər yazır, əsərlərində ərəb-fars tərkibli ifadələrdən izafətlərdən qaçır. Pərvizə diqqətlə nəzər yetirdim. Mənə elə tanış gəlirdi ki. Xatırlaya bilmədim. Məclisin yarısında o, Biləsuvara bir tədbirə gedəcəyini bildirdi, üzrxahlıq edib bizdən ayrıldı. 5-6 saatdan sonra onunla bir daha görüşməli olduq. Biz bu gün Biləsuvardan kor-peşman Ərdəbilə qayıdarkən iki maşınla yola düşdük. Sən demə, ikinci maşının sərnişinləri arasında Asim qardaşımız da vardı. Yolun yarısında ikinci maşının sürücüsü bizim maşının sürücüsünə zəng vurub maşını saxlamasını xahiş etdi. Dayandıq. İkinci maşından əyni əbalı, başı çalmalı, xoş

görünüşlü bir din xadimi düşdü. Yaxınlaşıb mənə dedi ki, adı Quddisidir və höccətül-islamdır. Bəs mən ikinci maşının sərnişinlərinin xahişi ilə onların maşınına əyləşib Ərdəbilə getməliyəm. Ağaye Quddusinin sözünə əməl etdim, o isə məni əyləşdiyim yerə keçdi.

İkinci maşında sürücüdən başqa iki nəfər vardı. Birincisini dərhal tanıdım: Şair Pərviz Asim idi. Bəli, şe'rləşə-şe'rləşə yolun canını üzürdük. Pərviz Asim yanında əyləşəni mənimlə tanış etdi, onun Şəhruz Həbibi olduğunu, xanəndəlik etdiyini söylədi. Y ol uzun biz şe'r deyir, Şəhruz isə muğam ifa edirdi. Həqiqətən gözəl oxuyurdu. Səsinə qulaq asa-asa fikrə dalmışdım. Birdən on iki il bundan əvvəlki Bakıda Asimlə tanışlığımız yadıma düşdü. Bakı, Vahid Bağı, Həkim Qəninin «Vahid ədəbi məclisi» və... Cənubi Azərbaycandan Bakıya gələn üç şair qardaşımız. Yadıma hətta o şairlərə yazdığım və orada onlara oxuduğum şe'rimin bir neçə beyti də düşdü. «İkinci Divan» kitabımda getmiş həmin qəzəl budur:

*Şövqüylə vüsalın necə sirdaş gəlibdir,*
*Olsun gözüm aydın, gözümə yaş gəlibdir.*
*Əlbəttə, sevinc yaşları axmaqda gözümdən,*
*Qardaş elinə bir neçə qardaş gəlibdir.*

*İlham pərisi qeybə çəkilmişdi yanımdan,*
*Vəsf etməyə eşqi o qələmqaş gəlibdir.*

*Əflakə ucalmış yenə vəslin başı, amma,*
*Hicrin başına dağ uçulub, daş gəlibdir.*

*Təsvir eləyim mən nə təhər? Qəlbimiz içrə,*
*Sevdasını nəqş etməyə nəqqaş gəlibdir.*

*Çox gəlsə də izzətli qonaqlar bizə, amma*
*Təbrizli qonaqlar hamıdan baş gəlibdir.*

*Şahin yenə təkrar eləyir öndəki sətri:*
*Şövqüylə vüsalın neçə sirdaş gəlibdir.*

*(10.02.1998)*

Ərdəbilin işıqları görünür. «Negin» otelinə gəlib çatdıq. Gecələdik. Sübh zamanı ağaye İbrahimpur maşınla gələrək bizi yenidən Biləsuvara yola saldı. Mən bu gecə oteldə zarafatla yazdığım bu qit'əni Əsgər Şahiyə çatdırmaqdan ötrü Hacıya verdim. Axı biz dünən Bakıya çatmağa tələsirdik. Ancaq bir gün də itirəsi olduq:

*Hicranın səddini, ey vah, yıxa bilmir Şahin,*
*Şahıya, qalmış idim üz-üzə gömrük ilə mən.*
*Ərdəbil cazibəsindən çıxa bilmir Şahin,*
*Bu səbəbdən də qayıtdım geriyə gömrükdən.*

Qit'əni Hacıya oxudum. Məmməd dedi: «Şairlər qəribə olurlar. Şahin Ərdəbilə geri qayıtmağımızın səbəbini guya Ərdəbilin cazibəsindən çıxa bilməməklə əlaqələndirir».

Gülüşdük. Üç saatdan sonra artıq Biləsuvar gömrük məntəqəsin- dəydik. Bayraqlar qaldırılmışdı. Xudahafiz, Biləsuvar! Salam, Biləsuvar!

Biləsuvar-Bakı yolu ilə irəliləyirik. Vaxtilə vahid bir şəhər olan, sonradan iki hissəyə ayrılan Biləsuvar haqqında düşünürəm. Biləsuvar və Biləsuvarlar. Yeni bir şe'r yarandı:

Torpaqkəsən qayçılar

*Ey dərzilər,*
*Ey dərzi kişilər,*
*dərzi qadınlar*
*Nə var ki sizə?*
*Sizə nə var?*
*Tutmuşunuz əllərinizdə*
*Parça kəsən qayçıları,*
*Kəsirsiniz, biçirsiniz...*
*Nə parça inciyir,*
*nə siz...*

## On doqquzuncu Səfərnamə Şe'rləri

*I*
*QƏZƏL*

*Bəh, yenə artıb səhərin şöləsi,*
*Sanki parıldar səfərin şöləsi.*

*Təbrizə yollanmadayam mən bu gün,*
*Parlayacaqdır nələrin şöləsi...*

*Dostları gördükdə, gözüm nurini*
*Artıracaqdır nəzərin şöləsi.*

*Qardaşı qardaş qucacaqdır yenə,*
*Yanmayacaqdır kədərin şöləsi.*

*Ərdəbilin şöləsi qəlbimdədir,*
*Gözdə Sərabın, Əhərin şöləsi.*

*Canda nə vaxtdır Qarabağ dərdi var,*
*Sardı canı çox qəhərin şöləsi.*

*Amma, inamım çoxalır get-gedə,*
*Gurlanacaqdır zəfərin şöləsi.*

*Ağ olacaqdır Şuşamın iqbalı,*
*Sönməyəcək Kəlbəcərin şöləsi.*

*«Çıx səfərə» söylədilər, Şahini,*
*Etdi səfərbər səfərin şöləsi.*

*19 oktyabr, 2009*

*II*
*QƏZƏL*

*Meyli münasib bilib məndəki imkanə mən,*
*Sözlərimi yazmışam bir neçə «Divan»ə mən.*

*Gah yetib vəslimə şükr elədim, gah da*
*Ayrılığa dözmüşəm zülm eləyib canə mən.*

*«Came-Cəm»im yoxsa da, seyr eləyib tarixi*
*Köhlənmi sürmüşəm İranə, Turanə mən.*

*Yaxşı imiş, ey pəri, sən demə divanəlik,*
*Sevgidə divanə sən, eşqdə divanə mən.*

*Ah ki, çox görmüşəm dərdimə biganəni,*
*Olmamışam heç kəsin dərdinə biganə mən.*

*Gah gedib bir neçə sahilə göz qoymuşam,*
*Gah xəyalən uçub girmişəm ümmanə mən.*

*Gah xəyalən səfər eyləmişəm Məkkəyə,*
*Gah Çinə getmişəm, gah Ərəbistanə mən.*

*Çox da uzun yol deyil, xoş görüş olsun təki,*
*Bildirirəm eşqimi Təbrizə, Zəncanə mən.*

*Şahin üçün, bəh, bu yol körpü yolu, gəlmişəm*
*Azəribaycandən Azəribaycanə mən.*

*19 oktyabr 2009*

*III*
*Ərk qalası*

*İbrət qalasıdır, görk qalasıdır, -*
*Ərk qalasıdır.*
*Ən bərk qalaların bərk qalasıdır, -*
*Ərk qalasıdır.*

*Şöhrət qalasıdır, şövkət qalası,*
*Qüdrət qalasıdır, qüvvət qalası.*
*Heyrət qalasıdır, qeyrət qalası,*
*Basılmaz, yenilməz Şərq qalasıdır -*
*Ərk qalasıdır...*

*Yağılar vəslini görə bilməyib,*
*Ondan vüsal gülü dərə bilməyib,*
*Yadlar ağuşuna girə bilməyib,*
*Azər qalasıdır, türk qalasıdır - Ərk*
*qalasıdır.*

*Üstünə od-alov saçılıbsa da,*
*Damı təmir üçün açılıbsa da,*
*Divarının biri uçulubsa da,*
*Bizi etməyəcək tərk, qalasıdır - Ərk*
*qalasıdır.*
*Ərk qalasıdır!*

*21 oktyabr 2009*

*IV*
*QƏZƏL*

*İmkan olacaqdır yenə Təbriz şəhərində,*
*Dostlarla görüşmək mənə Təbriz şəhərində.*

*Daim bir olan ellərimiz ayrıca qaldı,*
*Qaldı gözümüz çox sənə Təbriz şəhərində.*

*Qalmış Bakıda bir baba, tarixmi günahkar,*
*Amma ki, qalıbdır nənə Təbriz şəhərində.*

*Təbriz ilə, ey Rəbb, mənim çoxdu muradım,*
*Sən qıyma muradım sönə Təbriz şəhərində.*

*Çərxi-fələyin işlərini yaxşı bilirsən,*
*Yol vermə ki, çərxim dönə Təbriz şəhərində.*

*İlham pərisi quş kimi uçmuşdu yanımdan,*
*İlham pərisi qoy enə Təbriz şəhərində.*

*Hər dəfə gələndə məni xoş qarşılayıblar,*
*Gördüm nə qədər təntənə Təbriz şəhərində.*

*Arzumdu mənim çoxlu gəlim Təbrizə, Şahin,*
*Artıq bu görüş ənənə Təbriz şəhərində.*

*21 oktyabr 2009*

*V*
*Torpaqkəsən qayçılar*

*Ey dərzilər,*
*Ey dərzi kişilər,*
*dərzi qadınlar*
*Nə var ki sizə?*
*Sizə nə var?*
*Tutmuşunuz əllərinizdə*
*Parça kəsən qayçıları,*
*Kəsirsiniz, biçirsiniz...*
*Nə parça inciyir, nə siz.*

*Ey dərzilər,*
*Torpaqkəsən kəslər var,*
*Torpaqkəsən qayçılar var.*
*Torpaqkəsən qayçılarla*
*Kəsilir torpaqlar,*
*adlanır cənub,*
*şimal, Məsələn Astara,*
*Məsələn Бiləsuvar.*

*...İllərin bir ilində,*
*Günlərin bir günündə*
*hərisliklə işlədi*
*Torpaqkəsən qayçılar,*
*Nənə bir yanda qaldı,*
*Бaba başqa tərəfdə,*
*Бel bir tərəfdə qaldı,*
*Yaba başqa tərəfdə.*
*Çay bir tərəfdə qaldı,*
*Orman başqa tərəfdə,*
*Bağ bir tərəfdə qaldı,*

*Bostan başqa tərəfdə.*

*Bundan sonra*
*istərəm Bəd niyyətlər*
*dəyişə,*
*Pis xislətlər dəyişə,*
*Bir də işə düşməyə*
*Torpaqkəsən qayçılar.*
*Nə bir şəhər, nə diyar*
*Qayçılarla bölünüb*
*istəmirəm cüt olsun,*
*Qoy kəsməsin, küt olsun*
*Torpaqkəsən qayçılar.*

*23 oktyabr 2009*



# İYİRMİNCİ SƏFƏRNAMƏ

## *«ŞAHİN İSTƏR HƏR ZÄMÄN ETSİN SƏNİ YAD, ƏRDƏBİL!»*

16 noyabr 2009.

Bu gün İran İslam Cümhuriyyətinin Mədəniyyət Mərkəzindən mənim mobil telefonuma zəng vuruldu. Danışan Mərkəzin məsul işçisi cənab Məhəmməd idi. O, bu gün Ərdəbilə - şair Abbasqulu Yəhyəvi Ərdəbilinin şərəfinə təşkil olunmuş konfransa yola düşməyimi xahiş etdi. Çox təəccübləndim. Elə bu gün? Niyə bir neçə gün əvvəl xəbər verməmisiniz? Məlum oldu ki, səfər barədə səfirliyə dünən xəbər çatmış, dünənsə bazar günü olduğundan məni məlumatlandıra bilməmişlər. Cənab Məhəmmədi sözünə davam etdi: Hacı Ələmdar Mahir və Arif Buzovnalı da getməlidirlər və indi onların pasportlarına viza alınması üçün çalışırıq.

Tez-tələsik işlədiyim Tarix İnstitutuna getdim. Direktorumuz Yaqub Mahmudov bir gün əvvəl Macarıstana getmişdi. Elmi işlər üzrə müavin Cəbi Bəhramova müraciət edib, icazə aldım.

Günorta zamanı Ələmdar Mahirin telefonu səsləndi: Pasportumuz hazırdır, yola düşə bilərik.

Mənimsə pasportum xidməti pasport olduğundan viza almadan gedə bilərdim. Tez-tələsik maşına əyləşib, vədələşdiyimiz yerdən Bakı- Biləsuvar istiqamətinə yollandıq.

Qeyd etməliyəm ki, mən 2009-cu ilin sonuna yaxın Ərdəbildə keçiriləcək mərsiyə ədəbiyyatının «tacəş-şüəra»sı («şairlər tacı») əl-Hac- Abbasqulu Yəhyəvi Ərdəbilinin xatirəsinə həsr olunacaq konfransa hələ bir ay bundan əvvəl də’vət almışdım. Amma, o zaman konfransın keçiriləcəyi tarix dəqiq müəyyənləşdirilməmişdi. İndisə, birdən-birə yeni səfər. İrandan təzəcə qayıtmışdım. Hər halda qəflətən gələn bu də’vətdən məmnun idim. Mənim, ümumiyyətlə, İranla hər görüşüm bir səfər- naməyə çevrilir. On doqquzuncu İran səfərnaməmi «Gördüm nə qədər

təntənə Təbriz şəhərində» adlandırdım, Bakıya qayıdan kimi onu tamamlayıb şair-jurnalist dostum, «Nəbz» qəzetinin redaktoru Qurban Cəbrayıla təqdim etdim və sağ olsun, o da bu növbəti səfərnaməni dərhal qəzetində dərc etdi (bax: «Nəbz», 7, 14, 21 noyabr, 2009, 39-41-ci saylar). Mən Hacı Qurban Cəbrayıl ilə birlikdə İranda çox olmuşam. Tehranda, Urmiyada, Təbrizdə o qədər şe'rləşmişik ki... onun aşiqanə şe'rlərini cavanlar çox xoşlayır, xüsusilə qızlar. Yadıma Qurbanın «Qızlar elə gözəldi ki.» şe'ri düşdü.

Biləsuvara çatdıq. Sərhəd məntəqələrini keçdik. İstiqamət indi Ərdəbilədir. Sürücümüz biləsuvarlı idi. Dedi ki, bu maşını 2-3 gün bundan əvvəl almışdır. Ələmdar Mahir dərhal xəbərdarlıq etdi: Ehtiyatlı sür. Heç bilirsən kimləri aparırsan?

Məni göstərdi: Professordur.

Sonrasa iki hacını - yəni özünü və Arif Buzovnalını təqdim etdi: Biz isə əhli-beyt şairləriyik!

Əhli-beyt şairləri! Bəs mən kiməm? Mən professoram, bu öz yerində. Bu mənim elmi adımdır və mən elmlər doktoruyam. Mən həm də əhli-beyt şairlərindənəm, əhli-beytə dair onlarla müxtəlif janrlı şe'rlərim üç divan və başqa kitablarımda çap olunmuşdur, sözlərimə musiqi bəstələnmişdir.

Ümumiyyətlə, bu «əhli-beyt şairi» ifrat təkəbbürlü və özündən çox razı adamdır. Biz bir-birimizə açıq-aşkar zidd adamlarıq. 2006-cı ildə çap olunmuş «Təzkireyi-Şahin» adlı kitabımda bu cümlələr vardır: «Onunla mənim aramdakı münasibət soyuqdur. Elə soyuqdur ki, qarşılıqlı cəhd olsa da, heç isinə bilmir» (Bax: Təzkireyi-Şahin, s.195).

İrəliləyirik. Söhbət zamanı məlum oldu ki, sürücümüz hələ iki-üç gün Ərdəbildə qalacaqdır. «Nə üçün?» sualıma cavab verdi: «Bir qız məni şərləmişdi. Hakim bizim hərəmizi 130 şallaq cəzaya məhkum etdi. Amma, mən o qızın mənə şər atdığını sübut edə bildiyimə görə cəzam cərimə ödəməklə əvəz olundu. Qızı isə şallaqlayacaqlar». Nədənsə birdən-birə qıza yazığım gəldi. Soruşdum: «Qızın şallaqlanması sənin kişilik şəninə toxunmazmı?» Dərhal cavab verdi: «Yox! Qız məni biabır etmişdir».

Şallaq! Nə etmək olar? Hər yerin özünə məxsus qanun-qaydası var.

Ərdəbilə yaxınlaşırıq. Hacı Ələmdar mobil telefonu ilə şair Hacı Əsgər Şahiyə zəng vurdu. Müəyyənləşdi ki, bizi Mir Əbdülməlik məscidində gözləyirlər, çünki hazırda orada tacəş-şüəra əl Hac Abbasqulu Yəhyəvi

Ərdəbilinin şərəfinə təziyə məclisi qurulmuşdur.

Ərdəbildəyik. Bu da Mir Əbdülməlik məscidi. Qaranlıqda işıqları par-par yanır. Bir neçə şəxs küçəni keçib bizə yaxınlaşdı: Rəsul İsmayılzadə və Beytulla Cəfəri onların arasında idilər. Köhnə tanışlar. Rəsul bir müddət Bakıda «Əl Hüda» nəşriyyatının nümayəndəsi vəzifəsində işləyib. O, bir neçə il bundan əvvəl bizim «Məcməüş-şüəra» ədəbi məclisinin fəxri üzvü seçilmişdir. Təxəllüsü Duzaldır. «Qurani-Kərim»in ərəbcədən Azərbaycan dilinə son tərcüməsi məhz onundur. Bu haqda mənim bir elmi məqaləm də vardır: «Göydən gələn kitabın yerdə növbəti tərcüməsi». Məqalə akademiyamızın orqanı olan «Elm» qəzetində dərc olunub. Onu görən kimi soruşdum: «Ey Rəsul Duzal, Duzalda duz qalıbmı?». Gülümsəyərək cavab verdi: «Qalıb! Gedək duz yeyək».

İndicə adını çəkdiyim Beytulla Cəfəri isə əslən Urmiyədəndir, iki seçki müddəti İran Parlamentinə üzv seçilmiş, millət vəkili olmuşdur. Beytullanın «Lalələr» adlı şe'rlər kitabını xatırladım.

Xeyli yorğun olduğumuza görə Əsgər Şahi bizi qalacağımız «Negin» otelinə göndərdi. Negin - yəni üzük qaşı. Yaxşı oteldir. İkinci mərtəbədəyik. Arif Buzovnalı otağa girən kimi Yəhyəvi Ərdəbili haqqında qəzəl yazmağa başladı. Əlbəttə, bizə oxuduğu bir-iki beyt həmişə sadiq qaldığı üslubdandır, yəni qəlizdir. Söylədi ki, mən bunların (yəni bura azərbaycanlılarının) dillərində yazıram. Dedim ki, elə öz dilimizdə yazmaq lazımdır. Sözüm deyəsən xoşuna gəlmədi bu qəzəlxanın. İnsafən, Hacı Ələmdar da qəzəlin sadə dillə yazılmasını məsləhət gördü. Arif razılaşdı: «Yaxşı, sadələşdirərəm, amma «hətmən» sözündən əl çəkməyəcəyəm («hətmən», yəni «mütləq, hökmən»). Nə üçün? Çünki «hətmən» sözü qəzəlimin bir beytində yerinə elə oturub ki...».

İşığı keçirib yerimizə keçdik. Mən tacəş-şüəra Abbasqulu Yəhyəvi Ərdəbili haqqında düşünürəm. Yəhyəvi Ərdəbili! Cənubi Azərbaycanda müasir mərsiyə ədəbiyyatının ən məşhur nümayəndəsi. Mərsiyə ədəbiyyatı məqtəl (qətl, şəhadət) ədəbiyyatının bir növüdür. Məqtəl ədəbiyyatı, yəni qətlə yetirilmiş Kərbəla şəhidlərinə həsr olunmuş şe'r növü, nəsr növü.
Böyük şairlərin məqtəlləri də həcm etibarilə böyük olmuşdur.

Kərbəla! Kərbəla müsibəti! Kərbəla şəhidləri! Mənim o fəlakət- zədələr barədə məlumatım çoxdur. Məhəmməd Füzulinin olduqca qəliz dillə yazdığı

«Hədiqətüs-süəda» məqtəlini dilinin çətinliyindən baş sındıra-sındıra bir neçə dəfə oxumuş və bu əsərin bəzi beytlərinə təzminlər də yazmışam. Kərbəla torpağına böyük qiymət verən bu böyük şair şe’rlərinin birində deyir:

*«Ey Füzuli, məskənim çün Kərbəladır, şerimin*
*Hörməti hər yerdə vardır, xəlq onun müştağıdır.*
*Nə qızıldır, nə gümüş, nə ləlü nə mirvaridir,*
*Sadə torpaqdırsa, lakin Kərbəla torpağıdır».*

Bir məsələni xatırlatmalıyam: Məhəmməd Füzulidən səkkiz əsr əvvəl Əbu Müxnəf bin Yəhya ərəb dilində ilk məqtəl nümunəsi yazaraq onu «Ketabi-məqtəli-Hüseyn» adlandırdı. Əbül-Fərəc İsfahaninin (miladi tarixlə 897-967) yazdığı «Məqalilüt-talibin» kitabı isə məqtəl ədəbiyyatı sahəsində ikinci iri həcmli əsərdir. XI əsr müəllifi İshaq Əsfərayini də ərəbcə bu mövzuda «Nurül-eyn fi məşhədil-Hüseyn» adlandırdığı bir məqtəl qələmə aldı. Bunlar onu göstərir ki, ədəbi məqtəl nümunələrinin mənbəyi ərəb ədəbiyyatı olmuşdur. Hüseyn Vaiz Kaşefi (vəfatı 1505) «Rövzətüş-şühəda» adlı əsərini yazaraq fars dilində ilk məqtəl yaratdı. Türk ədəbiyyatında isə ilk məqtəl Qəstəmonlu Şadinin «Dastani-məqtəli-Hüseyni» əsəridir. Ondan sonra Yəhya bin Bəxşi, Lami, Hacı Nurəddin Əfəndi, Cəlibolulu Cami də məqtəllər yazmışdır (Bax: Məhəmməd Füzuli. Hədiqətüs-süəda, Bakı, 1993. Prof. Əlyar Səfərlinin «Şəhidlik abidəsi» məqaləsi, s.3-12).

Azərbaycan ədəbiyyatının ilk məqtəl müəllifi Məhəmməd ibn Hüseyn olmuşdur. O da ərəb və fars müəlliflərinin yolu ilə gedərək, «Şühədnamə» əsərində Kərbəla müsibətini dərin hüznlə qələmə aldı.

Məhəmməd Füzulinin 10 fəsildən (bab) ibarət olan məlum kitabının sonuncu babı belə adlanır: «Həzrəti - İmam Hüseynin ləşkəri-Yezidlə müharibəsin bəyan edər». İmam Hüseynin «şahi-Kərbəla» adlandıran şair yazır:

*«Surəti-təhrirə gəlməz olsa dəryalər midad Şərhi-*
*bidadü bəlayi-rəzmgahi-kərbəla.*
*Kərbəladə həsr olub aləmdə hər möhnət ki var,*
*Bənd qılmışdır təriqi-səbri şahi-Kərbəla».*

Mən Abbasqulu Yəhyəvi Ərdəbilinin 4 cildlik əsərini də Azərbaycan dilində yazılmış məqtəl adlandırıram (hərçənd ki, onun şe'rləri arasında fars dilində də nümunələr yox deyildir). «Bosati- Kərbəla», «Əsrari-aşura», «Pərçəmi-əza» və «Axerin asari-Yəhyəvi» kimi adlarla oxuculara təqdim olunan həmin dörd kitab əvvəldən axıra kimi Kərbəla müsibətinə həsr olunmuş məqtəldir. Yəhyəvi Ərdəbilinin dörd gündə oxuduğum kitabı mənim məlumatımı artırdı və «Dörd gündə oxuduğum dörd kitab və təqdim etdiyim beş şe'r» adlandırdığım məqaləmi Ərdəbil konfransına göndərdim. Beş şe'rin birincisi Yəhyəvi Ərdəbiliyə təzmin şəklində yazdığım aşağıdakı qəzəldir:

*«Qan yağdı Kərbəladə səhrayə, ya Məhəmməd,*
*Öldü Hüseyn, xəbər ver Zəhrayə, ya Məhəmməd».*

*Dərya qədər axıbdır göz yaşları, o şair Ümman*
*axıtdı gözdən dəryayə, ya Məhəmməd.*

*Beynimdə yer tutubdur yazmaq neçə şəhiddən,*
*Düşdüm çətin bir eşqü sevdayə, ya Məhəmməd...*

*Əl-Hac Yəhyəvidən dörd cild kitab yetişdi,*
*Güc ver ki, başlayım mən misrayə, ya Məhəmməd.*

Ərdəbildə oxuyacağım məqaləmə əlavə etdiyim sonrakı şe'rlər «Mərsiyə», «Qəsidə», «Qəzəl» adlandırdığım, amma çoxdan yazdığım 3 şe'rdən və təzəcə bitirdiyim ikinci qəzəl-təzmindən ibarət idi.

17 noyabr. Gözüm təzəcə yuxuya getmişdi ki, azan səsinə oyandım. Mən məqaləmdəki yuxarıda adlarını çəkdiyim şe'rlər barədə sonra məlumat verəcəyəm. Amma, indi oxuculara bu gecə yarısı yazdığım «Yəhyəvi» rədifli bir qəzəlimi təqdim edirəm:

*Açsa da İrandə qol və qanad Yəhyəvi,*
*Eylədi çox yandə gör necə ad Yəhyəvi.*

*Ömrünü həsr eylədi şövq ilə din elminə,*
*Səy ilə elm öyrənib, aldı savad Yəhyəvi.*

*Ruhinə ruhanilik həzzi onun yar idi,*
*Ömr uzunu ruhini eyləli şad Yəhyəvi...*

*Aləmə çox kəs gəlib, Şahina, ad qoymayıb,*
*Eylədi çox yandə gör necə ad Yəhyəvi!*

Ərdəbildə hava işıqlandı. Bir azdan hacılar Ələmdar və Arif növbə ilə namaz qılmağa başladılar. Ə.Mahir bir siqaret yandırdı. Dedim: Bu oldu səhər yeməyinin birinci mərhələsi. Dedi: Yox, bir qənd atmışam ağzıma. Dedim: Onda bu isə oldu səhər yeməyinin ikinci mərhələsi. Gülüşdük.

Ərdəbilə yağış yağır. Bizi «Yeddi göz meydanı»na gətirdilər. Dedilər ki, bu meydan hazırda «Yəhyəvi meydanı» adlanır.

Meydanın ortasında ağ parçaya bürünmüş heykəl nəzəri cəlb etməkdədir. Bir azdan açılış mərasimi başlanacaq və ağ örtük götürüləcəkdir.

Yağış yağır Ərdəbilə. Tədbirə gələnlərin əksəriyyətinin əlində çətir var. Yağış isə kəsmək bilmir. Əsgər Şahi çıxış edir. Həmişəki kimi odlu- alovlu. Yağış onun od-alovunu söndürə bilmir. Əsgər Şahi yağışdan güclüdür.

İran Mədəniyyət və İslam İrşadı naziri cənab Hüseyni, ostandar d-r Həqiqətpur və başqa məsul şəxslər heykəlin açılış mərasimini icra etdilər. Heykəltəraş isə Vədud Müəzzinzadədir. Bu ustad sənətkar və onun ustad xanəndə olan atası Səlim Müəzzinzadə ilə bir neçə dəfə Bakıda görüşmüşəm.

Yağış yağır Ərdəbilə. «Negin»ə qayıdırıq.

Azacıq istirahət. Telefon səsləndi. Dedilər ki, şair Hüseyn Düzgün bizimlə görüşmək istəyir. Aşağı düşüb foyedəki kreslolarda əyləşdik və söhbətə başladıq.

Ərdəbilə indi qar, d-r Hüseyn Düzgünün dilindənsə dürr tökülmək - dədir.

*«Elmin acıyan yarasıyam mən,*
*Paralanmış qəlbin parasıyam mən,*
*Əl qoy qəlbimə, gör harasıyam mən,*
*Hər dona girsəm də yenə Düzgünəm,*
*Haqqım vardır bu ad ilə öyünəm».*

İranda şah rejimi vaxtı Türkiyəni təbliğ etdiyinə görə bir müddət həbsdə yatan, indisə Universitet ustadı olan şair və alim Hüseyn Düzgün bu misraları

böyük Şəhriyarın «Heydərbabaya salam» poemasının təsiri ilə yazmışdır. Onun çoxlu kitabı, o cümlədən elmi məqalə və monoqrafiyaları vardır. Şair habelə qəzəl də yazmaqdadır:

*«Oyan bir xabi-qəflətdən, ötübdür karivan çoxdan,*
*Hamı bidar olub-getdi, mənəm yalnız sənə heyran».*

Bu 125 kitab müəllifinin çoxlu tərcümələri də vardır. Mahmud Kaşğarinin məşhur «Divani-lüğətüt-türk» adlı lüğəti məhz onun tərəfindən fars dilinə tərcümə olunmuşdur. Hazırda Tehranda yaşayan Hüseyn Düzgün Nəsimi, Nəbati, Vaqif kimi şairlər haqqında monoqrafiyalar da yazıb. Bakıda və Şəkidə də olub. Azərbaycanın VII Yazıçılar Qurultayında da iştirak edib. Amma, təəssüflə qeyd etdi ki, məni Gəncəyə aparmadılar. Və əlavə etdi: Bir gün Gəncəyə də gedərəm, inşallah!

Söhbətimizə şair də qoşuldu, Əkbər Əsədi. Ərdəbillidir. Şairlikdən başqa həm də tədqiqatçıdır. Bağır Xəlxalinin azərbaycanca yazdığı «Sələbiyyə» («Tülkünamə») əsərinə fars dilində şərhlər yazmışdır. Əkbər Əsədi də «Heydərbabaya salam» tərzində poema işləyib:

*«İsa əmi qonşuluğa can idi,*
*Məhəbbət dəryası, qeyrət kanıydı,*
*Ürəyi bir parça istək, qan idi,*
*Bakıdan, Gəncədən söhbət açardı,*
*Ruhu qanadlanıb orda uçardı».*

Əkbərin ədəbi qəhrəmanlarından biri olan İsa əmi XX əsrin ortalarında Bakıdan Meşkin şəhərinə (Çətəz kəndinə) gəlib bir müddət orada yaşamışdı.

Söhbətimiz bitdi. Əkbər Əsədi məni və Hüseyn Düzgünü Ərdəbilin «Unçular» məhəlləsindəki öz şəxsi bukinist mağazasına də'vət etdi, bu yağışlı gündə Ərdəbilin bir neçə küçəsini keçib onun dükanına gəldik. Burada əsasən xarici ölkə müəlliflərinin fars dilinə tərcümə edilmiş kitabları satılır. Divarda Lev Tolstoyun böyük bir rəngli portretini gördüm. Bu mağazadan çıxdıq, kitab və dəftərxana ləvazimatı satılan başqa mağazaya gəldik. Sahibi şair və ciddi tarixçi olan ağaye-Ciddidir. Dünya tarixini, xüsusən şumerlər tarixini pis bilmir bu tarixçi.

Geri qayıdan baş yolumuzu yaxın günlərdə Şah İsmayıl Xətaiyə qoyulacaq heykəlin yanından saldıq. Müəllifi, əlbəttə, Vədud Müəzzinzadədir. Başı taclı şah sağ əlində «Divani-Xətai» kitabını tutmuşdur.

«Negin»dəyəm. Günorta vaxtı. Ardımızca maşın gəldi. Xeyli yol getdikdən sonra «Fədək» adlanan Mədəniyyət sarayına gəldik (Mən «Fədək» sözünün mə’nası barədə keçmiş səfərnamələrimin birində məlumat vermişdim).

İclas zalı adamla doludur. Böyük səhnə. Yəhyəvi Ərdəbilinin rəngli boya ilə çəkilmiş böyük portreti. Portretin aşağısında nəstəliq xətti ilə «Tacəş-şüəra» sözləri yazılmışdır. Bu gün aban ayının 26-sı, 1388-ci ildir (miladi tarixlə 17 noyabr, 2009). Səhnəni bu konfrans üçün hazırlayanlar təşkilatçıların adlarını da yazmağı unutmamışlar: Ərdəbil ostandarlığı, Ərdəbil İslam İrşadı Baş idarəsi, Şe’r və Ədəbiyyat əncüməni, Şəhrdarlığın İslam Şurası Ensiklopediya idarəsi, İncəsənət Mərkəzi, İslam Təbliğatı idarəsi.

İran İslam Cümhuriyyətinin dövlət himni səslənir. Quran tilavəti.
Aparıcı Tovhid Dilavərqəvam xitabət kürsüsü arxasındadır. O, gah Azərbaycan, gah da fars dillərində danışmağa başladı, Yəhyəvinin İmam Hüseynə həsr etdiyi bir neçə beyt şe’rini söylədi və konfransın açılışını elan etdi.

Gözlərimiz səhnədəki ekrana zilləndi. Tacəş-şüəra öz tərcümeyi- halını danışırdı. Sonra isə bir tədqiqatçı şair barədəki fikirlərini bildirməyə, onun bəzi xüsusiyyətlərini izah etməyə başladı.

Ekran sönən kimi aparıcı göründü. O, mərsiyə musiqisinin sədaları altında iclasın proqramı haqqında məlumat verir, məruzəçilərə bir qədər ixtisarla danışmağı məsləhət görür və prezident cənab Mahmud Əhmədinejadın konfransa təbrik məktubu göndərdiyini bildirir. Demək, bu konfrans dövlət səviyyəlidir. Demək, bu konfransı ümumiran konfransı adlandırmaq olar.

İlk çıxışçı Rəsul İsmayılzadədir. Şair haqqında öz düşüncələrini hələ bildirməyən natiq (mən «natiq» sözünü heç də təsadüfən işlətmədim, Rəsul həqiqətən də əsl natiqdir) mərsiyə ədəbiyyatı haqqında məlumat verdikdən sonra belə dedi: «Mən çıxışımı fars dilində etmək istəyirdim, amma burada professor Şahin Fazili, Hacı Ələmdar Mahiri, Arif Buzovnalını gördüm və türkcə danışmaq fikrinə düşdüm». R.İsmayılzadə gülümsəyərək əlavə etdi:

«Mən həm qız evindənəm, həm də oğlan evindən. Mən mehmanlarımıza ehtiram əlaməti olaraq türk dilində danışacağam».

Çıxışçı İran, xüsusən Ərdəbil haqqında bunları dedi: «Əgər Şah İsmayıl olmasaydı İran olmazdı, əgər Ərdəbil olmasaydı şiəlik olmazdı».

Rəsul sonra «mərsiyə muğamatı»ndan bəhs etdi və hazırda bu muğamatın ifaçılarından yadigar qalan Səlim Müəzzinzadə haqqında dilinə şirin sözlər gətirdi, bu məşhur xanəndənin dörd muğamı birləşdirib oxuduğunu xüsusi vurğuladı. «Mərsiyə ədəbiyyatı min ildən çoxdur ki, yazılır və yaşayır. Ərəb, fars və türk ədəbiyyatında bu janra müxtəlif divanlarda daha çox təsadüf olunduğundan, yenə qeyd edirəm ki, məqtəl ədəbiyyatı çoxyaşlı və uzunömürlüdür» - dedi İsmayılzadə.

Elə bu zaman onun çıxışı dayandırıldı. Cənab nazir d-r Hüseyni və cənab ostandar d-r Həqiqətpur təşrif gətirmişdilər. Onlar alqışlarla qarşılandılar.

Çıxışını yekunlaşdıran Rəsuldan sonra d-r Behruz Sərvətyan çıxışa başladı. O da Yəhyəvi Ərdəbilini yüksək qiymətləndirdi, Füzulini və Yəhyəvini bir-biri ilə müqayisə etdi, birincinin şe’r dilinin qəlizliyini xüsusi vurğuladı: «Bir neçə il bundan əvvəl Bakı şəhərində keçirilən «Füzuli Konfransı»nda azərbaycanlı alimlər məndən xahiş etdilər ki, Füzulinin dili çox qəlizdir və buna görə də siz o böyük şairin yazdığı şe’rlərin şərhini hazırlayın» deyən çıxışçı fikrini belə tamamladı: «Deyə bilərəm ki, Yəhyəvi Ərdəbili Məhəmməd Füzuli şe’rlərini özünə xas ustalıqla sanki yenidən yazmış və sadələşdirmişdir».

Növbəti çıxışçı d-r Həqiqətpur oldu. O, Təbriz Konfransındakı kimi Ərdəbildə də öz nitqi, dünyagörüşü və elmi mülahizələri ilə nəzərləri özünə cəlb etdi. Cənab ostandarın Yəhyəvi Ərdəbili haqqında dediklərindən: «Yəhyəvi - aşura ədəbiyyatının dürdanəsidir... Mərsiyə- şünaslıqda onu ikinci Firdovsi adlandırırlar. Müasir aşura mədəniy - yətində bu şair həzrət-şühədanın (İmam hüseynin və başqa şəhidlərin - Ş.F.) ən sadiq tərənnümçüsüdür».

D-r Həqiqətpur çıxışının axırında prezident Mahmud Əhmədinejadın bu konfransa göndərdiyi təbrik məktubunu oxudu.

Nahar fasiləsi. Bir juranlistə Yəhyəvi ilə bağlı müsahibə verdim.

Konfransın davamı. Türkiyədən gəlmiş konfrans iştirakçıları Həmid turan və Hacı Niyazi Şərən yanımda əyləşdilər, mənimlə tanış oldular. Həmid turan İstanbulda «Zeynəbiyyə» camesinin imamıdır. Bu camenin orada ilk

«azərilər camesi» olduğunu bildirən H.Turan özünün və Hacı Niyazinin «Türkiyə azəriləri» olduqlarını bildirdi. «Bir neçə gün bundan əvvəl şeyxülislam Allaşükür Paşazadənin fəaliyyətə başlamasının 30 illiyi münasibətilə Bakıda olduq və şeyxi təbrik etdik» - dedi Həmid Turan.

İkinci oturumun çıxışları başlamazdan əvvəl səhnə ekranı yenidən işıqlandı, Yəhyəvidən bəhs edən qısa sənədli film göstərildi, təsirli bir mərsiyə oxundu. Salondakı adamların əksəriyyəti ağlayırdı.

Aparıcı səhnəyə gələrək bir ləhzə bundan əvvəl göstərilən filmdə İranın dini rəhbəri ağaye-Xameneyinin söylədiyi bir beyt şe’ri bir daha təkrar etdi:

*«Ay batdı, sübh açıldı, Zeynəb nəvayə gəldi,*
*Zəhra dedi «Hüseyn vay!» aləm sədayə gəldi».*

Bundan sonra Əsgər Şahi sözə başladı. Sözlərindən od yağan, ah, fəryad və nalə axan Əsgər Şahi. Bir neçə ay bundan əvvəl Bakıda çap olunan «Füzuli qəzəllərinin irfani şərhi» adlı kitabın I cildinin müəllifi olan Əsgər şahi (kitabın redaktoru bu sətirlər müəllifidir). İranda müasir mərsiyə ədəbiyyatının görkəmli nümayəndəsi Əsgər Şahi. Ustad şair, tacəş-şüəra Abbasqulu Yəhyəvi Ərdəbilinin vəfalı şagirdi Əsgər Şahi.

Yarım saatdan çox danışan natiq tez-tez gözlərinin yaşını silir və başqalarını da ağladırdı.

Cənab nazir d-r Hüseyni xitabət kürsüsünə də’vət olundu. Müasir dövr mərsiyə ədəbiyyatı və Yəhyəvi Ərdəbilidən danışan nazir maraqlı mülahizələr yürüdürdü ki, bu da onun hərtərəfli ədəbi məlumatından xəbər verirdi.

Xaricdən gəlmiş iştirakçıların adından söz mənə verildi. Mən məqaləmi oxumaqdan vaz keçdim, Yəhyəvi Ərdəbiliyə üç şe’r yazdığımı bildirdim və əvvəlcə bu qəzəl-təzmini oxudum:

*Gəlmişəm üqba üçün, dünya, səlam olsun sənə,*
*Bivəfa dünya imiş, üqba, səlam olsun sənə.*

*Bilmirəm misralərim layiq olarmı mədhinə?*
*Başladım mən şe’rimi, misra səlam olsun sənə.*

*Sözdə surət, həm də mə’na axtaran bir şairəm,*
*Surətə xor baxmıram, mə’na, səlam olsun sənə.*

*Gəlmə ey röya bu gün, qoy ki, şəhidlərdən yazım,*
*Gözlərimdən çıx, çəkil, röya, səlam olsun sənə.*

*Əs-səlam, ey Kərbəla cəngində can qurban edən,*
*Çox kəsə çox var səlam, amma səlam olsun sənə.*
*Şahin istər Yəhyəvi tək Kərbəladan söz yaza,*
*Bəh, nə xoş xülyadı bu, xülya, səlam olsun sənə.*

Şe'rimi tamamladım və konfransın məzmununa uyğun olan mərsiyələrimdən birini söyləməyə başladım:

Qəsidə

*Gör bir neçə vaxtdır tökülüb qanı Hüseynin,*
*Yandırmadadır bizləri hicranı Hüseynin.*

*Əsli, nəsəbi, mərtəbəsi alidən ali,*
*Əlbəttə, ürəklərdədi ünvanı Hüseynin.*

*Elmi, hünəri, mərifəti ümmana sığmaz,*
*Olmuş görəsən bir gilə nöqsanı Hüseynin?*

*Heyran edəcək aləmi illər boyu şəksiz Fəzli,*
*ədəbi, hikməti, irfanı Hüseynin.*

*Haqq aşiqi olmuşlara dərman nəyə lazım?*
*Əlbəttə, şəhadətdədi dərmanı Hüseynin.*

*Təkcə Ərəbistanı deyil, qətli sərasər Zar*
*etmədimi Azəribaycanı Hüseynin?*

*Üsyan elədi şövq ilə yetmiş iki aşiq,*
*Xar eylədi kafərləri üsyanı Hüseynin.*
*Həmrahləri yaxşı bilirdi bunu: hətta Sağ*
*qalmağa yox azca da imkanı Hüseynin.*

*Amma ki, çəkilmək geri gəlmirdi xəyalə,*
*Hazırdı hamı olmağa qurbanı Hüseynin.*
*Müslim deyilən azəribaycanlı da vardı,*
*Çəkmişdi onu meydanə fərmanı Hüseynin.*

*Həzrət Əlinin ruhu uçub etsə də pərvaz,*
*Həzrət Əlinin canı idi canı Hüseynin.*

*Hər mömінə kaş qismət ola öylə şəhadət,*
*İslamə şərəfdir şərəfi, şanı Hüseynin.*

*İslampərəstik, yenə kafərlərə qarşı*
*«Gəl-gəl» deyə səslər bizi meydanı Hüseynin.*

*Ol zatın olubdur necə heyranı bu Şahin!*
*Olmuş, olacaq daima heyranı Hüseynin!!!*

*(Бах: Kərbəlayi Şahin Fazil.*
*Allah eşqi, peyğəmbər məhəbbəti, imam sevgisi (təkmilləşdirilmiş II nəşri), БОЪ, 2001, səh. 136-137)*

Ağlayanların sayı Əsgər Şahi şe'rlərindən riqqətə gəlib göz yaşı tökənlərdən az olsa da, başlarına döyüb «Ya Hüseyn!» deyənlər də az deyildi.

Mən yerimə keçib oturduqdan sonra Kərbəla müsibətinə dair olduqca təsirli qısa bir film göstərildi. Cəng. Yezidlər və müsəlmanlar arasında ölənlər və öldürülənlər. Çoxluq azlığa qalib gəlməkdədir. Bunları görən və səhraya qaçıb canını qurtarmaq istəyən 7-8 yaşlı məsum bir qızcığazın yanaqlarından axan, sonra sanki donub qalan göz yaşı. Mən də ağladım. Çox təsirli mənzərəydi...

Sonra Yəhyəvi Ərdəbilinin heykəltəraş Vədud Müəzzinzadə tərəfindən hazırlanmış altı ədəd büstünü səhnəyə gətirib yan-yana düzdülər. Aparıcı bu büstlərin mükafat (cayizə) layiq görülənlərə veriləcəyini elan etdi.

Bu arada heykəltəraşın atası Səlim Müəzzinzadə səhnəyə də'vət olundu və dərhal yanıqlı səslə oxumağa başladı. Ərəb, fars və Azərbaycan dillərində ifa olunan mərsiyələrin təsirindən millət fəryad edirdi. Xanım

Zeynəbin şəhadətinin təsviri məqamı yetişdikdə Səlim Müəzzinzadəyə ünvanlanan alqışlar içərisində bir nalə eşitdim:

*«Ey dad, ey dad,*
*Evin abad!».*

Konfransın sonu yaxınlaşmaqdaydı. Xanəndə tərə qərq olmuşdu. Bərk vəcdə gəldiyindən başından papağını, boynundan şarfını çıxarıb yerə atdı.

Xanəndə əyləşdikdən sonra cənab nazir, ostandar və daha bir neçə məşhur adam səhnəyə də’vət olundular.

Cayizə təqdimi. Birinci büst tacəş-şüəranın oğlu Abbasəli Elçiyə təqdim olundu. Habelə, Əsgər Şahi, məddah Hacı Rəhim Heydəri onlara verilən büst və gülləri aldıqdan sonra A.Elçi söz istəyib təşkilatçılara öz təşəkkürünü bildirdi.

Mükafatlandırılıb büstə layiq görülənlərdən biri də mən idim.

Axşamüstü «negin» otelində bizimlə şairlər arasında şe’rləşmə (müşairə) başlandı. Mən bu yerdə növbə ilə öz şe’rlərini söyləyən şairlərin hərəsindən bir neçə şe’r nümunəsi verməyi münasib bilirəm:

Həbib Yəzdani:

*«Baltalar gəliblər bağa gəzməyə,*
*Ağaclar odur ki, pıçıldaşırlar.*
*Qovlanıb göylərə vay-şivən səsi,*
*Ay allah, söyüdlər bir-bir aşırlar».*

*«Dan ulduzum, de görüm yoldadır bahar, ya yox?*
*Boranlı günlər ötər, bir çiçək açar, ya yox?*

*Min ovçu daldalana hər budaq dalında əgər,*
*Köçər mahaldakı quşlar qatar-qatar, ya yox?»*

Şair Şəkiba:

*«Hamı kəslərdən ağam kəsdi mənə,*
*Eşqi daim bəre-növrəsdi mənə.*

*Can verən vəqtdə əgər lütf eləsə,*
*O təbibanə baxış bəsdi mənə».*

Ehsan Məhəmmədi:

*«Məni hicrində qocaltmaqla fələk kam aldı, Бu*
*yanan sinədə eşqində ölüncək qaldı.*
*Yenə Leyla bu yeni Qeysi salıb qəm çölünə...*
*Nə yazım eşqindən?..*
*Dəli oldum».*

Əsgər Şahi:

*«Nə vardı qəsrə əlaqəm, nə maili-tacəm,*
*Fəqət Hüseynə, Hüseynə, Hüseynə möhtacam.*
*Ənəl-Hüseyn deyib kafər olmuşam, yaran,*
*Gəlin çəkin məni darə ki, mən də Həllacəm».*

Ələmdar Mahir:

*«Ey can, ürəkdə zərrə qədər mehr yox sənə*
*Viranə qəlbə qoydu o gündən ki, qəm qədəm.*
*Mən hicri-yar ilə səni çoxdan dəyişmişəm,*
*Ardımca sayə tək nə düşübsən qədəm-qədəm?»*

Şəhriyar Neməti:

*«Gecə yoldan yetişərkən başıma qəm tökülür,*
*Sanki hər bir tükümə yeddi cəhənnəm tökülür.*
*Necə qan ağlamasın hər gecə Həvva anamız,*
*Buğdadan ötrü bugün isməti-Adəm tökülür.*

*Bəsdi eşqin məni öldürməyə day naz nə üçün?*
*Xəstə bir Söhrabın üstə neçə rüstəm tökülür».*

Şair Həbib Yəzdani ərdəbilli şairə xanım Həmidə Rəiszadə Səhərin belə bir şe'rini söylədi:

*«İstərəm sevdanı qanıma qatam,*
*İstərəm varımı yoxuma satam.*
*Dar paltardır əynim, canımı sıxır,*
*İstərəm əynimi çıxarıb atam.*
*Sığmayır bağrıma bağırtılarım,*
*Haçanacan gərək bağırtı udam?*
*Ay sevgi yayından yayınan oxlar,*
*Ayıqlıq sevirəm, qoymayın yatam.*
*Sahili tapşırın ağıllılara,*
*Mən getdim dənizdən dənizə batam».*

Sonda məndən də bir neçə şe'r deməyimi xahiş etdilər. Bir neçə əruz və heca vəznli şe'rlər dedim, «Birinci Divan» kitabımın sonundakı «Avtoportret» adlı şe'rimlə müşairə məclisimiz yekunlaşdı:

Avtoportret

*Həyat vaxtından tez qocaldıb məni,*
*Ömür orta yaşı mənə çox bilib.*
*Arabir əlimdən yerə düşəni Qaldıra bilmirəm*
*yerdən əyilib.*

*Özündən bədgüman aşiqlərsayaq Qəlb*
*sevdaya düşmür, ürək həvəsə.*

*Hər an odlu olan, həmişə oyaq Eşqim*
*mürgüləyir arabir nəsə.*

*Yazardım, pozardım mən bütün günü,*
*Meylim o adəti haxlaya bilmir.*
*Zehnim qüvvəsini, qolum gücünü,*
*Gözüm işığını saxlaya bilmir.*

*Vaxtın surətindən şikayətim var,*
*Ayları, illəri qınayıram mən.*
*Mən kimi cavanlıq edən az olar,*
*Mən kimi qocalan çoxmudur görən?*

*(Бах: Şahin Fazil, Divan, Бакı, 1996, s.450)*

18 noyabr. Bu gün geri qayıdırıq. Ərdəbilə yağış yağmaqdadır. Ağaye-İbrahimpur və başqa ərdəbilli dostlar bizimlə xudahafizləşməyə gəliblər. Bir qədər söhbətləşdikdən sonra, Əsgər Şahi bizi öz maşını ilə şəhərin kənarına gətirdi. Onun maşınından düşüb, Parsabaddan olan cavan bir sürücünün maşınına əyləşdik.

Artıq Biləsuvardayıq. Yolumuz indi Biləsuvardan Biləsuvara və Biləsuvardan Bakıyadır.

Salamat qal, ey Xətailər, Yəhyəvilər, Arif Ərdəbillilər diyarı. Sən məni xatırlasan da, xatırlamasan da mən səni həmişə yad edəcəyəm, çünki

*Şah Xətayi, Yəhyəvi, Şahi gəzən bir bölgəsən,*
*Şahin istər hər zaman etsin səni yad, Ərdəbil!*

Бакы-БПэсиуаг-ЭгДэЬП-БПэсиуаг-Бакы
16-18 noyabr, 2009

## İyirminci Səfərnamə Şe'rləri

*I*
*QƏZƏL*

*«Qan yağdı Kərbəlada səhraya, ya Məhəmməd,*
*Öldü Hüseyn, xəbər ver Zəhrayə, ya Məhəmməd»*[1].

*Dərya qədər axıbdır göz yaşları, o şair Ümman*
*axıtdı gözdən dəryayə, ya Məhəmməd.*

*Beynimdə yer tutubdur yazmaq neçə şəhiddən,*
*Düşdüm çətin bir eşqü sevdayə, ya Məhəmməd.*

*Yazmazsa Kərbəladan əllər, qələm qan ağlar,*
*Təbim mənimlə başlar qovğayə, ya Məhəmməd.*

*Çox söz dedim mən aciz, lütf eylə, Yəhyəvidən*
*Öyrən, sözüm yetərmi imzayə, ya Məhəmməd.*

*Əl çəkmərəm mən əsla mə'na təfəkküründən,*
*Surət gülü tay olmur mə'nayə, ya Məhəmməd.*

*Bidarı daşlayan çox, röyanı xoşlayan çox...*
*Getmir gözüm haçandır röyayə, ya Məhəmməd.*

*Etməkdəyəm təəccüb, bəzən görünmür ilham,*
*Bəzən fikir sığışmır xülyayə, ya Məhəmməd.*

*Əl-Hac Yəhyəvidən dörd cild kitab yetişdi,*
*Güc ver ki, başlayım mən misrayə, ya Məhəmməd.*

*16 noyabr, 2009*

[1] *Beyt Yəhyəvi Ərdəbilinindir.*

*II*
*QƏZƏL*

*Açsa da İrandə qol və qanad Yəhyəvi, Eylədi*
*çox yandə gör necə ad Yəhyəvi.*

*Ömrünü həsr eylədi şövq ilə din elminə,*
*Səy ilə elm öyrənib, aldı savad Yəhyəvi.*

*Ruhinə ruhanilik həzzi onun yar idi,*
*Ömr uzunu ruhini eyləli şad Yəhyəvi.*

*Yaddaşına Kərbəla həkk olunandan bəri*
*Çəkdi fəğan Yəhyəvi, eylədi dad Yəhyəvi.*

*Mərsiyəsi kafərə qarşı qiyam eylədi,*
*Cürəti dağdan da bərk, əzmi polad Yəhyəvi.*

*Aləmə çox kəs gəlib, Şahina, ad qoymayıb,*
*Eylədi çox yandə gör necə ad Yəhyəvi!*

*17 noyabr, 2009*

*III*
*QƏZƏL-TƏZMİN*

*«Ey əzize-həzrəte-Zəhra, səlam olsun sənə,*
*Vey şəhidey-yovme-aşura, səlam olsun sənə»*[1].

*Gəlmişəm üqba üçün, dünya, səlam olsun sənə,*
*Бivəfa dünya imiş, üqba, səlam olsun sənə.*

*Бilmirəm misralarım layiq olarmı mədhinə?*
*Бaşladım mən şerimi, misra səlam olsun sənə.*

*Sözdə surət, həm də mə'na axtaran bir şairəm,*
*Surətə xor baxmıram, mə'na, səlam olsun sənə.*

*Gəlmə ey röya bugün, qoy ki, şəhidlərdən yazım,*
*Gözlərimdən çıx, çəkil, röya, səlam olsun sənə.*

*Təbinin Leylasıdır şairləri şair edən,*
*Parla, ey təb ulduzum, leyla, səlam olsun sənə.*

*Düşmüşəm sevdayə mən Kərbəladan söz deyim,*
*Ey məni vadar edən sevda, səlam olsun sənə.*

*Əs-səlam, ey Kərbəla cəngində can qurban edən,*
*Çox kəsə çox var səlam, amma səlam olsun sənə.*

*İslamın hifzindən ötrü cəngə girdin, ya Hüseyn,*
*Söylədin: «Ey cəng, ey qovğa, səlam olsun sənə».*

[1] *БCУT Yəhyəvi Ərdəbilinindir.*

*Həqqi inkar eyləyənlər küfrü təsdiq etdilər,*
*Etmisən haqq naminə dəva, səlam olsun sənə.*

*Söyləmişsən Kərbəladə: «Döndü yoxdur, öldü var!»,*
*Qeyrətin vermiş buna fitva, səlam olsun sənə.*

*Əs-səlam, ey təşnə kəslər, ey sudan məhrumlər,*
*Əs-səlam, ey qovrulan səhra, səlam olsun sənə.*

*Qətrələrmi gözlərindən Zeynəbin sel tək axan?*
*Göz yaşı dəryasıdır! Dərya, səlam, olsun sənə.*

*Şahin istər Yəhyəvi tək Kərbəladan söz yaza,*
*Bəh, nə xoş xülyadı bu, xülya, səlam olsun sənə.*

*17 noyabr, 2009*



# İYİRMİ BİRİNCİ SƏFƏRNAMƏ

## *«ŞAHİN YENƏ İRAN İLƏ SEVDA HƏVƏSİNDƏ»*

*23* fevral, 2011. Sabah Tehrana uçmalıyam. Təxminən iki ay əvvəl İran İslam Cümhuriyyətinin Bakıdakı Mədəniyyət Mərkəzinin məsul işçisi ağaye-Məhəmmədinin mənə belə bir təklifi oldu: Fars dilində şe'r yazan qeyri-fars şairlərin İranda V Beynəlxalq festivalı keçiriləcəkdir. Bizim məlumatımıza görə, həmçinin sənin kitablarında oxuduğumuz müxtəlif fars dilində yazdığın şe'rlərdən göründüyü kimi sən həmin festivalda ləyaqətlə iştirak edər və fars dilində şe'r yaza bilmək qabiliyyəti olan bir azərbaycanlı kimi ölkənizi təmsil edə bilərsən.

Mən axırıncı dəfə İranda 2009-cu ilin sonlarında olmuş və məşhur Ərdəbil şairi Abbasqulu Yəhyəvi Ərdəbilinin şərəfinə təşkil olunmuş Konfransda iştirak etmişdim. Hər halda fars dilində də şe'r yazan bir qələm əhli kimi Azərbaycanı təmsil etmək lazım idi. Ağaye Məhəmmədiyə öz razılığımı bildirdim. O, bildirdi ki, Şəfəq xanım Əlibəyli də həmin festivalda iştirak edəcək. Bu vaxt elə Şəfəqin özü də gəlib çıxdı və qarşıdakı festivalda «mehman sifəti» ilə iştirak edəcəyini bildirdi. «Yorulmuşam məruzə yazmaqdan, - dedi, - heç olmasa qoy bu dəfə dinləyici olum». Amma, Şəfəq təyyarə ilə getməkdən imtina etdi və maşınla Astara-Tehran istiqamətinə getmək istəyini söylədi.

Bir neçə gün ötdü. Məndən Tehrana göndərmək üçün bir neçə şe'r istədilər və dedilər ki, əgər farsca şe'rlərin bəyənilərsə yanvarın axırında İran səni gözləyəcək.

Daha bir neçə gün keçdi. Məlumat aldım ki, Tehranda keçiriləcək şe'r festivalının katibliyi tərəfindən mənim şe'rlərim bəyənilmişdir və bir neçə gündən sonra İrana uçmalıyam. Daha bir neçə gün ötdü. Bildirildi ki, qarşıdakı festivalın işi təxirə salınır və gediş fevralın sonunda olacaqdır. Ayın sonuna yaxın Tehrandan rəsmi də'vətnamə aldım. Orada yazılmışdı:

*«Cənab ağaye-Şahin Fazil! Salam. Siz alicənabdan xahiş olunur ki,*

*esfənd ayının 7-dən 10-dək (26 fevraldan 1 martadək) Tehranda keçiriləcək БештЫ Беynəlxalq kamil Şe'r (şe'ri-fəcr) festivalında iştirak edəsiniz. Qeyd olunur ki, bütün xərclər tərəfimizdən ödəniləcəkdir*».

DəVətnamə İran Mədəniyyət və İslam İrşadı Nazirinin müavini, festivalın Təşkilatın Şurasının sədri Yəhya Talebyan tərəfindən imzalanmışdı.

Festivala aparacağım kitabları və farsca yazdığım şe'rlərimdən bəzilərini bir yerə yığdım və sabahkı gün münasibətilə bu günün səfərnamə şe'rlər silsiləsinin birinci şe'rini yazdım:

*«Gedərəm mən təzədən İrana Allah qoysa,*
*Dözərəm bir neçə gün hicrana Allah qoysa.*

*Бu şe'r məclisinə dəvət olundum bir də,*
*Çıxaram əldə şe'r meydana Allah qoysa...*

*...Hədəfə enməsi təyyarənin Allah işidir,*
*Can sağ olsun, yetərəm canana Allah qoysa.*

*Çin olub çox səfərim Tehrana, Şahin Fazil,*
*Çin olar həm bu səfər Tehrana Allah qoysa».*

*24* fevral. Gecə narahat yatdım. Sübh tezdən isə artıq bir qəzəl hazır idi:

*Şahin yenə iran ilə sevda həvəsində,*
*Məcnun təzədən şövq ilə Leyla həvəsində.*

*Şah ismayılın Ərdəbili yadıma düşdü,*
*Coşdum yenə Qum, Savə, Marağa həvəsində...*

*Düşmənlə dolubdur Qarabağ, boşdu tüfəngim,*
*Ver güllə, alışdım yenə qovğa həvəsində...*
*Şairlərə «xülyalı» deyirlər, elə şair*
*Olmuşmu məgər olmaya xülya həvəsində?*

*Fəth etsə bu dünyanı əgər Şahinə bəsdir,*

*İnsanlarımız var iki dünya həvəsində.*

Saat 11-də Heydər Əliyev adına Bakı aeroportunda təkərlərini yerdən üzən təyyarə bir saat 15 dəqiqədən sonra İmam Xomeyni adına Tehran aeroportunda yerə endi. Hava limanının birinci mərtəbəsinə düşdüm, nəzərimi əlində mənim adım və soyadım yazılmış (həm ərəb, həm də latın hərfləri ilə) lövhə tutan bir oğlan cəlb etdi. Y axınlaşıb salam verdim və onun məni gözlədiyini bildirdim. O, dərhal bir qədər aralıda dayanmış bir neçə nəfəri səslədi. Gəldilər. Özləri ilə video-kamera da gətirmişdilər. Mən bu vaxtadək İranda olduqca şərafətlə qarşılanmışdımsa da, hələ beləsi görünməmişdi. Hər addımım lentə köçürülürdü. Maşınlara əyləşdik. Mən və məsul bir işçi bir maşina, qalan dörd nəfər isə ikinci maşina əyləşdik.

Tehrana yollanırıq. Qarşıda 40 km. uzunluğunda məsafə var. Mən bu aeroportla Tehran arasındakı yolu əvvəlki səfərnamələrimdə təsvir etmişəm. Geniş avtoban magistralı və yolun sağ-solunda üzərində şüarlar yazılmış plakatlar...

Müşayiətçi birdən-birə məndən soruşdu:

- Sizin fikrinizcə Mövlana türkdürmü?

O, əlbəttə, Şərq aləminin ən məşur şair və mütəfəkkirlərindən olan Cəlaləddin Rumini nəzərdə tuturdu. Dedim:

- Mövlananın milliyyəti barədə hələ dəqiq məlumat yoxdur. Farslar onu fars, türklər türk kimi tanıyırlar. Özü isə bütün şe’rlərini və başqa epik əsərlərini, o cümlədən «Məsnəvi»sini dövrün yazı ənənəsinə uyğun olaraq fars dilində yazıb.

Dedi: - Son vaxtlarda İnternet məlumatlarında onun türk mənşəli olması xüsusunda çoxlu fikir və mülahizələr var.

Dedim: - Doğrusunu Allah bilir. Bəlkə də türkdür. Mövlana hazırkı Əfqanıstanda, mənim dəfələrlə olduğum Bəlx şəhərində doğulub. Bəlxin əhalisi isə tarix boyu əsasən, lap elə bu gün də özbək və türkmən tükrlərindən ibarətdir. İnternet məlumatları doğru ola bilər.

Bu dəfə müşayiətçi dedi: - Doğrusunu Allah bilir.

Tehrana yaxınlaşırıq. Qarşımızca gedən bir yük maşınının arxasında Azərbaycanca bir yazı oxudum. «Gözəl Allah, gözlə məni». Müşayiətçi və sürücü Azərbaycan dilini bilmirdilər. Yazını onlara tərcümə etdim: «Gözəl

Allah, məni gözlə, yəni məni qoru». Yazı xoşlarına gəldi. Sürücü dedi: - Qorumaq Allah-təalaya xas xüsusiyyətdir, amma yaxşı adamları.

Tehrandayıq. Bir metro stansiyasının yanından keçirik. Yazılıb: «Tehran metrosu». Xoşuma gəldi. Bilmirəm ki, niyə Bakıda «metro» əvəzinə «metropoliten» yazırlar. Qoy yazılsın. Adamlar onsuz da «metro» deyirlər.

«Lalə» otelinə gəldik. Yenə video-kamera çəkilişi. Otelə daxil oldum. Orada da ehtiramla qarşılandım.

Səkkizinci qatdakı 30 saylı otağımdayam.

Bir qədər istirahət. Telefon səsləndi. Danışan bir qadındır. Mənim müşayiətçim (rahnüma) olduğunu bildirdi və nahar yeməyinə də’vət etdi.

Otelin restoranındayıq. Rahnümanın adı Puran Hüseynidir. Söhbət arası dedi ki, siz 3 nəfəri (məni, bir pakistanlı xanımı və bir suriyalını) Tehranda olacağınız günlər ərzində o müşayiət edəcək. Əlavə etdi ki, sizin üçün müxtəlif gəzintilər də təşkil edə bilərəm. Tehranda çox olduğumu bildirdim və gəzintilərdən imtina etdim. Bildirdim ki, yazı- pozu ilə məşğul olacağam və sabah cümə günü (istirahət günü) olduğu üçün heç yana getməyib elə oteldə dincələcəyəm.

Elə hiss etdim ki, elə o da məmnun oldu. Axı sabah onun da istirahət günüdür, qoy dincəlsin.

Xatırlatmaq istəyirəm ki, bu festivala dünyanın müxtəlif ölkələrindən 17 şair də’vət olunub. Xanım Hüseyni nüsxəsi kompüterdə çıxarılmış bir siyahını mənə verdi. Xaricdən də’vət olunanlar aşağıdakılardır:

Ehsan Əkbər (Pakistan), Şəfəq Əlibəyli (Azərbaycan), Fəxri Bouş (Suriya), Məsumə Şirazi (Pakistan), Nonq Yanq Mu (Çin), Şahin Fərzəliyev (Azərbaycan), Kadır Turqut (Türkiyə), Naqi Abbas (Hindistan), Mehdi Baqir xan (Hindistan), Tariq Zeynalabdin Əş-Şərif (Sudan), Cəfər Xolmuminov (Özbəkistan), Həmidcan Həmidov (Özbəkistan), Kula N.Əbdül-Həssan (İraq), Cəlal H.Muhammad (İraq), Murtəza Musvi (Pakistan) və Cumaquli Atayev (Türkmənistan).

Televizoru açdım və dərhal da söndürdüm. Bir qədər yuxulamaq istədim. Y uxum gəlmədi. «Lalə» yaxınlığındakı xiyabanlara baş çəkdim. Tehran elə əvvəlki kimi gur şəhərdir... Bir neçə meydana da baş çəkib otelə qayıtdım, bu kiçik şe’ri yazdım:

Qorxusuz Tehran

*Bu gün Tehran ilə hal-əhvalım var,*
*Bilmədim ki, vaxtım necə ötüşdü.*
*«Qorxulu Tehran»ı yazan sənətkar -*
*Böyük Məmməd Səid yadıma düşdü.*

*Gözəl bir əsərə qoyub ad, yazıb!*
*Gəzirəm şəhəri qorxusuzlar tək.*
*«Qorxulu Tehran»ı o ustad yazıb,*
*«Qorxusuz Tehran»ı mən yazım gərək.*

Son vaxtlar, demək olar ki, hər gecə yuxu görürəm. Deyəsən bərk yorulmuşdum, bu gecə yuxu görmədim, amma yuxumda mən sanki qulağıma bu misraları pıçıldayırdım:

Yuxugörmələr

*Bu yuxugörmələr, yuxugörmələr!..*
*Qurtula bilmirəm yuxugörmədən.*
*Hayana olursa etdiyim səfər Qorxulu*
*yuxular görmədəyəm mən.*

*Yuxuyla cəngdədir gecəmin çoxu,*
*Nə yaman üz varmış mənim yuxumda,*
*Gözümü yumuram - dağılır yuxu,*
*Gözümü açıram yuxu hücumda...*
*Mən yenə Tehrana etmişəm səfər,*
*«Qorxulu Tehran»da qorxu görmədim.*
*Yuxudan qorxan yox bəlkə mən təhər,*
*Şükür ki, bu gecə yuxu görmədim.*

*25* fevral. Səhərin gözü açılmamış gözümü açdım. Rahat yuxulamışdım. Televizora bir qədər baxıb, dünyada baş vermiş hadisələrdən hali oldum.

Saat 9. Otelin foyesindəyəm. Bizim sabahkı festivalımız haqqında iri bir elan nəzərimi cəlb etdi. Bu vaxt yanımda bir şəxs ayaq saxladı.

- Siz Bakıdansınız?
- Bəli.
- Tanış olaq. Mən də Bakıdan gəlmişəm. Əli Babayev - AMEA Riyaziyyat İnstitutunun işçisi.
- Məlum oldu ki, o da bir Elmi Konfransa gəlibdir. Böyük, çox böyük alim və mütəfəkkir olmuş Nəsirəddin Tusinin şərəfinə Tehranda təşkil olunan mötəbər bir məclisə.

Xeyli söhbətləşdik. Maraqlı adamdır. Bu gün qayıdacaq Bakıya.

Bu vaxt rahnüma mənə yaxınlaşdı, Şəfəq Əlibəylinin bu gecə saat 4- də Tehrana gəlib çatdığını bildirdi. Otağına zəng vurdum. Oyanmadı. Az sonra aşağı düşdü. Sübh yeməyi. Sonra mənim otağıma gəldik: Əli müəllim də bizimlə idi. Söhbətimiz bir saatadək çəkdi. Əli müəllim riyaziyyatla yanaşı ədəbiyyatı da yaxşı bilirmiş. Nəsirəddin Tusinin vurğunudur Əli müəllim.

Nahara yaxın bir nəfər mənə yaxınlaşıb özünü təqdim etdi:

- Mən sizin təşrif gətirdiyiniz festivalın katibi (dəbir) Pərviz Beygiyəm.

Şair idi. Kitabları var.

Təbrizdən və Ərdəbildən gələn 6 şairlə görüşdük. Dostum Əsgər Şahi də onların arasındaydı. Sədr Məhəmmədi, Rəncbər və Asim Ərdəbili.

Otağımdayam. Bir qədər poetik istirahət etdim, yəni şe’r yazdım. Bir qəzəl peyda oldu dəftərimdə:

*İranla görüş naminə dəvət yenə gəldi, İran ilə*
*ünsiyyətə fürsət yenə gəldi.*

*Təşrif gətirdi bura həm Əsgəre-Şahi,*
*Şahi ilə məclisdə söhbət yenə gəldi.*

*Asim dedi ki, Ərdəbilə qar yağıbdır,*
*Allahə şükür, sağ-səlamət yenə gəldi.*

*Бn bəzi şe’r əhli ilə şe’rləşirdik,*
*Gördüm ki, Şəfəq gəldi, şəfəqqət yenə gəldi...*

*26* fevral. Başqa şairlərdə olduğu kimi hicran və vüsal mövzusunda

çoxlu şe’rim var. Birini də bu gecə qaraladım.

Qit’ə

*Бu gecə yummamışam gözlərimi sübhə kimi,*
*Бihəya hicrana bir bax, necə qışqırdı mənə.*

*Gündüzündən çox olur zülmü gecə hicranın,*
*Üzümə gülsə də gündüz, gecə qışqırdı mənə...*

Bu gün festivalın açılışı günüdür. Mərasim İran Milli Kitabxanasının iclas salonunda keçiriləcək.

Milli Kitabxana. Valeh Dəstpiş ilə görüşdük. Şair və tədqiqatçıdır. Bakıya da bir neçə dəfə gəlib. Böyük Üzeyir Hacıbəyovun «Məşədi İbad» («O olmasın, bu olsun») və «Arşın mal alan» musiqili komediyalarının librettolarını İranda çap etdirib.

*«Бu bəzmə gözəl saqi deyin badə gətirsin,*
*Qəmdən acıyan ağzımızı dadə gətirsin...*
*Hicran dağını səbr ilə yarmaqdadı Valeh,*
*Şirinə deyin tişəni Fərhadə gətirsin»*

qəzəlindəki bu misralar onundur. Əli Səliminin məşhur «Sizə salam gətirmişəm» mahnısının sözləri də onundur:

*«Sərin sulu bulaqlardan,*
*Yaşılyarpaq budaqlardan,*
*Lalə rəngli yanaqlardan,*
*Bal süzülən dodaqlardan*
*Sizə salam gətirmişəm»*

misralarını xatırlayırsanmı, oxucu?

Mərasimin açılışı. İran Mədəniyyət və İslam İrşadı naziri cənab d-r Seyid Məhəmməd Hüseyni və müavinləri gəldilər.

Quran tilavəti.

Dövlət himni.

Dəfçalanlar (dəfnəvazi) dəstəsinin ifasında gözəl bir çıxış. 4 qız və 1 oğlan. Nə üçün 4 qız və 1 oğlan? Dəstpiş dedi ki, əgər qızlar səhnəyə tək çıxsalar haram sayılır, həmçinin qızların tək oxumaları da haramdır. Oğlanın dəfi qızların dəflərindən böyük idi (dairə-dəf).

Aqaye-Biyabanəki bu mərasimdə aparıcılıq edir. Şairdir. İsfahanlıdır. Fars dilində «Sənin gözlərin» rədifli bir qəzəl ifa etdikdən sonra «Bismillah» deyərək sözə başladı, festival münasibətilə hamını salamladı, sözü nazir müavini Yəhya Talebyana verdi.

Y.Talebyanın çıxışından: «İran mədəniyyətində şe'rin çox qədim kökləri var. Məqame-müəzzeme-rəhbər (cənab Xameneyi) demişkən «şe'r bizim milli sərvətimizdir». Məclisimizdə 150 nəfərdən çox daxili və xarici şair iştirak edir. Şe'r şairlərdəki elmin və savadın təcəssümüdür».

Söz yenə aparıcınındır. Yenə bir neçə beyt. Bu dəfə məşhur klassik şair Sayib Təbrizidən.

Nazir Seyid Məhəmməd Hüseyni xitabət kürsüsündədir. Onun çıxışından: «Şe'r ölkəmizin tayı-bərabəri olmayan sərmayəsidir... Biz bundan əvvəl keçirdiyimiz festivallara əsasən farsdilli şairləri də'vət etmişdik. Bu dəfə qeyri dilli şairləri də çağırmışıq».

Ustad şair Məhəmməd Əli Bəhməni (təranə şairi) şe'rini oxuduqdan sonra d-r xanım Mənsurə Nikugoftar səhnədə göründü. O, Azərbaycanda və Türkiyədə də olmuşdur. Nikugoftar bir qəzəl və iki sərbəst vəznli şe'rini dedi. Xitabət kürsüsündən aşağı düşən bu xanım şairəni yenə bayaqkı 5 dəfnəvaz əvəz etdi. Yanımda əyləşən Valeh Dəstpiş:

- Bu festival sayca 5-ci olduğu üçün səhnəyə 5 dəfnəvaz çıfxarılıb, - dedi.

Aparıcı sözü Sudandan gəlmiş Tariq Zeynalabdin əş-Şərifə verdi. Dərisinin rəngi qapqara olan bu şair Sudanda fars dili və ədəbiyyatının tədrisi xüsusunda danışdı, öz «ağ şe'r»ini qiraət etdi.

Dördüncü çıxışçı d-r Əfşin Yədullahi oldu. İxtisasca can həkimi olan bu şairin çoxlu bəstələri var. Bir sərbəst vəznli şe'r və iki qəzəl dedikdən sonra səhnədən düşdü. Səhnədə uşaq şairi Məhəmməd Cavad Məhəbbət göründü, çoxdan yazdığı ilk qəzəllərindən birini oxudu və həmin qəzəlini «qəzəle-ilahi» («ilahi qəzəl») adlandırdı.

Söz Çindən gəlmiş Mu Honq Yangındır (xanım Mu). Mən onunla 2008-ci ildə Tehranda tanış olmuşdum. Pekin şəhərindəki Xarici Dillər İnstitutunun fars dili müəllimidir. Xanım Mu «ağ şe'r», yəni vəznsiz şe'r oxudu. Aparıcı zarafatla dedi: «Çinlilər çox zirvələri fəth edib. Xanım Mu da ağ şe'r zirvəsini fəth etdi».

D-r Seyid Əli Gərmarudi. Bir müddət Tacikistandakı İran Səfirliyi Mədəniyyət Mərkəzində işləyib. O, söylədi ki, xanım Munun indicə ifa etdiyi şe'r mənim şe'rimdir. Çində çin dilində çap olunmuşdur. D-r Gərmrudi mərhum əfqan şairi Xəlilullah Xəlilidən (məliküş-şüəra) bir şe'r oxudu və müəllifi çox təriflədi. Yadıma Əfqanıstan düşdü. 13 il işlədiyim Əfqanıstan. Heyf Əfqanıstandan, heyf Xəlilullah Xəlilidən! Mən əfqan diyarında işlədiyim dövrlərin birində (ikinci dövrdə) şair Xəlilullah Pakistana səfir təyin olundu, ölkəyə rus təcavüzündən sonra vətənə qayıtmadı və elə xaricdə də vəfat etdi.

S.Ə.Gərmrudi məşhur klassik şair Şeyx Müslihiddin Sədi Şiraziyə ithaf etdiyi bir qəzəlini oxumaqla kifayətləndi.

Bununla da, festivalın açılış mərasimi sona yetdi.

Nahardan sonra bizi «Fərhəngsəraye-Razi» («Razi Mədəniyyət Sarayı») adlanan böyük bir binanın iclas salonuna gətirdilər və bu günün ikinci iclası başlandı.

Quran tilavəti.

Aparıcı əvvəlki aparıcıdan da pərgar adamdı. Xitabət kürsüsünə çıxdı və sözə başladı:

*«Eşq suzanəst,*
*Bismillahir-rəhmanir-rəhim,*
*Hər ke xahanəst,*
*Bismillahir-rəhmanir-rəhim»*

*Tərcüməsi:*

*«Eşq yandırar,*
*Bismillahir-rəhmanir-rəhim,*
*Kimdə meyl var,*
*Bismillahir-rəhmanir-rəhim».*

Aparıcının qısa çıxışından sonra şairlərin çıxışları başladı, nə başladı. Xanım Pərvanə Nicati (Şiraz), Behruz Sepidnamə (Gilan), Mortəza Kəraməti (Buşəhr), Qadir Təravətpur (Kuh-Giluyə) kimi şairlərdən sonra bu sətirlər müəllifi səhnəyə də'vət olundu. Bir qədər Azərbaycanda fars dilinin öyrənilmə səviyyəsindən danışdım, birinci «Divan» kitabımı açdım və orada dərc olunmuş farsca şe'rlər silsiləsindən «Qarətçilər» və «Qapılar» adlı sərbəst vəznli şe'rlərimi oxudum və fars dilinin gözəlliyini tərənnüm edən bir qəzəlimi təqdim etdim:

*Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,*
*Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl.*

*Nə qədər şairi vardır, əcəba, İranın,*
*Neçə arif yetirib hər ili, yarəb, nə gözəl.*

*Qərq olubdur gülə hər guşəsi, güldən başqa*
*Bu qədim ölkədə var dil gülü, yarəb, nə gözəl.*
*Adi hər sözdəki məzmun məni ovsunlatmış,*
*Sanki axmaqdadı mə'na seli, yarəb, nə gözəl.*

*Би rəvan dildə Nizami yaradıb, Sədi yazıb,*
*Yetirib Ənvərini, БШеН, yarəb, nə gözəl.*

*Би dilin şöləsi çox qəlbi işıqlatdı, bu dil Nura*
*qərq eylədi çox mənzili, yarəb, nə gözəl.*

*Hafizin şe'rini Şahin dedi, bülbül susdu,*
*Fars dili məst elədi bülbülü, yarəb, nə gözəl.*

Bu qəzəlimi əvvəllər də İranda oxumuşdum. Bu dəfə də alqışlarla qarşılandı. Oxuduğum sərbəst şe'rlərin hər ikisi Əfqanıstanda çap olunmuş və vaxtı ilə əfqan oxucularının da marağına səbəb olmuşdu. Vallah, mən qurd ürəyi yemişəm. Mahir fars şairlərinin qarşısında ana dili Azərbaycan türkcəsi olan bir şairin farsca şe'r deməsi böyük cəsarətdir zənnindəyəm.

Məndən sonra Səccad, Əzizi Aram (Tehran), Məhtab Bazvənd

(Xorrəmabad), Məhəmməd Rəncbər Baher (Rənci) Şərqi Azərbaycan, Qaderbəxş (Sistan), Şahrux (Kürdüstan), Yəhya Mühəddisi Xorasani (Məşhəd), Aliyə Mehrabi (Yəzd), Mənsur Əli Əsğəri (Mazandaran), Əli Firdovsi (İsfahan), Vəhid Tələt (Miyandoab), Əli Süleymani (Həmədan), Yədulla Şəhrcu (Hörmüzşəhr), Məryəm Əfzəl (Tehran), Mehdi Qasimi (Kirmanşah), Məryəm Tərək (İsfahan), Möhsün Kaşani (Kirman), Əmir Mərzban (Tehran) özlərinin fars, kürd, təbəri, ərəb dillərindəki şe’rlərini oxudular. Əlbəttə, fars dilindəki şe’rlər böyük üstünlük təşkil edirdi. Türkmənistandan gəlmiş Cumaquli Atayev qısa çıxış etdi, amma şe’r oxumadı (görünür şair deyilmiş).

«Lalə»yə qayıtdıq. Şam yeməyindən sonra xarici ölkələrdən gələn şairlər otelin 13-cü mərtəbəsindəki restorana də’vət olundular. Aldığım də’vətnamədə farsca belə yazılmışdı:

*«Rəvaqe-mənzəre-çeşme-mən aşiyaneye-tost,*
*Kərəm nomay-o forud a ke xane xaneye-tost».*

*Tərcüməsi: «Səndən ötrü gözümün üstü aşiyanəndir,*
*Et kərəm, xanəyə gəl, xanə sənin xanəndir».*

Bu səmimi beytdən sonra də’vətnamədə yazılmışdı:

«*Əziz mehman cənab Şahin Fərzəliyev.*

*Salam-əleyküm.*

*Беşinci Беynəlxalq Fəcr şe’ri Festivalının bütün mehmanlarına xoş dincəlmək arzusu ilə siz alicənab şənbə günü 7.12.1389-cu ildə saat 20-dən 23-dək Беynəlmiləl «Lalə» otelinin 13-cü mərtəbəsindəki «Çeşməndaz» salonuna dəvət olunursunuz. Şe’r oxumaq və çıxış etməkdən ötrü hər birinizə 10 dəqiqə vaxt ayrılmışdır*».

Mustafa Ümidi -
Festivalın icraçı katibi

Də’vətnamədə göstərilən salondayıq. Nədənsə, ilk söz mənə verildi. Tərcümeyi-halım və elmi-ədəbi fəaliyyətim haqqında məlumat verdikdən sonra «İkinci Divan»ımdakı bir qəzəl-nəzirəmi oxudum.

Şəfəq xanım Əlibəyli, özbək şairi Termezi, Rusiyadan «Kazan şəhərindən» gələn Cəfər Xolmuminov və adını yuxarıda çəkdiyimiz xanım Mu

(Çin) da çıxış etdilər. Şəfəq öz çıxışında gözəl bir cümlə işlətdi: «Fars dilini bilməyən adamlar elə güllərə bənzəyirlər ki, bülbülün dilini bilmirlər». Əhsən!

Otağımdayam. Mən bu gün farsdilli İran şairləri qarşısında onların dillərində üç şe’r oxumuşdum. Bir qədər yuxarıda dediyim «vallah, mən qurd ürəyi yemişəm» sözlərimi xatırladım və bir şe’r yarandı:

Qurd ürəyi

*Vallah, qurd ürəyi yemişəm bu gün,*
*Fars dilində olan şe’rlərimi Cürətlə*
*oxudum iranlı üçün,*
*Б^ türk şairi yox, sanki fars kimi.*
*Deyəsən özümdən çox razıyam mən,*
*Fars şe’r mülkünə səyahətə bax!..*
*Şiraz şairi tək şe’r söyləyən Бакı şairində*
*cəsarətə bax.*

*Şair bilməlidir ləyaqətini,*
*Şe’rdə gün kimi ziya gərəkdir.*
*Müşfiq yaxşı deyib bu töhmətini:*
*«Adamın üzündə həya gərəkdir».*

Bu şe’r özünütənqidmi? Mənə elə gəlir ki, yox. Şe’rlərimin hamısı dəfələrlə alqışlandı. Şəfəq xanım buna şahiddir («Yalançının şahidi yanında olar» - Atalar sözü). Yalan danışmıram və üzümdə həyam da var.

Nahar.

Saat 15-də «Kaxe-Sə’dabad» («Sə’dabad qəsri») adlanan bir malikanəyə gəldik. «Kaxe-Sə’dabad», yaxud Pəhləvilərin sarayı. Mən bu sarayın təsvirini əvvəlki səfərnamələrimdə müfəssəl vermişəm.

«Kaxe-Sə’dabad»ın Milli Süfrəxanasına gəlirik. Çadıra bənzər böyük bir restorandır. Şe’r oxumaq mərasimi və şam yeməyi burada olacaq.

Quran tilavəti.

Şairlərin çıxışı: Əkbər Behdarvənd, Əmir Bərzgər, Seyid Məhəmməd Səccadi, Əli Rza Bədi, Əbdülhəmid Rəhmaniyan, Müslim Mühibbi, Məhəmməd Rza Kakayi, Abbas (təxəllüsünü eşitmədim), Həsən Salehi, Əsgər

şahi (o, nə üçünsə çıxışının əvvəlində mənə öz təşəkkürünü bildirdi), Mürtəza Dilavəri Parizi, Zəhra Rezəvi, Məsud İbrahimi, Hüseyn İsrafili, Abdullah Rəva, Əmir Mərzban, sonda isə Pərviz Beygi. Əsgər Şahi başqa şairlər kimi fars dilində şe’r oxudusa da, nəhayət qəsidəsinin axırında türkcə bu beytini deməkdən qalmadı:

*«Oxlar dedi «ləbbeyk» yağış misli töküldü,*
*Б^ sinə ki, meyxanəyi-vəhy idi, söküldü».*

28 fevral. «Səraye-əhle-qələm»dəyik («Qələm əhli sarayı»). Fəcr şe’rinin davamı bu gün burada keçiriləcək. Bu sarayın fəaliyyəti haqqında ağaye-Beygi məlumat verdi: Saray iki ildir ki, fəaliyyət göstərir. Tehranın qələm əhli iki ildir bu sarayın ayrı-ayrı zallarında öz dərnək və məşğələlərini keçirirlər. Bu sarayın jurnal, qəzet və kitab çap etmə imtiyazı da vardır (Kaş Bakıda da əhle-qələm üçün belə bir saray tikiləydi. Neçə ildir ki, 131 yaşı «Məcməüş-şüəra» məclisini aparmadığım yer qalmayıb: Azərbaycan Mədəniyyət Fondu, Tarix Muzeyi, Ədəbiyyat Muzeyi, Şirvanşahlar Sarayı, hazırda isə Vahid Kitabxana-Muzeyi).

Quran tilavəti. Şairlər: Əbdül Rza Radfər, Qədir Turqut (Türkiyə), Mehdi Baqir xan (Hindistan), Əbülfəzl Nəzəri, Mənsur Kəlamifərd, Zəhra Azadiyan, Əhməd Kəşmiri Dilbəstə, Hacı Mühəddisi Xorasani, Əli Rza Dehruye, Nəsrullah Əcəm Novruzi, Əli Ehsan Firiduni, Əbdül Rza Kuhmal, Məsumə Əzhəri, Əli Səhami, Məsud Bimadi, Heydər Mirani, Samiyə Səlimi, Qulam Rza Məhəmmədi, Əli Sipahi Yunisi, Məhəmməd Baqqalan, Fətullah Bigdeli, Cəlal Zərdabadi (İraq).

Yuxarıda adı çəkilən Mənsur Kəlamifərd Zəncanda «Fəryad» ədəbi məclisinin katibidir (dəbir). O, çıxışının başlanğıcında türkcə bir şe’r oxumaq istədi, amma aparıcı onunla razılaşmayıb dedi ki, bizim festivalın məzmununa müvafiq olaraq fars dilində yazdığınız şe’rləri oxumaq lazımdır. M.Kəlamifərd əvvəlcə razılaşdı, lakin sonra israrla özünün bir türk şe’rini dedi:

İmam Rzaya ithaf

*Qaşların tağı edibdür məni heyran, gözəlim,*
*Kipriginlə atısan qəlbimə peykan, gözəlim.*

*Ay görən vəqtə sənun surətini gizlənacaq,*
*Gizlənirsən nədən ey söhrəsi taban gözəlim?..*

*Gəlmisən, hiç demusən ölkədə bimarun var,*
*Bir baxışla edəsən dərdimə dərman, gözəlim.*
*Ayrılıq qərq eləyib kiprigimi göz yaşına,*
*Qoyma dəryadə boğa aşiqi hicran, gözəlim...*

*Gülgilən ta ki, gülüstandə güllər açıla,*
*Gəl gülüstandə ol güllərə mehman, gözəlim.*

*Salmısan çoxlarını çöllərə Yəqub kimi,*
*Mənə də baxgilən ey Yusife-Kənan gözəlim.*

Əbdül Rza Kuhmalın oxuduğu iki şe'rin birincisinin adı «Təvəllüd», ikincisi isə «Ölüm» idi. Şe'rlər, əlbəttə, məzmunlarına uyğun yazılmışdı. Əli Səhami isə Xaqaninin şərəfinə yazdığı qəzəlində Şirvanı, Rudəkiyə ithaf etdiyi qəzəlində Səmərqənd və Buxaranı xatırlatdı. Əslən kürd olan İraq şairi Cəlal Zərdabadi isə 6 şe'r təqdim etdi: 3 ərəbcə, 3 kürd dilində.

Tehranda saat 17-dir. «İslam Təbliğatı Cəmiyyəti»nin İncəsənət hövzəsinə gəldik.

Quran tilavəti.

Dövlət himni.

Aparıcı yuxarıda adını dəfələrlə çəkdiyim Əmir Mərzbandır. Pərviz Beygi şairlərə üz tutub dedi: «Vaxtdan səmərəli istifadə edək və qısa şe'rlər oxuyaq». Lakin oxunan şe'rlər yenə də bir qədər uzun idi. Şairlərdən Abbas Baqeri, Qulam Rza Kafi, Əli Rza Şəkərriz, Zəhra Mühəddisi, d-r Məhəmməd Əli Abun, Humayun Əlidusti, Qədir Turqut, Hamid Hüseynxani, Mehdi Maqer, Seyid Məhəmməd Əmin Şirazi, Cəfər Xolmuminov (Rusiya), Simin Rövşəndel, Həsən Delbəri, Ehsan Əkbər (Pakistan), Sina Əli Məhəmmədi, Hüseyn Narənc, Həmid Rza Şekarçi, Məsumə Şirazi (Pakistan), Mehdi Mərdani, Fatimə Qaidi, Əli Huşmənd qəzəldən, məsnəvidən, sərbəst, hətta postmodernist şe'rlərindən ibarət əsərlərini oxuyaraq öz məharətlərini göstərdilər.

Saat 21-dir. «Talare-vəhdət» sarayına gəldik. Bu axşam İran Mədəniyyət

və İslam İrşadı naziri d-r Seyid Məhəmməd Hüseyni Festival iştirakçılarının şərəfinə ziyafət verəcək.

Nazir və müavinləri gəldilər. Aparıcı ilk sözü Ərdəbil şairi Asimə verdi. Asim Ərdəbili şe'rlərinin birini fars, ikincisini isə türk dilində səsləndirdi. Onun türk dilində oxuduğu şe'rdən iki misra yadımda qaldı:

*«Sındırdı sükutu güllənin səsi,*
*Qaldı qatarından aralı durna».*

Sonra xanım Mu özünün Çin dilindəki bir sərbəst vəznli şe'rini və onun fars dilinə tərcüməsini oxudu.

Qeyd etməliyəm ki, bu şam yeməyindən əvvəl d-r Pərviz Beygi, prof. Şəfəq Əlibəyli və xanım Mu ilə bir kənarda dayanıb söhbət edirdik. Cənab Beygi xanım Mudan adının mə'nasını soruşdu. Xanım Mu:

- «Mu» mənim adım yox, soyadımdır.
- Mə'nası nədir?
- Qaranquş.
- Bəh, bəh, yanımızdakı şairlərin biri şahin, o biri isə qaranquşdur. Onda mən yəqin ki, sərçəyəm (gonceşk).

Gülüşdük.

1 mart. Bu gün çiskinli havadır. «Talare-vəhdət»dəyik. Ciddi yoxlama aparılır. Prezident Mahmud Əhmədnejad ilə görüş günüdür.

Dövlət himni çalındı, Quran tilavəti səsləndi, şairlərin İrana gəlişləri və qarşılanmaları haqqında film göstərildi. Mahmud Əhmədinejad zala daxil oldu. Alqışlar. İran barədə bir mahnı. Aparıcı yenə də «Eşq suzanəst, bismillahir-rəhmanir-rəhim»lə sözə başladı və söz cənab Talebyana verildi. Məruzəçi Fəcr şe'ri Festivalı haqqında müxtəsər məlumat verdi və söylədi ki, Birinci Festival 1383-cü ildə (miladi tarixlə 2004-cü ildə) keçirilmişdir. Elə bu zaman hamı ayağa qalxdı və alqışlar. Gələn şəxs ağaye-Golpayegani idi - dini rəhbər ayətullah Xameneyi dəftərxanasının başçısı. Mən onunla bir neçə ilə bundan əvvəl şeyxülislamımız Allahşükür Paşazadənin evində tanış olmuşdum. O vaxt cənab Golpayegani ilə Azərbaycan ziyalılarının görüşü münasibətilə şeyx böyük bir ziyafət vermişdi. Qeyd edim ki, cənab Golpayegani də şairdir.

Ağaye-Talebyan sözünə davam etdi:

- Xarici ölkələrdən ölkəmizə təşrif gətirmiş bu şairlər fars dilini elə

mənim kimi bilirlər. Onlar İranla xarici ölkələr arasında elçilik missiyasını yerinə yetirirlər.

Sonra ustad şair Müşfiq Kaşani, özbək şairi Termezi, Əli Müəllim Damğani, Golpayegani çıxış etdilər. Əli Müəllim Damğani İran Fərhəngistanının sədridir. O, İmam Xomeyniyə həsr etdiyi bir qəzəlini, sonra bir siyasi məzmunlu şe'rini təqdim etdi. İkinci şe'rində türkməni, əfqanı, həmçinin «torke-Şirvani»ni («Şirvanlı türk»ü) təriflədi və üçüncü şe'rinə keçdi.

Cənab Golpayegani:

- Mən şair deyiləm, amma bəzən şe'rlər deyirəm, - dedi, İzraili tənqid atəşinə tutdu və bir qəzəlini oxudu.

Müğənnilərin çıxışı.

Söz Pərviz Beygiyə verildi. O, Festivalın Bəyaniyyəsini səsləndirdi. Cənab Beyginin bəyaniyyəsində fars dili və fars şe'ri təriflənir və belə cümlələr işlənirdi: «Mənim ölkəm müsəlman ölkəsidir... Şe'r bu ölkənin milli sərvətidir. Şe'r iranlıların Milli himnidir» və s. Onun məlumatına görə, bu Fəcr şe'ri Festivalına ümumilikdə 41 min şe'r göndərilmiş və 150 nəfərədək şair iştirak hüququ qazanmışdır ki, onların 17 nəfəri xarici ölkə vətəndaşlarıdır.

Şairlərə mükafat verilməsi mərasimi. Prezident Mahmud Əhmədinejad, ağaye-Golpayegani, cənablar Beygi, Talebyan, nazir Hüseyni səhnədədirlər.

Mükafatlar təqdim olundu. Mükafatlandırlanlar ancaq daxili şairlər oldular, biz isə təşəkkür qazandıq.

Prezident xitabət kürsüsü arxasındadır. Əvvəlcə şe'r haqqında danışdı. Rudəki, Sədi, Əttar, Xacu, Bafqi, Hafiz, Şəhriyar, Baba Tahir, Pərvin Etimasini xatırladı, Ömər Xəyyamı, Firdovsini, Camini, Nizamini təriflədi. Prezident dedi:

- İndi sizə kimdən və kimin şe'rlərindən deyim.

Cənab Golpayegani:

- Öz şe'rlərindən de.

Prezident gülümsündü və daha bir neçə şe'r söylədi.

Axşam çağı «Lalə»də Urmiyəli şair Hacı Məsud İbrahimi mənə yaxınlaşaraq özünün «Pak eşqin zümzüməsi» («Zümzümeye-eşqe-pak») kitabını bağışladı. Kitabının arxasında öz dəst-xətti ilə belə bir qəzəl də yazmışdı:

*«Fazil, fəzilət əhlinə dünyadə dəyərsən,*
*Golbange-şəfəq, nəğmeye-əlhane-səhərsən.*

*Həqq nəğməsi irfan nəfəsin, möhnəte-canlan,*
*Sultane-ədəb, bəhre-vəfa, pire-qədərsən.*

*Canane güvəndin rəhe-eşqin səfərində,*
*Gördün qəme-dünyam, fərazində başərsən.*

*Баş-göz ağarıb, qəm gücünə yoxdu qərarın,*
*Aldın fərəhe-canı, həyatında gülərsən...».*

2 mart. Festival günləri arxada qaldı. Bu gün şairlərin gedəni gedir, qalanı qalır. Şəfəqlə mən qalırıq. Bizim Bakıya uçuşumuz sabahdır. Bu gün şəhərə gəzintiyə çıxdım. «Lalə»dən «Meydane-Fatimi»yədək piyada getdim (təxminən iki-üç km.).

Oteldəyəm. Televizorun düyməsini basıram. Liviya inqilabı... Tunis, Misir, Bəhreyn, Yəmən əhvalatları. Kolumbiyada torpaq sürüşmələri. Daşqınlar. Mərhum yazıçımız Əbülhəsən demişkən «Dünya qopur».

Televizorun düyməsini bir də basıram. Ekran sönür. Canımda qəzəl yazmaq şövqü var. Artıq bir neçə misra hazırdır. Sonra daha bir neçə beyt. Alındı qəzəl:

*Бitməкdə ömür günləri, bitmir zaman amma,*
*Yaş yetmişə yetmişsə də, qıvraqdı can amma.*

*Dağ timsalı qəddim dik olubdur mənim, indi*
*Dağ üstünü almaqda sərasər duman amma.*

*Faidə-ziyan məsələsində belə gördüm:*
*Faidəmiz olmuşsa da, çoxdur ziyan amma.*
*Həzz ilə fəğan fərqi müəyyən ola bilsə,*
*Üstün gələcəkdir neçə həzzə fəğan amma...*

*Şahin yenə İrandə ilhamə gəlibdir,*
*İranə gedən çoxsa da, azdır yazan amma.*

Telefon səsləndi. Aşağıdan dedilər ki, sübh tezdən pərvazınız olacaq (onsuz da bilirdim, amma sağ olsunlar, xatırladırlar). Dedilər ki, gecə saat 4-də sizi oyadacağıq. Təşəkkürümü bildirdim.

3 mart. Məni oyatmadılar. Mən özüm oyandım. Y axşı ki, oyandım. Yenə bir qəzəl:

*Yox idim, olmağa var ərzə yönəldim sanki,*
*Mən əzəldən əbədi olmağa gəldim sanki.*

*Yaxşı söz yaz ki, olum yaxşı, əzəllər amma Bir*
*cocuq tək sözəbaxmaz və dəcəldim sanki.*

*Düz yolumdan məni sapdırmağa cəhd eylədilər,*
*Kəlləşdim neçə şair ilə, kəldim sanki.*

*Məndən əvvəl də təmiz dillə qəzəl yazmışlar,*
*Onlara ehtiram üçün dilə gəldim sanki...*

*Şahinəm mən, yapalaq tək yaşamaqdan uzağam, Məğruram,*
*namixuda, ərşə dikəldim sanki.*

Çox tez yazdım bu qəzəli. Saat 4-ə hələ çox var. Yatmaq istəmirəm. Yenə yazmaq istəyirəm. Yazdım da:

Qəzəl

*Gül üstündə oturmuş, qovma, bülbüldən nə istərsən?*
*Deyilmi bəs ki, gül qırdın, axı güldən nə istərsən?*
*Səni, ey bağiban, divanə etmiş gül, gəl insaf et,*
*Qərənfildə ətir yoxdur, qərənfildən nə istərsən?..*
*Deyən çoxdur mənə «Qalmış gözün əfqan diyarında,*
*Çox oldun Kabilində, bəsdi, Kabildən nə istərsən?..»*

*Səyahət etməyə vadar edirsən Şahini, Rəbim,*

*Бu Şahindən nə istərsən, bu Fazildən nə istərsən?*

Saat düz 4 tamamda aşağıdan zəng etdilər. Dedilər ki, taksi saat 5- də gələcək, hazırlaşın.

Hazırlaşdım. Saat 5-ə 5 dəqiqə qalıb. Aşağıdayam. Şəfəq də gəldi. Bizi yola saldılar.

Hələ qaranlıqdır. Küçəsüpürən kişilər süpürürlər küçələri (nə üçünsə bizdə qadınlar süpürür).

Aeroporta çatmağımıza az qalıb. Yeni bir qəzəlimin bitməsinə də az qalıb. Axır ki, bitdi:

*Gələrəmmi yanına bir də, ey İran, yaşa,*
*Olarammı yenidən hüsnünə heyran, yaşa...*

*Sülh içində yaşasın yerdə bütün millətlər,*
*Düşməsin torpağa bir qətrə belə qan, yaşa...*

*Mehriban qonşu kimi daima asudə olaq,*
*Ola düşmənlərimiz zarü pərişan, yaşa.*

*Salam, ey Azərbaycan, ey olan Şahinə can,*
*Yaşa, ey Azərbaycan, mənə ey şan, yaşa.*

Aeroportdayıq. Təyyarədəyik. Təyyarədə Yavəri gördüm. Rəssam və xəttat Yavər Əsədi. Bu mehriban adamla çox mehriban görüşdük. 2007-ci ildə çapdan çıxmış «Azərbaycan haykuları» adlı kitabımın şəkilləri onundur.

Yavər Təbrizdə imiş. Orada keçirilən Beynəlxalq Karikatura Müsabiqəsində münsiflər heyətinin üzvü olub. Təbrizdən Tehrana dünən gəlibmiş. Gözlərindən yuxu tökülürsə də, əhvalı bir o qədər də pis deyil, axı o, böyük bir müsabiqədə iştirak edib. Qeyd edim ki, 2008-ci ildə Pakistanın Lahor şəhərində keçirilən Beynəlxalq Xəttatlar Festivalında Yavər birinci yeri tutmuşdur. Hələ Pakistana getməzdən əvvəl Yavərin oraya göndərdiyi göyərçin şəkli («İslam» sözünü ərəb hərfləri ilə göyərçinə döndərmişdi) həmin Beynəlxalq Festivalın emblеminə çevrilmiş, bu şəkil Festivalın bayrağının və idarə heyəti tərəfindən hazırlanan kataloq və kitabların üz qabığı üzərində həkk

olunmuşdu, Yavərin yaratdığı həmin sülh quşu şəkli bir növ o zaman islama olan hücumla (Ben Laden əhvalatına görə) əlaqədar idi. Sonradan Pakistanın konvert və markalarında bizim Y avərin göyərçinə çevirdiyi «islam» sözü nəqş olunmuşdu.

Bakı. Hava Tehranın havasına nisbətən bir qədər soyuqdur. Şəfəqin gözəlliyindən nur yağan qızı Nuranə bizi qarşıladı və onun maşını ilə şəhərə yollandıq.

Evdəyəm. Çayı qaynadana və xörəyi isidənə qədər bir qəzəl də hazır oldu:

*Qıfılı açmadı, əfsus, açarım sındı,*
*Qüvvətim sındı, gücüm sındı, vüqarım sındı...*

*Var qərarım ki, alım həzz Azərbaycandan,*
*O zaman söyləmərəm mən ki, qərarım sındı.*

*Ayağım dəydiyi dəm torpağıma, ey Şahin,*
*Sağlam oldu ürəyim, çünki qübarım sındı.*

*Bakı-Tehran-Bakı 24*
*fevral-3 mart 2011*

## İyirmi birinci Səfərnamə Şe’rləri

*I*

*QƏZƏL*

*Gedərəm mən təzədən İrana, Allah qoysa,*
*Dözərəm bir neçə gün hicrana, Allah qoysa.*

*Бuг şe’r məclisinə də’vət olundum bir də,*
*Çıxaram əldə şe’r meydana, Allah qoysa.*

*Fars dilində orada bir neçə nəzmim çap olub,*
*Gələcəkdə düşəcək «Divan»a, Allah qoysa.*

*Əfqanıstanda da çox şe’rimi dərc eylədilər,*
*Бu də təzim edərəm əfqana, Allah qoysa.*

*İşlərim düşməlidir sahmana inşaallah,*
*Salaram hər işi mən sahmana, Allah qoysa.*

*Fərman alsam ki, «yaz osmanlıca həm çoxlu şe’r»,*
*Sidq ilən baş əyərəm fərmana, Allah qoysa.*

*Hədəfə enməsi təyyarənin Allah işidir,*
*Can sağ olsun, yetərəm canana, Allah qoysa.*

*Çin olub çox səfərim Tehrana, Şahin Fazil,*
*Çin olar həm bu səfər Tehrana, Allah qoysa.*

*23.02.2011*

*II*

*Şahin yenə İran ilə sevda həvəsində,*
*Məcnun təzədən şövq ilə Leyla həvəsində.*

*Şah İsmayılın Ərdəbili yadıma düşdü,*
*Coşdum yenə Qum, Savə, Marağa həvəsində.*

*Б^ vaxt mənim sevgili Dərbənd - vətənimdi,*
*Rus dövləti oldu ona sevda həvəsində.*

*Düşmənlə dolubdur Qarabağ, boşdu tüfəngim,*
*Ver güllə, alışdım yenə qovğa həvəsində.*

*Zərgər zərə aşiq, bu həvəsdən düşə bilmir,*
*Şair isə gündüz-gecə misra həvəsində.*

*Mə'nasevənəm sidq ilə, mümkünmü məgər ki, Surətsevənin*
*olması mə'na həvəsində.*

*Şairlərə «xülyalı» deyirlər, elə şair Olmuşmu*
*məgər olmaya xülya həvəsində?*

*Fəth etsə bu dünyanı əgər Şahinə bəsdir,*
*İnsanlarımız var iki dünya həvəsində.*

*24.02.2011*

*III*
*Qorxusuz Tehran*

*Bu gün Tehran ilə hal-əhvalım var,*
*Bilmədim ki, vaxtım necə ötüşdü.*
*«Qorxulu Tehran»ı yazan sənətkar -*
*Böyük Məmməd Səid yadıma düşdü.*

*Gözəl bir əsərə qoyub ad, yazıb!*
*Gəzirəm şəhəri qorxusuzlar tək.*
*«Qorxulu Tehran»ı o ustad yazıb,*
*«Qorxusuz Tehran»ı mən yazım gərək.*

*24.02.2011*

*IV*
*Yuxugörmələr*

*Bu yuxugörmələr, yuxugörmələr!..*
*Qurtula bilmirəm yuxugörmədən.*
*Hayana olursa etdiyim səfər Qorxulu*
*yuxular görmədəyəm mən.*

*Yuxugörmələrin sirri müəmma,*
*«Bu sirri açan kəs yoxdur» deyirlər.*
*Bu gecə mən yuxu görmədim amma,*
*Yuxuda olmadı yuxudan əsər.*

*Yuxuyla cəngdədir gecəmin çoxu,*
*Nə yaman üz varmış mənim yuxumda.*
*Gözümü yumuram - dağılır yuxu,*
*Gözümü açıram - yuxu hücumda...*

*Mən yenə Tehrana etmişəm səfər,*
*«Qorxulu Tehran»da qorxu görmədim.*

*24-25.02.2001*

*Yuxudan qorxan yox bəlkə mən təhər,*
*Şükür ki, bu gecə yuxu görmədim.*

### *V*
### *QƏZƏL*

*İranla görüş naminə də'vət yenə gəldi,*
*İran ilə ünsiyyətə fürsət yenə gəldi.*

*Təşrif gətirdi bura həm Əsgəre-Şahi,*
*Şahi ilə məclisdə söhbət yenə gəldi.*

*Asim dedi ki, Ərdəbilə qar yağıbdır,*
*Allahə şükür, sağ-səlamət yenə gəldi.*

*Biz bəzi şe'r əhli ilə şe'rləşirdik,*
*Gördüm ki, Şəfəq gəldi, şəfəqqət yenə gəldi.*

*Eykaş, bu məclislərimizdən çox olaydı,*
*Şadəm ki, bizə eşqü məhəbbət yenə gəldi.*

*Eykaş, təam ilə deyil, sözlə doyaydıq,*
*Ey saqi, gətir söz meyi, işrət yenə gəldi.*

*Təkrar eləyir öndəki misranı bu Şahin:*
*İranla görüş naminə də'vət yenə gəldi.*

*25.02.2011*

*VI*
*QİT’Ə*

*Бu gecə yummamışam gözlərimi sübhə kimi,*
*БMaya hicrana bax bir, necə qışqırdı mənə.*

*Gündüzündən çox olur, zülmü gecə hicranın,*
*Üzümə gülsə də gündüz, gecə qışqırdı mənə.*

*Vecinə almadı cananə ilə vəslə yetim,*
*Qışqırım mən də həmin bivecə? Qışqırdı mənə.*

*26.02.2011*

*VII*
*Qurd ürəyi*

*Vallah, qurd ürəyi yemişəm bu gün,*
*Fars dilində olan şerlərimi Cürətlə*
*oxudum iranlı üçün,*
*Б^ türk şairi yox, sanki fars kimi.*

*Deyəsən özümdən çox razıyam mən,*
*Fars şe’r mülkünə səyahətə bax!..*
*Şiraz şairi tək şe’r söyləyən Бakı*
*şairində cəsarətə bax.*

*Şair bilməlidir ləyaqətini,*
*Şe’rdə gün kimi ziya gərəkdir.*
*Müşfiq yaxşı deyib bu töhmətini:*
*«Adamın üzündə həya gərəkdir».*

*26.02.2011*

*VIII*
*Dördlük*

*Yenə də görünmür, ham günəş, ah,*
*Tutqun asimanda, gözüm, günəş gəz.*
*Soyundur buludu qadın tək, Allah,*
*Bulud soyunmasa günəş görünməz.*

*27.02.2011*

*IX*
*QƏZƏL*

*Bitməkdə ömür günləri, bitmir zaman amma,*
*Yaş yetmişə yetmişssə də, qıvraqdı can amma.*

*Dağ timsalı qəddim dik olubdur mənim, indi Dağ*
*üstünü almaqda sərasər duman amma.*

*Faidə-ziyan məsələsində belə gördüm:*
*Faidəmiz olmuşsa da, çoxdur ziyan amma.*

*Həzz ilə fəğan fərqi müəyyən ola bilsə,*
*Üstün gələcəkdir neçə həzzə fəğan amma.*

*Gəzdimsə də çox yerlərini mən bu diyarın,*
*Çəkmiş məni daim özünə İsfahan amma.*

*Yazmaqda səfərnamə qələm hər səfərimdə,*
*Çox yazmalıyam mən hələ, çoxdur güman amma.*

*Şahin yenə İranda ilhamə gəlibdir,*
*İranə gedən çoxsa da, azdır yazan amma.*

*2.03.2001*

*QƏZƏL*

*Yox idim, olmağa var ərzə yönəldim sanki,*
*Mən əzəldən əbədi olmağa gəldim sanki.*

*Yaxşı söz yaz ki, olum yaxşı, əzəllər amma Bir*
*cocuq tək sözəbaxmaz və dəcəldim sanki.*

*Düz yolumdan məni sapdırmağa cəhd eylədilər,*
*Kəllələşdim neçə şair ilə gəldim sanki.*

*Məndən əvvəl də təmiz dillə qəzəl yazmışlar,*
*Onlara ehtiram üçün dilə gəldim sanki.*

*Şövq ilə şe’r yazıb, zövq ilə elm öyrəndim,*
*Gözünü bədnəzərin səy ilə dəldim sanki.*

*Şahinəm mən, yapalaq tək yaşamaqdan uzağam,*
*Məğruram, namixuda, ərşə dikəldim sanki.*

*3.03.2011*

*XI*
*QƏZƏL*

*Gül üstündə oturmuş, qovma, bülbüldən nə istərsən?*
*Deyilmi bəs ki, gül qırdın, axı güldən nə istərsən?*

*Səni, ey bağiban, divanə etmiş gül, gəl insaf et,*
*Qərənfildə ətir yoxdur, qərənfildən nə istərsən?..*

*Sənin qəsdin qurutmaqmı Araz tək bir çayı, şair,*
*O sahildən nə istərsən, bu sahildən nə istərsən?*

*Deyən çoxdur mənə «Qalmış gözün əfqan diyarında,*
*Çox oldun Kabilində, bəsdi, Kabildən nə*
*istərsən?..»*

*Deyən vardır ki, İstanbulda, ey şair, nə bulmuşsan?*
*Keçibsən Ərdəbildən çox, bəs Ərbildən nə istərsən?*

*Deyən vardır ki, Təbrizdə çox olmuşsan, bu məlumdur,*
*Şəhərdir çox böyük!.. Amma ki, Məncildən nə istərsən?*

*Acı mey vermə, ey saqi, dilim, əlbəttə, şirindir,*
*Acı dillər kəsilsin qoy, şirin dildən nə istərsən?*

*Səyahət etməyə vadar edirsən Şahini, Rəbbim,*
*Bu Şahindən nə istərsən, bu Fazildən nə istərsən?*

*3.03.2011*

*XII*
*QƏZƏL*

*Gələrəmmi yanma bir də, ey İran, yaşa,*
*Olarammı yenidən hüsnünə heyran, yaşa...*

*Həzrət Allah yaratmış Yeri, əlhəmdüllah,*
*Və demiş: Yerdə, ey insan, firavan yaşa.*

*Elə əvvəldə də imkanın olub yüksəlişə,*
*Yenə əvvəlki təkin eyləyib imkan, yaşa.*

*Kafərin cümləsi, əlbəttə, cəhənnəmlikdir,*
*Elə hey cənnəti yad, sən a müsəlman, yaşa.*

*Sülh içində yaşasın yerdə bütün millətlər,*
*Düşməsin torpağa bir qətrə belə qan, yaşa...*

*Mehriban qonşu kimi daima asudə olaq,*
*Ola düşmənlərimiz zarü pərişan, yaşa.*

*Salam, ey Azəribaycan, ey olan Şahinə can,*
*Yaşa, ey Azəribaycan, mənə ey şan, yaşa.*

*3.03.2011*

*XIII*
*QƏZƏL*

*Qıfılı açmadı, əfsus, açarım sındı,*
*Qüvvətim sındı, gücüm sındı, vüqarım sındı...*

*Saqiyə bax ki, verib mey qədəhi sındırdı,*
*Var idi canda xumarım, o xumarım sındı.*

*Mən dünən sanki bahar görmüş idim Tehranda,*
*Soyuğu gördü bu gün, dondu, baharım sındı.*

*Nə üçün neydə nəva olmadı, sazım susdu,*
*Düşdü mizrab əlimdən, niyə tarım sındı?*

*Var qərarım ki, alım həzzi Azərbaycandan,*
*O zaman söyləmərəm mən ki, qərarım sındı.*

*Ayağım dəydiyi dəm torpağıma, ey Şahin,*
*Sağlam oldu ürəyim, çünki qübarım sındı.*

*Tehran-Бakı,*
*3.03.2011*

# MÜNDƏRİCAT

